*Bu kitab "**Anar**. Beşmərtəbəli evin altıncı mərtəbəsi"* (*Bakı, Yazıçı, 1981*) *və "**Anar**. Ağ qoç, qara qoç"* (*Bakı, Azərnəşr, 2003*) *nəşrləri əsasında təkrar nəşrə hazırlanmışdır*

**894.361'3 - dc 21**
**AZE**
**Anar. Seçilmiş əsərləri**. Bakı, "Lider nəşriyyat", 2004, 416 səh.

Xalq yazıçısı Anarın bu kitabına "Ağ liman", "Beşmərtəbəli evin altıncı mərtəbəsi" və "Ağ qoç, qara qoç" əsərləri daxildir.

Oxuculara yaxşı tanış olan "Ağ liman" povestində əxlaqi problemlər qaldırılır, insanın həyatda öz yerini tapa bilməsi, məzmunlu və dolğun ömür sürməsindən bəhs olunur. Yazıçı burada öz insan konsepsiyasını ziyalının "mənəvi dəyər" və "əxlaqi sərvət" anlayışının guşə daşı kimi yoxlayıb, sınaqdan keçirir.

"Beşmərtəbəli evin altıncı mərtəbəsi" romanı bir növ "Ağ liman"ın davamı kimi düşünülsə də, əslində müstəqil əsərdir. Milli bədii fikrin ədəbi-fəlsəfi axtarışlarında yeni mərhələnin ifadəsi olan bu romanın da mərkəzində "Ağ liman"dan tanıdığımız Zaur və Təhminə dayanırlar. Əsərdə onların məhəbbətindən, həqiqi hissin qorunub saxlanmasının vacibliyindən söz açılır.

Son illərdə qələmə aldığı "Ağ qoç, qara qoç" əsərində isə müəllif xəyallarında gerçəkləşdirdiyi Azərbaycanın gələcək taleyini iki fərqli yöndə, bir-birindən əks qütblərdə dayanan qatlarda təsvir etmişdir.

**ISBN 9952-417-24-X**

Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
“**Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında**”
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir

## MİLLİ MƏNƏVİYYATIMIZ VƏ ANAR YARADICILIĞI

İyirminci yüzil Azərbaycan mədəniyyətinin özünəqədərki və özündənsonrakı çağlarının ilgəyini yaradıb, bütövlüyünü təmin edən orqanik zamandır. Məhz XX yüzildə Azərbaycan mədəniyyəti özünütəşkil prinsiplərini müəyyənləşdirdi, hansı köklərdən gəlib hansı yönlərə budaqlandığını aydınlatdı, tarixin hansı çağlarında siyasi-mədəni epiqonçuluğa varıldığını, hansı yolların səhv gedildiyini, nələrdə büdrədildiyini, hansı istiqamətlərdə düzgün addım atıldığını, hansı səmtlərdə irəli getməyin mümkün və gərək olduğunu sezdi. Azərbaycan mədəniyyətinin onurğa sütunu XX əsrin güclü birləşdirici "fəqərəsi" ilə bərkiyib qayım oldu. Azərbaycan mədəniyyətinin bu tarixi-genetik bütövlüyünün dərk olunması və yaradılmasında müstəsna xidmətləri olan mütəfəkkir sənətkarlarımızdan biri də, şübhəsiz ki, Anardır.

Anarın doğma vətəndə, eləcə də onun sərhədlərindən kənarda, Rusiyada 60-a yaxın kitabı çap olunub. "Ağ liman" Moskvada (1973, 1980, 1988), Polşada (1978), Macarıstanda (1972), Bolqarıstanda (1973), Türkiyədə (1991), Özbəkistanda (1978), Qazaxıstanda (1976), "Beşmərtəbəli evin altıncı mərtəbəsi" Moskvada (1980, 1988), iki dəfə müxtəlif tərcümələrdə Türkiyədə (1994, 1995), Almaniya Demokratik Respublikasında (1979), Almaniya Federativ Respublikasında (1989), Çexoslovakiyada (1980-ci ildə çex, 1984-cü ildə slovak dillərində), Macarıstanda (1981), İsveçrədə (1992), Estoniyada (1989), Gürcüstanda (1997), "Əlaqə" povesti üç dəfə Moskvada, Polşada (1981), Macarıstanda (1982), Almaniyada (1986), Fransada (1995), Estoniyada (1981), "Dantenin yubileyi" üç dəfə Moskvada, Estoniyada (1975), Bolqarıstanda (1973), Tacikistanda (1977), "Ağ qoç, qara qoç" Rumıniyada (2004), "Dədə Qorqud" Moskvada (1980, 1988), İranda böyük tirajlarla, nəfis şəkildə nəşr olunub. "Mən, sən, o və telefon" hekayəsi ABŞ-da, Kanadada, Yaponiyada, Finlandiyada, ərəb ölkələrində və bir sıra başqa ölkələrdə çap olunub. Anarın ayrı-ayrı hekayə, pyes və məqalələri dünyanın bir sıra mətbuat orqanlarında ingilis, fransız, alman, ispan, benqal, türk, macar, rumın, bolqar dillərində və keçmiş SSRİ-nin bütün respublikalarında dərc edilib. Amma əlbəttə, Anar ən böyük populyarlığı öz Vətənində – Azərbaycanda qazanıb. Xüsusilə 70-80-ci illərdə Anarın 30, 40, 50 min tirajla çap olunan kitabları, dərgilərdə çıxan əsərləri əl-əl gəzir, dürlü polemikalara səbəb olurdu. Anarın nəinki əsərləri, hətta bu əsərlər haqqında dərc olunan məqalələr Azərbaycan ictimaiyyəti tərəfindən çox həssaslıqla qarşılanırdı.

Anar, əsərlərində çağının ən aktual problemlərini qaldırıb onun, ən həssas nöqtələrinə toxunduğundan bu əsərlər təbii ki, əhatəli ədəbi-tənqidi münasibətlərə, disskusiyalara hədəf olur, estetik qavrayış çevrəsini yaradır.

Anarın yaradıcılığı haqqında Azərbaycanda və dünyanın müxtəlif ölkələrində yazılan çoxsaylı məqalələr, aparılan tədqiqatlar, yəqin ki, bu zərurətin bəhrəsidir. Anarın qələmindən çıxan əsərləri oxuyub başa çıxandan sonra həmin əsərlər haqda yazılmışları göz önünə gətirdikcə, belə bir qanunauyğunluq ortaya gəlir: Azərbaycanın klassik və çağdaş mədəniyyəti, xüsusilə ədəbiyyatı küll halında Anar yaradıcılığında bu və ya digər formada öz əksini tapıb. Şəxsiyyətləri, dəyərləri, problemləri, yönləri ilə. Eyni zamanda, çağdaş mədəniyyət və ədəbiyyatımızın, tənqidimizin elə seçkin nümayəndəsi yoxdur ki, Anar yaradıcılığına bu və ya digər formada, səviyyədə müraciət etməmiş olsun. Anar yaradıcılığı Azərbaycan mədəniyyətinə tarixilik və müasirlik baxımından elə qaynaqlanıb ki, bu vəhdətdə onların harmoniyasından yalnız, heyrətə gəlmək olar.

Bütövlükdə, Anar yaradıcılığına Azərbaycan tənqidinin dörd münasibətini müəyyən etmək mümkündür: iki əks yöndə tənqid, iki əks yöndə təqdir. 60-80-ci illərin tənqidçilərinin bir parası – "dünənkilər" Anarı yenilikçiliyinə, irəli getdiyinə, "modernizminə", "formalizminə" və s. "izmlərinə" görə tənqid edirdilər, 90-cı illərin və yeni əsrin əvvəllərinin bir para tənqidçi və yazarları – "bugünkülər" isə "köhnəliyinə", "geri qaldığına", "antimodernizminə", "izmlərsizliyinə" görə suçlayırlar. Anar yaradıcılığının təqdiri də iki cürdür: tənqidin səthi, saya üzdəngetmələri: və nəhayət, Azərbaycan tənqidinin bu dolğun yaradıcılığa ciddi elmi-analitik, namuslu münasibəti. Azərbaycan mədəniyyəti və ədəbiyyatının inkişafı fonunda görkəmli siyasi xadimlərimizin, alim, yazıçı və tənqidçilərimizin – Heydər Əliyev, Əbülfəz Elçibəy, Məmməd Arif, Sabit Rəhman, İsmayıl Şıxlı, Bəxtiyar Vahabzadə, Tofiq Quliyev, Toğrul Nərimanbəyov, Arif Məlikov, Xəlil Rza Ulutürk, Bəkir Nəbiyev, Araz Dadaşzadə, Yaşar Qarayev, Elçin, Nizami Cəfərov, Tofiq Hacıyev, Yusif Səmədoğlu, Rüstəm İbrahimbəyov, Rəhman Bədəlov, Sabir Rüstəmxanlı, Aydın Məmmədov, Kamil Vəli Nərimanoğlu, Vilayət Quliyev, Kamal Abdullayev, Rəfael Hüseynov, Nadir Cabbarov, Vaqif Yusifli və başqalarının Anar yaradıcılığını yüksək dəyərləndirmələri, onların bu zəngin sənət dünyasına obyektiv baxışları əhəmiyyət kəsb edir. Keçmiş SSRİ məkanında və dünya mətbuatında Anar yaradıcılığına həsr olunmuş məqalələrin müəlliflərinin – L.Anninski, B.Perevedensev, D.Urnov, E.Şklovski, V.Kovski, A.Latınina, A.Boçarov, N.Boqoslovski, İ.Borisova, Q.Petrova, L.Lavrov, A.Tverskoy, L.Lavrova, A.Zemnova (Rusiya), Fəqir Bayqurt, Mustafa Qutlu, Adnan Özyalçınər, Əhməd Bican Ərcilasun, Oktay Akbal, A.Qədir, Yavuz Onk, Əli Yavuz Akpinar, Firudin Andaç, İrfan Ülkü, Firat Qızıltug (Türkiyə), Mixael Farenholts, Taqe Zommerfild, Friderike Bühner, Stefan Proys, Uli Rotfus (Almaniya), Zoltan İslai (Macarıstan), İbrahim Darabi (İran), Cövdət Bilal İsmayıl (İraq) və başqalarının müxtəlif milli psixologiya və ədəbi ölçülərdən Azərbaycan yazıçısının əsərlərinə yanaşmaları sayğıyadəyər və gələcək tədqiqatlar üçün tutarlı mənbələrdir. Burası

da önəmlidir ki, hələ SSRİ dövründə xarici ölkə mətbuatında dərc olunmuş bu məqalələrin bəzilərində Anarın "sovet həyat tərzinə kəskin münasibəti", "rejimə sığmazlığı", "ənənəvi Asiya epik nəqletməsi ilə ədəbiyyatın Qərbə xas olan texniki üsul və formalarını ustalıqla əlaqələndirməyi bacarması", "Şərq müdrikliyi", "modernist yapqıları" önə çəkilir (Uli Rotfus), Anarın təqdim etdiyi "dünyanın bizim təsəvvür etdiyimizdən (yəni isveçrəlilərin – *R.U.*) qat-qat zəngin, çoxcəhətli və təzadlı olduğu" ("Noys Sürixer saytunq" qəzeti, Sürix, 7/8, 1990-cı il) nəzərə çarpdırılır.

Anar ədəbi-bədii yaradıcılığını ictimai-siyasi fəaliyyəti ilə uzlaşdıra bilən nadir şəxsiyyətlərdəndir. Anarın həm sovet dönəmində, həm də indi – müstəqillik çağında bütün yaradıcı fəaliyyəti başlıca məqsədilə milli-mənəvi tərəqqiyə yönəlmişdir. Onun Azərbaycan Yazıçılar Birliyinə rəhbərlik etdiyi illərdə bu təşkilatın nəzdində "Tərcümə və Ədəbi Əlaqələr Mərkəzi", "Dədə Qorqud Ensiklopediyası" yaradılmış, "Ədəbiyyat və İncəsənət" qəzeti Mədəniyyət Nazirliyi ilə şərikli nəşr olunmaqdan çıxarılaraq "Ədəbiyyat qəzeti" adıyla Yazıçılar Birliyinin orqanı olmuş, "Qobustan" toplusu da Yazıçılar Birliyinin orqanına çevrilmişdir. Birliyinin təklifi və təşəbbüsü ilə Azərbaycan PEN klubu – Beynəlxalq Yazıçılar Təşkilatının Azərbaycan bölməsi yaradılmış, Moskva, Türkiyə, Gürcüstan və Polşanın yazıçılar təşkilatları ilə ikitərəfli müqavilələr bağlanmışdır.

1987-ci ildə erməni fitnəkarlarının təhriki ilə Qarabağ məsələsi ortaya atılandan bəri Yazıçılar Birliyi fəal mövqe tutmuş, ilk dəfə Moskvaya etiraz məktubları yazıçılar ocağından, onların imzasıyla göndərilmişdir. Yazıçılar Birliyinin Ağdam döyüş bölgəsində və Gəncədə plenumları keçirilmişdir. Anar Naxçıvan, Ağdam, Goranboy və Qazaxda döyüşçülərlə görüşmüş, qaçqın ailələrinin Yazıçılar Birliyinin Şüvəlandakı Yaradıcılıq evində yerləşdirilməsini təmin etmişdir.

1988-ci ildən bəri Azərbaycan Ali Sovetinin deputatı, SSRİ xalq deputatı və SSRİ Ali Sovetinin üzvü Anar Azərbaycanın ən ağır günlərində istər Azərbaycan parlamentində, istərsə də SSRİ-nin ali məclisində Qarabağ problemi xüsusunda dəfələrlə çıxış edib. Başqa Azərbaycan deputatları ilə birlikdə bir neçə dəfə Qorbaçovla görüşüb və ona Azərbaycanın haqq səsini çatdırıb. Yanvar hadisələrinin günahkarlarının cəzalandırılmasını tələb edib. 1990-cı ilin Qara Yanvar gecəsindən sonra Anar rus dilində "Müsibət" adlı müraciət yazıb və səhəri gün yüzdən artıq ünvana – SSRİ xalq deputatlarına və Yazıçılar İttifaqlarına göndərib. Yanvarın 21-də Akademiyada Azərbaycan ziyalılarının etiraz iclasını Anar aparıb. Yanvarın 22-də Azərbaycan Ali Sovetinin bütün gecə davam edən sessiyasında çıxış edib, təkliflər verib, bəyanatlar imzalayıb. 1988-ci ildə Azərbaycanda milli-siyasi hərəkat başlayan çağda bu çağın milli-mənəvi, əxlaqi-intellektual təməlini yaradanlardan biri olmuş Anar bir neçə mitinqdə və 1990-cı il yanvarın 20-də indiki Prezident sarayı qarşısındakı mitinqdə çıxışlar edib.

1995-ci ildə Azərbaycan Respublikası Milli Məclisinin deputatı seçilən Anara müstəqil Azərbaycanın ilk Milli Məclisini açmaq, ilk iclasını aparmaq şərəfi nəsib olub. Anar, yaradıcı şəxsiyyətin özəyini təşkil edən müqəddəs tənhalığını qoruya-qoruya ünsiyyətsevər əsilzadəliyi ilə fəal ictimaiyyətçi olaraq sanki yüz illər bundan öncə başladığı işi səbrlə, təmkinlə davam etdirir. Yaşadığı çağı ömrü, düşüncələri, əməlləri ilə daha mənalı, yaşamalı edən Anar "Mübarizə bu gün də var" məramı ilə, sanki hər işi yenicə başlayırmış kimi tükənməz enerjisi ilə yazıb yaratmaqdadır...

Milli klassik mədəniyyətimizin bütün şirəli köklərindən gələn irsi güc, qaynar enerji Anar yaradıcılığının ən dərin qatlarına sirayət edərək bu yaradıcılığın rüşeymlərini hərəkətə gətirir. Bu səbəbdən Anar klassik irsə münasibətində olduqca müasir, müasirliyə münasibətində olduqca örnəkçidir.

Xalqın mədəniyyət qalası yeganə qaladır ki, heç vaxt tikilib qurtarmır. Hər gələn nəsil onun təzə qatını hörür. Hər qat hörüldükcə, qalanın özülü – milli varlığın bünövrəsi bərkiyir... "Kitabi-Dədə Qorqud"un yaranış və yazıyaalınma tarixinin dürüstləşdirilməsində və onun neçə illərdən sonra 1300 illik yubileyinin dünya miqyasında keçirilməsində həlledici xidməti olan Anar yazır: "Kitabi-Dədə Qorqud" tariximizin təməl məsələsi – Azərbaycan xalqının mənşəyi və məskəni məsələsiylə birbaşa bağlıdır, daha doğrusu, bu məsələlərin tam dəqiqliklə açılması üçün ən etibarlı mənbə və məxəzdir".

Anar ölməz milli eposumuzu məhz belə güvəncli örnəktək araşdıraraq onun çağdaşlıq gərəyini də üzə çıxara bilir. Bu essedə saysız-hesabsız təkzibedilməz tutarqa var. Ancaq mən onun birini misilsiz hesab edirəm: Azərbaycan xalqının ilk mənəvi dayaqlarının, ədəbi dilimizin özülləşmə çağının əsas əlamətlərini hifz edən bu eposun ən arxaik dil qatı altında heç bir başqa xalqın qədim dil izi yoxdur. Ən ilk qatdan belə bu dil öz bünövrəsi üzərində boy atıb, bu dil dünyanın təməl etnoslarından olan Türk Oğuzların dilidir ki, o da mahiyyətcə heç bir qəti dəyişikliyə uğramadan indi də yaşayır, – həmin ulu dilin yaşadanı da bizik. Bu elə etibarlı söykəncdir ki, artıq onu heç kim, hətta ən qatı təəssübkeşlər belə dana bilməz.

Anar, bəşəriyyətin tarix boyunca yaradılmış say-seçmə incilərilə yanaşı araşdırdığı "Dədə Qorqud" eposunun ilk laylarını yüksək sənətkarlıq və elmi intuisiya ilə aça-aça belə bir təbii qənaətə gəlir ki, böyük bədii-estetik dəyərə malik olan bu abidə Azərbaycan təfəkkürünün məhək daşıdır və mədəniyyətimizin inkişafının hər yeni mərhələsində ona təzədən dönmək zərurəti yetişəcək. Abidə hər zaman tarixi bir iftixar duyğusu doğuracaq. Ancaq... təkcə fəxr etmək azdır, başlıcası – ona layiq olmaq gərəkdir. "Azərbaycançılıq haqqında düşüncələr"ində (Bakıda Amerika Universitetində oxunmuş məruzə) Anar bir mütəfəkkir sənətkar olaraq Azərbaycanın tarixi taleyinə və Yeni Çağ Azərbaycançılığının fəlsəfi-ideoloji mahiyyətinə konseptual baxışlarını irəli sürmüşdür. Çağdaşlaşan tarixin, tarixləşən çağdaşlığın yazarı Anar müəyyən mənada "Tarixi-Allahın səbri" sayır bu əsərində. O, tarixə

ənənəvi-standart baxışlardan yan keçərək, dövrlər kataloqu, zaman ardıcıllığı məntiqinə sığmayan olumlar düzümündə substansial gerçəkliyin mahiyyətini arayır, göstərir ki, tarix – yuvarlaq rəqəmlərlə tamamlanmır, epoxal hadisələrin bir-birinə təkanvericiliyi, şəbəkələnməsi, harmoniya qatlarını yaratması onun məntiqini şərtləndirir. Vaxtilə Hegel də "Tarixin fəlsəfəsi" əsərində tarixin öz məntiqini yaratmasındakı təşnə cəhdində "ümumdünya ruhunun iradəsini", "substansial pafosu" önə çəkmiş, tarixin ən böyük mənasını mənəviyyat dəyərlərinin üzə çıxarılmasında, ruhi harmoniyaya çatılmasında görmüşdü. Anar da iyirminci və iyirmibirinci yüzillikləri, ikinci və üçüncü minillikləri ayırıb qovuşduran eyni rəqəmlərin səf-səf düzülüşü ilə deyil, bəşəriyyətin, eyni zamanda Azərbaycan xalqının tarixi yaddaş və həyatının doğurduğu epoxal dönüşlərlə tarix yarandığı qənaətinə gəlir. Bu mənada tarix – milli varlığın, milli ruhun zaman-zaman, fəsil-fəsil çiçəkləməsidir. Dünən bugünə çatmırsa, demək, bu gün də sabaha çatmayacaq. Dünənin bu günə, bugünün sabaha yetməsi, qovuşması ilə zaman bütövlənir, tarix pillələnir. Bu pillələrlə düşmək də, qalxmaq asandır. Ən məğrur yeriş – tarix pillələrindəki gedişdir. Tarix – pillələşməyəndə, cəngəlliyə, yaxud da səhraya çevrilir. "Zamanların rabitəsi qırılır" (Şekspir). Bu mənada Anarın "ənənə" yerinə "gələnək" işlətməsi, mədəniyyətin davamlı milli ruh sütununa gələnək prinsipləri ilə yanaşması tamamilə qanunauyğundur.

Mədəniyyətin inkişafı – yalnız bütün cinahlardakı hərəkatla təmin olunur. Ona görə də klassik mədəniyyət qurucuları milləti silkələmək, milli düşüncəyə təpər vermək üçün onun bütün cəbhəsində fədakarlıqla çalışmışlar. Bu ənənə, göründüyü kimi, Anar üçün də məram və örnək olub.

Yeni çağın klassik əsərlərini yaradan Anar ötəni – itən saymayan, keçmişlə bugünün (ötənlə bitənin) ulu doğmalığına söykənc verən, tarixin arxitekturasına öz naxışlarını, oymalarını yapan, sərt doğruları ilə ürəyimizdən tikan çıxardan bütün yaxşı sənətkarlar kimi həqiqi mənada adamı xoşbəxt edən yazıçıdır. Yazıçı Anarın yaradıcılığı sanki bu hikmətli fikri bir daha təsdiq edir: "Öz nöqsanlarını duyan, görən, düşünən, yazan xalq yetkin xalqdır!" "Aşağılıq kompleksi"ndən sıyrılıban öz üstünlüklərini pasdan təmizləyib, bülövləyib, itiləyib, parıldadıb kəsərli, gərəkli edən xalq da eləcə.

Anarın nəsri, şübhəsiz, onun çoxşaxəli yaradıcılığının nüvəsini təşkil edir. Yazıçının nəsri 60-cı illərdən ta günümüzədək özünəməxsus zənginləşmə, dərinləşmə yolu keçmiş, gəlişməsində yeni çalarlar, özəl keyfiyyətlər qazanmışdır. Onun nəsr yaradıcılığındakı poetik təkamülün ritmlərini sanki bir-birindən doğulan, fəqət ayrı-ayrı dünyalardan keçən əsərlərin ümumi arxitektonikasında aydınca bəlirləmək olur. Yazıçının daim gərilən üslubu, analitik təhkiyəsi, öz daxili enerjisinə güvəncli süjet-obrazyaratma çəmləri, yorulmaz ideya axtarışları onun nəsr poetikasının dinamikasını təmin edir.

Anarın bir əsərindən o birinə qapı açılır. Hər bir əsərin mövzu, üslub və forma bitkinliyi olduğu üçün bu "poetik məkana" sığdırılan hər bir detal in-

cəliklərinə qədər işlənildiyindən həmin "poetik məkana" sığmayanlar da yeni bir əsərin obraz potensiyasına çevrilir. Dərinlik genişlənmə, budaqlanma, dürləşmə situasiyası yaradır. Bir əsərin ötəri cizgisi, epizodik obrazı yeni bir əsərdə fokuslaşdırılır, mayalanmış bədii hüceyrənin orqanizmə çevrilməsi, doğuluşu, həyat qazanması kimi təbii bir proses baş verir. Bu mənada Anarın bütün nəsr əsərləri bütöv, sürəkli bir romandır. Dünya ehramının şüuraltı labirintlərində hörümçək torlarını yırta-yırta gedən, əlindəki lampa ilə qaranlıqları işıqladan kahin bilib-bilmədiklərimizi bizə sirr gözəlliyi ilə açır...

Anarın antik fəhmi onun bədii dünyagörüşü və düşüncə texnologiyasını klassik nəsrdən (məsələn, Lukian, Rable, Servantes satirasından, "Kəlilə və Dimnə" müdrikliyindən) çağdaş nəsrin modern axtarışlarınadək dünya bədii mədəniyyətinin bütün buğum nöqtələrinə qaynaqlayır. Çağdaş nəsr prosesi XX əsrin ikinci yarısından günümüzədək olan dövrü əhatə edir ki, bu dövrün bədii atlasında Azərbaycan nəsri həm də Anar yaradıcılığı ilə dəyərincə təmsil olunmaqdadır. Çağdaş nəsr axtarışlarında Anarın yeri seçkincə görünür. Bu fikri ayrı variasiyasında belə də demək olar: Anar çağı ilə bütöv, dolğun, ahəngdar görünür. Anar nəsrində Zaman – saat kimi çıqqıldayır, hər Anın – əbədiyyət qədər zəngin və ləzzətli olduğu duyğusu yaradılır. Altmışıncılar sırasında Anar dövrünün yazarları ilə bənzəyişlərindən daha çox bənzəməzliklərinə görə nəsildaşdır. Yazıçı özü də "Nəsrin fəzası" adlı dəyərli araşdırmasında "yeni Azərbaycan nəsrinin" yaradıcılarını ortaq bir müstəviyə gətirməyə çalışsa da, yenə məhz onların bənzərsizliklərində, problemə ayrı tərzdə yanaşmalarında "yeni nəsrin" ədəbi ruhunu görürdü.

İnsanın daxili aləminə enməyin Balzak, Tolstoy, Dostoyevski, Unamuno bədii üsulundan ayrı bir səpkidə, ancaq gələnəkli bir bağlantıda təzahürü yeni çağ dünya nəsrinin estetikasını müəyyən etdi. Buradakı realizm mistika və sürrealizmə varmasında da, sosial problemləri insanın içərisinə ötürməsində, onları şüuraltında oynatmasında, xırdalıqları qurdalamasında da daha inadlı idi. Dostoyevski və Eynşteyn "atomik başlanğıca", Markes və Priqojin isə materiya və ruhun "özünütəşkil stixiyasına", "xaosdan nizam" yaranmasına istinad etməklə çağlarının bədii və elmi təfəkkürünün konsentrasiya – birləşik nöqtələrini tapmış olurlar. Azərbaycan nəsrində Anar şüuraltı psixologiyanın dərinliklərini belə inadla araması ilə milli bədii düşüncəmizi çağdaş sorğulara urcah edir. Markesin Melkiadesi ("Yüz ilin tənhalığı") isti Makondo şəhərciyinə qaraçının gətirdiyi buz külçəsinə əlini vurub heyrətlə "Bu bizim əsrimizin ən böyük kəşfidir!" deyirsə, Anarın Feyzulla Kəbirlinskisi Dantenin yubileyinə dəvəti ilə aldadılıb çox pərt, yöndəmsiz vəziyyətə düşdükdən sonra arvadı Həcəri yalnız metro möcüzəsi ilə təəccübləndirməyə gücü çataraq söyləyir: "Bəli, görürsən, bu da yeriyən pilləkən...". Assosiasiya doğuran situasiyalar fərqli poetik açıma gedir. Markes bütöv bir nəslin aramsız süqutunu, Anar isə sayğısızlıq gerçəyində mənəviyyatın ölümü təhdidində belə onun diriliyinə işartıları göstərir. "Xaosdan nizama" doğru gedən sanıl-

maz yolların biri də budur... Markesin gözəl Remediosu hamının gözü qabağında yerdən üzülüb göyə uçur, Anarın gözəl Təhminəsi isə ölümündən sonra Zaurun gözünə "beşmərtəbəli evin altıncı mərtəbəsində" görünür... Əslində, yeni çağ bədii-fəlsəfi düşüncəsi elə "beşmərtəbəli evin altıncı mərtəbəsindəkiləri" ələk-vələk etməklə məşğuldur...

Anarın nəsr əsərlərinin əksər mövzuları – göründüyü kimi, müasirlik, qəhrəmanları – müasirlərimizdir. Bu real obrazlar bizdə o fikri yaradır ki, deyək: "Bunlar ki bizik! Yaxud: "Biz ki elə onlarıq!" Əbədiyyəti də, çağı da yaradıcılığında uzlaşmada alan Anarın əsərləri yazıldığı vaxtla bu günü aktuallığı və sönməzliyi ilə bağlayır. Yazıçının cızdığı bədii dünya daim zamanla tənləşmə və dalaşmadadır. Onun əksər qəhrəmanları – "orbitindən çıxmış insanlar", "faktla həqiqət arasında" vurnuxan insanlar (O.Şpenqler) düşdükləri və ya özlərinin yaratdıqları çevrənin darlığında can çəkişdirirlər. Onlar "obıvatel" mühitinə sığmaq istəmir, bu mühitin içərisində, yan-böyüründə öz antidünyalarını yaratmağa can atırlar. Xüsusilə urbanist mənəviyyatın mağaralarında Anar gəzişmələri çox orijinaldır. Meşşan həyatının yekrəngliyinə, dözülməzliyinə etiraz – ötən əsrin 60-80-ci illərinin mənəviyyat axtarışları palitrasında tünd boyaları da ortaya çıxarır, o dövrün sərt yasaq və tabularına əksbasqı kimi bir sıra sosial-siyasi mətləblərə də toxunulurdu. Anar qəhrəmanlarının çabalayışları, etiraz psixologiyası milli şüurun başqa qatlarını da tərpədir, vətəndaş təpkilərinə impuls verirdi. Barışqanlığın, güzəştçilliyin, ipə-sapa yatarlığın içərisində bir barışmazlıq, güzəştəgetməzlik, ipə-sapa yatmazlıq ruhu çırpınırdı.

Şüuraltı psixologiyanın içərilərinə varmada Anar əsrdaşları – Frans Kafka, Jan Pol Sartr, Alber Kamyu, Con Faulz, Çingiz Aytmatovun nəsr poetikası ilə səsləşən, lakin tamamilə orijinal bir poetikanın yaradıcısı olur. Bu – büsbütün Azərbaycan psixologiyasının dərinliklərinin poetikasıdır. Personajlar bütün mental biçimlərində Azərbaycan ekzistensiyasını ifadə edirlər. Şüuraltı proseslərin döngələri, uçurumları, çırpıntıları miniatür və epik təsvirlərin kontrastı ilə açılır. Yazıçının fikir, söz labirintləri, dolanbacları insan mənəviyyatının daha çatılmaz qatlarına yetmək vasitələridir. Mənəviyyatın əks dərinliklərində – okeanında və kosmosunda bulunduqca nəinki realizmin və romantizmin hüdudları itir, həm də bu dərinliklərin birindən o birinə əbədi yollar, cığırlar, ünsiyyət kanalları olduğu üzə çıxır. Təbiətin okeanı və kosmosu birləşdirən harmoniyası insaniçi dünyaların aranışında da tapılır. Bu mənada Anar qəhrəmanlarının Qəlb qalaktikasını, Marian çökəkliyini kəşf etmiş sənətkardır. Bir-biri ilə incə, dordolaşıq, ötəri, isti, soyuq, sevgili, yağı münasibətləri olan bu qəhrəmanlar – zəngin dünyanın xırda, xırda dünyanın zəngin insanları Anar nəsrində bütöv bir cəmiyyət, "poetik dövlət" təşkil edirlər. Xarakterlərin açılması məkan dəyişmələrini, məkan dəyişmələri xarakter açılmalarını şərtləndirir. "Ağ liman" – "Beşmərtəbəli evin altıncı mərtəbəsi" – "Otel otağı" yalnız ayrılıqda mövcud olan fiziki məkanlar deyil,

həm də sıralanmış düşüncə, tale məkanlarıdır. Nemətin qapalı dünyadan qurtuluşuna heç olmasa bir ümid yeri var: ağ liman. Zaur isə hələ sağlığında əldən verdiyi ölmüş Təhminəni "beşmərtəbəli evin altıncı mərtəbəsində" tapıb da itirir. Bütün ümidlərin qırıldığı yer – otel otağı isə Kərimin ölüm məkanı olur... Tragik sonluğa doğru bu çapışı Anarın başqa əsərlərində əks tərəfə və ayrı tərəflərə yönəlmələr şəklində də "düzmək" olar. Məsələn, "Otel otağı"ndan "Dədə Qorqud"a – dağ zirvəsində alovlanan, insanları bir-birinə hay verməyə çağıran üç tonqala doğru...

Burası da önəmlidir ki, yazıçının əsərləri süjet xəttinin düyün məqamları, unudulmaz epizodları və bitkin insan obrazları ilə daha çox yadda qalır. 60-80-ci illərdə yazılmış əsərlər məhz belə səciyyəvi – seçənəkli xüsusiyyətlərinə görə indinin və gələcəyin də diri əsərləridir. Bütün səviyyələrin və zövqlərin yazarı Anarın qəhrəmanları elə real və tükənməzdir ki, onlara bütün səviyyə və zövqlərdən yanaşmaq olar. Heç şübhəsiz, bu qəhrəmanların "yaşadığı" əsərlərdən başqa, minlərlə oxucunun yaddaşında da onların bənzərsiz obrazı var. Həmin qəhrəmanlar və onların yaddaşımızdakı obrazları bizim mənəvi-intellektual həyatımızın sinirlərindədir.

"Asılqanda işləyən qadın"ı xatırlayaq. Sən demə, heç nəyi ilə diqqəti cəlb etməyən, cəmiyyəti kənardan izləyən bu qadın insan münasibətlərinin kardioqrammasını hamıdan yaxşı çıxarırmış. "Ağzında bir dənə də sağ dişi" olmayan adi bir idarə işçisi Məmməd Nəsir sən demə, əsl insan sərrafı imiş...

Buna görə də Anarın bədii yaradıcılığında tamdeyilməzliyin estetikası xüsusilə önəmlidir. Anar heç vaxt hazır dəyərlər kompleksini təqdim etmir. Əksinə, Anarın təqdim etdiyi dünya öz dəyərlər kompleksini təbii şəkildə doğurur.

Anarın müxtəlif dövrdə yazılmış üç əsəri – "Ağ liman", "Beş mərtəbəli evin altıncı mərtəbəsi" və "Ağ qoç, qara qoç" buna klassik nümunədir. İlk iki əsərdə fərdi insan xarakterlərindən, talelərindən, üçüncü əsərdə isə kökübir xalqların taleyindən dünya problemlərinə çıxılır. Anarın "Ağ liman" və "Beşmərtəbəli evin altıncı mərtəbəsi" Azərbaycan ədəbiyyatşünaslığı və tənqidində geniş şəkildə araşdırılmış, bu əsərlərin dərin poetikasına varılmışdır. Anarın "Ağ qoç, qara qoç" əsəri janrına, üslubuna, problematikasına görə Azərbaycan ədəbiyyatında tamamilə yeni, orijinal bir əsərdir. Bu əsər üçüncü minillikdə dünya türk xalqlarının vəhdəti ideyasını ortaya qoyan bir mənəviyyat proqramıdır ki, onun da əsasında çox doğma duyğular, tarixin qaçılmaz məntiqi dayanır.

Anar kənardan gətirilən, yad nəzəriyyələrdən diktə edilən qondarma azadlıq ülgülərinin deyil, milli (ümumtürk) mənəviyyatın doğurduğu, türk (o cümlədən Azərbaycan) insanının içindən baş alıb gələn azadlıq duyğularının fərdin və cəmiyyətin həyatında dönüş yarada biləcəyinə inam və güvənc verən bir sənətkar kimi Yeni Çağın yönəldici istiqamətlərini düzgün sezir və seçib göstərə bilir. Yazıçının nəsr yaradıcılığı bu təkamül prosesini izləyib əks etdirən çox güclü və dəyərli sənət örnəklərindəndir.

Anarın yaradıcılıq polifoniyasında ən müxtəlif sənət dürlərinin tutaşı çoxboyalı estetik görüntü və nizam yaradır. Həyat sanki bütün çalarları, çeşidləri, məna saçmaları, yozum imkanları ilə bu yaradıcılıqda variasiyalanır, güzgülənir. Sənətkarın nəsr əsərləri ilə yanaşı, pyes, teletamaşa, radiopyes, bədii, sənədli, tele və cizgi filmləri, ssenariləri, esseləri, ədəbiyyat və sənət haqqında məqalələri, məruzə və çıxışları, xatirələri Azərbaycan mədəniyyəti və incəsənətinin bir yaradıcının dünyasına necə sığdığına və bu dünyadan neçə saçıldığına gözəl nümunədir.

Anarın dramaturgiyası, ssenari yaradıcılığı və rejissor işi onun öz bədii ideyalarını teatral biçimdə, aktyor oyununun dinamikasında, şəkillənmə vasitələrində ifadə etmək, həyatla sənətin söz və hərəkət uzlaşığında vəhdətini yaratmaq, sözü "yeritmək", ideyanı "danışdırmaq" istəyinin, gərəyinin barıdır.

Dramaturqun aktuallığı ilə seçilən, ən kəskin problemləri hədəfə alan pyesləri Azərbaycanın bütün teatrlarında tamaşaya qoyulub. Akademik Dram Teatrında beş pyesi ("Şəhərin yay günləri", "Adamın adamı" – sonuncu Anarın rejissorluğu ilə – , "Səhra yuxuları", "Sizi deyib gəlmişəm", "Təhminə və Zaur"), Rus Dram Teatrında "Şəhərin yay günləri", "Təhminə və Zaur", Gənc Tamaşaçılar Teatrında "Keçən ilin son gecəsi", Kukla Teatrında "Qaravəlli" tamaşaya qoyulub. Onun dram əsərləri SSRİ-nin başqa teatrlarında, Moskvada Miniatür teatrında, Kazan və Kişinyovun Akademik Dövlət teatrlarında, Daşkənddə Mukimi teatrında, habelə Polşa, Bolqarıstan, Türkmənistan və Qırğızıstanda, Rusiyanın bir çox şəhərlərində oynanılıb. Moskvanın Mərkəzi televiziyasında "Mən, sən, o və telefon" əsərinin motivləri üzrə "Hər axşam 11-də" bədii filmi çəkilib...

Xalqın milli-siyasi varlığını qorumağın özül daşı – onun mənəvi bütövlüyünə mane olanlarla mübarizə duyğusudur. Mənəvi yetkinliyə çatmamış bir kütlə həyatın əsas məqsədlərindən daim yayınar və gözüdarlığa qapanıb qalar. Anarın "Qaravəlli" komediyasında olduğu kimi, diş qurdalamaq üçün çöp axtara-axtara, bir-birinin əlini yuya-yuya, üzü kirli, alnı nursuz qalar! Güzəranı qaravəllilləşər! Sonsuz dərəcədə sərsəm bir vəziyyəti qroteks səviyyəsində göstərməsinə görə Cəlil Məmmədquluzadənin "Danabaş kəndinin məktəbi" ilə səsləşən bu gülməcə öz içində çalxalanan, gicəlib qalmış bir kütləyə kəskin parodiyadır. Anarın bir yazıçı kimi daxil olduğu 60-70-ci illər ədəbi nəslinin Cəlil Məmmədquluzadə irsinə, ümumiyyətlə, "Molla Nəsrəddin" məktəbinə yalnız üslub cəhətdən bağlılığını iddia edənlər yanılırlar. Əslində bu bağlılığın əsasında sırf ideal məsələsi – xalqın özünüdərk probleminə yanaşmadakı ruh yaxınlığı dayanır. Anar, Mirzə Cəlildən, hər şeydən öncə, tənqid etmək sənətini, cəmiyyət həyatına ayıq münasibət göstərmək məharətini mənimsəyib. Cəmiyyət həyatının qabarıb-çəkilmələrində isə elə problemlər ortaya çıxır ki, onu bütün mahiyyətilə aşkar etmək əsl yazıçı fəhmi tələb edir. Tarixin böyük dövrlərini üzbəüz qoyub tutuşduranda amansız suallar diklənir. Necə oldu ki, neçə zamanlar bundan qabaq "Çal

qılıncını, Qazan xan, yetdim!" – deyə bir-birinin dadına yetən istiqanlı və isti qanlı bir millətin övladlarında bir-birinə simsarlıq, həyançılıq getdikcə sönükləşdi?! "Şəhərin yay günləri"ndə Bəhram Zeynallıya Qiyas yana-yana, çılğıncasına belə də deyir: "...Ay əmi, sənə qurban olum, nə olub bizə? Axı, biz belə deyildik, ay əmi!..". Sonra XX əsr təlxəyi Firuz bu dəyişməni öz təbirincə belə xırdalayır: "Adamlar həyatda yavaş-yavaş, misqal-misqal, heç özləri də bilmədən satın alınırlar..." "Adamın adamı" pyesində göstərildiyi kimi, cəmiyyətin həyatında elə bir vəziyyət əmələ gəlir ki, "Pul cırım səninçün" – deyən harınlar zümrəsi yetişir, "Pulun gücünə vurma cədvəlini də dəyişmək olar", "Pulun açdığı qapını avtogen də deşə bilməz" – "məntiqi" doğulur, adamlar az qala rüşvətsiz yaşamağın mümkün olduğuna da inanmırlar, düzlükdən, doğruluqdan danışanısa, sadəcə olaraq, ciddi adam hesab eləmir, hətta ona, üzdə olmasa da, rişxənd eləyirlər... Getdikcə sürətlənən bu mənəvi iflas ictimai dağıntılardan tutmuş dövlət ölgünləşməsinə, hakimiyyət bayağılaşmasınadək bütün proseslərdə görünəcəkdi. Roma aristokratları da quş dilindən təamlar bişirtdirib, səhərədək yeyib-içərmişlər, – qüvvələri tükənincəyədək... Onların fənalığı isə tarixdə başqalarına görk olmadı...

Elə bu səbəbdən də Anar cəmiyyətdə baş verən böhranları cücərtilərində bəyan etməyə, onların sosial-psixoloji aqibətini izləməyə – özü də son dərəcə fərdi araşdırmalarla izləməyə çalışıb.

Bir çox nəsr əsərlərinin səhnə və ekran variantını yaradan Anar sanki sənətin bu yeni imkanları ilə həyat dramaturgiyasının daha gizli qatlarını, cizgilərini üzə çıxarmaq, onları daha görüntülü etmək məqsədi daşıyır. Bütövlükdə Anarın səhnə və ekran əsərləri qədərincə cazibədar və geniş tamaşaçı auditoriyasının davamlı marağına səbəb olan əsərlərdir. Onun əksər filmləri, televiziya tamaşaları neçə illərdir ki, dəbdəndüşməz şuxluğunu saxlamaqda, dərinliyi, istiliyi, məlhəmliyi, temperamenti, kəsərliliyi ilə mənəviyyatımızda duyğu, düşüncə bolluğu yaratmaqdadır. Artıq Azərbaycan kinosunun klassikasına çevrilmiş "Dədə Qorqud" filminə, "Evləri köndələn yar" televiziya tamaşasına hər il (bəzən bir neçə dəfə) baxılır, fəqət doyulmur. "Dədə Qorqud" filmi kimi bir sənət örnəyi Azərbaycan olduqca var olacaq, zərifliyin və qəhrəmanlığın ölməzliyini zaman-zaman göstərəcək və bəlli edəcək ki, milli sənət və mənəviyyatımız məhz belə örnəklər təməlində əbədi yaşarılıq və törədicilik gücündədir. Hələ iyirmi il öncə Türkiyədə nümayiş etdirilən və məşhur "Spartak" filmi ilə tutuşdurulan "Dədə Qorqud" filmi haqqında Ərgün Gözə əbəs yerə yazmırdı: "Dədə Qorqud" filmi göstərdi ki, bizim nağıl dediyimiz və ya deməyə məcbur edildiyimiz "Dədə Qorqud"da 16 dövlət qurmuş bir millətin mənəvi zənginliklərinin hamısı var. Elə əxlaqi mühtəva var ki, insanlığın hamısına yetər və artıq da qalar. Haramzada olmayan türk milləti əslini heç bir zaman inkar etməz və bir gün görərik ki, Azərbaycanla Türkiyənin babası eyniymiş: Dədə Qorqudumuz... (Ərgün Gözə. "Dədə Qorqud" – "Tərcüman" qəzeti, 1983).

Anar Azərbaycan mədəniyyətinin yaradıcılarına təkcə bədii, sənədli əsərlər həsr etməmiş, onların ekran və səhnə obrazlarını yaratmamış, həm də onlar haqqında çoxsaylı məqalə və esselər yazmışdır. Ümumiyyətlə, Anarın ayrı-ayrı seçkin şair, yazıçı, alim, bəstəkar, aktyor, rəssam, memar, ifaçı və başqa sənətçilərimiz haqqında, ədəbiyyat, tənqid, musiqi, teatr, kino və s. dürlü sənət sahələri xüsusunda yazdığı məqalə və esselərində, dünyadan köçmüş ədib və sənətçilərə həsr etdiyi ağılar və anılarda, "Sizsiz", "Mübarizə bu gün də var", "Gecə düşüncələri", "Əsrim və nəslim" kimi dəyərli və orijinal janrlı əsərlərində yeni çağ Azərbaycan mədəniyyəti və incəsənətinin zəngin palitrası yaradılır. Elm, incəsənət və ədəbiyyatımızın yaradıcı nümayəndələrinə Anarın nəfis baxışı, onların yaratdıqlarına dərin araşdırmalar, tutuşdurmalarla müşayiət olunan incə, analitik münasibəti bütövlükdə Azərbaycan mədəniyyətinin xarakterik cizgilərini, önəmli keyfiyyətlərini, struktur mahiyyətini, şəbəkələnmə prinsiplərini anlamaqda, onun təkamül xüsusiyyətlərini dərk etməkdə, perspektiv gəlişmə yönlərini aramada böyük əhəmiyyət kəsb edir.

Mütəfəkkir yazıçının dünya sənətkarları haqda düşüncələri milli mədəniyyətimizin dünya mədəniyyəti ilə təmas və ilişgilərini bir qədər də artırır və dərinləşdirir. Azərbaycan – dünya mədəniyyətləri arasındakı İpək Yolu həm də Anarın klassik və modern üslubların orijinal sintezindən ibarət olan çoxşaxəli – ornamental yaradıcılığından, genişmiqyaslı ədəbi-ictimai fəaliyyətindən keçir...

Anar yaradıcılığının mühüm bir qolunu da ədəbi, etnoqrafik, siyasi publisistika təşkil edir. Onun Azərbaycanın etnoqrafiyası, etnocoğrafiyası ilə bu və ya digər şəkildə bağlı olan yazılarında Vətən torpağının əlvan mənzərəsi yaradılır, hər qarışında mənəviyyatımızın, estetik düşüncə və duyğularımızın boyaları çalarlanan, hər qırçını genetik yaddaşımızı çiçəklədən yurdumuzun aşıb-daşan sərvətləri qədərincə bolluca sevdirilir. Azərbaycan özü boyda bir xalça – milli varlığımızın bütün rənglərini özündə ilmələyib əks etdirən xalça şəklində göz önünə gətirilir.

Həmişə zamanla nəfəs-nəfəsə, sözü tətikdə olan sənətkar Azərbaycanın ən ağrılı problemlərinə vaxtında, həssaslıqla və bütün kəskinliyi ilə münasibətini bildirmiş, həmin problemlər ətrafında ictimai fikir formalaşdırmağa çalışmışdır. Onun 1990-cı ildə söylədiyi fikirlər ölkəmizdə vətəndaşlığın tarixi məsuliyyətinin dərk olunmasına güclü impuls verən qəti mövqeyi ortaya qoyur. Həmin mövqedən faciələrimiz, bizi normal inkişafdan məhrum edən, baş məqsədlərdən yayındıran çatışmazlıqlarımız apaydın görünür: "Altı və üstü talan olunmuş torpağımız, azdırılmış tariximiz, unutdurulmuş adımız, dəyişdirilmiş əlifbamız, illər boyu kürül-kürül axan yalanlar, boş vədlər, təbiətin kor qoyulması, şəhərlərimizin zəhərlənməsi, mənəviyyatın pozulması, riyakarlıq, saxtakarlıq, rüşvətxorluq, qohumbazlıq, yerlibazlıq – cəmiyyətimizdə yer almış bütün bu bəlalara görə heç birimiz məsuliyyət, cavabdehlik və təqsir yükünü boynumuzdan ata bilmərik"...

Anar, həmişə olduğu kimi bu gün də Azərbaycanın mənəvi-siyasi mövqeyini ləyaqətlə qorumaq missiyasını davam etdirməkdədir. Məlum olduğu kimi, Azərbaycan müstəqillik qazanandan sonra da onun müxtəlif bəhanələrlə suçlandırılması, təklənməsi siyasəti səngiməyib. Anar "Azərbaycançılıq haqqında düşüncələr"ində bu siyasətin əsas yönlərini nişan verərək, Moskva televiziya kanallarının "Azərbaycanda çeçenlərin hərbi düşərgələri, bazaları var, silahlar tranzit olaraq Azərbaycandan keçir, Azərbaycanda islam fanatizmi güclənir, təməl dinçilik (fundamentalizm) təmayülləri artır, radikal dinçi mərkəzlər fəaliyyət göstərir" və b. kimi axın-axın iftiralarını sərrast məntiqlə belə puça çıxarır: "Azərbaycanın Çeçenistanla sərhədi yoxdur. Sual olunur, əgər Azərbaycandan Çeçenistana silah keçirilirsə, deməli, Dağıstandan, yəni Rusiya ərazisindən keçirilir və əgər Rusiya öz ərazisinə nəzarət edə bilmirsə, Azərbaycanı nədə günahlandıra bilər?"

Azərbaycan artıq öz yolunu seçib. Onu belə fitnələrlə yolundan azdırmaq olmaz. Yazıçı ölkəsinin bu yolda qətiyyətlə irəliləməsinə sözü, məntiqi, uzaqgörənliyi ilə dayaq durmaqdadır.

Artıq Avrasiya ölkələrinin həyatında mühüm rol oynayacaq, Şərq-Qərb sivilizasiyalarının qarşılıqlı əlaqələrini bir qədər də dərinləşdirəcək İpək Yolu layihəsi həyata keçirilməyə başlayıb. Bu ideyanın ilk rüşeymlərini, özü də onun məhz Azərbaycana, ümumən türk dövlətlərinə fayda gətirəcək şəkildə irəli sürülməsini Anarın 1991-ci ildə yazdığı "İpək yolu" məqaləsində görürük. O, dünyanın siyasi mənzərəsinin dəyişməsi, yeni düzən yaradılması istiqamətində Azərbaycanın bir müstəqil dövlət olaraq strategiyasını müəyyənləşdirən amilləri önə çəkir. Bu strategiyanın prioritet yönlərini düzgün seçimləyərək yazır: "Tarixi, dini və ideoloji fərqlərlə aralanmış, müxtəlif əlifbalara malik olan türk xalqları hələ qeyri-müəyyən vəziyyətdə olan türk aləmini – Vahid Türk dünyasına çevirməyə qadir olan intellektual, mədəni inteqrasiya və koordinasiya mexanizmləri, institutları yaratmalıdırlar". Yazıçı-publisist tamamilə doğru olaraq qeyd edir ki, Vahid Türk dünyasının yaranması – türk dövlətlərinin müstəqilliyinin itirilməsi demək deyil, əksinə, bu təbii inteqrasiya prosesində müstəqilliklərini möhkəmləndirərək, onların vahid, yenilməz bir gücə çevrilməsi deməkdir. O, müasir dünya tarixindən ərəb, ingilis dilli ölkələri, Latın Amerikası respublikalarını örnək gətirərək, türk dövlətləri inteqrasiyasının da yeni dünyanın qlobal inkişaf məntiqindən doğduğu qənaətinə gəlir. O, bu inteqrasiya prosesində Azərbaycanın geostrateji önəm daşımalı olduğunu da xüsusi vurğulayır: "Bu tarixən təbii prosesdə Azərbaycan vacib rol oynamalıdır. Qismən Avropameylli türk sahələri (Türkiyənin özü, Kiprin türk hissəsi, Balkan türk anklavları) və Uyğur çöllərindən Qazaxıstan və Orta Asiyaya qədər uzanan türk əraziləri arasında körpü rolunu Azərbaycan oynamalıdır. O, həmin fəzanın mərkəzindədir. Həm coğrafi-siyasi mövqeyinə görə, həm də tarixən bir çox məsələlərdə birinciliyinə görə..." Son on iki ilin çalxantılı süreçləri aydınladır

ki, tarixin nəticələndirdiyi bu ideyaların həyata keçirilməsi reallıqdır. Bu gün Azərbaycan – Türkiyə əlaqələrinin gerçək durumu, dövlətimizin regionda apardığı siyasət, uluslararası münasibətlərdə ölkəmizin siyasi-iqtisadi mövqeyinin getdikcə möhkəmlənməsi, Azərbaycanın Qafqazda liderliyə yetməsi prosesi bu özünümüəyyənləşdirmə, özünüüstünlətmə, mədəniyyət və mənəviyyatda olduğu kimi siyasətdə də "aşağılıq kompleksi"ndən qürtulma strategiyasının düzgün seçildiyini təsdiq edir.

Dünya və Azərbaycan mədəniyyəti irsinə, onun ədəbi-fəlsəfi, bədii-estetik, dini-tarixi dəyərlərinə dərindən bələd olan Anar, əslində, milli mədəniyyətimizi Şərq və Qərb mədəniyyətləri sintezində təsəvvür etməyə imkan verən bir sənətin yaradıcısıdır.

Dünya mədəniyyətinin şəhdi-şirəsi Azərbaycan mədəniyyətinə, Azərbaycan mədəniyyətinin şəhdi-şirəsi Anar yaradıcılığına süzülüb. Ona görə də bu yaradıcılıqdan dünyanın dərin mənalarına çıxmaq, dünyadan bu yaradıcılığın dərin mənalarına enmək mümkündür.

Oxuculara təqdim olunan bu kitab Azərbaycanın xalq yazıçısı, əməkdar incəsənət xadimi, Azərbaycan Dövlət mükafatı laureatı, Azərbaycan Respublikası Milli Məclisinin üzvü, Azərbaycan Yazıçılar Birliyinin sədri, Milli Məclisin mədəniyyət komissiyasının sədri, bir çox fəxri adlara layiq görülmüş, məktəblidən akademikə qədər hamının sevimlisi, respublikamızın müstəqilləşməsində və mədəniyyətimizin inkişafında mühüm xidmətləri olan yazıçı, dramaturq, publisist, esseist, kinorejissor, bütün həyatını Vətənimizin, xalqımızın tərəqqisinə, gözəl əsərlər, duyarlı sözlər, tutarlı obrazlar, yozumlu hikmətlər yaratmağa həsr etmiş görkəmli ictimai-siyasi xadim, "İstiqlal" ordenli Anarın təqribən 45 illik ədəbi-ensiklopedik fəaliyyətinin bir qismini əks etdirir.

Çağımızın dünyaünlü böyük qırğız sənətkarı Çingiz Aytmatovun deyimincə, "öz ədəbi dinastiyasını yaratmış Anarın" ərən ruhu və susmaz qələmi onun müdrik, barlı yaşında bundan sonra da çiçəkləyəcək, mədəniyyətimizi əvəzsiz incilərlə zənginləşdirəcəkdir.

***Rahid Ulusel***

## GÜNLƏRİN BİR GÜNÜ

– Üç yüz otuz üç!

Heç kəs hay vermədi.

Kassaçı ucadan təkrar etdi:

– 333!

Birdən Nemət duman içində dərk elədi ki, deyəsən, onu çağırırlar. Yaxasından döşlük kimi asılmış kərpicvarı ağ lövhəyə baxdı: lövhənin üstündəki üç iri rəqəmi aydın gördü və var gücüylə bağırdı:

– Mənəm, Namazov Nemət!

Səsi lap yavaşdan çıxdı.

Növbədə dayanmış adamlar ona məzəmmətlə baxırdılar. Susmuşdular. Yorğun, kədərli görkəmləri vardı. Çoxusunun sifəti Nemətə tanış gəlirdi, amma kim olduqlarını təyin edə bilmirdi. Bu adamları harda görüb, haçan?

Səssiz addımlarla kassaya yanaşdı.

– Hara bilet almaq istəyirsiniz?

– Bakıya.

– Hansı qatara? Kislovodsk-Bakı, yoxsa Krasnovodsk-Bakı?

– Kislovodsk-Bakı, – dedi və fikirləşdi ki, yaxşı, bəyəm biz Kislovodskda deyilik?

Kassaçı Səfdər dayı eynəyinin ardından mağmın-mağmın Nemətə baxdı, sonra zəhmlə soruşdu:

– Bakıya getməyə icazən var?

– İcazə lazımdır? Mən üç ildir növbəyə yazılmışam.

– Dəxli yoxdur. Neçə bilet istəyirsən?

Nemət barmaqlarını yummağa başladı.

– Bir, iki, üç, dörd, beş, altı. Altı. Plaskart. Kupe.

– Kimə-kimə?

– Arvadım bir. Mən iki. Qayınanam üç. Üç də qızım.

– Qızlar sənin deyil.

Nemət təəccüb etdi: kassaçı qadın bunu hardan bilirdi?

– Biri mənimdir, ikisi...

– Birinə bilet verə bilərəm. O ikisinin də öz ataları gəlib alsın.

Neməti qüssə bürüdü. Gərək həmişə belə bir əngəl çıxsın. Özü də lap son dəqiqədə. Üç il gözləyəndən sonra. Bu zaman yadına başqa bir məsələ də düşdü: “Qoy bunu da deyim, sonra bu da bir iş olar”.

– Pişiyimiz də var, – dedi, – pişiyə də bilet almaq lazımdır?

– Mütləq.

– Yaxşı, onda deməli, beş bilet verin, – barmaqlarını bir-bir yumdu, – arvadım, mən, qayınanam, kiçik qızım, pişik.

Kassaçı biletləri yazmağa başladı.

Bu vaxt növbədən kimsə çıxıb kassaçıya yanaşdı, əyilib qulağına nə isə pıçıldadı.

Kassaçı diqqətlə Neməti süzdü:

– Eyib olsun sənə, – dedi, – aldadıbsan bizi. Bir əyninin geyiminə bax.

Nemət əvvəl öz geyiminə, sonra isə növbədə dayanmış yorğun, əzgin adamların geyiminə baxdı.

Növbədə dayanan kişilər və qadınlar eyni rəngli boz zolaq-zolaq pijama və xalat geymişdilər. Təkcə Nemətin əynində mavi rəngli saya pijama vardı.

Adamlar ona məzəmmətlə baxırdılar.

Bu zolaq-zolaq adamların içində Nemət qərib və əcaib görünürdü.

Hamının yaxasından kərpicvarı lövhə asılmışdı, üstündə də qara rəqəmlər.

– Axı, mən növbəyə yazılmışdım. – Nemət adamlara yalvardı. – Üç həftə bundan qabaq, yox, üç il. Üç il bundan qabaq. Bilirdim ki, bilet işi çətindir. Nömrəm də 333-dür.

– Hanı? – deyə bayaq kassaçıyla pıçıldaşan kişi Nemətə baxdı. – Sənin nömrən yoxdur.

Nemət yaxasındakı lövhəyə baxdı: doğrudan da, lövhə ağappaq idi. Nemət yavaş-yavaş aradan çıxıb əkilmək istədi. Kassaçı Səfdər dayı arxadan onu harayladı.

– Nemət, al biletini...

– Bəs axı...

– Bir bilet verə bilərəm. Pişik üçün. Çünki o, zol-zoldur.

Nemət böyük mavi dənizin sahilinə çıxdı. “Kislovodskda dəniz? – deyə təəccüblə düşündü. – Bəlkə, bura Kislovodsk deyil, Krasnovodskdır. Aha, belə de. Bəs, mən onda qatara niyə bilet alıram? Gəmiylə də getmək olar. Onda anamla atamı da apara bilərəm, axı onlar da hardasa bu tərəflərdədir”.

Kislovodsk parkının ağ sütunlu qapılarından yaşıl xiyabana daxil oldu. Söyüdlər sərin-sərin xışıldaşırdı.

“Amma insafları varmış. Səfalı yerə sürgün eləyiblər. Atamı deyə bilmərəm, amma anam yazıq istiyə dözə bilmir”.

Nə qədər cəhd elədisə də, anasının sifətini yada sala bilmədi.

Birdən xatırladı ki, gedib zol-zol pijama almalıdır. Yoxsa qatara bilet verməzlər.

Kislovodskın məşhur “Pyataçok” küçəsinə çıxdı. Küçəni keçəndə arxadan milis fiti eşitdi. Ona aid idi; hərəkət qaydasını pozmuşdu. Milis bir də aramsız fit çaldı. Nemət dayanmadı. Addımlarını becidləşdirdi. “Bacarırsa qoy çatsın” – deyə sürətlə uzaqlaşdı. Milis isə şəhərlərarası telefon zəngi kimi aramsız fit çalırdı.

Birdən fit səsi kəsildi. Nemət cəld tini buruldu, nəfəsini dərib geri qanrıldı: onu təqib edən yox idi. Qəflətən ağlına gələn fikirdən Neməti soyuq tər basdı. “Bilirsənmi daha niyə fit çalmır, niyə təqib etmir? Nömrəni yazıb, vəssalam. Bəs elə bilirdin qaçıb qurtarmısan? Lap arxayın ol, nömrəni yazıb götürüb, bütün postlara xəbər verəcək”.

Gözü divara sataşdı. Divarda tumbul bir qız uşağının şəkli asılmışdı. Qıvırcıq saçları, çəhrayı, gödək, qırçınlı paltarı vardı. Yanaqlarından qan damırdı. Şəklin altında: “Ata, Kislovodskdan mənə səsli məktub yaz” sözləri yazılmışdı.

Nemət “Pyataçokun” hündür yerindən üç nəfərin ona tərəf gəldiyini gördü. Biri böyük qızı idi, qızı ona yanaşıb:

– Ata, mənə maqnitofon al, – dedi.

İkincisi anası idi. Nemət onun üzünün cizgilərini ayıra bilmirdi. Amma bilirdi ki, anasıdır.

Üçüncüsü Sürəyya idi – Nemətin arvadı.

Sürəyya saatı soruşdu.

Nemət iri küçə saatına baxıb:

– Üç tamam, – dedi.

Arvadının səsi lap yaxından eşidildi:

– Ay Nemət, oyan görək! Saatı soruşuram.

Nemət gözlərini açdı.

– Nə?

– Deyirəm saat neçədir? Mənim saatım yatıb.

Nemət qol saatına baxdı.

– Doqquza iyirmi dəqiqə qalıb, – dedi.

– Sən allah, dur get çörək al. Çörəyimiz qurtarıb.

– Yaxşı, bu saat. Beş dəqiqədən sonra.

Gözlərini ovxaladı. Divara tərəf çevrildi.

– "Taldı-Kurqan, Alagöl, Manançı".

Bir ilə yaxın idi ki, Nemət iş otağını böyük qızına verib onun yerinə keçmişdi. Ancaq vaxtilə qızının çarpayının yanından vurduğu böyük xəritə hələ də divarda dururdu. Sovet İttifaqının siyasi xəritəsi. Ölkənin cənub sərhədi Nemətin balışının yanına düşürdü.

Hər səhər Nemət gözlərini açıb bu xəritəni görürdü. O, Şərqi Qazaxıstanın şəhərlərini, göllərini, çaylarını əzbər bilirdi.

Çox vədə gecələr yuxusu qaçardı. Qaranlıqda xəritə yazılarını seçmək olmurdu. Amma gözüyumulu halda da Nemət barmağını düz Taldı-Kurqanın, yaxud Alagölün, ya da Manançanın üstünə qoya bilərdi.

Bəzən bu şəhərləri, çayları, gölləri, ümumiyyətlə, bu ərazini təsəvvüründə canlandırmağa çalışırdı. Ucsuz-bucaqsız çöllər, alaçıqlar, susayıb göl, çay kənarına gələn at ilxıları... Uzun yallı ağ atlar... sonra yuxu bataqlıq kimi çəkib onu aparırdı.

– Ay Nemət, sən allah, dur çörəyə get də...

Yuxu qırsaqqız olub yapışmışdı, əl çəkmək istəmirdi. Ancaq Sürəyyanın səsində narazılıq xalları vardı.

Nemət cəld yorğanı kənara atıb sıçradı. Bir-iki dəfə əl-qolunu atdı – öz aləmində bu, səhər idmanı idi. Üzünü yuyub mətbəxə keçdi.

– Adam – madam iysi gəlir, yağlı badam iysi gəlir.

– Get çörək al gətir, onda yağlı badam da görərsən.

Çörəyə növbə yox idi. On dəqiqədən sonra ər-arvad ağ, təmiz, səliqəli mətbəxdə qabaq-qabağa oturub çay içirdilər.

Nemət:

– Bir qatmaqarışıq yuxu görürdüm ki! – dedi. – Görürəm Kislovodskdayıq. Bakıya bilet almaq istəyirəm, özü də, bax, bu pijamada gəlmişəm, deyirlər yox, zol-zol pijama geyməsən bilet verməyəcəyik.

Pişik miyoldadı. Nemət kolbasanın bir tikəsini ona atdı və gülümsündü:

– Pişiyə də bilet alırdım. Ona bilet verdilər, dedilər zol-zoldur.

– Belə ağıllı yuxular gördüyünçün ayılmaq istəmirdin? Saatı soruşuram, deyirsən üç.

– Yuxuda saat üç idi də.

Sürəyya:

– Mürşüdgil deyəsən bu il də Kislovodska gedəcəklər, – dedi.

– Kislovodskın o bilet müsibəti yadıma düşəndə heç ora ayaq basmaq istəmirəm.

Mixəyi qalstuku qırış idi, yaşılı bağladı.

– Yaxşı, hələlik, – dedi. – Mən getdim.

– Tez gələcəksən? Axı, bu gün şənbədir...

– Ay aqibətin xeyir, – şeşəbığlı Musa kişi qırmızı siqaret paçkasını Nemətə uzatdı. – "Arzu" da var a, bəlkə "Arzu" verim! Mağıl indi filtrin bolluğudur.

– Yox, elə "Nərgiz" yaxşıdır. Kibritin varmı? Ay sağ ol.

Siqareti damağına aldı. Kibrit çəkdi. O biri səkiyə keçib qəzet köşkünə yanaşdı.

– Sabahın xeyir... Varındı?

Salman kişi eynəyinin altından gözlərini azacıq qıydı. Nemətdən başqa heç kəsin sezə bilmədiyi "hə" işarəsini verdi. İşindən qalmadı:

– Bu sənin "İzvestiya"n. Al, bu "Kommunist". Buyur, "Gənclər", "Pravda" yoxdur, qurtarıb. "Trud" üç qəpik. "Bakı", əlbəttə, dünənkidir, yoxsa bugünkü olacaq səhər-səhər? "Komsomol?" Buyur, – deyə alıcıları bir-bir yola salırdı.

Sonra becid bir hərəkətlə piştaxtanın altından qəzet çıxarıb Nemətə uzatdı.

Nemət:

– İki dənədir də? – deyə soruşdu.

– Eyib sözdür ki...

– Ay səni yüz yaşa. Buyur.

– Sağ ol! Xoş getdin!

Bu iti əməliyyat növbədə dayanmış çil-çil köynək oğlanın nəzərindən yayınmadı.

– Ə kişi, bəs deyirdin "Futbol" yoxdur? Deməli, daşbaşçün saxlamısanmış. Barı saç-saqqalından utan!

Salman kişi partladı:

– Ağzını dağıtma, qırışmal! Daşbaşı atan eləyir. Bu yoldaş abunəçi yazılıb. Abunəçini qoyub sənə verəcəyəm?

Nemət aralanıb gedə-gedə Salman kişinin səsini eşidirdi.

– Sən də zəhmət çəkib vaxtında yazılaydın.

– Abunəçi burdan niyə gəlib alır? – Oğlan son zəif bir cəhd də etdi. – Evinə yazdırar da...

– Kefi belə istəyir. Burda yəni sənlik bir iş var?

Salman kişi elə böyük bir canfəşanlıqla ağın qara olduğunu isbat edirdi ki, çil-çil köynək oğlan təslim bayrağını qaldırdı:

– Yaxşı, nöş dava eləyirsən? Bir sözdü dedim, deməmiş olum, bağışla.

Nemət dodaqaltı qımışa-qımışa bağa girdi. Boş skamyada əyləşdi. "Yox, deyəsən, bu gün pis başlamayıb... qəribə yuxu. Dadlı səhər yeməyi. Ətirli filtr. İki "Futbol" qəzeti".

Günəşli ılıq gündü. Ağ seyrək buludlar pərən-pərən olub göyə dağılmışdı. "Belə gündə həmişə adamın ovqatı xoş olur".

Amma ovqatının xoş olmasının ayrı, daha vacib səbəbi də vardı: Dadaş kişi sözünün üstündən qaçmasa...

Qəzeti açıb baxmağa başladı. SSRİ və İrlandiya seçmə komandalarının sabahkı oyunu haqqında yazılar dərc olunmuşdu. Məşqçilərin bəyanatları, komandaların heyəti, gümanlar, fərziyyələr...

– Sabahın xeyir, Nemət, işə getmirsən?

Narın ətir iyi Nemətin burnunu çaldı. Başını qaldırıb Təhminəni gördü.

– İndi gələcəyəm. Hazırlıqlı gəlmək istəyirəm. – Əlindəki qəzeti göstərdi. – İstəyirəm futbol yeniliklərindən əvvəlcə özüm agah olum.

Təhminə:

– Görək axırı bu futbol sizin başınıza nə oyun açır, – dedi və gülümsündü. Ağappaq, xırda tən-bərabər dişləri vardı. Qarğıdalı dənələri kimi bir boyda və narın.

Qırmızı baharı paltarının qolları kəsik idi. Yaxasından ətəyinəcən bir düzüm düymə cərgələnmişdi.

– Yaxşı, hələlik, – deyə əl elədi, uzaqlaşıb getdi.

Nədənsə Nemət Təhminəni ürəyində həmişə Kaman-qız çağırırdı.

"Kaman-qız!" Özünə deməmişdi, amma onu gördüyü ilk günlərdən belə adlandırmışdı. Səsinə görə yox. Səsi boğuq və bəm idi. Bəlkə ona görə ki, ucaboylu, arıq idi, uzun ayaqları vardı. Bəlkə də ona görə ki, kaman kimi onu da ancaq şaquli təsəvvür etmək olurdu.

Bəzi qadınları üfüqi təsəvvür edə bilirsən. Amma Kaman-qız şaquli qadın idi, gözlərini yumsan da, onu yalnız dimdik görəcəksən. Uzun ayaqlarıyla addımlayır, gedir. Quş kimi harasa tələsir. Həmişə ayaq üstə. Şəməşək. Kaman-qızı yataqda uzanan təsəvvür etmək çətindir. O yalnız üz-üzə dayanıb öpüşə bilər, qollarını boynuva salar.

Dolayar qollarını boynuva. Dolayar uzun qollarını boynuva. Dolayar uzun qollarını boynuva şərf kimi.

Yox, deyəsən, doğrudan da, bu gün pis başlamayıb. Bütün ayrı gözəlliklərdən başqa səhər-səhər dünyalar gözəlinin qarşına çıxması, iki kəlmə söz kəsməsi savabların savabıdır.

– "Görək Dadaş kişi ovqatımıza soğan doğramasa. Dəbbələməsə!"

Dünən işdən çıxıb evə gəlirdilər, birdən Dadaş Nemətə müraciət elədi:

– Yaxşı, de görüm, sən bədii ədəbiyyat tərcümə eləmirsən? Vallah, deyir, elmə də, kütləyə də canım qurban, başımı elə bu yolda ağartmışam, amma tək elmi-kütləvi ədəbiyyat tərcüməsindən nə çıxacaq! Deyir, qaz vur, qazan doldur. Yaxşı, savadlı, ixtisaslı tərcüməçisən. Yavaş-yavaş keç bədii ədəbiyyat da tərcümə elə.

– Eləyirəm də, Dadaş müəllim, hərdən görürsən düşəndə hekayədən, oçerkdən...

– Hekayədən, oçerkdən nə olsun e... Maşallah bir çətən külfətin var.

– İndi kinostudiya üçün "dublyaj" eləmişəm. "Jivıye i mertvıye" kino var e, bilmirəm, görmüsünüz...

– Hə, Simonovun romanını çəkiblər...

– Bəli.

Aralığa sükut çökdü. Nemət tilov atmış balıqçı kimi gözləyirdi. "Hər halda məndən deməkdi. Tutdu qatıq, tutmadı ayran. Səhərdən bəhanə axtarırdım. Yaxşı ki, sözü özü saldı".

Kiçik bir tərəddüdən sonra Dadaş:

– Lap yaxşı, – dedi, – o roman bizim nəşriyyatın planında da var. Götür tərcümə elə. Bacararsanmı?

Nemət şiddətli ürək döyüntüsünə görə dilinin dolaşacağından qorxdu, bir müddət danışmadı. Sonra:

– Dublyaj eləyəndə materialın içinə girmişəm, – dedi və nəfəsini dərdi, – mətnə elə alışmışam ki, məncə, çətin olmaz.

– Neynək. Mənim etirazım yoxdur.

Yenə bir müddət susdular. Dinib – danışmadan addımlayırdılar.

– Amma bilirsiniz də, Dadaş müəllim, – Nemət sükutu pozdu, – qabaqdan yay gəlir. İstəyirəm ayrı iş götürməyəm, elə bütün yayı oturub bunu işləyəm.

Dadaş arif idi. Mətləbi göydə tutdu.

– Sabah yadıma sal, – dedi. – Müqavilə bağlayaq səninlə. Oturub rahat işləyə biləsən.

– Çox sağ olun.

Pis kişi deyil bu Dadaş. Görüb-götürmüş adamdır. Özü deməyinə qırx ildir nəşriyyatda işləyir. Deyir başımın tükü sayı adamlar görmüşəm burda. Otuz beş il bundan qabaq kuryerlikdən başlayıb...

Ay Dadaş, başıva daş.
Tərpənmə belə yavaş.

Bəli, şunu götür, şunu qoy. Ora qaç, bura qaç. Ora-bura qaça-qaça bir gün olub korrektor, sonra redaktor, sonra şöbə müdiri... nə isə, indi nəşriyyatda heç beş də yox, üç kişinin biridir. Hörməti, sözkeçərliyi müdirdən heç əskik deyil.

Amma, insafən, heç özünü dartmağı-zadı yoxdur. Böyüknən böyükdü, kiçiknən kiçik. Boş damarı da ki, futbol. Pah atonnan! Bu yaşda belə həvəs?! Futbol adı gələndə kişinin gözü-başı qaynayır. Elə "Futbol"un ikinci nüsxəsini də onunçün götürmüşdü.

Avtobus dayanacağa çatıb nəfəsini dərdi. Qapıları açıldı, düşüş-miniş başlandı. Nemət nömrəsinə baxdı. Yox, mənimki deyil. Onun avtobusunun nömrəsi Nemətin yaşına uyğun idi – 33.

Görəsən, camaatın dediyi nə dərəcədə həqiqətə uyğundur? Yəni doğrudan Dadaşla Təhminənin arasında ayrı haqq-hesab var? Heç inanılası deyil. Dadaş hara, Təhminə hara? Təhminə! Kaman-qız! Bəli, bu da sənin kaman-qızın. Şaquli qadın. Yox əşi, inanmıram, sözdür. Camaatdır da, danışmağa qeybət gəzir... Amma bir yana baxanda... Dadaş da az aşın duzu deyil ha, yüz fırıldaqdan çıxıb. Bildir Daşkəndə konfransa gedəndə yadımdadır nə oyunlardan çıxırdı.

Nemət bir də Dadaşla Təhminəni gözlərində canlandırdı. Dadaşın yekə qarnını, daz başını, ziyilli burnunu... bir də Təhminənin uzun qıçlarını, uzun qollarını.

Üz-üzə dursaydılar Dadaşın başı Təhminənin çiyninə çatmazdı. "Dola qollarını boynuma!" Qollarını Dadaşın yoğun peysərinə dolamaq üçün Təhminə gərək dizi üstə çökəydi. Ya da Dadaş taburetkanın üstünə çıxaydı...

Nemət xəyalında canlandırdığı mənzərəyə özü də güldü. Dadaş taburetkanın üstündə! "Əşi, mənim nə borcuma! Onun əri var, bunun arvadı: özləri bilərlər. Bu gün mənim müqaviləmə qol çəksin. Vəssa-

lam, şüttamam. Onda yayın pulu düzəlir. Onda bu gün dublyajdan mənə çatacaq pula maqnitofon alaram. Karmenə çoxdan söz vermişəm".

Karmen Nemətin böyük qızı idi. Üç qızı vardı, Ortancılı Cilda, kiçiyi Nərgiz.

Nemət nə səsini itirmiş sabiq müğənni idi, nə də opera dəlisi. Opera dəlisi rəhmətlik Əsəd kişi idi. Karmenlə Cildanın atası, Sürəyyanın birinci əri.

Nədənsə bir səhnə heç Nemətin gözləri qarşısından getmirdi: Əsəd kişi iri lırt meşin kürsünün lap dibinə çöküb. Bir dizinin üstünə Karmeni alıb, bir dizinin üstünə Cildanı. Hardansa tapdığı nadir opera vallarına qulaq asırlar.

Karmen olardı o vaxt yeddi-səkkiz yaşlarında, Cilda beş-altı yaşında. İndiki kimi yadımdadır, qızların cüt paltarları vardı. Moskvadan gətirmişdi, çəhrayı paltarlar, qırçınlı, göm-gödək... Başlarında iri çəhrayı bantları vardı. Yanaqlarından da qan damırdı. Qıpqırmızı. Üzlərini Əsəd kişinin üzünə qoyub saatlarla qulaq asardılar. Əsəd kişi də elə bil cənnətin tən ortasında oturub, aldığı zövqdən-səfadan gözlərini yumardı.

Bir dənə də qəribə abajurları vardı. Elə xoş, ılıq işıq salırdı ki, bütün otaq isti pürrəng çay rənginə çalardı.

Karmen məktəbə gedəndə dərslərindən axsamağa başladı. Əsəd professor idi, məşhur cərrah idi, ora-bura çəkirdilər, uşaqla məşğul olmağa hövsələsi hardandı? Elə boş vaxtı olan kimi valları qoyub çorta gedirdi.

Uzun sözün qısası, soraqlaşıb Neməti tapdılar. Köhnə pulnan ayda 150 manata Nemət Karmenlə məşğul olurdu. Cildanı da məktəbə hazırlayırdı.

55-ci il idi. Nemətin 23 yaşı vardı, mətbəədə mürəttib köməkçisi işləyirdi, universitetdə də qiyabi oxuyurdu, biblioqrafiya şöbəsində.

Anası bir il bundan qabaq rəhmətə getmişdi. Ömür vəfa eləmədi ki, atasının şad xəbərini alsın. Arvadı basdırandan iki həftə sonra Nemətə atasının bəraət kağızını təqdim elədilər.

Əsəd Sürəyyadan iyirmi iki yaş böyük idi. Müharibədən qayıdandan bir il sonra Sürəyyayla evlənmişdi.

Qısa müddətdə Nemət Əsədgilin ailəsinə çox isnişdi. Kasıblıq çəkdiyini bilirdilər, tez-tez nahara saxlayırdılar: "Tələbə babasan, otur, görək Sürəyya xanım bizi nəyə qonaq edəcək" – deyə Əsəd onu

masanın başına dəvət edərdi. Həmişə arvadına "Süreyya xanım" deyərdi. Nemət bir dəfə də olsun eşitməmişdi ki, Əsəd arvadını eləcə "Süreyya" çağırsın, "xanımsız", yox, həmişə "Süreyya xanım" ki, "Süreyya xanım!"

Böyük otaqları vardı. Yumşaq xalılarla döşənmişdi. Xalılar addım səslərini su hopduran kimi canlarına çəkirdi. Divarda Əsədin atasının iri şəkli asılmışdı.

Qonaqları oldu, olmadı, fərqi yoxdur, həmişə masanın üstünə ağappaq, nişastalı süfrə salınardı. Bahalı qab-qacaq, gümüş çəngəl-bıçaq düzülərdi. Ailə üzvləri yaxalarına ağ salfet salıb eyni vaxtda masanın başına keçərdilər.

Ev-eşik par-par parlayardı. Nemət heç bir dəfə də olsun Süreyyanı, ya qızlarını səliqəsiz görməmişdi. Həmişə paltarları ütülü, saçları daranmış.

Hər dəfə Nemətə elə gəlirdi ki, Süreyya hamamdan bax bu dəqiqə çıxıb: əl-üzü tərtəmiz, ağappaq. Dərisi hamar-hamar...

Çox vaxt Nemət İçərişəhərdəki dar, rütubətli daxmasına qayıdıb bütün gecəni yata bilmirdi. Gözünü əhəngi tökülmüş divarlara zilləyib, yerində o yan-bu yana qurcuxurdu, yatanda da elə bil yuxusuna od tökülürdü.

Novruz bayramı axşamı Neməti yenə saxladılar. Ağ süfrəyə yaşıl səmənilər, nazik, rəngbərəng şamlar, boyalı yumurtalar, bəzəkli xonça düzüldü. Şəkərbura, paxlava gəldi.

Əsəd:

– Yaxşı, xoş bayramdır, – dedi. – Amma heyif ata-babalarımız bir az xərifləyiblər içkini haram eləyəndə... İçkisiz məclisin nə duzu?

Nemət gülümsündü. O bilirdi ki, Əsəd içən deyil. Bu sözləri də yüngül zarafat naminə, məzəyçün deyir.

– Deyirəm, Nemət müəllim, – o yenə qımışdı: "Nemət müəllim", – gəlsənə bu köhnə bazara təzə nırx qoyaq. Bir balaca qədim ənənəni pozaq. Deyirəm o rəhmətlik kişilər bizdən inciməz, həmi?.. Əslinə qalsa, onların özlərinin də içməklə araları saz imiş.

Əsəd kişi uzun bir əhvalat danışdı, 22-ci ildə 17 yaşında, ilk dəfə Bakıya gəlməsindən, əhli-kef əmisiylə içki məclisinə düşməsindən (indiki zabitlər evi var ha, bax, onun yerində restoran idi), ömründə ilk dəfə dilinə araq vurmasından, sonra da halının xarab olmasından, biabırçılıqdan... Susdu və əlavə etdi:

– Gəl adama bir azacıq konyak içək. Şirniyyatın malı konyakdır.

Sürəyya xırda, zərif qədəhlər gətirdi.

– Sağ olaq! Deyirəm gəl içək Sürəyya xanımın sağlığına!

Nemət:

– Sağ olunuz! Sürəyya bacı, sizin sağlığınıza! – dedi və həyatında ilk dəfə içdi.

İkinci qədəhdən imtina etdi. "Gərək abırlı gedəm" deyə düşündü.

Amma abajurun işığı o qədər mülayim, ılıq, mehriban, çay o qədər ətirli, Əsədin çaldırdığı musiqi o qədər həzin idi ki, heç durub getməyi gəlmirdi.

Əsədgildən çıxanda gec idi. Küçədə dönüb bir də onların dördgöz pəncərəsinə baxdı. İki pəncərə qaranlıq idi – qızlar yatmışdılar. İki pəncərə isti pürrəng çay rəngli idi. Onların ardında musiqi səsləri yumşaq xalçalara hopub itirdi.

Nemət bu pəncərələrə baxdı, baxdı, birdən tramvayın xırıltısını eşitdi, bildi ki, son tramvaydır, götürüldü, sürüşüb yıxıldı, tələsik durdu, yenə qaçdı və özünü zorla çatdırıb, axırıncı vaqonun dal qapısından içəri atıldı.

Tramvay bomboş idi. Nədənsə içəridə işıq da söndürüldü. Relslər üstündə taq-taq taqqıldayan tramvayın axırıncı vaqonunda bir Nemət qaldı, bir də pəncərələrdə əks olunan ulduzlar. Qabaqkı vaqonda konduktor qızla sürücü oğlan bərk mazaqlaşırdılar. Dünyayi-aləm gözlərində deyildi.

Havada baharın nəfəsi duyulurdu. Yaz gecəsinin nəfəsi.

Bir fikir-hiss qəfil külək kimi Nemətin içində qopdu, bayraq kimi qəlbində dalğalandı: birdən-birə dərk etdi ki, Sürəyyaya aşiq olub. Bu kəşf damardakı qan kimi təpədən topuğacan içini dolaşdı, dövran etdi, qızdırdı. İçində nə isə uçub dağıldı. Düşündü, anladı ki, bu, hədər, ümidsiz, gümansız bir sevgidir. Nə əvvəli var, nə axırı. Sürəyya onunçun əbədiyyən çatılmazdır. Və bu fikrin mütləqliyi xəstə bir ehtiras kimi onu daha da gözərtdi, qövr etdirdi, elə bil qəlbinə, beyninə bir qom qor atdılar.

Kədərlənmədi. İlıq, titrək, nigaran bir duyğu bütün varlığını limhəlim doldurmuşdu. Elə bil tramvay silkələndikcə o bu hissin bir giləsinin, bir damcısının dağılacağından qorxurdu.

Tramvay relslərdə çaqqaçuruq atlandıqca pəncərələrdə ulduzlar diksinirdi...

O gecə dar daxmasına getmədi. Səhərəcən küçələri hadırladı. Səhərəcən Sürəyya da onunlaydı.

Aman Allah! Elə bil bütün bunlar dünən olmuşdu. Ya da min il bundan qabaq. İndi, on il sonra o mart gecəsinin uzaq ürkək xatirələrini düşündükcə Nemət gülümsünürdü.

Həyat qəribə gözlənilməzliklərlə doludur. On il bundan qabaq, o mart gecəsi Nemətə ömrünün bax bu gününü, 65-ci il 5 iyun gününü danışsaydılar, inanmazdı.

Bu gün səhərdən bəri baş vermiş ən adi, xırda hadisələr – Sürəyyanın onu yuxudan oyatması, qarşı-qarşıya oturub çay içmələri, qəndqabını bir-birinə ötürmələri, evdən çıxarkən sağollaşmaları – bütün bunlar hamısı on il bundan qabaq Nemətə mümkünsüz bir xülya, çatılmaz bir röya kimi görünürdü. Doğrudan belədir e...

Bu fikirdən başqa bir xoş ümid də doğdu. Bəlkə on il sonra həyatında olacaqları da bu gün heç təsəvvürünə gətirə bilmir. Nemət ən gizli arzularını, quyular dibində gizlətdiklərini, heç bir zaman həyata keçəcəyinə inanmadıqlarını yada salmağa çalışdı. Yadına saldı, düşündü, güldü. Yəni doğrudan bir vaxt gələcək, bütün bunlar reallığa, doğruya çevriləcək? Çətin ağlım kəsir. Amma məgər on il bundan qabaq bu günümü danışsaydılar, inanardım? Yox. Deməli...

Deməli, hər şey ola bilər. Fikrimdən qovduqlarım, quyular dibində basdırdıqlarım, haqqında düşünmək belə istəmədiklərim hamısı bir gün – beş ildən, on, on beş ildən sonra, həyatım ola bilər.

Ancaq bu fikirdən sevinmədi. Çünki bu fikrin ardınca ikinci bədbin fikir də gəldi: bəlkə bütün bunlar reallığa, doğruya çevriləndə, ömrüm olanda onlar da bugünkü həyatım kimi adi, vərdişli, gündəlik olacaq...

Bir gün Nemət həmişəki kimi qızlarla məşğul olmaq üçün Əsədgilə gələndə çöl qapılarını taybatay açıq gördü. Qonşular, qohumlar, tanıdığı və tanımadığı çoxlu adam girib-çıxırdı. Dəhlizdə Alyanı – Sürəyyanın böyük bacısını gördü. Əvvəl geyiminə diqqət elədi – geyimində nə isə bir tələsik matəm, lapdan düşmüş yas əlaməti vardı: başına qara örpək salmışdı, ancaq paltarı ala-bəzək idi. Sonra sifətini gördü. Gözləri şişmişdi, qıpqırmızı idi, amma dodaqları boyalıydı.

Nemət hövlnak içəri keçdi.

O gün gündüz saat ikidə Əsəd elə idarədəcə keçinmişdi. Ürəyi partlamışdı.

Meyit balaca otaqda idi. Arvadlar olan otaqda. Böyük otaqda divar boyunca çoxlu stul düzülmüşdü. Qonşulardan yenə də daşıyırdılar. Nemətin tanıdığı və tanımadığı kişilər oturub xısın-xısın Əsədin özündən, rəhmətlik atasından, ölümün qaşla göz arasında olmasından, əcəldən, ürək xəstəliyindən, ümumiyyətlə, xəstəliklərdən söhbət edirdilər. Qara boz köynəyini şalvarının üstündən salmış, buxara papaqlı, çal topasaqqallı, Nemətin tanımadığı qoca bir kişi:

– Ölüm var ki, ölümdür, ölüm də var zülümdür, – dedi. – Bununku lap zülüm oldu.

Yeddisi çıxanacan Nemət səhər-axşam hər gün gəlirdi.

Yeddisi günü axşam camaat dağılışanda Sürəyya Nemətə yanaşdı:

– Bu günlər aləm qarışdı, – dedi. Karmen onsuz da axsayır, indi yəqin, lap geri qalıb. Sabahdan yenə məşğul olmağa başlayın, özü də lap ciddi.

İki aydan sonra bir gün Nemət utana-utana Sürəyyaya yanaşdı:

– Sürəyya bacı, – dedi. Çoxdan bəri demək istədiyi sözləri necə deyəcəyini bilmirdi. – Bilirsiz, Sürəyya bacı, mən elə alışmışam ki, sizin ailənizə... istəyirdim deyəm sizə ki, mənə... pul-zad lazım deyil. Karmenlə də, Cildayla da elə-belə məşğul olacam...

Sürəyya güldü:

– Nə danışırsız, Nemət! – dedi. – Bir də belə sözü ağzınıza almayın. İnciyərəm. Möhkəm inciyərəm.

Yayı Sürəyyagil heç hara getmədilər. Bakıda qaldılar. Əsədin ilini verdilər. Bir payız axşamı söz təzə filmdən düşdü. Sürəyya dedi ki, heç axırıncı dəfə kinoya getdiyi gün yadına gəlmir. Səhərisi gün Nemət “Bahar” kinoteatrına dörd bilet alıb gətirdi. Karmen və Cildanın səyləriylə Sürəyyanı birtəhər razı saldılar. Dördü bir yerdə “Bahar"da məzəli bir komediyaya baxdılar: cavan sevgililər öz ata-analarının bütün maneə və əngəllərinə baxmayaraq, yüz cür kələk qurub sonda bir-birinə qovuşurdular. Sürəyya xeyli güldü. Kinodan çıxanda Nemətə elə gəldi ki, o cavanlaşıb, elə bil birdən-birə birillik matəmi üzündən yuyulub tökülüb. Sürəyya əvvəlki Sürəyya, Əsədin sağlığındakı Sürəyya idi. Bəlkə də daha əvvəlki Sürəyya, Nemətin onu hələ tanımadığı bir vaxtın Sürəyyası. Əsədə getməmişdən qabaqkı çağın, qız çağının Sürəyyası.

İki-üç dəfə də birlikdə kinoya getdilər. Dördü bir yerdə. Maraqlı xarici film gedirdi. On altı yaşına çatmamış uşaqları buraxmırdılar. Bu filmə ikisi getdi... Sürəyya və Nemət.

Bəzən bulvara, parka gəzintiyə çıxırdılar. Sürəyya, Karmen, Cilda, Nemət. Bir dəfə dəniz seyrinə çıxdılar.

Payız, asqılıqdan palto götürən kimi, ağacların başından küləyi götürüb getdi. Səssizlik çökdü təbiətə. Bir gecə sükut və sakitlik içində aram-aram, yavaş-yavaş, yumşaq-yumşaq qar yağmağa başladı. Qar gecəni ağartdı. Qış gəldi.

Nemət timsah ağzı kimi aralanmış ayaqqabılarında artıq gəzə bilmirdi. Özünə təzə çəkmə aldı, paltoya pulu çatmadı. "Eybi yoxdur, pencək müəllim bu qışı da bizi birtəhər yola verər" – deyə düşündü.

Bir gün Sürəyyagildən gedəndə Sürəyya ona qəzetə bükülü iri bir bağlama uzatdı. "Evdə açarsan" – dedi. Nemətin səbri çatmadı, elə pilləkəndə açdı. Dərhal geri qayıtdı. "Bu nədir? – dedi. – Mən sizdən inciyərəm. Eyib deyilmi?". O, doğrudan pərt olmuşdu.

Uzun mübahisələrdən, xeyli çənə-boğaz olandan sonra Sürəyya onu razı saldı. Nemət evə təzə paltoda getdi. Evdə gördü ki, karıxdığından paltonun mağaza kağızını da çıxartmayıb, bütün yolu belə gəlib.

Qış günlərindən birində qızlarla məşğul olub, evinə gedirdi.

Sürəyya:

– Otur bizimlə nahar eləyək, – dedi. – Yarpaq dolması bişirmişəm.

Nahardan sonra "ləzgi qonağı" kimi dərhal durub qaçmaq olmazdı. Oturub Sürəyyayla söhbət etməyə başladılar. Qızlar öz otaqlarına gedib yatdılar.

Nemət özü haqqında danışmağı sevməzdi. Bəlkə də bacarmırdı. Amma indi qəribə bir həvəslə Sürəyyanın suallarına müfəssəl, yerli-yataqlı cavablar verirdi.

Əvvəl söhbət atasından düşdü. "Yadıma gəlmir, – dedi. – Lap duman içində xatırlayıram ki, boyu çox uca idi. Ya bəlkə o vaxt mənə elə gəlirdi. Axı onu aparanda beş yaşım vardı.."

"Bəli, düzdür. Zakfederasiya vaxtı narkom olub, axır illərinə qədər böyük vəzifələrdə işləyib, 35-ci ildə Samuxda ispalkom işləyib. Anam danışardı, deyir, camaat onun başına and içirdi, evlər tikdirmişdi, yol saldırmışdı. Evindən aparmağa qorxublar. Bakıya çağırıb burda tutublar".

"Hə, otuz səkkizinci ildə Bakıya köçdük. Camaat qoymurmuş, anama deyiblər ki, sən arxayın ol, səni də saxlayacayıq, uşağınızı da böyüdəcəyik. Amma anam razı olmayıb. Köçüb Bakıya. Dayım Bakıda imiş. Elə mən indi olduğum həmin bu evi də dayım tapıb. Hə, ba-

lacadır, çox balacadır, amma daha neyləyəydik. Hələ, siz onu deyirsiniz... bura təzə köçəndə qonşularımız bilirmiş ki, atamı aparıblar. Anam, rəhmətlik, deyirdi ki, adamın Allahı var, insafən üzümüzə vurmurdular, amma öz aralarında danışırlarmış. Qonşumuzun bir oğlu vardı. Elə mənimlə yaşıd idi, beş-altı yaşında olardıq o vaxt. Həmişə çıxıb bizim damımızda oynayır, atılıb düşürdü. Anam danışırdı ki, çıxıb deyirəm: ay bala, orda atılıb düşmə, qırı xarab eləyirsən, yağış yağanda bütün su evimizin içində olur. Uşaq nə desə yaxşıdır? "Çox danışma, siz qraq narodsuz". O vaxtdan anam həmişə acı-acı gülüb: neyləyək, a bala, qraq naroduq da, – deyərdi.

– İnişil anam ağır xəstə yatanda... hə, vərəmdən öldü. Üstəlik yel xəstəliyi də vardı, hə, anam inişil xəstə yatanda o uşağın atası bizə dəyməyə gəlmişdi. Anamdan çıxmayan iş, danışdı bu əhvalatı. Kişi qıpqırmızı qızardı. "Bəs o vaxt mənə niyə xəbər eləməmişsiniz, – dedi, – öz damıma qır saldıranda sizin damınıza da saldırardım". Eh, nə isə...

Sonra Sürəyya danışmağa başladı.

Nemət indiyəcən heç bilmirdi ki, Əsədlə Sürəyya həm də Sürəyyanın anası tərəfdən yaxın qohum imişlər: dayıoğlu, bibiqızı.

Əsəd də Nemət kimi uşaq yaşından yetim qalıb. Onu Sürəyyanın atası Fəttah kişi böyüdüb, Kiyevdə oxutdurub. Rəhmətə getməmişdən bir az qabaq Əsədi yanına çağırıb, deyib bax, bu üç qızımı sənə tapşırıram. Aralığa müharibə düşüb. Müharibədə Əsəd cərrah kimi yaman ad çıxarıb. Cəbhədə, deyir, qiyamət eləyirmiş. Ölüləri dirildirmiş. Təcrübəsi çox olub. Özü deyirdi ki, elə bil on akademiya qurtarıb gəldim. Gələndən üç il sonra professor olub.

Fəttah kişinin külfəti müharibə vaxtı çox qıtlıq görübsə də, Əsəd qayıdandan bəri bir şeydən korluq çəkməyib. Sürəyyanın böyük bacısı Alyanı Əsədin cəbhə dostu Murtuz adında bir polkovnik alıb.

– Tahirə, ortancıl bacım institutdan bir oğlanla gəzirdi, həmin bu Cabbarla, bir qrupda oxuyublar, elə ona da getdi.

...Bir gün də görürəm anam məni çağırıb deyir, bala, bacıların getdi, səninçün də yol açıldı, bəs, səni Əsəd istəyir.

On doqquz yaşım vardı. APİ-də oxuyurdum. Sonra ki, Karmen oldu, institutdan çıxmalı oldum. Əsəd elə hey deyirdi ki, heç olmasa qiyabi oxu qurtar. Amma hardan? Cilda oldu. Başım elə qarışmadı ki... oxumaq yadıma düşsün. Eh, nə bilim, vallah!

Söhbətləri çox uzandı. Nemət birdən saata baxdı və ürəyi tupp elədi: birin yarısı idi. Heç vaxt bu evdə belə gec qalmamışdı. Ayağa durmaq istəyəndə birdən gözləri Sürəyyanın gözlərinə sataşdı. Necə olub bayaqdan bəri bunu görməyib? Sürəyyanın gözləri dolmuşdu. Yanaqlarına iki gilə yaş axmışdı. Nemət lap özünü itirdi. Nə etməyi, hansı sözlərlə ovutmağı, təsəlli verməyi bilmirdi. Karıxıb qalmışdı. Sürəyya onun bu təlaşını gördü, baftalı kiçik dəsmalını çıxarıb göz yaşlarını sildi, gülümsəməyə çalışaraq:

– Eybi yoxdur, – dedi, – mənə fikir vermə, keçər. Susdu və qəfilcən Nemətin heç gözləmədiyi sözləri əlavə etdi:

– Allah mənə bir oğul vermədi. – Nemət bu sözlərdə nə isə bayaqkı qəmli söhbətə bənzəməyən başqa bir həyəcan duydu, sövq-təbii bir hisslə bu həyəcanın xalını, çalarını anladı və özü də həyəcanlandı.

Elə həmin andaca Sürəyya alayavaş səslə:

– Elə istərdim ki, oğlum olsun, – dedi, – özü də heç olmasa bir az sənə oxşasın.

Nemətin ürəyi şiddətlə döyünməyə başladı. Qızardığını hiss etdi və bunu hiss etdiyindən, qızarmamağa cəhd göstərdiyindən və bacarmadığından daha da pörtdü.

Sürəyya onun üzünə baxırdı, əvvəl iki yanağından çıxan iki "qırmızı turpu", sonra bütün sifətini bürüyən rəngi görür və Nemətin halını başa düşürdü. O, mehriban və bir qədər şıltaq təbəssümlə əlini Nemətin saçlarına çəkdi. Həmin dəqiqədəcə Nemət əsəbi və kəskin hərəkətlə Sürəyyanın əlini qapıb cod öpüşlərlə aramsız öpməyə başladı. Abajur çayın rəngi kimi dibə çökdü. Tavan uzaqlaşdı, qaraldı, itdi. Bir an Nemət məkan hissini itirdi, ancaq bir fikir beynində titrəyib duruldu ki, Sürəyya əlini çəkmir. Və qəfil qərarla Nemət illərdən, aylardan bəri rütubətli daxmasında boğduğu çılğınlıqla Sürəyyanı qolları arasına aldı, bağrına basdı və tez-tez öpməyə başladı. Dodaqlarını axtardı. Sürəyyanın çovuyan, itən dodaqlarını axtardı, tapa bilmədi, göz qapaqlarından, alnından, çənəsindən, boynundan öpdü.

Nemətin iyirmi üç yaşı vardı və həyatında ilk dəfə barmaqlarında, dodaqlarında bəyaz qadın dərisinin hamarlığını duyurdu...

– İcazə verin.

Nemət başını qaldırıb ona tərəf əyilmiş kişini gördü. Siqareti damağından götürüb kişiyə uzatdı. Kişi siqareti papirosuna dirəyib sümürdü, yandırdı, "təşəkkür" deyib getdi, bağın içindən çıxdı, uzaqlaşdı.

Bir aydan sonra evləndilər. Sürəyya nə məharət işlətmişdisə, o gündən bəri Karmen də, Cilda da Neməti “ata” bilirdilər. Nemət də onları doğma övladı sayırdı.

57-ci ildə Sürəyyanın Nemətdən bir qızı da oldu. Sürəyyanın anası Bikə xala qızı Nemətə gedəndən bəri bir il idi onlarla küsü saxlayırdı. Sürəyyanın Nemətə getməsiylə heç cür barışa bilmirdi. “Ay virananın övladı, bizi el içində xar etdin. O cür kişinin arvadı, yaraşar ki, ərinin meyiti soyumamış belə dılğırın, uşaq-muşağın birinə getsin?! Əvvəl, səndən neçə yaş balacadır. Sonra lüt-üryanın biridir, o necə ailə saxlayacaq, özüvü, o böyründəki tifilləri necə dolandıracaq?” Bikə xala çox dedi, Sürəyya az eşitdi. Bikə xala da axırda qızının daşını atdı. Bir il qapısını açmadı.

Uşaq olandan sonra naəlac qalıb barışdı. Doğum evinə qızını görməyə gəldi. Nemətin də üzündən öpüb: “Qismət belə imiş, Allaha qurban olum, – dedi, – olacağa nə çarə! Yazılana pozu yoxdur!"

Sonra Nemətlə evə gəldi, biş-düş elədi. Karmenlə Cildanın pal-paltarını yudu. “Bizim soyumuz belədir, – dedi, – oğlan doğmuruq. İki bacı biz idik. Mənim üç qızım var. İndi Sürəyyanın da üçüncü qızı oldu”.

(İki aydan sonra Bikə xalanı birtəhər dilə gətirdilər. Evini satıb tamam Sürəyyagilə köçdü. Sürəyyaya kömək oldu. Yoxsa yazığın lap kələyi kəsilmişdi.)

Ata-ananın birgə istəyilə qızın adını Nərgiz qoydular. Yalnız metrikada adı yazdırıb evə qayıdarkən yolda Nemətin ağlına gəldi ki, yaxşı, axı “Nərgiz” də opera var. Deməli, qeyri-ixtiyari yazıq Əsəd kişinin ənənəsini davam etdiriblər. Amma Sürəyyaya bu barədə heç nə demədi.

Yenə də dayanaq tərəfdən ləhləyib yoxuşu çıxan avtobusun səsi eşidildi. Nemət nömrəsinə baxdı, durub dayanağa tərəf addımladı.

Adam seyrək idi. Pəncərənin yanında oturdu. Nemətin ardınca avtobusa qalxan çadralı qarı keçib onun qabağında əyləşdi.

Qarşıdan gələn trolleybusun “buynuzları” havada telindən çıxdı, yana əyildi. Sürücü yerə düşüb kəndiri çəkməyə başladı.

Nemətin başına qəribə bir fikir gəldi: “Trolleybus müəyyən marşrutla gedir. Yolundan çıxa bilməz. Bir balaca yolundan sapsa, “buynuzları” hava telindən çıxar. Trolleybus hərəkətsizləşib qalar. Tramvay da sabit, dəyişməz yol üzrə hərəkət edir. Relsindən çıxsa qəzadır.

Yaxşı, bəs bu minik, bax bu marşrut avtobusu adlanan salxaq araba niyə hər gün, hər saat eyni yolla gedir, hər gün bazarın, poçtun, bankın, kinonun, hamamın, dəlləkxananın qabağından keçir? Axı o, hansı yolla istəsə gedə bilər, hansı küçəyə kefi gəlsə burula bilər?! Ağzında "marşrutlu avtobus" deyirsən. Onun taleyi daha mürəkkəbdir. Trolleybus və tramvayın yolunu dəyişməsinə texniki əngəllər mane olur. Avtobus isə mənəvi qadağaların əsiridir. Onun qadağası daxildəndir, qəbul olunmuş qayda-qanunlardan, razılaşdırılmış, təsdiqlənmiş hərəkət cədvəlindən asılıdır. O, bu cədvəli, bu bir dəfə qəbul olunmuş qayda-qanunları poza bilməz, yolunu aza bilməz. Pozsa, azsa... Bəh, bəh, lap şeir çıxdı ki..."

Nemət düşündü ki, doğrudan da bu barədə fəlsəfi şeir yazmaq olardı. Adı da "Qiyam etmiş avtobus" və yaxud "Qiyamçı avtobus!"

On bir yaşında olanda Nemət şeir yazmışdı. Bircə son misraları yadındaydı:

Stalin rəhbərimizdir,
Qələbə də bizimdir.

Dayısına oxudu. Dayısı dedi ki, bala, sən niyə şeir yazırsan? Məşhur adam olmaq istəyirsən? Hə, onda bil ki, Əhməd Namazovun oğlu istəyir lap İlyas Nizami olsun, onu üzə çıxmağa qoymazlar. Şair olub daldeydə daldalanmaq nəyinə gərəkdir? Ondansa sal başını aşağı, dərsini oxu, bəlkə axırın bir yana çıxdı.

Amma Nemət bir müddət yenə yazdı. On üç-on dörd yaşınacan. Xəlvət yazdı, heç kəsə göstərmədi.

Dadaş:

– Yerin məlum, – dedi, – bu saat sporumuz düşmüşdü.

Nemət:

– Hər vaxtınız xeyir, – dedi, – nədən spor eləyirdiniz ki?

Qapının yanında oturmuş cürübbəz Yəhya cır səslə çığırdı:

– Dadaş müəllimlə mərc çəkmişəm ki, sabah Xusainov oynamayacaq.

Nemət dinib-danışmadan "Futbol" qəzetinin bir nüsxəsini Dadaşın masasının üstünə qoydu.

– Burda komandaların tərkibini veriblər, – dedi.

Dərhal bütün otaqdakılar fırtınanın əydiyi gəminin göyərtəsindəymişlər kimi bir tərəfə – Dadaşın masası tərəfə axışdılar.

Dadaş bir qədər suçlu hərəkətlə qəzeti açdı.

– Hanı?

Nemət yerini tapdı:

– Budey.

– Aha, Kavazaşvili, Voronin...

İri gövdəli kişi quş kimi yerində atıldı:

– Budur bax, Xusainov, hə, gördün, yaxşı bax, hə, nədən mərc çəkmişdik? – Kişinin sevinci yerə-göyə sığmırdı. Onun fərəhi, səs-küyü otağı qüdrətli radiostansiya efiri dolduran kimi doldurmuşdu. – Əşi, sən yəni belə ağız bəhəm eləmisən ki, mənimlə futboldan mərc çəkirsən?

Otaqda bir mərəkə, bir səs-küy qopdu, gəl görəsən. Dadaşın qələbəsi bütün şöbənin təntənəsinə çevrildi. Yəhya elə bil bir az da cürübbəzləşdi, büzüşdü. Burnunun altında mızıldanmağa başladı. Dadaşın səsi gur-gur guruldayırdı.

– Əşi, deyirəm iki oyundu onu buraxmırlar, sabahkı görüşə saxlayırlar, deyir yox, xəstədir, ayağı zədələnib. Əşi, mən bilirəm axı...

Qurban:

– Gərək interesə mərc çəkəydiniz, – dedi.

Cümşüd:

– Hə, düz deyir, interessiz ləzzəti yoxdur, – dedi.

Şöbələrində altı iş stolu qoyulmuşdu. Stollardan birinin açıq tərəfi qəzetlərlə örtülmüşdü. Bu, Təhminənin stolu idi. Şöbənin qalan işçiləri kişilərdi. Qurbandan başqa hamısı futbol cəfakeşi idi. Təhminənin də əri Manaf cəfakeş idi. Manaf futbola da Dadaşgillə gedərdi, stadionda abonement yerləri yan-yana idi. 16-cı sektor, 31-ci sıra. Dalbadal: Dadaş, Nemət, Manaf, Yəhya, Cümşüd.

İndi Nemətə qəribə gəlirdi ki, nəşriyyata işə girməzdən əvvəl, o, futbol azarkeşi deyildi. Uşaqlıqda özü dalanlarında çox oynamışdı, amma böyüyəndən sonra biganələşmişdi, ildə, ayda bir dəfə futbola ya gedəydi, ya getməyəydi. Dadaş başda olmaqla şöbələrinin futbol azarı ona da yoluxdu. İndi o da ən aktiv cəfakeşlərdən olmuşdu. İndi özü də başa düşə bilmirdi ki, bir vaxtlar futbol kimi bir gözəlliyə necə biganə qala bilirmiş? İndi oyunun öz ləzzətindən başqa, onun bütün dəm-dəsgahı da Nemətə xüsusi zövq verirdi: hələ çox erkən, yaz aylarından abonement tədarükü, sonra futbol mövsümünün təntənəli açılışı, futbol günləri boşalmış küçələrdən stadiona axışan adamların nəqliyyat rəqabəti və nəqliyyat həmrəyliyi, stadion radiosuyla verilən pozuq

melodiyalar (bunun da öz ləzzəti var)... Minlərlə adamın saat kimi dəqiq bir ritmlə tum çırtlaması, avarçı qolları kimi qalxıb-düşən əllər, xeyrimizə vurulan topların müştərək sevinci, məğlubiyyətlərin müştərək kədəri.

Hələ oyundan qabaq stadionda dost-aşnayla birlikdə, sırf kişi "kampaniyasında" subayvarı pivələmə... (istər meydançada, istər tribunalarda, istərsə də, ümumiyyətlə, futbol aləmində zənən tayfasının olmaması da az məziyyət deyil. Heç olmasa stadionda saat yarım adamın qulağı dinc olur.)

"Bu zəhər tuluğu Qurban pul qırpmaqdan başqa dünyada heç nəylə maraqlanmır. Hələ bizə də rişxənd eləyib deyir ki, siz ürəkdə heç biriniz futbol cəfakeşi-zad deyilsiz. Elə-belə boynunuza düşüb. Bütün bu marağınız, ehtiraslarınız da saxtadır, deyir. Axmaq adam, bəs nə bizi məcbur edir ki, bu futbol zəhrimarın yolunda bu qədər can qoyaq? Maraqlanmasaq, yanmasaq, nə düşüb axı bizə, işimizi-gücümüzü atıb cumaq stadiona, radioya qulaq asaq, yüz minnətlə qəzet tapaq? Deyirəm, görürsən başını bulayır, cavab verməyə söz tapmır, axı nə cavab verəcək? Gah da görürsən deyir ki, bircə Dadaş əsil "bolelşikdir", siz hamınız ona yarınmaq üçün futbolbaz olmusuz. Axmaq adam. Belə səfeh fikir elə onun başına gələr. Gah da deyir ki, vaxtınızı bilmirsiniz nəynən doldurasınız, onunçün, deyir, cəfakeş olmusuz. Həyatınızda, deyir, vakuum var, futbolla doldurursunuz bu vakuumu. Futbol, deyir, tiryək kimi, nəşə kimi şeydir. Başı qatıb, gündəlik həyatı unutmaq üçündür. Əşi, qoy danışsın da, əbləh adamdır, zoğallayır özüyçün, kimdir onun ağzına baxan..." Cümşüd:

– Dadaş müəllim, – dedi, – siz futbolun cikini də bilirsiniz, bikini də. Sizcə, biri gün hesab necə olar?

Bir həftə idi ki, bütün şöbə birigünkü oyunun intizarıyla yaşayırdı. Bu oyunun şöləsi bütün idarə və ev söhbətlərinin, işin və məişətin üstünə çökmüşdü. Bir sözlə, bu həftəni İrlandiyayla oyun doldurmuşdu. Gələn həftə də vacib oyun vardı: Tiflislə Moskva "Torpedo"su. Gələn həftəni bu oyun dolduracaqdı. Ancaq birigünkü oyun keçməyincə, o biri oyun haqqında danışan yox idi. Həmin günü, ümumiyyətlə, böyük futbol günlərini bir təntənə, bayram, yeni il kimi, toy-büsat kimi gözləyirdilər.

Dadaş qəti bir səslə:

– 3:0, – dedi.

Cümşüd:

– Gör e! 3:0 – deyə təəccübləndi. O bunu elə dedi ki, guya artıq bu fərziyyə doğrulmuşdu. İrlandiya 3:0 hesabıyla uduzmuşdu. – Amma İrlandiya da güclü komanda idi ha! – Dadaşın fərziyyəsindən sonra Cümşüd birigünkü oyun haqqında keçmiş zamanda danışırdı.

Yəhya:

– Heç vaxt, – dedi. – Ni za çto! Hesab iki-iki olacaq. Gəlin mərc çəkək.

Dadaş:

– Sən yenə mənimlə mərc çəkirsən? – dedi. – Bayaqkı dərs olmadı?

Yəhya tərs idi:

– Yox, görərsiniz! İki-iki.

Yenidən mübahisə qopdu. Ağız deyəni qulaq eşitmirdi. Bayaqkı kimi "Futbol" qəzetini masanın üstünə qoyub məsələni ayırd etmək də mümkün deyildi.

– Keçən səfər mən deyən oldu, yox?

– Yox, sən demişdin birinci taymda iki top vuracaqlar, amma...

Nemət başa düşdü ki, bu fısqırıqda məsələni qaldırmağın yeri deyil. Kirimişcə otaqdan çıxdı.

Dəhlizin başında, açıq pəncərənin qabağında Təhminə və Zaur söhbət edirdilər. Zaur pıçıltıyla nə isə deyirdi. Təhminə şaqqanaq çəkib gülürdü. Onun qəribə gülüşü vardı. Ha, ha, ha... Elə bil pianoda qamma çalınır. Yaxud motosikl uzaqlaşıb gedir...

Zaur özü gülmürdü. Yəqin, Təhminə gülən müddətdə düşünüb, yada salıb başqa bir zarafat, ya məzəli söz hazırlayırdı. Gözləriylə də Təhminəni yeyirdi.

Zaur başqa şöbədə işləyirdi. Hər dəfə onu görəndə Nemətin ağlına nədənsə "qoltuğuna qarpız veriblər" ifadəsi gəlirdi. Ancaq məcazi yox, hərfi mənasında. Elə bil Zaurun hər iki qoltuğunda görünməz iri qarpızlar vardı, ona görə əzələli qolları gövdəsindən belə dairəvi şəkildə aralı qalmışdı.

Axır vaxtlar Zaurla Təhminəni tez-tez söhbət edən görəndə Nemətin başına başqa qəribə bir fikir də gəlirdi. Ona elə gəlirdi ki, Zaurun ən böyük istəyi Təhminəylə plyaja getməkdir. Axı, niyə məhz plyaja? Bəlkə də bu fikir ondan doğmuşdu ki, Zaurun şəxsi maşını vardı, tez-tez plyaja gedirdi. Bəlkə də onun Təhminəyə "kor-kor, gör-

gör" belə iştahla baxması Neməti bu qənaətə gətirmişdi. Hər halda plyaj Zaurun əzələlərini nümayiş etdirməsi üçün münasib yer idi.

Nemət onlara yanaşdı:

– Zaur, belə olmaz ha, – dedi. – Bax, Manafa deyəcəyəm. – Manaf Təhminənin əri idi. Bir ay idi Moskvadaydı, ezamiyyətdə. – Sən ştangistsən, amma o da köhnə pəhləvandır.

– Çəkimiz düz gəlməz. Mən ağır çəkiliyəm, o yüngül.

– Ay qız, doğrudan ərin yüngüldür?

Təhminə güldü. Əlbəttə, bayaqkı kimi gülmədi. Xəfifcə gülümsündü. Nemətin zarafatı ortalıqda qalmasın deyə güldü. Nemət özü də bilirdi ki, zarafatı bəzi qəzetlərdə dərc olunan bayram şarjları, dostluq şarjları kimi duzsuzdur. Amma "ər-arvad" mövzusunda sataşmalar şöbələrinin klassik yumoru idi.

Birdən Nemətin gözü Təhminənin paltarına sataşdı. İki düyməsi açıq idi və oradan mavi alt paltarı görünürdü.

Nemət fikirləşdi ki, bu mavi ərazi tamam başqa bir dünyadır – paltarın altındakı Təhminə, paltarsız Təhminə. Bir də onu fikirləşdi ki, bu ərazi onunçün əbədiyyən yasaq ərazidir. Bəlkə Dadaşın ora vizası var. Zauru da bilmirəm, deyə bilmərəm, amma mən heç vaxt, ömrümdə heç vaxt bu əraziyə keçə bilməyəcəyəm. Yalnız onun bir qarışını – iki açıq düyməlik maviliyini görə bilərəm.

Gözünü çəkdi.

Təhminə:

– Zaura yuxumu danışırdım, – dedi. – Yuxuda Riqanı görmüşəm. Ən qəribəsi odur ki, ömrümdə Riqada olmamışam.

Mavi ərazi yenə Nemətin gözünə doldu və o dedi:

– Bir vaxtlar mən də yuxumda heç bir zaman olmadığım şəhərləri görərdim... nə bilim, London, Paris... – o, pəncərəyə baxdı. Pəncərəyə səmanın mavisi dolmuşdu. – Ümumiyyətlə, pis vərdiş deyil. Otağından çıxmırsan, yatağından durmursan, pulsuz-pənəsiz bütün dünyanı gəzirsən. Bilet də lazım deyil, viza da.

"Viza" sözünü qəsdən işlətdi. Bayaqkı fikrini yada salıb özüyçün işlətdi.

– Bəs, indi nə görürsən?

– Eh, ay Təhminə, indi yuxularımın bütün fantaziyası qaçıb. İndi yuxu görmürəm, həyatdan parçalar, fraqmentlər görürəm. Gündüzkü həyatımın davamını görürəm. Məsələn, gündüz yarım list tərcümə

eləmişəmsə, yuxuda dalını tərcümə edirəm, qonorarını da alıram, ya, da mağazada növbədə dayanıram, kimsə növbəsiz almaq istəyir, onu məzəmmət eləyirəm, ya da bazarda çənə-boğaz oluram. Ən böyük fantaziyam o olur ki, Kislovodsk-Bakı qatarına bilet alıram. Ya da idarəmizi görürəm. İşçiləri – Səfdər dayını, Məmməd Nəsiri, Dadaş müəllimi, Qurbanı – əlavə etmək istədi "səni" ancaq Zaura baxıb demədi.

Zaur açıq-aşkar əsəbiləşirdi. Nemətin gəlib söhbətlərinə qarışması, Təhminənin diqqətini yayındırması onu heç açmırdı. Zaur:

– Mən heç vaxt yuxu görmürəm, – dedi, – hələ ömrümdə bir dəfə də görməmişəm.

Təhminə:

– Sən nə danışırsan? Ola bilməz! Heç vaxt inanmaram,– dedi.

– Canımçün düz deyirəm. Heç bilmirəm yuxu görmək nəyə deyirlər, nə deyən şeydir.

Zaur çox cavan idi, lap uşaq idi və Nemət başa düşürdü ki, bu qəribə, lakin yüz faiz uydurma iddiayla o, yalnız yenidən Təhminənin diqqətini, marağını özünə qaytarmaq istəyir.

Nemət:

– Mənim bir dostum vardı, – dedi, – deyərdi ki, yuxu görməyən adamlar Avstriyaya, İsveçrəyə bənzəyirlər.

Təhminə suallı baxışlarla Nemətə baxdı. Yenə də onu təəccübləndirən, marağını cəlb edən Nemət olmuşdu. Zaur bir qədər kəskin tonla:

– Niyə məhz Avstriya, İsveçrə, məsələn, Kamboca yox? – dedi.

– Kamboca? – deyə Nemət təkrar etdi və xəyalında xəritəni canlandırmağa çalışdı. – Yadımda deyil Kamboca dənizin sahilindədir, ya yox. O, Avstriya və İsveçrə deyirdi, çünki bu ölkələrin dənizə çıxışı yoxdur. O deyirdi ki, yuxu görməkdən məhrum adamlar dənizdən məhrum ölkələr kimidir. Avstriya, İsveçrə, daha hansı ölkələr dənizsizdir?

Təhminənin təəccübü açıldı:

– Aaa, o mənada...

Sükut çökdü, Zaur cibindən daraq çıxarıb, bir qədər əsəbi hərəkətlə saçlarını daramağa başladı. Nemət:

– Yaxşı, – dedi, – bağışlayın, söhbətinizə mane oldum.

– "Görəsən bütün günü belə gəzəcək, düymələrini düymələməyəcək?" – deyə düşündü və bir neçə addım aralanandan sonra özünü saxlaya bilmədi, dönüb bir də Təhminəyə baxdı:

– İşdi şayət təsadüfən yuxumda Riqaya düşsəm, mütləq səni axtarıb taparam, – dedi.

Dişləri narın, tən-bərabər, qarğıdalı dənələri...

Nemət otağa girdi. Futbol ehtirasları sinsiyib hamının içinə çökmüşdü. Başlarını aşağı salmışdılar, hərə öz işiylə məşğul idi. Deyəsən, Dadaş dünənki söhbətdən heç söz salmaq fikrində deyildi.

"Üzümə salım, deyim. Yox. Yaxşı düşməz". Ancaq deməsəm də, özünün yadına düşən deyil. Bəlkə bir bəhanə tapıb deyim. Məsələn, "bu gün gedəcəm dublyajın pulunu almağa, deyirdim sizə, "Jivıye i mertvıye". Yaxud "dünən şkafa baxdım, tapa bilmədim, bizdə burda yoxdur ki, o roman?" Yox, bu bicliklərin köhnə pulnan qiyməti beş qəpikdir. Dadaş qazdan ayıqdır. Ya bəlkə belə deyim: "Dünən oturub başladım bir az romandan tərcümə etməyə, pis getmir". Yox, bu da yaramaz. Deyər başlamısan, əcəb eləmisən, qurtar gətir, plana salaq... "Əşi, nə götür-qoy edirəm?".

– Dadaş müəllim, – dedi, – dünən müqavilə haqqında danışmışdıq, yadınızda?

Nemət duydu ki, otaqdakılar qulaqlarını şəklədilər.

Dadaş başını qaldırdı:

– Hə, hə, əlbəttə, yadımdadır. Yəhya, zəhmət çək, Təhminəni çağır, bir müqavilə doldursun.

Təhminə otağa girdi. Düymələri bağlanmışdı. Görəsən, Zaur deyib? Siyirtməsindən müqavilə çıxarıb doldurmağa başladı. Atanın adı, ünvanı...

– Dadaş müəllim, neçədən bağlayırsınız?

Bir an səssizlik çökdü. Guya Qurban da, Yəhya da, Cümşüd də öz işləriylə məşğul idilər. Amma Nemət bilirdi ki, üçünün də qulağı darı dənləyir.

Nemət düşünürdü: "Lap aşağısı 60, yuxarısı 150. Bunlar heç, indi, görəsən həştad olacaq, yüz, ya yüz iyirmi?".

Dadaş:

– Yüz iyirmi, – dedi, – sanballı işdir.

Təhminə yazdı.

– Qol çək.

Nemət qol çəkdi. Dadaş da qol çəkdi.

– Bay, 120 yazmısan ki... – dedi, – bəs mən 100 dedim. Gülüşdülər. Bu da şöbə yumoru qəbilindən idi. Dadaş:

– Daha keçib, qol çəkdik, – dedi, – babalı Təhminənin boynuna. Yazılana pozu yoxdur.

Dadaş: “Yazılana pozu yoxdur” deyəndə səhərki xatirə – Bikə xalanın doğum evində dediyi sözlər ani bir qığılcım kimi Nemətin fikrində alışıb söndü.

Nemət:

– Çox sağ olun, – dedi. – Artıq dərəcədə minnətdaram.

– Beh haqqında ərizəni də yaz, aparım müdir ikisinə bir yerdə qol çəksin.

...Dadaş kağızları götürüb otaqdan çıxdı.

Yəhya başını qaldırıb:

– Sən çaldın, – dedi.

Nemət:

– Yetim əlində qoğal əcaib? – dedi.

Cümşüd:

– Ayəndə düşər şənbəyə novruz, – dedi.

Qurban heç nə demədi. Qaşqabağı yernən gedirdi. Nemət bilirdi ki, içini gəmirir.

Dadaş qayıtdı:

– Hə, indi get Səfdərə təzimə.

Səfdər dayı baş mühasib idi.

– Yox, yox, indi pulumuz yoxdur. Qəpik də.

Hələ idarənin tarixində elə hadisə olmamışdı ki, Səfdər bir adama gələn kimi əlüstü pul versin.

– Bəs, haçan olacaq?

– On gündən sonra.

Amma Səfdər dayının bir məziyyəti var idi. On gündən sonra deyirdisə, düz on gündən sonra arxayın gedib pulunu ala bilərsən. Sözünün ağası idi. Dadaş, Səfdər dayı, bir də Məmməd Nəsir bu idarənin ən köhnə işçiləri idi.

– Bilirsən ki, olsaydı, sənə yox deməzdim. Bayaq Dadaş gəlmişdi. Alacağı var. Birisi gün Riqaya gedir. Dedim yoxdur. Dalınca göndərərəm.

“Deməli, Dadaş birisi gün gedir. Bu nə pis oldu”.

Nemət çoxdan nərddə Dadaşa bir düşbərə-qutab uduzmuşdu. Özü də əhvalat yay məzuniyyətinəcən olmalıydı. İndi bir sabahkı gün qalırdı. Çatdırmaq olardı. Amma bir az yaxşı düşmürdü. Müqavilə-

filan... Elə çıxırdı ki, əvəz-əvəzdi, xəcalətdən çıxır. Yox, əlbəttə, Dadaş onu tanıyır, xasiyyətinə bələddir. Bilir ki, elə adamlardan deyil. Ancaq işçilərdən elə düşünənləri olacaq. Elə biri bu Qurban... "Gördün, lələ, öyrən, bacarana can qurban. Eh dünya, məlik dünya, təpəsi dəlik dünya!" və sair folklor yaradıcılığı... hər halda Dadaşa təklikdə demək lazımdır. Xəbərləri olmasın. Ancaq əvvəl "baş vəkillə" razılaşdırmaq lazımdır. Dəhlizdən evə zəng elədi. Mətləbi Sürəyyaya açdı.

– Özün bilirsən də, – dedi, – lazımdır.

Bir müddət qulaq asdı.

– Əti özüm tapacam, – dedi, – səhər tezdən gedərəm. Hər nə lazımdır alaram. Yox, heç kəs, bir Dadaş olacaq, bir də Murtuzgilə deyərik. Tahirəgilə. Vəssalam.

Dadaşa dəhlizdə yanaşdı, dedi.

– Əşi, bu nə zəhmətdir, nə xəcalətdir, qoy qalsın payıza.

"Görürsən, müqavilə, nə bilim, əvəz-əvəz məsələsini heç ağlına da gətirmir".

– Yox, canımçün, çoxdan hazırlıq görmüşük. İntəhası bilmirdim ki, biri gün gedirsiniz. Odur ki, belə bir az gec deyirəm.

– Uşaqlara demisən?

Nemət bir an tutulan kimi oldu.

– Yox, deyirəm, elə özümüz oturaq, necə deyərlər, xudmani, çünki bilirsiz, – dolaşıb səbəb tapmağa çalışdı. Dadaş dərhal onun imdadına çatdı.

– Aa, nə olar, lap yaxşı, deməli, sabah üçdə.

Nemət otaqlarına girib papağını götürdü,

– Mənim bir balaca işim var gedirəm. Xudahafiz.

Pilləkənlə düşəndə kimsə qəfilcən onun qolundan yapışdı. Nemət diksinib dayandı. Məmməd Nəsir idi.

– Ay səni xoş gördük.

– Salam, salam, Məmməd Nəsir.

Otuz beş il bundan qabaq Dadaş, Səfdər, Məmməd Nəsir bu idarəyə bir vaxtda işə giriblər. İdarədə yaşından asılı olmayaraq hamı Dadaşa Dadaş müəllim, Səfdərə Səfdər dayı deyərdi. Məmməd Nəsiri isə cavan da, qoca da, uşaq da, böyük də adıyla çağırırdı. Bu üçündən başqa bütün ayrı işçilər idarəyə çox-çox sonralar gəlib. Otuz beş il bundan qabaqkı idarə folklorunu:

“Ay Dadaş, başına daş,
Tərpənmə belə yavaş” –

misralarını da orta və gənc nəslə elə Məmməd Nəsir çatdırıb. İndi də Nemətin qulağına əyilib: “Yenə onun şöbəsindəsən?” – deyə xəbər aldı və simayi-şəms üstündə xısın-xısın oxudu:

Ay Dadaş, başına daş...

Nemət bildi ki, yenə dəmdir. Məmməd Nəsirin həyatda iki ehtirası vardı: nərd atmaq və vurmaq. İçəndə başqa aləm idi.

Məmməd Nəsir beli bükülmüş, saçları seyrəkləşmiş ortaboylu arğaz bir kişi idi. Qəribə yazıq təbəssümü vardı. Elə bil icazəylə gülümsünürdü. Həm də böyük məşəqqətlə gülümsəməyə icazə almışdı. Elə bil yerimək, oturmaq, yaşamaq icazəsini də böyük çətinlik və yalvar-yaxardan sonra almışdı. Həm də müvəqqəti almışdı.

Köynəyinin yaxası həmişə çirkdən qartmaq bağlayırdı. Ayıq vaxtlarında savadlı korrektor idi. Bütün aldığını içkiyə verirdi. Arvaddan, oğul-uşaqdan da heç kəsi yox idi. Özü deyərdi ki, bir həsirəm, bir də Məmməd Nəsir.

Onu idarədə Dadaş saxlatdırırdı. Dadaş olmasaydı, yəqin, içməyin ucbatından çoxdan qovulmuşdu. Bir vaxtlar, 30-35 il bundan qabaq bərk dost imişlər. Can bir qəlb. İndi bu dostluqdan əsər-əlamət qalmamışdı. Amma hər halda Dadaş həmişə onu müdafiə edirdi: “İşiniz yoxdur, dəyməyin, yola verin getsin, bədbəxt adamdır”.

Məmməd Nəsirdən ucuz şirin çaxır iyi gəlirdi.

– Ömər Xəyyam deyir ki:

Bər xaki fikəndi meyi qulqun məra
Xakəm bədəhən məgər to məsti rəbbi!

Yəni mən içmişəm, ay fələk, sən nöş piyansan? Farsların yaxşı bir sözü var: rus demişkən, aslan yest aslan. Bir həsirəm, bir Məmməd Nəsir. Bir gün mənəm, Hüseyn Sərrafdır, bir də Səlim Şeyda vardı, şair-qəzəlxan idi, şair deyirəm e sənə, indikilərdən yox, əsil şair, görürsən, dayanıb səninlə danışır, birdən susur, gedir özünə, fikirləşir, bəli, bir az keçir, bir qəzəl! Nədi, təbi gəlib, elə bil ağzından dürr tökür.

Bülbülü Şeydanın halın sorma nasehdən, fəqir,
Hər tikəndə qanı vardır, könlünü güldən soruş.

Hə, onu deyirəm axı, həmin bu Səlim Şeydadır, mənəm, bir də Sərraf, mömin kişilərdən biri idi. Gündüz mollalıq edirdi, axşamlar Əsli Kərəm oxuyurdu. Hə, üçümüzük – Məmməd Nəsir əlini boğazına çəkdi, – bax bura qədər içmişik, nuş olmuşuq. Amma indi gərək paxmellənək. Di gəl bir qara qəpik pulumuz qalmayıb. Bir də gördük Sisyanov küçəsiylə Bandelninin tinindən Əhməd Fani gəlir. Getdik tutduq onu, dedik bəs Mirzə, sən bilirsən ki, biz sənin dostunuq. Dedi, bəli, bilirəm. Niyə də bilməyim, axı? Dedim: bəs bilirsən ki, biz ölmüşük. Dedi: xeyr. Bunu bilmirdim, çünki bu gün hələ qəzetlərə baxmamışam. Yəqin, nekroloqdan-zaddan çıxmamış olmaz. Dedim: bəs, qəzeti görsən inanarsan? Dedi: bəli, inanaram, Dedim: Hüseyn Sərraf, cum bir qəzet al. Dedi: köhnəsini, təzəsini? Dedim: hansından tapsan. Bəli, aldı gətirdi. Dedim sər bura. Sərdi Əhməd Faninin ayağının altına. Dedim: bəs, Mirzə, üçümüz burda uzanıb qalsaq, inanarsan ki, ölmüşük? Dedi: bəli, indi inandım. Çıxartdı bir qızıl Nikolay onluğu verdi. Onluq deyirəm sənə, onluq, qızıl onluq... Bəli, getdik, bir həftə kefin istəyən içdik. Bir-birimizi səhər tapdıq, axşam itirdik. İndi pulumuz qurtarıb, gərək paxmel olaq. Neyləyək? Üçümüzük. Mənəm, Səlim Şeydadır, bir də Hüseyn Sərraf. Gedirik Tarqovıynan...

Nemət gördü ki, canını asanlıqla qurtaran deyil.

– Məmməd Nəsir, – dedi, – de görüm Krasnovodska haçan gedirik e?

Məmməd Nəsir bir an söhbətinə ara verdi. Nemətin sözlərini dərk etmək istədi. Döyükdü. Sonra birdən başa düşdü.

– Krasnovodska? Hə, hə, bildim. Haçan istəyirsən. Sənin könlün haçan istəsə, Məmməd Nəsir qulluğunda hazır.

Nemət bura təzə işə girəndə bir gün Məmməd Nəsir onu tutdu ki, gəl minək gəmiyə gedək Krasnovodska.

Nemət təəccübləndi.

– Krasnovodskda nə var?

– Heç nə. Elə-belə. İndi şənbədir. Minək gəmiyə gedək. Çaxır götürək, bala-bala vuraq özümüzçün. Dənizin seyrinə dalaq, külək də bala-bala üzümüzə vursun. Düşək Krasnovodskda bir yaxşı xudmani yer tapaq. Oturaq bir balaca vuraq. Sonra yenə minək gəmiyə, bala-bala vura-vura qayıdaq geri. Səhər də beçə xoruz kimi çıxaq işə. Necədir səninçün?

Nemət:

– Yox, – dedi, – bu işdə bir məna görmürəm.

Məmməd Nəsir kəhrəba təsbehini pencəyinin sürtülmüş qoluna keçirtdi:

– Oğul, – dedi, – hər şeydə bir məna olsaydı, həyatın bir mənası olmazdı.

Çıxıb getdi. Sonralar işçilər Nemətə dedilər ki, Məmməd Nəsir bu təklifi hamıya eləyir. İndiyəcən heç kəs də razı olmayıb.

"Krasnovodsk! Barı bir səfalı yer ola. Deyirlər, nə su var, nə də bir kölgəlik".

Məmməd Nəsirin dumanlı yorğun gözlərində nə isə bir həvəs qığılcımı oyandı:

– Bu gün şənbədir, verək özümüzü sübh obaşdannan. Mən bu gün özümə əməlli maya qoymuşam. Amma səniynən yenə içərəm.

– Gələn şənbə, Məmməd Nəsir. Allah qoysa, gələn şənbə mütləq gedərik.

– Eh, – deyə Məmməd Nəsir əlini yelləyib getdi. Nə qədər sərxoş olsa da, başa düşdü ki, nisyə söhbətdir.

İdarənin çöl qapısının ağzında anqutboğaz bir oğlan Nemətə müraciət etdi:

– Nəşriyyat buradır?

Nemət bu oğlanı ilk dəfə görürdü. Qoltuğunda iri bir qovluq vardı.

– Sizə kim lazımdır?

Oğlan boğazını arıtladı.

– Mənə, – deyə kəkələdi, – burda kitablara kim baxır?

– Kitablara?

– Hə, kitab çap eləmək işinə.

Nemət: "Yəqin, cavan yazıçıdır, aman Allah" – deyə düşündü.

– Kitab yazmısan?

– Bəli.

– Nədəndir?

– Bizim müasir cəmiyyətin həyatından.

– Hekayədir, romandır, poemadır?

– Hamısı var. Hekayə də, şeir də. Altı ildir yazıram. Apardım jurnala, dedilər nəşriyyata aparsan yaxşıdır. Birbaşa kitabın çıxar. Dedilər, onlar belə şeylər axtarırlar.

Bir an içində kinolent kimi səhnələr Nemətin gözü qarşısından keçdi. Bu nataraz gəncin ömrünün epizodları: oxuduğu kitablar, izlədiyi mətbuat, yazmaq meyili, qaraladığı səhifələr. Müxtəlif redaksiyaların daş qapıları. Qarşılarındakı adamın cızmaqaraçı olduğunu təyin edən, şəbədə üçün obyekt axtaran bəzi redaksiya işçilərinin nabələd adamçün aydın olmayan dolamaq priyomları. Nəzakət pərdəsiylə örtülmüş istehza, rişxənd, lağ. Yaxa qurtarmağın yetmiş iki müxtəlif fəndi. Sanki bütün bunları Nemət öz gözüylə görmüşdü. Daha doğrusu, görmüşdü də.

Bu və buna bənzər yüzlərcə hədər həvəs...

Bütün bunlar Nemətə nə qədər tanış idi! Öz başına gəlməmişdisə də, onda elə bir duyğu vardı ki, guya bütün bu işlərdən özü keçib. Hər halda, o bu gəncə nə qədər acı və kədərli, mütləq lazımlı söz deyə bilər, həyat dərsi verə bilərdi.

Birdən-birə Nemət istədi ki, qayıdıb Məmməd Nəsiri, məhz Məmməd Nəsiri, ayrı adamı yox, tapsın, bu gənci də götürsün, gedib xudmani yerdə otursunlar, bala-bala içsinlər, içib səmimi olsunlar, bala-bala söhbət eləsinlər, ürəklərini boşaltsınlar, çünki Məmməd Nəsir demişkən, qarnını doldurmasan, ürəyini boşalda bilməzsən. Düz deyir. Ayıq vaxtı ürəyinin dibində pas atıb qalanları, çürüyüb ürəyində itənləri üzə çıxarıb özgəsinə açmaq olmur. Onlar da qalır, kif atır, çürüyüb ürəyini də çürüdür, ömrünü də.

İçəndən sonra Nemət bu anqutboğaz, bu yöndəmsiz geyinmiş oğlana deyərdi ki, bala, mənə qulaq as. İnan, hələ gec deyil. Mənim dayım, Allah ona rəhmət eləsin, Allah bütün ölənlərinizə rəhmət eləsin, mənim dayım demişkən, İlyas Nizami deyilsənsə, vaz keç, boşla, girişmə bu işə. Özüvə peşə seç. Texniki peşə olsa daha yaxşı. Yazıqsan, bala. Sonra başına döyəcəksən, gec olacaq. Bunun axırı yoxdur. Sənin kimi yüzlərcə, minlərcə gənc bax bu saat, sənin yazdığını, lap elə sənin yazdığın kimi, ya bir az ayrı cür, heç təfavütü yoxdur, bir az daha yaxşı, ya daha pis, daha savadlı, ya daha bisavad, hə, sənin yazdıqlarını onlar da yazır. Hələ gec deyil, cavansan. Ömrün qabaqdadır. At bu işin daşını. Əlbəttə, əgər İlyas Nizami deyilsənsə! Yox, bəlkə İlyas Nizamisən? Hə, onda başqa məsələ. Bəlkə elə doğrudan İlyas Nizami oldun. Kim bilir?

Nemət:

– Çıx üçüncü mərtəbəyə, – dedi, – on birinci otaq.

Nəşriyyatdan çıxıb studiyaya tərəf getdi. Meydançadan keçəndə gördü ki, on bir-on iki yaşında uşaqlar futbol oynamağa hazırlaşırlar. Ayaq saxladı. Dayanıb onları izləməyə başladı.

İçlərində ikisi lap balaca idi. Yeddi-səkkiz yaşında. Yəqin, onları qapıçı qoyacaqlar. Həmişə uşaqlar ən balacaları, ən zəifləri qapıçı təyin edirlər.

Oğlanlardan biri daş qoydu – ştanqa! Bir neçə addım saydı, ikinci daşı qoydu. Bu bir qapı! Sonra gedib eyni üsulla ikinci qapını düzəltdilər.

Doğrudan da balacaları qapıçı qoydular. İki dəstəyə bölündülər. Üç-üç. Bir nəfər artıq idi.

– Sən sudya!

"Sudya" cığallığa başladı.

– Özün ol sudya. Mən istəmirəm. Mən oynamaq istəyirəm.

– Yaxşı, indi sən ol. Üç qoldan sonra mən olaram, sən oynayarsan.

Razılaşdılar. Kapitan yerdən çöp götürüb yumruğunda gizlətdi. O biri komandanın kapitanı tapdı.

Oyun başlandı.

Nemətin öz uşaqlığı yadına düşdü. O qədər bax lap bu cür futbol oynayıb ki... Küçə futbolunun ənənələri, texnikası, qanunları dəyişməzdir. 25 il bundan qabaq da hər şey beləcə idi. Daş ştanqalar. Balaca qapıçılar. Vaxt yox, qol hesabı oyun. Qolların cığallanması. "Yox, yan getdi", ya da "hündürdən getdi, ştanqanın üstündən" – hər şey, eynilə olduğu kimi qalmışdı.

– Tofiq, ver mənə! Özün çıx. Ala, Nazim!

– Ruka! Ruka! – deyə qışqırışdılar.

Əli topa toxunmuş oğlan küçə futbolunun əfsanəvi qanununa isnad etdi. "Prijataya ruka" – dedi. Mübahisə başlandı. Birdən kiminsə ağlına gəldi ki, hakimin də bir rolu ola bilər, hakim amiranə bir səslə:

– Pinal, – dedi. Nəhayət, o da bir anlıq xəlifə olmuşdu. Cərimənin səbəbkarı bir kəlmə də kəsmədi. Dinməzcə penalti yerini təyin etməyə başladı: qapıdan addımladı. "İndi gör necə addımlayacaq!" Doğrudan da addımlarını elə iri atırdı ki, qorxurdun bağanağı aralı qalsın.

Belə saya-saya onuncu addımda gəlib rəqibin qapısına çıxdı. Özü də başa düşdü ki, deyəsən çox ağ eləyib. Sonuncu addımını bir az qısa etdi.

– Bax, buradır, – dedi, – vurun!

Bayaqdan bəri dinməz-söyləməz ona tamaşa edən rəqib komandanın kapitanı:

– Ala! – dedi və özü saymağa başladı.

"İndi gör bu necə sayacaq!"

Bu kapitan elə bil ayağı zəncirli dustaq kimi yeriyirdi – dıpbır-dıpbır. Penalti yeri lap yaxın oldu. Təzədən haray qopdu.

Nemət özü də bilmirdi ki, nə səbəbdən işini-gücünü atıb burada dayanıb, belə maraqla bütün bu şeyləri izləyir, ayrılıb gedə bilmir.

Kövrək uşaq xatirələrinin riqqətindən başqa bu futbolda nə isə başqa bir şey də var idi. Hisslərin, həvəslərin çılpaqlığı, təmənnasızlığı, saflığı, təmizliyi...

Görəsən bizim şöbənin cəfakeşləri bu oyuna baxsaydılar, nə deyərdilər? Əlbəttə, Qurban zəhər tuluğudur. Dedikləri də hamısı tikanlı sözlərdir. Ancaq bəlkə onun dediyində bir faiz, yarım faiz, çərək faiz həqiqət var. Futbol marağında bəlkə də çirkin bir şey yoxdur, ancaq hər halda, çox kədərli bir şey var. "Boşluğu doldurma". "Cəfakeşlik çoxunuzun boynuna düşüb". Ay səni, Qurban! Amma bəlkə cəfakeşliyə səbəb işdaşların söhbətindən, marağından, həvəsindən geri qalmamaq istəyidir? Deməli, belə çıxır ki, hamı bir-birinin ucbatından cəfakeş olub. Bir-birinin xətrinə.

– Qol! Qol! – deyə uşaqlar qışqırışdılar.

Studiyanın kassası qarşısında xeyli adam vardı. Nemət yarım saata qədər növbədə durdu. Zənd-zəhləsi getdiyi İ. də burda idi.

İrişə-irişə:

– Görürsən də, – dedi, – soyuruq hökumətimizi.

Bir xeyli pul aldı.

– Kasıbçılığımızı eləyirik də. – İrişə-irişə saydı. Nemətə tərəf uzatdı:

– Sən mənim canım, buyur üstündən götür.

– Çox sağ ol. Özüm alacağam.

İrişə-irişə cibinə qoydu:

– Di sağ ol!

İrişə-irişə çıxıb getdi.

Nemət: "Pulu da adamlar cürbəcür alır – deyə düşündü. – Biri halal zəhmətinin dəyəri kimi, açıq üzlə. Birisi də bax bunun kimi, elə bil qəbih bir iş tutur, qanunla aldığı pulu da oğru təki alır. Elə bil haram mal yeyir, üstünü açmasınlar deyə də hamıya irişir. Eh, nə isə..."

Deməli, belə. İndi gedək, maqnitofon alaq.

Poçtamtın yanından keçəndə əlini döş cibinə atdı. Pasportu yanında idi. İçəri girdi "Do vostrebovaniya" yazılmış pəncərəyə yanaşdı:

"Mənim bura gəlməyim nəyə oxşayır? Elə bil qəbir üstünə gəlirəm. Ya da suyu qurumuş dəyirmana. Yox, bu bənzətmələrin heç biri düz deyil. Bu pəncərənin ardında heç kəsi basdırmamışam. Burda qurumalı bir şey də yox idi".

Hər dəfə yolu bu küçədən düşəndə poçta girər, pasportunu uzadıb gözləyərdi. Qəribə bir həyəcanla gözləyərdi. Kağızçı səliqəylə zərfləri yoxlayar, hər dəfə də eyni sözləri deyərdi: bir şey yoxdur. Məktub hələ yəqin, yoldadır.

Hardan da olaydı? Nemət bilirdi ki, yolda-zadda da deyil. O heç yerdən, heç kimdən məktub gözləmirdi: Yox yerdən məktub çıxmayacaqdı ki... Yaddaşını ələk-vələk eləsə də başqa şəhərdən ya Bakının özündən ona "do vostrebovaniya" məktub yazacaq bir adam xatırlaya bilməzdi.

Amma nədənsə bu küçədən tək keçəndə hər dəfə həmin pəncərəyə yanaşırdı. Yanında bir sənəd olmayanda heyifslənirdi:

– Namazov, aha, var. Yox, bu, Namazov Nadir imiş. Siz Nemətsiniz!

– Bəli, mən Nemətəm.

Kağızları bir-bir ötürüb son zərfi də bir qırağa qoydu:

– Hələlik heç nə yoxdur, – dedi. Şüşənin yarımdairəvi kəsiyindən pasportu qaytardı.

Nemət ağır-ağır pəncərədən aralandı. Qəfilcən fikrində gözlənilməz bir bənzətmə oyandı. "Bu da mənim qəribəliyimdir, – deyə düşündü. – Məmməd Nəsirin Krasnovodsku kimi... Hər şeydə məna axtarsan..."

Siqaretini odlayıb küçəyə çıxdı.

## NƏRGİZİN XORUZ BABAYA MƏKTUBU

Salam, Xoruz baba!

Xoruz baba, mənim adım Nərgizdir. Xoruz baba, mənim doqquz yaşım var. Xoruz baba, mən bu məktubumda sizin tapşırdığınız quş adlarını yazıram. Quş adları: göyərçin, qaranquş, sərçə, sığırçın, bildirçin, qarğa, ağacdələn, sağsağan, qartal, şanapipik, qaraquş, tovuz quşu, turac, laçın, qırqovul, cüllüt, dolaşa, durna, bayquş, kəklik. Ev quşları: toyuq, xoruz, ördək, hind toyuğu, qaz. İyirmi altı quş.

Xoruz baba, mənim Rəhilə yoldaşım var. Rəhilə yaxşı oxuduğu üçün müəllimə onu sinifkom seçib. Onların maqnitofonları var. Xoruz baba, ora sizin səsinizi yazıblar. Sən Rəhilənin adını radioda demisən. Rəhilənin atası səni yazıb maqnitofona, sən deyirsən Rəhilə Həsənova mənə məktub yazıb. Xoruz baba, mən də sənə məktub yazmışdım. Xoruz baba, atam bizə də maqnitofon alacaq. Xoruz baba, mənim adımı da radioda de. Atam maqnitofon alanda mən deyərəm səni maqnitofona yazsın. Maqnitofon almağı Karmenlə Cilda istəyir. Atam onlarçün alacaq. Atam dedi ki, dərslərini yaxşı oxusan, Xoruz baba sənin də adını çəkər. Rəhilə deyir ki, Xoruz baba sənin adını deməz, sən hesabdan üç almısan. Xoruz baba, mən hesabdan beş alacam. Xoruz baba, mən yaxşı qızam. Xoruz baba, mən ailəmizdə kiçik yaşlı olduğum üçün, atam, anam, nənəm və bacılarım mənə hörmət bəsləyirlər. Mən anamın sözünə qulaq asıram. Nənəmə kömək eləyirəm. Mənim nənəm mənə çoxlu nağıllar danışır. Xoruz baba, mən çoxlu nağıllar, mahnılar, şeirlər bilirəm. Mən pianinoda “Kukla” mahnısını çala bilirəm. Xoruz baba, mən həmişə radioda sənin bizim üçün verdiyin nağıllara qulaq asıram. Xoruz baba, sabah radioda mənim də adımı de. Xoruz baba, mən yaxşı qızam. Mənimçün “Telefon” mahnısını çaldır.

İmza: Sizin kiçik nəvəniz
Namazova Nərgiz Nemət qızı

# İKİ-BİR

*Fələk iki-bir atdı*
*Bəxtimin nərdi kimi*

Zaur bilirdi ki, axır Təhminəni razı salacaq, çünki bu elə bir təklif idi ki, ilk dəqiqədən həqarətlə rədd olunmamışdısa, deməli, gec-tez qəbul olunacaqdı.

– Axı niyə mütləq plyaja getmək istəyirsən?

– Yadında, mən "Moskviç"imi alanda sən dedin ki, yaxşı oldu, yayda bizi plyaja apararsan.

– Mən deyirdim bütün şöbəynən gedərik, demirdim ki, ikimiz...

– Bütün şöbə? – Zaur rişxəndlə sadalamağa başladı.– Dadaş, Nemət, Qurban...

Təhminə uğunub getdi.

– Axı, Zaur, başa düş, eşidən-bilən nə deyər, mənim ərim...

– Biz nə günah işlədirik ki... ərin Bakıda olsaydı... amma indi burda yoxdur... gedək çimək, iki saata qayıdarıq.

– İki saata? Yəqin?..

"Vəssalam!".

– Lap yəqin. Söz verirəm.

Təhminə alt dodağını dişləri arasına alıb, başını yana əydi. Saçları çiyninə axdı.

– Gedim qarajdan maşını götürüm, iyirmi dəqiqədən sonra gəlirəm evinizin qabağına.

– Yox, yox, evin qabağına gəlmə. Evimizin yanında bağ var e, onun sol tərəfində gözlə.

– Oldu. Çox gözəl.

Zaur üçüncü mərtəbəyə dırmaşmağa başladı. Pillələri beş-beş atılır, bığaltı gülümsünür, zümzümə edirdi. Uçmağa qanadı çatmırdı.

Pilləkənin başında Məmməd Nəsirlə toqquşdu. Tünd çaxır iyi Zaurun burnunu çaldı.

Məmməd Nəsir onun qolundan yapışdı.

– Mən ölüm, – dedi. – Gedək bir nərd ataq.

– Məmnuniyyətlə, Məmməd Nəsir, gələn səfər. İndi yaman tələsirəm.

Dartınıb çıxmaq istədi.

Məmməd Nəsir:

– Bircə tas, – dedi, – sən mənim canım.

– Ay kişi, dedim də, tələsirəm...

Məmməd Nəsir:

– Yeddi dəfə orfoqrafiyanı dəyişdilər, – dedi. – Amma məni işdən xaric eləyə bilmədilər. Hər dəfə qaydaları əzbərləyirəm. Qoy gəlsin sənin cavan korrektorların. Görək hansımız yaxşıyıq. Əski əlifbanı da bilirəm, latını da, indikini də.

– Yaxşı, a kişi, burax qolumu...

– Yox, dayan, sən cavansan, görməmisən. Kişilər vardı, kişilər. Kişi deyirəm e sənə. Kişi. Bax həmin bu yerdə Teymur Mahmudov məni tutdu. Deyir: "Nə olub, Məmməd Nəsir, gözümə bir az turş dəyirsən?" Dedim: "Yox, sağ oluz, yaxşıyam". Eh kişilər vardı. Hər birisi bir şiri-nər, aslan, bəbir.

Zaur qolunu qopardıb götürüldü.

Məmməd Nəsir onun dalınca baxıb, baxıb, başını buladı. Öz-özüylə danışa-danışa pilləkəni enməyə başladı.

– Deyirəm, əmim Türkiyəyə gedib, mənim nə təqsirim? Niyə daş eləyib ayağıma bağlayırsız... Deyirlər, yox, ot kökü üstə bitər. Deyirəm, əşi, o vaxt mən uşaqdım. Nikolay vaxtı çıxıb gedib. Özü də Əliqulu kişi hardan mənim köküm oldu? Üzünü də görməmişəm. Deyirlər yox ki, yox, yox oğlu yox. Niyə gizlətmisən ki, əmin xaricdədir? Çıxardırıq səni işdən. – Pilləkəni qalxan qızlara salam verdi: – Salaməleyküm, xanım qızlar, hər vaxtınız xeyir. – Qızlar pıqqıldayıb gülüşdülər. Məmməd Nəsir onlara fikir verməyib öz-özünə danışmağını davam etdirdi: – Çıxarırsız çıxarın, neynək. İndi də viqovor verirlər ki, içirsən. Eh, mənə nə var, bir həsirəm, bir Məmməd Nəsir. İçirəm, neçün ki, lazımdır. Yəhya, ay Yəhya, mən ölüm, gedək bir nərd ataq.

– Yekə kişisən, get özünə iş tap.

– Ay Cümşüd, sən atovun goru, mən nə dedim ki. Deyirəm, gedək nərd ataq, bəyəm bimərifət söz dedim?

Yəhya:

– Məmməd Nəsir, deyəsən, yenə o söz, – dedi və çırtmayla boğazına vurdu.

– Ay bic xərəngə, – deyib Məmməd Nəsir göz vurdu. – Məmməd Nəsiri el içində xar eləmə. Açma sandığı, tökmə pambığı.

Cümşüd:

– Məmməd Nəsir, şöbə müdirisən, yoxsa, idarənin müdiri? – deyə xəbər aldı.

– Hə? Yox, hələ redaktoram, ha, ha, ha... Vur bura, mən ölüm. – Məmməd Nəsir otuz beş il idi bu idarədə korrektor işləyirdi. Amma deyirdi ki, üçüncü qədəhdən sonra oluram redaktor, beşincidən sonra şöbə müdiri, yeddincidən sonra idarənin müdiri. Sonra daha hesabı itirirəm. Ancaq bir vaxt görürəm ki, zamministrəm. Sonra ministr. Sonra Hindistan padşahı. Sonra allah...

– Deməli, redaktorsan? Nə əcəb bəs, belə az vurmusan. Bu gün ki, şənbədir. Əsil məqamdır.

– Ay Cümşüd, bəlkə gedək bir nərd ataq?

– Sabah, Məmməd Nəsir, sabah.

Yəhyayla Cümşüd yarımçıq qalmış söhbətlərini davam etdirə-etdirə pilləkənlə düşməyə başladılar.

– Bəli, indi Nemət olub gülməşəkər. Getmə gözümdən, gedərəm özümdən.

– Əşi, dünən Dadaşla xosunlaşırdılar, mən bildim ki, işin içində iş var.

Məmməd Nəsir:

– Sabah bazardır, – deyə onların dalınca qışqırdı, amma cavab almadı. Zümzümə eləyə-eləyə dəhlizlə getdi:

– Bilsən nə qədər, sevgili canan, can alansan.

– Xeyir ola, Məmməd Nəsir, yenə segah deyirsən?

Az qala makinaçı Tavusla toqquşdu.

Məmməd Nəsir:

– Segah deyil, qızım, dilkeşdir, – dedi və sonra əlavə etdi, – ay səni xoş gördük, əhvali-şərif?

– Sağ ol, duaçıyam.

– Çoxdandır gözümə dəymirsən?

– Rayona getmişdim. Anama dəyməyə. Bizim tərəflərdə olmamısan ki? Bir gözəl, səfalı yerlərdir, iki göz istəyir tamaşasına. Bu səfərimdən çox razı qaldım.

Məmməd Nəsir.

– Ən yaxşı səfər... – deyə sözə başladı.

– Bilirəm nə deyəcəksən. – Tavus onun sözünü ağzında qoydu, – ən yaxşı səfər şərab kuzəsinin boğazından dibinə səfər etməkdir. Yüz dəfə eşitmişəm.

– Ay sağ ol. Bu yolu ki, keçirsən, çatırsan şüşənin dibinə, düşürsən cənnətə. Bəli, hurilər, qılmanlar, məlaikələr... Özləri də qələt eləyirlər, cənnətdə "suxoy zakon"zad yoxdur. İçki bax buracan – əlini hulqumuna dirəyib elə bil mişarladı. – Bəli, iki saat, üç saat olursan cənnətqradda. Yanında da sənin kimi bir canalan canan. Bax, bir var can, bir var canan, bir də var canalan...

Tavus:

– Ala ey, – deyə iki əlini çətir kimi Məmməd Nəsirin başına tutdu, – ətin tökülsün, kişi, ətimizi tökdün.

– Hə, cənnətdə ki bir az cövlan eləyirsən o yan-bu yana, sonra uzadırlar səni xərəyə, yəni ki, çarpayının üstünə, gətirirlər obratnı geri. Ayılıb görürsən bəli, yenə öz otağındasan ki, varsan, həmin-zəmin, Məmməd Əmin.

Tavus çıxıb getmişdi.

Məmməd Nəsir onun dalınca baxıb:

– Qudurasan qurbağa, – dedi, – bizim rayon, sizin rayon... Mərdan kişi düz deyirdi ki, bu bakılılar, qarabağlılar, qazaxlılar, nə bilim gəncəlilər, göyçaylılar, naxçıvanlılar içində azərbaycanlı olmaq çox çətin məsələdir.

Məmməd, Nəsir belini büküb dəhlizlə yolunu davam etdirirdi. Evə gedən işçilərə kamal-ədəblə: "Salaməleyküm, hər vaxtınız xeyir, xoş getdiniz, sağ olun, gülə-gülə" deyirdi.

Həmişə aşağı baxdığındanmı beli bükülmüşdü, ya beli bükülü olduğundanmı həmişə aşağı baxırdı?

Dadaşgilin qapısına çatdı. Qapını elə açırdı, elə bil qapıdan üzr istəyirdi ki, bağışla səni açıram. Qapını açıb yan-böyürü, barmaqlarının ucunda, tələsik içəri şütüyürdü.

Dadaşgilin otağına elə girdi ki, elə bil otaqda yatan, ya xəstə var.

Dadaş kağız-kuğazını iri şişman portfelinə yığışdırırdı. Portfel elə yekəqarın idi ki, bura lap adamı da yerləşdirmək olardı.

Təhminə siyirtməsindən balaca güzgüsünü çıxarıb dodaqlarını boyayır, sonra diliylə boyanı yalayırdı.

Qurban başını aşağı sallayıb nə isə yazırdı.

Məmməd Nəsir:

– Salaməleyküm, – dedi, – xanım qız, səni görməmişəm.

Təhminə güzgüsünü çantaya qoyub:

– Salam, Məmməd Nəsir, – dedi.

Dadaş:

– Nədi, Məmməd Nəsir, sözlü adama oxşayırsan? – dedi.

Məmməd Nəsir dırnaqlarını çeynəyə-çeynəyə:

– Deyirəm, bəlkə bir ataydıq... – dedi.

– Canımçün tələsirəm, yoxsa məmnuniyyətlə, – mixəyi, zəhmli portfelini əlinə götürdü. Ötkəm səslə: “Di salamat qalın” – dedi.

Dadaşın enli kürəyi bir anlığa qapını tamam tutdu.

Məmməd Nəsir üzünü bu kürəyə tutub:

– Sağ oluz, gülə-gülə, – dedi, bir-iki dəfə başını əyib kürəklə vidalaşdı, beli daha da büküldü, yarıqat oldu, – sağ oluz, xanım qız, sən də xoş getdin.

Qapı örtüldü. Dadaşın ağır addımlarının səsi gəlirdi: elə bil dəhlizdə bir cüt ütü yeriyirdi. Bu səsə Təhminənin dikdaban çəkmələrinin addım səsləri calandı: elə bil döşəməyə gilə-gilə su damırdı.

Səslər uzaqlaşdı, itdi.

Qurban başını qaldırdı:

– Məmməd Nəsir, düzdü, deyirlər sənin bu Dadaşla xüsusi zarafatın var?

– Necə bəyəm? Nə zarafat?

Qurban qımışdı:

– Nə bilim vallah, uşaqlar danışır. Deyirlər bərk içəndə gecə saat ikidə, üçdə gedirsən bunlara. Zəngi basırsan, arvadı oyanıb gəlib qapını açır. Deyir nə olub, nə təcili işdir ki? Deyirsən bəs çox təcili işdir. Bəli, Dadaş bir tuman-köynəkdə gözünü ovuşdura-ovuşdura qapıya çıxır. Deyir nə olub, nə var, nə xəbərdir, ay Məmməd Nəsir, gecənin bu vaxtında? Sən də ki, – Qurban papiros çəkənlərin xırıltılı gülüşüylə güldü, – sən də ki, çırtıq çalıb deyirsən:

> Tupbuludu, tupbulu.
> Cupbuludu, cupbulu.

Məmməd Nəsir də bərkdən güldü. Ağzında bir dənə sağ dişi yox idi.

– Olub-olub, – dedi, – əşi, mən bu Dadaşın dabbaqxanada gönünə bələdəm. Neçə il yoldaş olmuşuq. Sən o vaxt uşaq olardın. Birinci bura işə mən gəlmişəm. Elə o vaxtdan korrektor işləyirəm. Yeddi dəfə orfoqrafiyanı dəyişdilər. Hamısını da əzbərlədim. Latını da bilirəm,

ərəbi də, indikini də. Bir gün Parapetin tinində Mirzə Cəlilə rast gəldim. Göy parusin pencəyi vardı. Əlində də əsası. Dedi: "Məmməd Nəsir, axı biz belə deməmişdik, qardaş". Eh, ay Qurban, adamlar var idi, adamlar görmüşdük.

Qurban:

– Dadaş da o vaxtdan işləyir?

– Yox, birinci bura mən gəlmişəm. Sonra dartdım Səfdəri gətirdim. İndi baş mühasibdir e... o vaxt kassir köməkçisi idi. Şunu götür, şunu qoy. Bu Dadaş da var ha... Bunu da bura mən işə düzəltmişəm. Bir gün bax elə bu yerdə, söz yerinə çəkər Teymur Mahmudova rast gəldim. Dedi: nə var, Məmməd Nəsir, gözümə bir az turş dəyirsən? Dedim: bəs sağ oluz, sağlığınıza dolanırıq. Amma bir yoldaşım var. Mümkün eləsəydiniz, onu işə götürərdiniz. Dedi: bəs nə yoldaş? Dedim: bu Dadaş. Dedi: bəs nə bacarar? Dedim: Bəs hər nə desən. Dedi gəlsin kuryer götürüm onu hələlik, sonra baxarıq. Eh, kişilər vardı o vaxt, hanı indi onlar!.. Qaldıq uşaq-muşaq əlində. İndi hər yerindən duran...

– Bəs, düzdür ki, bu Dadaş Teymur Mahmudovdan material verib?

Məmməd Nəsir çiyinlərini çəkdi:

– Əşi, gedək bir nərd ataq da...

– Deməli, Dadaşı işə sən düzəltmisən. Kuryerlikdən başlayıb gör hara qalxıb!

– Hə, o vaxt yaman ləng idi. Elə hey qışqırırdılar: ay Dadaş, di tez ol, tərpən. Əlli-ayaqlı ol bir az. Şeir də qoşmuşdular: ay Dadaş, başıva daş, tərpənmə belə yavaş. İndi gör kimdir!

Qurban:

– Müdirin sağ əli, – dedi, – sözü qılınc kimi keçir. Kəsdiyi başa sual yoxdur. Amma insafən səni həmişə müdafiə eləyir. O səfər töhmət vermək istəyirdilər, qoymadı.

Məmməd Nəsir:

– Çox sağ olsun, – dedi. – Mən ki, ondan bir pislik görməmişəm, ancaq yaxşılıqdan başqa. Adamın Allahı var. Əşi, kişisən, dur gedək bir nərd ataq.

– Yox, gərək evə qaçam. Beş dəqiqə gec gəlsəm, arvad günümü göy əsgiyə bürüyəcək. Sən belə-belə şeyləri bilməzsən, Məmməd Nəsir, sənə nə var ki, subay adamsan...

– Subaylıq sultanlıqdır. Bir həsirəm, bir də Məmməd Nəsir.

Otaqdan çıxdı. Otaqların çoxu boşalmışdı. Səfdər dayı dəmir qapısını qıfıllayıb pilləkənə tərəf yollandı. O həmişə işə hamıdan tez gəlib hamıdan gec gedərdi.

Məmməd Nəsir:

– Səfdər, – dedi, – bir nərdlə necəsən?

Səfdər dayı fikirli və dalğın görünürdü. Səsi eşidib diksindi, başını qaldırdı. Elə bil Məmməd Nəsiri əvvəlcə tanımadı, elə bil onu ilk dəfə görürdü. Eynəyini çıxarıb nəfəsini şüşəyə verdi, sonra dəsmalla sildi.

– Ey, ay Nəsir, – dedi, – mən nə hayda, sən nə hayda!

İki ay bundan qabaq Səfdər dayının arvadı rəhmətə getmişdi.

Məmməd Nəsir:

– Ay Səfdər, – dedi, – vallah, bu dünya bir yer deyil. Bir başım açılmır, bir macal eləyə bilmirəm ki, gedib özümü öldürüm.

Səfdər:

– Özünü niyə artıq zəhmətə salırsan, əcəl onsuz da özü gəlib səni tapacaq.

Məmməd Nəsir pıçıltıya keçdi:

– Səfdər, deyirlər Dadaş Teymur Mahmudovdan danos yazıbmış, hə?

Səfdər dayı arı qovurmuş kimi dəsmalını yellədi:

– Məmməd Nəsir, sən ölənlərinin goru, xatovu məndən uzaq elə. Sən içmisən, dünya vecinə deyil.

Tələsik addımlarla çıxıb getdi: tak-tuk, tak-tuk...

Maşını qarajdan çıxaranda Zaurun yadına düşdü ki, çimmək paltarı yadından çıxıb idarədə qalıb. Yay vaxtı bu dənizliyini həmişə idarədə qoyurdu. Görürsən işdən sonra uşaqlarla sözləşib tələsik cumdular dənizə.

Maşını nəşriyyatın qabağına sürdü. İş qurtarmış, camaat dağılmışdı. Qapını döydü. Qapıçı: heç kəs yoxdur, – dedi, – hamı çıxıb gedib.

– Bilirəm, – deyə Zaur tələsik onun yanından içəri dürtüldü, – yadımdan şey çıxıb qalıb.

Öz otaqlarına çıxdı. İçəri girdi, siyirməni çəkdi, qəzetə bükülmüş dənizliyini götürdü. Saata baxdı və birdən təəccüblə qulaq verməyə başladı.

Bomboş idarənin yuxarı mərtəbəsindən nərd səsi aydın eşidilirdi. “Bıy, Məmməd Nəsir burdaymış ki! Görəsən, kimi xamlayıb?”

Fikirləşdi ki, qoy çıxım baxım, görüm kimi xamlayıb. Əvvəl-əvvəl Təhminəylə danışmağa mövzu da olar. Ümumiyyətlə, fikir verib Təhminə Məmməd Nəsirdən danışmağı sevir, o biri məktəb əhvalatını da danışaram. "Sonra da keçərsən ayrı söhbətlərə, incə mətləbə, Zaur kişi. Ay vələddüzzina!".

Bığaltı qımışdı, saçlarına sığal verdi, yüyürüb yuxarı mərtəbəyə dırmaşdı, nərd səsi gələn otağa tərəf getdi.

Qapını açdı, baxdı. Mat qaldı.

Otaqda Məmməd Nəsirdən başqa heç kəs yox idi. Məmməd Nəsir öz-özüylə nərd oynayırdı. Zaurun gəlişini duymadı:

– At, Dadaş, – dedi. Atdı. – Aha, şeş qoşa.

Oynadı.

– İndi ləleşün Məmməd Nəsir atsın.

Atdı.

– İki-bir. – Başını qaşıdı. – Yaxşı, mən bu iki-bir andıra qalmışı hardan oynayım? Əldən oynasam bataram ki... ayrısı da yoxdur. – Oğrun-oğrun ətrafa döyükdü. Zauru yenə görmədi. – Bu heç, – dedi. – Guya bu olmayıb. Qoy bir də atım. Özümüzük də, bilən olmaz.

Atdı.

– Tfu səni. Yenə iki-bir. Gətirmir də...

Zaur yavaşca qapını örtüb ağır-ağır pilləkəni düşməyə başladı. Başını buladı, gülümsündü. Qapıçıya:

– Sağ olun, – dedi və çıxarıb otuz qəpik verdi.

Küçəyə çıxanda bir də başını buladı.

## DADAŞIN PROFESSOR TEYMUR MAHMUDOVA MƏKTUBU

Moskva
Dobrolyubov küçəsi, 11-ci ev, mənzil 7

Hörmətli və əziz professor! Atəşin salamlar. Cürbəcür işlər adamın başını elə qarışdırır ki, heç bir macal tapıb Sizə məktub yaza bilmirəm. Nəhayət, bu gün, şənbə günü öz-özümə dedim ki, daha nə cür olursa-olsun, gərək vaxt tapıb Sizə bir-iki kəlmə yazam. Məktub yazmıramsa, bu o demək deyil ki, Sizdən xəbərsizəm. Moskvadan gələn

tanış-bilişdən həmişə Sizi soruşuram. Səhhətinizin, kef-əhvalınızın sağlam və gümrah olduğunu eşidib çox sevinirəm. Tez-tez mərkəzi mətbuatda imzanızı görəndə ürəyim dağa dönür. Professor, Siz bəlkə heç özünüz də təsəvvür edə bilmirsiniz ki, Sizin adınız, işiniz, taleyiniz, ömrünüz bizim nəsil üçün nə deməkdir. Mən həmişə əsil insanı, yüksək ülvi bir humanist, bütün çətinliklərdən mərd-mərdanə və açıq alınla çıxan bir insanı təsəvvür etmək istəyəndə məhz Sizi düşünürəm. Sizin necə ağır illərdən çıxıb, haqsız ittihamlara məruz qalıb sarsılmaz inam və etiqadla, yenidən qurub-yaradan insanların içində belə ləyaqətli yer tutmağınız yalnız cavan nəslə deyil, elə bizim yaşlı nəslimizə də ibrət dərsidir. Doğrudan, bəzən elə adamlara rast gəlirsən ki, kiçicik bir haqsızlığı, ya kəsiri görüb laqeydləşir, yorulur, yaxasını kənara çəkir, heç nəyə qarışmır, başını girləyir. "Dəymə mənə, dəymərəm sənə, ya azacıq aşım, ağrımaz başım". Siz isə bütün kəşməkeşlərdən sonra yenə də əvvəlki hünərlə, cavanlıq həvəsiylə, gənclik ehtirasıyla işləyir, çalışır, yaradır, xalqımıza, millətimizə xeyir verirsiniz. Əziz Teymur müəllim, bu təmtəraqlı və pafoslu sözlər üçün məni bağışlayın. Ancaq inanın ki, bu sözlər ürəkdən gəlir, qəlbimin ən dərin, ən səmimi hissələrini ifadə edir.

Əziz professor, keçən yay söz verdiniz gəlmədiniz, heç olmasa bu il sözünüzün üstündə durun. Universitetdə dərsləriniz qurtaran kimi istirahətə bura gəlin, necə deyərlər, doğma vətən torpağı yolunuzu gözləyir. Gedək bir əməlli-başlı Azərbaycanı gəzək. Qalxaq Göy gölə. Özüm öz əlimlə Sizə yaxşı bir kabab çəkim. Ötək ordan Şuşaya, Laçına, Kəlbəcər tərəfə. Siz ki maşallah, belə səyahətlərin aşnasısınız. Sonra da Bakıda bizdə bir köhnə dost-aşnaynan yığışaq, armudu stəkanlarda bir yaxşı məxməri çay içək, bir nərd ataq. (Nərd oynamağı unutmamısınız ki?) Yeri gəlmişkən, bildir Yəhyayla Sizə bir nərdtaxta göndərmişdim. Nuxada bir ustaya şəxsən özüm sifariş vermişdim. Belə ayrı aləmdi, əl işi... Bilmirəm xoşunuza gəldi, yoxsa, yox? Burda sağ-salamatlıqdır. Səfdər kişinin arvadı öldü. Mina xanım, bilmirəm yadınıza gələr, ya yox? Bəli, professor, bizim nəsil də yavaş-yavaş seyrəlir. Baxırsan köhnə dostlardan kim qalıb? Kimdi qalan o vaxtın adamlarından? O vaxt, Sizin işə götürdüyünüz adamlardan indi idarədə qalan bir mənəm, bir Səfdər, bir də Məmməd Nəsir. Məmməd Nəsir zalım oğlu da elə hey içir. Onu vaxtında evləndirmədik ki, bəlkə arvad ipə-sapa yığaydı. Yoxsa indi tək adamdı, nə vecinə? O gün az qala

işdən qovacaqdılar. Qoymadım. Durdum dedim, atacaqsınız bayıra, neyləyəcək? Bayıra atmaq asandır. Gəlin bir məsləhət eləyək, qolundan tutaq, kömək eləyək. Köhnə işçidir, idarənin veteranıdır. Savadlı korrektordur. Hələ siz cavanlar ondan çox şey öyrənə bilərsiniz. Bilirsiniz də professor, cavanlardır, odlu-odlu danışırlar, elə bilirlər hamıdan ağıllıdırlar. Deyirəm onlara ki, biz sizin yaşda olmuşuq, amma siz hələ bizim yaşa çatmamışsınız. Odur ki, siz biləni biz çoxdan bilirik, amma biz biləni siz hələ bilmirsiniz. Uzun sözün qısası, saxlatdım Məmməd Nəsiri. Sizi də köməyə çağırdım. Dedim bəs professor da eşitsə, bizdən inciyər, axı, Məmməd Nəsiri bura işə o götürüb.

Nə isə, əziz professor. Sizə xeyli başağrısı verdim. Ancaq Sizə bir işim də düşüb. Bilirəm, indi Sizin yerinizə başqa adam olsaydı, düşünə bilərdi ki, hə, işin düşüb, elə məktubu da onunçün yazmısan. Ancaq mən sizin qəlbinizin genişliyinə bələdəm, bilirəm ki, belə dar fikirlərə düşməzsiniz. Hər halda, mənim haqqımda belə düşünməzsiniz. Məsələ ondadır ki, biz burada "Tarixi şəxsiyyətlər" seriyası buraxmaq haqqında təşəbbüs irəli sürmüşük və prinsipial razılıq almışıq. İndi bu məsələnin təsdiqini Moskvada bir az tələsdirmək lazımdır. Mən özüm bu iş üçün Moskvaya gəlmək istəyirdim. Ancaq sonra fikirləşdim ki, heç kəs bu işə Sizin kimi kömək edə bilməz. Sizin orada necə böyük nüfuza malik olduğunuzu yaxşı bilirəm və odur ki, Sizdən artıq dərəcədə xahiş edirəm, bu işə himayədarlıq edin. Əgər prinsip etibarilə razısınızsa, konkret məsələlər barəsində Sizə yeni bir məktub yazaram:

Ayrı elə bir yenilik yoxdur. Bizim Aqil bu il orta məktəbi qızıl medalla bitirib. Meyili də Moskvayadır. Ali məktəbi orda oxumaq istəyir. Deyirəm, elə bilirsən asandır Moskvada imtahan verib ali məktəbə qəbul olunmaq? Amma heç bir şey eşitmək istəmir. Hələ özü də bilmir hansı sahəyə gedəcək. Bəlkə Siz bir məsləhət verəsiniz. Nə isə... bu da bir problemdir.

Hörmətli professor. Cavabınızı səbirsizliklə gözləyirəm. Daha böyük bir intizarla Sizin özünüzü burada gözləyirik.

Dərin hörmət hissiylə Dadaş
5 iyun 1965

## ÜÇÜNCÜ

Siqareti siqaretə calayırdı: “Əgər dolamaq istəyirmişsə, çox mənasız zarafatdır”.

“Bəlkə bağın o biri tərəfini deyib? Yox, orda maşın saxlamaq qadağandır. Sol tərəfi dedi. Sol tərəf buradır da”.

Zaur maşının saatına bir də baxdı, sonra qol saatına baxdı. Sözləşdikləri vaxtdan düz 45 dəqiqə keçirdi.

“On beş dəqiqə də gözləyim. Olsun bir saat. Əgər gecikirsə, bir saat bəsidir. Ondan artıq mən heç Bricit Bardonu da gözləmərəm. Yox, əgər mənimlə zarafat eləmək fikrinə düşübsə, nə olar, heç eyib etməz, mən də papaq altında qalan oğlanlardan deyiləm”.

Yeddi dəqiqə də keçdi.

Son siqareti damağına qoydu. Boşalmış qutunu xışmalayıb ovcunda əzdi, tuşlayıb səkidəki zibil qutusuna atdı.

Maşının gözünü açıb təzə qutu götürdü, cibinə qoydu, rulu tumarlamağa başladı.

Lap qulağının dibində səs eşitdi:

– Bağışla, deyəsən, bir az gecikmişəm.

Bayaqdan bəri bu səsi gözləyirdisə də diksindi, qanrılıb baxdı. Təhminənin qırmızı paltarının ağ düymə cərgəsini gördü.

– Zərər yoxdur, – dedi, – keç bu tərəfə.

Qapını açdı. Təhminə içəri keçdi, əlindəki iri ala-bula çantanı Zaura uzatdı.

Zaur:

– Ver çantanı bura, – dedi, – arxaya qoyum. Nə yığmısan bura bir belə?..

– Heç, bir az yemək götürmüşəm.

Zaur maşını işə saldı, hərəkətə gətirdi...

– Yemək? Yemək neyləyirsən, evdə yeyəydin də, – üzünü Təhminəyə tərəf çevirib bığaltı gülümsündü, – iki saata qayıdarıq da...

Təhminə maşının güzgüsünü üzünə tuşlayıb, saçlarını düzəldirdi.

– Yeməyinə yemişəm. Dedim birdən yubandıq. Acsaq...

– Aa... belə de, – mənalı-mənalı Təhminəni süzdü. “Pah atonnan! – deyə düşündü, – gör dünyanın nə günüdür?! Yad kişiylə plyaja gedir. Özü də bilir niyə gedir, amma tədarükünü də yaddan çıxarmır.

Qarnının da qeydinə qalır. Bəli, XX əsrdir, Zaur kişi. Romantika vaxtı çoxdan keçib”.

– Hansı tərəfə gedək? – deyə Təhminədən soruşdu. Təhminə dərhal:

– Pirşağı tərəfə, – dedi. – Pirşağıdan da o tərəfə bir plyaj var. Yaxşı yerdir, sakit, adamsız...

“Görünür, yaxşı bələddir. Kişinin qızının əməlli-başlı səriştəsi varmış. Kül başına, Manaf!”

– Uşaqlıqda Pirşağıda bağımız vardı. Atam sağ olanda. Çimməyə həmişə o tərəfə gedərdik. Bir qiyamət qayalıq var orda...

Səs-küylü, adamlı küçələrdən keçib geniş şoseyə çıxdılar. Yol basırıq idi. Şənbə günü axşama doğru elə bil bütün şəhər maşın-maşın, avtobus-avtobus sahil bağlarına tərəf axışırdı. Maşınların dal şüşələri bostanı andırırdı: xiyar, qovun pomidor...

Boy-buxunu, yaraşıqlı sifəti, idmançı inadı və başqa keyfiyyətləri Zauru erkən kişiləşdirmişdi. İyirmi üç yaşında çox şey görmüşdü. Təcrübədə kamilləşmiş fitri bir məharətlə hər növ, hər çeşidli qadınla söhbət sala bilir, söhbətdə hər şeyin faizini, dərəcəsini, məqamını da bilirdi. Nə dərəcədə qəlizdən qırıldatmaq, neçə faiz yumor, ikibaşlı eyhamlar. İncə mətləblərə keçmək məqamını da duyurdu, incə söhbətdə müvazinət saxlamaq ustalığı da vardı. Yeri gəldikcə gah adam üzünə həyəcan göstərir, tutulur, özünü itirir, gah da adamına görə açıq-saçıq danışırdı. Təhminənin özüylə də küncdə-bucaqda müxtəlif çeşidli söhbətlərdən az eləməmişdi.

Amma bax indi, onun, nağıllarda demişkən, arzu-kamına, muradına çatmasına lap az qalan bir zamanda, onu məqsədinə doğru saatda 80 kilometr sürətlə aparan bu maşının içində gözlənilməz bir acizliklə danışmağa söz tapmırdı. Bilmirdi nədən başlasın, hansı səmtdən gəlsin. Təhminə də susmuşdu.

Birdən Zaurun yadına Məmməd Nəsir düşdü.

– Nə olub, niyə gülürsən?

– Heç əşi, yadıma düşdü bir şey. Bayaq qayıtmışam idarəyə, bir də gördüm...

Məmməd Nəsirin öz-özüylə nərd oynamasını yerli-yataqlı danışdı. Deyəsən, əhvalatın duzu Təhminəyə çatmadı:

– Bəyəm adam öz-özüylə nərd oynaya bilər?

– Yox da elə məsələ ondadır. Heç kəsi tutub tovlaya bilməyib, odur ki, öz-özüynən oynayır.

Təhminə:.

– Məmməd Nəsir çox qəribə tipdir, – dedi.

– Əşi, ayrı aləmdir. Keçən yay bunun bacısı qızı universitetə girir. Yəqin içib dəm olub, lovğalanıb ki, bəs mən düzəldərəm. Mənim bir yoldaşım universitetdə işləyir, o danışır: deyir, görürəm bir gün bu Məmməd Nəsir dayanıb universitetin qabağında yetim quzu kimi büküb boynunu. İçəri buraxmırlar. Özü də bir balaca dəmdir. Bəs, qapıçıya dedim ki, burax onu, bilirsən bu kimdir? Böyük adamdır. Buraxdırdım onu içəri. Bacısı qızı da yanında imiş. Deyir içəri keçən kimi belini düzəltdi, yanındakı qızın əlindən dartdı birbaş imtahan verilən otağa. Mən də, deyir, düşdüm bunların dalınca, görüm bu neyləyəcək. Açdı, deyir, sinif qapısını, girdi içəri, bəli, imtahandır, uşaqlar oturub. Komissiya-filan. Komissiyada da bir Rəhim var, odur, bir də Cavanşir var, köhnə müəllimlərdəndir, odur. Bəli, Məmməd Nəsir, deyir, kamal ədəblə bunlara salam verdi, dedi, bəs Cavanşir, məni tanıyırsan? – Bəli, tanıyıram. – Çox əcəb, çox gözəl. Rəhim, sən necə? – Bəli, mən də tanıyıram, Məmməd Nəsir. – Çox əcəb. Bax bu mənim bacım qızıdır. Bildiniz də? Daha ayrı söz demirəm. Bacım qızı! Bildiniz? – Bəli bildik. – Hə, qızım, keç otur. Xatircəm ol. Vəssalam! Di salamat qalın, – deyib otaqdan çıxıb, bir də qayıdıb ki, bağışlayın a, siz də bağışlayın, uşaqlar. Sonra çıxıb gedib, bacısıgildə basıb kəsib ki, bəs, sən arxayın ol, ürəyini buz kimi elə. Elə bil ki, qızın oturub universitetdə leksiyada.

Maşın bol gediş-gəlişli şəhərbasardan çıxıb, getdikcə seyrəkləşən yolla irəliləyirdi.

Susmuşdular. Bir azdan sonra Təhminə:

– Yaxşı, nə olub, qəbul eləyiblər qızı? – deyə soruşdu.

– Hardan qəbul eləyəcəklər? Tökülmüşdü. Kəsiblər gedib.

– Niyə?

– Necə niyə? Məmməd Nəsirin ağzına baxan kimdir? Adamı o cür tapşırarlar?

Təhminə:

– Əlbəttə, – dedi, – tapşırmağın da öz ritualı, qayda-qanunları var. Necə deyərlər, zəngin adət-ənənələri. Əvvəlcə kənar söhbətlər, sizin it bizim ərsini apardı, o yandan, bu yandan, havalar xoş keçir, daha nə var, nə yox, sonra belə sözarası kiçik bir işarə, ehyam, arifsən, gərək başa düşəsən, sən mənim işimi düzəlt, biz də xəcalətdə qalmarıq, filan-peşməkan, əl-əli yuyar, əl də üzü...

Zaur:

– Eh, kim kimədir, – dedi. Bir qədər susandan sonra Məmməd Nəsirlə əlaqədar başqa bir əhvalatı xatırladı. – Məmməd Nəsirin müdirimizlə olan əhvalatından xəbərin var?

– Yox.

– Bir gün Cəfər müəllim küçədə Məmməd Nəsirə rast gəlib. Deyib: axşamın xeyir, Məmməd Nəsir. Bir də görüb ki, Məmməd Nəsir iki əlini başına çəkdi ki, vay, Cəfər müəllim, bütün mayam batdı. Kişi başa düşməyib: – Nə danışırsan Məmməd Nəsir, nə mayabazlıqdır? Deyir: bəs, Cəfər müəllim, əməlli-başlı özümə maya qoymuşdum. İçib əntiqə dəm olmuşdum. Sizi gördüm tamam ayıldım. Bütün mayam batdı.

Təhminə güldü, Zaur:

– Neyləsin yazıq Məmməd Nəsir, – dedi. – O da kamını içməkdən alır. Tək kişidir. Ürəyi darıxır, içir də. Bədbəxt oğlu vaxtında bir halal süd əmmişin başını bişirib evlənməyib də, – udqunub əlavə etdi, – əlbəttə, bişirmək onunçün o qədər də asan deyil, amma...

Təhminə:

– Səninçün necə? – dedi, – səninçün asandır?

Zaur çırtmayla siqaretinin külünü atdı.

– Baxır da, – dedi və güzgüdə Təhminəyə göz vurdu. – Baxır atəşin hərarətinə.

– Onda mənə bir siqaret ver, bir də atəş.

– Oho, sən çəkirsən? Heç bilməzdim.

Kibrit çəkdi. Maşının içindəki yeldöyəndə kibritin odu yaralı quş kimi çırpınıb söndü.

Təhminə ikinci kibriti çəkib əlləriylə odu bələdi, bürüdü, ovuclarının içində gizlətdi. Bir qullab vurub:

– Sən hələ çox şeyi bilmirsən, əzizim, – dedi.

– Bircə onu bilirəm ki, bu maşının içində indiyə kimi belə dünya gözəli oturmayıb.

– Yəni bura çox dünya gözəli mindirmisən?

Zaur nə isə qeyri-müəyyən bir səs çıxardı, həm təsdiq, həm inkar kimi qəbul etmək olardı.

– Maşını çoxdan almısan?

– Yeddi ay olar.

Kaş soruşmayaydı ki, hansı pula? “Atamın puluna” demək istəmirdi. Təhminə soruşmadı. Yəqin hamı kimi o da bunu bilirdi.

– Yaxşı işləyir, – dedi. Yarısual, yarıtəsdiq ifadəsi ilə dedi.

– Ceyran kimi qaçır. Zarafat deyil e, əlli at gücü var burda.

– Necə?

– Əlli.

– Mənim bir tanışım vardı. “Volqa”sı vardı. Elə hey qürrələnirdi ki, yetmiş at gücündədir. Bir dəfə lap zəhləmi tökdü, dedim bilirsən nə var, maşının yetmiş at gücündədir, amma başında yeddi at beynicə ağlın yoxdur. Küsdü məndən, o gedən getdi.

– Kimdi ki o?

– Çox bilsən, tez qocalarsan. – Zaurun tutulduğunu görüb, – eləbelə, bir tanışım idi, – dedi, – aramızda heç bir şey yox idi.

Zaur düşündü ki, ağlına gələn sualı versin, ya verməsə yaxşıdır, sonra qərara gəlib.

– Təhminə, – dedi, – bağışla, sənə bir şəxsi sual verim. Amma incimə.

– Aha.

– Bəs, Manaf səni qısqanmır?

Təhminə gülüb əlini onun başına çəkdi, saçlarını qarışdırdı. Xoş bir gizilti iynə-iynə Zaurun bədənini dolaşdı. Bir an gözləri dumanlanan kimi oldu, əlində rul oynadı, maşın sərxoş kimiləngər vurdu.

Təhminə müvazinətini güclə saxlayaraq:

– Oho, nə yaman odlu cavansan, – dedi.

Zaur cəld özünü ələ aldı. Bir qədər əsəbi güldü.

Maşın yolu yumaq kimi təkərlərinə sarıyırdı. Ağaclar, teleqraf dirəkləri arxaya yıxılıb qalırdı. Uzaqda asfalt üzərində ilğımlar-gölməçələr parlayır və yoxlaşıb gedirdilər. Maşın yolu hərisliklə udur, udurdu.

Təhminə:

– Məndən sənə əmanət, – deyə sükutu pozdu, – əgər günlərin bir günündə işdi-şayəd evlənib eləsən, mütləq arvadını qısqan. Qısqanclıq duydun, duymadın, əsasın oldu, olmadı, heç təfavütü yoxdur, əgər istəyirsənsə arvadın səni saysın, sənə hörmət eləsin, yerini bilsin, mütləq qısqan onu. Əlbəttə, daha lap xırdaçılıq eləyib zəhləsini tökmə, yazıqdır. Görürsən elə kişilər olur e, yerli-yersiz səfeh-səfeh qısqanıb arvadı çərlədir, dığ edirlər. Əlbəttə ki, o cür yox, amma belə öz qaydasında, həmişə gərək arvadın elə bilsin ki, sən onu dəlicəsinə qısqanırsan, amma ağır kişisən, büruzə vermirsən. Onda bütün işlər yaxşı gedər. Görürsən sənə necə məişət dərsi verirəm, desələr kim öyrətdi, denən elə özüm bilirdim.

– Çox sağ ol, artıq dərəcədə minnətdaram.

Uzun bir qullab vurub sözünə davam etdi:

– Çünki bilirsən, qısqanmamaq arvadı təhqir edir, fikirləşir ki, yəqin ya ərim mənə biganədir, sevmir məni, ona görə qısqanmır. Ya da ərimin rəyincə mən elə idbar bədəncərəyəm ki, heç kəs, heç bir kişi ömründə mənə yaxın düşməz. Bildin? Necə deyərlər, əndazədən çıxmadan, həddi-ölçünü itirmədən belə qaydasınca bir balaca qısqanmaq mütləq lazımdır.

– Sənin ərin belə edir?

Təhminə onun atmacasını qulaqardına vurdu:

– Sənə bir dərs də verim, – dedi. – Heç olmasa bugünkü səfərimizdə təzə bir şey öyrən. Əgər arvadın bilsə ki, ona xəyanət etmisən, coşub özündən çıxa bilər, qab-qacağı sındırar. Çox dəlisovdursa, nə bilim, lap vurar özünü yandırar, ya gedib rəqibinin saçını yolar, üz-gözünü cırmaqlayar, dağıdar. Yox əgər insan adamdırsa, nəcibdirsə, xasiyyətcə həlimdirsə, üzə vurmaz, içinə salar, içini yeyər, içəridə yanıb-yanıb qovrular. Ərinə qəzəblənər, qızar, nifrət eləyər. Amma bu hisslərin heç biri həqarət deyil. Ərə qarşı həqarət, ikrah hissi ancaq bir halda baş qaldırır. O vaxt ki, arvad özü ərinə xəyanət edir, həm də bilir ki, əri bunu hiss eləyə-eləyə özünü bilməməzliyə, eşitməməzliyə, görməməzliyə qoyub. Bax, onda arvad kişidən iyrənməyə başlayır. Bütün başqa hisslər, qəzəb də, nifrət də sovuşub gedir, sönür, soyuyur, amma bu hiss, iyrənmək hissi ömürlük qalır. O adama daha yaxın dura bilmirsən. Elə bil qurbağa, kərtənkələyə toxunmaqdan çimkinən kimi çimkinirsən. Bildin? – O, əlini yenə Zaurun saçlarına tərəf uzatdı, lakin tez çəkdi. – Yox, yox, sən allah, – dedi, – yaxşı yadıma düşdü. Sən elektriklisən. Sonra maşını aşırdarsan, xataya düşərik.

Zaur:

– Bütün bunlar mənimçün çox mürəkkəbdir, – dedi, – onunçün də evlənmirəm.

– Bir yana baxanda elə yaxşı eləyirsən.

Yenə bir müddət sükut çökdü. İki dolu taksi hay-haraylı siqnallarla onları haqlayırdı. Qabaqdakı maşının sürücüsü əlini siqnala batırıb çıxarmırdı. Zaur çəpəki güzgüyə baxıb, ayağını qaza basdı. Maşının şüşələri titrədi. İndi maşınlar döş-döşə gedirdi.

Sürücünün yanında oturmuş bığlı kişi onlara baxıb irişir, dişlərinin iki cərgəlik qızılında günəşi əks etdirirdi.

Təhminə:

– Nə oyun çıxarırsan? – dedi. – Nə bəhsə-bəhsə girmisən? Qoy keçib getsinlər... Yavaş-yavaş sür, söhbət eləyirik.

Zaur ayağını pillə-pillə qazdan çəkdi.

Hər iki taksi güllə kimi ötüb qabağa çıxdı. Kəsik-kəsik siqnallarla qələbələrini qeyd etdilər, uzaqlaşdılar.

Təhminə:

– Mən idarəyə gələndə uzun zaman işçilərlə dil tapa bilmirdim, – dedi. – Mənə elə gəlirdi ki, çox kütdürlər. İçlərində bircə Nemət ağıllı, mədəni adama oxşayırdı. O da həmişə elə qayğı içində idi, elə bil alnında yazılmışdı ki, "neyləyim, necə eləyim, nə cür dolanım?" Mənə elə gəlirdi ki, heç vaxt onlarla dil tapa bilməyəcəyəm. Amma vaxt adamı bilirsən necə dəyişir! Adam heç özü də bilmir, – maşının küləklik pəncərəsini açıb siqaretin kötüyünü bayıra vıyıldatdı, – bax, saatı görürsən, saniyə əqrəbi necə tez qaçır. Gözünü zillə bax, gör heç saat əqrəbinin hərəkətini görə bilərsən? Amma gözünü çək, iki-üç saatdan sonra bax, görəcəksən ki, burdan bura gəlib. Adam da belədir. Uşaqlıqda tez-tez dəyişir. Saniyə əqrəbi kimi. Böyüyəndə isə yavaş-yavaş. Saatlar, günlər gedir, ömürdən gedir, gündə necə dəyişdiyini duymursan, ancaq hər dəqiqə, hər saat dəyişirsən. İki-üç ildən sonra birdən baxırsan özünü tanımırsan. Əşi, yəni bu mənəm?

– İndi sən də belə dəyişmisən?

– Hərdən düşünürəm özümü tanımıram. Necə oldu ki, mən bu adamlarla uyuşdum? Uyuşdum yox e, dostlaşdım, mehribanlaşdım, eyniləşdim...

– Nə olar ki? Dostlaşmısan, dostlaşmısan da. Dostlaşmaq bəyəm pis işdir?

– Demirəm ki, pisdir. Məsələ onda deyil. Mən onlara alışdım. Başa düşürsən, meyillərinə, həvəslərinə, sözlərinə, zarafatlarına, ibarələrinə. Özlərinin, arvadlarının, uşaqlarının ad günlərinəcən əzbər bilirəm. Mövqelərinə də bələdəm, məclislərinə də, tostlarına, tamadalarına... əh!

– Yəni belə pis adamlardır?

– Eh, sən nə yapışmısan: pis-pis! Heç nə başa düşmürsən. Pis adam. Yaxşı adam! – əlini başına apardı, küləyin dağıtdığı saçlarını səliqəyə salmağa başladı, – dünyada nə pis adam var, nə yaxşı adam. Ömür elə uzun çəkir ki, ancaq pis olmağa, ya ancaq yaxşı olmağa heç kəsin hövsələsi çatmır. Görürsən biri həyatı boyu gah yaxşı olur, gah pis...

– Yox, baxma, yenə adamdan adama təfavüt var. Məsələn, tutaq ki, Dadaş necə adamdır?

Güzgüdə baxışları toqquşdu.

Təhminə güldü:

– Ay vələdüzzina, məndən söz almaq istəyirsən?

Zaur:

– Yox, – dedi, – mən camaatın şəxsi işinə qarışmaq istəmirəm.

Təhminənin baxışında əvvəlcə təəccüb oxundu, sonra nəyisə anlamış kimi:

– A, belə de, – dedi, ciddiləşdi və əlavə etdi: – Bax, bir şey məni çox maraqlandırır. Hamı elə bilir ki... – bir an tutuldu, qısa tərəddüddən sonra davam etdi. – Mən Dadaşın aşnasıyam. Çox yaxşı, indi məni maraqlandırır görüm, sən bu barədə nə fikirləşirsən? Bax, sən Zaur Zeynalov.

Zaur:

– Zeynallı, – dedi, – mən? Nə bilim, mənə elə gəlir ki...

– Sən özün də dedin ki, mən dünya gözəliyəm. Çox yaxşı. Deməli, istəsəm yüz sənin kimi cavan oğlan başıma fırfıra kimi fırlanar.

Zaur kəskin ədayla:

– Fırlansınlar da!

– Oho, damağına dəydi. Yaxşı, yüz yox, on, beş. Yaxşı, səndən bircə dənədir, bax, elə sən özün. Məndən xoşun gəlir, eləmi?

Zaur:

– Elədir, lap elədir, – dedi və əsəbi hərəkətlə qazı basdı. Maşın zəncirdən açılmış kimi irəli cumdu.

– Yaxşı, yaxşı, sakit ol. Dediyim odur ki, Dadaş mənim nəyimə lazımdır? Keçəl, yekəqarın, yekəburun, qoca. Ondan bir keçəcəyim, bir təmənnam da yoxdur. Müdirimdir. Çox olsun lap bəd başına məni işdən çıxartdıracaq, yəni bir yerdə bir parça çörək qazana bilməyəcəyəm? Siqaret ver görüm...

Yandırdı.

– Ay sağ ol. Məsələ ondadır ki, Dadaş özü də bunu başa düşür, hərif deyil. – Tüstünü halqa-halqa maşının tavanına üfürdü. – Dadaş barmağının ucuyla da mənə toxunmayıb. Yəni onda bir toxunası hal da yoxdur. Hay-hayı gedib, vay-vayı qalıb, – güldü, – amma burda bir məsələ var. Dadaşa şayiə, söz-söhbət lazımdır. Çünki o yaşda, o ağızburunda mənim kimi cavan, gözəl bir arvadın adamı olmaq onun başının ucalığıdır.

Yolun kənarında bir neçə nəfər dayanmışdı. “Moskviç”i görüb əllərini qaldırdılar. Maşın yanlarından ötüb keçəndən sonra arxadan qışqırışdılar.

– Məndən nə gedir? İndi ki bundan Dadaşın könlü xoş olur, qoy olsun, qoca kişidir.

– Düz demirsən. Mən eşitmişəm ki, söz düşəndə Dadaş həmişə bu şayiəni danır.

– Ay allah, nə yaman uşaqsan sən hələ! Əlbəttə, danacaq. O vaxt ki, bu şayiə yox idi, onu yaratmağa cəhd edirdi. Bəli, bəli, bu fikir onun özündən başqa heç kəsin ağlına gəlmirdi. Özü başladı belə rəy yaratmağa. Əlbəttə, çox ustalıqla, altdan-altdan. Nə bilim işdən bir yerdə çıxmaq, məni ötürmək, ikibaşlı sözlər, mənalı baxışlar. Məsələn, otaqda mənimlə qəsdən sırf rəsmi danışırdı. Çöldə-bayırda, dəhlizdə isə tutub uzun-uzadı söhbət edirdi. Özü də xısın-xısın, pıçıltıyla. Hamı da görür axı. Deyirlər, balam, bu nə söhbətdir ki, otaqda hamının yanında eləmirlər; xəlvətə çəkilirlər? Sonra başqa şeylər də vardı. Məsələn, bax belə xırda təfərrüat. Axşam bizə zəng eləyir, mənimlə, Manafla danışır. Görürsən, deyirəm ki, xəstəyəm, bəlkə sabah işə gələ bilmədim. Bəli, səhər, idarədə bunu belə xüsusi cür xəbər verir: Təhminə bir balaca kefsizləyib, bu gün işə gəlməyəcək.

– Yaxşı, sən də sözbazlıq eləmə də, burada nə var ki?

– Başa düşmürsən? Guya bu məlumatı sadəcə telefonla almayıb, hamıda belə təsəvvür oyanır ki, guya bu nə isə yaxın, məhrəm adamdır, bir sözlə, ev adamıdır. Ailənin içindən gəlib işdə xəbər verir. – Susdu və bir qədər əsəbi əlavə etdi: – Təhminə işə gəlməyəcək. Guya başqası bunu zəng eləyib bilə bilməzdi. Kibriti ver görüm. Sönüb. Aha... Hə, sonra ki, başladı söz-söhbət, eyhamlar, onda da arifdi, başladı danmağa, özü də elə can-başla danmağa başladı ki, yatanları da ayıltdı. Çox vaxt görürsən, özü bu söhbəti heç eşitməyənlərə eşitdirirdi: əşşi mənimçün söz çıxarıblar, yaxşı deyil, qızım yerindədir; gedər ərinə çatar, duz-çörək kəsmişik, filan-peşməkan. Deyərsən daha bundan namuslu adam yoxdur, – istehzayla əlavə etdi, – qeyrət dağarcığı, – susdu, sona yenə sözünə davam etdi. – Hə, belə-belə hamıda fikir oyandı ki, bəli, burda mütləq bir iş olmamış deyil. Mən də qaldım gic vəziyyətdə. Hər sözümü, hər hərəkətimi başladılar müəyyən yerə yozmağa. Dadaşa mehribanlıq da göstərsəm, etinasızlıq da, heç fərqi yoxdur. Hər şeyi bir cür başa düşürlər.

Birdən nədənsə Zaurun Təhminəyə yazığı gəldi. Düşündü ki, bütün bu yüngülməcazlığına, əzilib-büzülməsinə baxmayaraq, yəqin, onun da öz dərdi-səri var.

Təhminə:

– Əlbəttə, – dedi, – mən də istəsəm, yüz cür kələk qurub işin içindən çıxaram. Məsələn, bəd ayaqda adımı bir başqasıynan çıxardaram. Dadaş da qalar qurumsaq kimi baxa-baxa.

Qəfildən maşının güzgüsündə gözləri Zaurun nigaran baxışlarıyla haçalandı, bir an içində şıltaq bir fikir beynindən keçdi.

– Məsələn, – dedi, – şayiə buraxardım ki, səninlə sevişirəm. Hamı da inanardı, çünki, maşallah, şəkil kimi göyçək oğlansan, özün də subay, – şaqqıldadı, – bura bax, yoxsa elə bilirsən səninlə plyaja getməyə də onunçün razı oldum, məqsədim var, hə? Düzünü de, sən allah, elə fikirləşirdin?

– Arvad deyilsən sən, şeytansan, şeytan.

– Nə olar? Qoy şeytan olum. Bir var dəli şeytan. Mən də dərdli şeytanam.

– Nədir axı sənin dərdin, Dadaş?

Təhminə bu sözləri də qulaqardına vurdu, cavabsız qoydu.

– Bəli, çox şey edərdim, – dedi, – etmirəm, çünki mən adamların hamısını başa düşürəm. Bilirəm bu dünyada kimə gərək olan nədir. Dadaşa ancaq vur tut quru söz-söhbət lazımdır. Necə deyərlər, ocağın tüstüsü. Nə olar, qoca kişidir, qoy könlü xoş olsun. Məndən nə gedir?

– Necə nə gedir? Bəs, adına ləkə gəlmir?

– Əzizim, – dedi, – adlarına ləkə düşməkdən qorxan bilirsənmi kimlərdir? O adamlardır ki, təmiz elə bir adlarıdır, özləri çoxdan çirkab içindədirlər. Ona görə də ancaq quru adlarını qoruyurlar. Aman günüdür ləkə düşər. Əgər mən özümü ləkəli bilmirəmsə, adamlar adıma nə ləkə vurur-vursun vecimə deyil.

– Bəs, Manaf da belə duşünür?

– O...mənim ərim ayrı oğlandır. Dünyada tayı-bərabəri yoxdur. Deyir ki, ürəyim buz kimidir, arvadımdan arxayınam. Təhminə aydan arıdır, sudan duru, intəhası, gözəldir. Gözələ həmişə söz qoşarlar, o qədər paxıl gözügötürməyən var ki... Düz demir, sən allah?

– Nə bilim, yəqin düz deyir də.

Təhminə rişxəndlə ona baxdı.

– Elə bilirsən dediyinə özü inanır? Qəlbinin dərinliyində bilir ki, mən onu sevmirəm, deməli, ona sadiq də deyiləm. Ancaq bu fikri bey-

nindən rədd edir, bu barədə düşünmək belə istəmir. Amma orda, lap, lap ürəyinin dibində, barmağını Zaurun köksünə sarı uzatdı, – bax burda bir quyu var ha, onun lap dibində, özünə belə təsəlli verir ki, nə olsun, mən də Təhminəyə xəyanət edirəm. – Təhminə bərkdən güldü. – Amma məndən beşbetər aşnaları bir ifritə bədəncərədirlər, gəl görəsən! İkisini mən tanıyıram. Biri Bakıdadır, biri Tiflisdə. Kişinin oğlu mecduqorodnı Don-Juandır. Yəqin Moskvada da adamı var, amma mən tanımıram. Hər halda tez-tez bəhanə tapıb cumur Moskvaya. Odey, indi də bir aydır Moskvadadır. Deyəsən, günü pis keçmir. Tezliklə qayıtmaq fikri yoxdur.

Laqeyd, tənbəl hərəkətlə maşının güzgüsünü özünə tərəf çevirdi, dodaq boyasını çıxarıb dodaqlarını boyamağa başladı. O, solğun boyaları sevmirdi, həmişə dodaqlarına al-qırmızı rəng çəkir, özü də boyanı dodağına elə sıxırdı ki, dodağı qat-qat boyanırdı. Boyanı bağlayıb balaca çantasına qoydu.

– Amma zövqü bir şey deyilmiş. Bilmirəm heç məni necə bəyənib. Bakıdakı dəhrəcanlı bir şeydir, dam boyda. Tiflisdəki də dəmbərəgöz, Allah göstərməsin.

Zaur:

– Sən də bütün bunlardan belə sakit danışırsan, – dedi və öz sualından özü utandı. – “Deyəsən, hansı əsrdə yaşadığını unutmusan, Zaur kişi” – deyə düşündü.

– Eh, mənə nə! Od ver görüm. Sağ ol. Birinci dəfə eşidəndə pis oldum. Sonra adət etdim, laqeydləşdim. Ən ləzzətlisi də odur ki, elə bilir mənim heç nədən xəbərim yoxdur. Gəlir, belə ciddi tonla “sovnarxoza çağırmışdılar” – deyir. – “Tiflisə bir həftəliyə ezamiyyətə göndərirlər”. Mən də bilirəm axı, işdən öz hesabına bir həftəlik məzuniyyət alıb. “Sabah gedirsən? – deyirəm, – yoluna nə hazırlayım?” Bəli, Tiflisdə də şıdırğı hazırlıq gedir. Bir nəfər var, mənə danışıb. Deyir arvadın ayrıca mənzili var, iki otaq. Manaf teleqram vuranda ki, bəli gəlirəm, otaqlara xüsusi xəli döşənir, döşəkçələr, mütəkkələr düzülür, kişinin oğlu keçmiş xansayağı kef eləyir. Sonra...

Zaur çevrilib Təhminəyə baxdı. Təhminə tuşla çəkilib uzadılmış kirpiklərini qaldırdı. Birdən Zaur onun gözlərinin lap dibini gördü. Səhrada qəflətən qum axıb-çöküb quyu açılan kimi, Təhminənin gözlərində nə isə uçub-dağılmışdı, gözlərinin lap dibində, bəlkə də dibsizliyində nə isə zil qaranlıq bir lağımın ağzı açılmışdı. Qəlbin gizlinlərinə açılan bir lağım, uçuruma aparan bir yolun ağzı.

Zaur:

– Lazım deyil, – dedi, – danışma. Keç ayrı söhbətə.

– A... belə de. Bu cür söhbətlər sənin zərif qəlbinə toxunur. Bəs, özünü elə göstərirdin ki, müasir oğlansan, həyatın hər üzünü görmüsən, dəyirmanın bu başından girib o başından çıxmısan, – gözlərini qapamadı, amma gözlərinin içindəki quyunun ağzı tutuldu, gözləri yenə də həmişəki kimi şıltaq və işvəkar, şux və işıqlı idi, – nə oldu, xoşun gəlmir belə söhbətlərdən? Həyatdır da bu, oğlum, həyat demirsən, qulaq as!

– İstəmirəm. Bu həyat deyil, həyatın astarıdır. Mənim belə söhbətlərdən xoşum gəlməz. Görürəm səninçün danışmaq ağırdır, danışma, nə vacib olub...

– Ağırdır? Əksinə. Ağır neçin olur? Ağır-zad deyil. – Uzun zaman yola baxdı, sonra, – mən Manafı başa düşürəm, – dedi, – cavanlıqda çətin dolanıb. Ailə saxlayıb. İndi, necə deyərlər, bolluğuna düşüb. Yaşı keçdikcə cavanlıqda ötürdüyü dəmlərin əvəzini çıxmaq istəyir. Dünyada ən yaman dərd görməmişlikdir.

Siqaret tüstüsündən boğuldu. Bir xeyli öskürdü. Sonra birtəhər sakit oldu.

– Tiflisdən gələndə də yoluna yemək qoyurlar, – dedi, – qab-qacağı bilmirəm gizlədir, ya atır. Bir dəfə, bilmirəm, içmişdi, ya kef başına vurmuşdu, çaşıb evə Asyanın qab-qacağını gətirmişdi. Tiflisdəki arvadın adı Asyadır. Belə göy kasa idi. Noxud-noxud ağ naxışlı. Mən də götürüb gizlətdim. Gələn səfər Tiflisə gedəndə yeməyini o kasaya qoydum. Elə bilirsən, başa düşdü?

– Deyirsən iki evin qab-qacağını əzbər bilsin?

– Yox, heç olmasa Asya xanım onu başa salaydı.

– Nə bilirsən, bəlkə Tiflisə çatanda da sənin qab-qacağını gizlədir?

Təhminə şaqqıldadı.

– Bax, bu, mənim ağlıma gəlməmişdi. Yox, bala, gələcəyin parlaqdır, – sonra çılğınlıqla əlavə etdi: – Dünyada ən çox acığım gələn şey riyakarlıqdır, bir də yalan...

Zabratın yanından Pirşağı yoluna buruldular. Avtobus dayanacağında bir kişi uzaqdan “Moskviç”i görüb əl qaldırdı.

– Saxla götürək onu.

– Bir o çatmırdı.

– Xahiş edirəm saxla. Yoxsa bütün söhbətlərimiz qurtardı, danışmağa sözümüz qalmadı, heç olmasa saxla görək nə istəyir.

Zaur ayağını əyləcə basdı. Maşın sürüşüb dayandı.

Kişi sadə kəndli geyimində idi. Yanında çarşablı bir arvad da vardı. Maşın dayanan kimi kişi zənbilini qapıb maşına tərəf gəldi.

– Qardaş, – dedi, – Pirşağıyacan apararsan bizi?

Təhminə:

– Gəl aparaq, – dedi, – gör nə yorğundurlar.

Zaur:

– Yaxşı, oturun, – dedi.

Kişi arvada əl elədi. Sonra ucadan qışqırdı:

– Bəri gəl, Əlmərdan.

Dayanaq köşkünün altından ucaboylu bir oğlan çıxdı. Axsaya-axsaya maşına tərəf gəlməyə başladı:

Zaur:

– Ancaq iki yerim var, – dedi və Təhminəyə tərəf dönüb əlavə etdi. – Ya moqu vzyat tolko dvoix. Vstretiş qaişnikov, nepriyatnostey ne obereşsya. Hara gedirsən, bunlar kimdir? Özün bilirsən də... budut spraşivat i o tebe.

Oğlan axsaya-axsaya gəlib maşına çatdı.

Zaur:

– Əmi can, – dedi, – iki yerim var. Ancaq ikiniz otura bilərsiniz.

– İkimiz? A bala, bəs bu üçüncü yoldaşı neyləyək?

– Üçüncü kimdir?

– Üçüncü? Gözümün ağı-qarası. Bircə oğlum. Gedib şəhərdə imtahanlarının hamısını beşə verib. Boyuna qurban olum onun.

Zaur əllərini yellədi.

– Təbrik edirəm, – dedi, – gözünüz aydın. Ancaq... daha neyləyək, yerimiz ikidir.

Əlimərdan:

– Dədə, ay dədə, – odey, bax avtobus gəlir...

– Ay səni xoşxəbər olasan. Əşi, bir saatdır gözləyirdik. Oğlum, bağışla, sizi də yoldan elədik.

– Allah bağışlasın.

"Moskviç" hərəkətə gəldi, uzaqlaşıb getdi.

Təhminə:

– Radio işləyir? – dedi, – bir şey tut.

– Hələ tezdir. Bir azdan...

Şlaqbaum lap "Moskviç"in burnunun qabağında endirildi. Maşın yerə mıxlanmış kimi dayandı. Dəmir yolunun o biri tərəfində də iri yük maşınları dayanıb gözləyirdi. Təhminə:

– Bilmirəm niyə, – dedi, – axır vaxtlar tez-tez yuxumda şlaqbaum görürəm. Zol-zol şlaqbaum.

Zaur:

– Səndən də sözlər çıxır a, – dedi, – adam da yuxuda şlaqbaum görər?

– Deməli, görərmiş də ki, görürəm. Əvvəllər həmişə yol görərdim. Uzun-uzadı yol. Getdikcə gedirsən, getdikcə gedirsən. Heç hara da gəlib çıxmırsan. İndi də şlaqbaum görürəm.

Uzaqdan qatar göründü. Yaxınlaşdı, hay-küylə keçib getdi. Səs-küy içindən Təhminənin sözləri qırıq-qırıq eşidildi:

– Görürəm... haçan... zolaq...

Yol gözətçisi qalın məftilli hərləngəci fırlatmağa başladı, şlaqbaum yuxarı qalxdı.

Hər iki tərəfdə dayanmış maşınlar irəli cumdu. Zaur “Moskviç”i qabarıq relslər üstündən ehmallıca keçirdi. Maşınsız yola çıxıb sürəti artırdı. Külək pəncərələrdən içəri doldu.

Təhminə:

– Üçüncü! – dedi. – Fikir verdin? Yaxşı sözdür, hə? Bayaqdan bəri fikirləşirəm. Bundan yaxşı söz tapmaq çətindir, hə? Nə qədər məna var bu sözdə?

– Hansı sözdə?

Suala cavab vermədi.

– Həyatın mənası da elə budur da!

– Xeyir ola, yenə həyatın mənasından dəm vurursan? Yoxsa, sənin də könlünə filosofluq düşüb?

– Bəs, nə bilirdin? Bilmirsən ki, mən filosofam, diplomum da var hətta? Fəlsəfə fakültəsini qurtarmışam.

– Yox əşi... Yatsam yuxuma da girməzdi.

– Sən ki yuxu görmürsən.

– Görsəm də, görməsəm də, hər halda heç təsəvvür eləyə bilməzdim ki, sən filosofsan.

– Niyə? Fəlsəfə hara, mənim kimi yelbeyin hara, hə?

– Yox, mən elə demək istəmirdim. Amma, ümumiyyətlə, mənə elə gəlir ki, fəlsəfə arvad işi deyil.

– Yox, əzizim, əsil elə arvad işidir. İntəhası kişilər fəlsəfəni kitablardan çıxarırlar, arvadlar qarınlarından. Bağışla a, deyəsən bir az kobud çıxdı... Xətrinə dəymədi ki... Sən geofakı qurtarmısan da?

– Bəli.

– Diamat keçmisən?

– Keçmişəm.

– Bilirsən tezis, antitezis, sintez nədir?

– Məni imtahan eləyəcəksən?

– Yox, bir fikir ver. Birinci tezis, həmi? İkinci, onun əksi antitezis. Üçüncü ikisinin sintezi, hə?

– Yaxşı, nə olsun?

– O olsun ki, bax, uşaq da üçüncüdür – sintez. Qadın tezisdir. Kişi antitezis. Uşaq sintez. Bax, mən tezisəm, sən antitezissən... – qəfilcən susub dayandı.

Zaur: "İşə düşmədik, – deyə düşündü, – heç bilməzdim ki, belə səftərəngidir. Sən tezis, mən antitezis, uşaq sintez. Bircə uşaq çatmırdı..."

– Heç fikirləşmisən ki, dinin də, fəlsəfənin də, cürbəcür etiqadların da əsasında üç rəqəmi var? Çünki həyat elə bu üçlük deməkdir. Üçüncü – uşaq deməkdir, nəticə, çıxış, yol, məna, məntiq deməkdir. Son deməkdir. Bəlkə elə ona görə də uşağı olmayan adama sonsuz deyirlər. Sonsuz! Dəhşətli sözdür, eləmi?

– Yaxşı, bu qədər "uşaq, uşaq" deyirsən, bəs, özünün niyə uşağın yoxdur?

– Mənim? Ha, ha, ha. Mənim ha? Əzizim, bütün bu dediklərim nəzəri mülahizələrdir. Dəliyəm ki, uşağım olsun? Dünya beş gündür, əzizim, gəz, dolan, kefini çək.

– Manaf da belə deyir?

– Manaf? Yox, Manaf yəqin istəyir. Kişilərə nə var ki? Onlara nə əziyyət düşür? Amma, bəs, mən yazıq deyiləm ki, cavan ömrümü uşağın cığ-vığında çürüdüm? Yox, əzizim, uşaq saxlamaq, böyütmək mənim təbiətdə adamçün deyil. Odur qonşumuzda bir arvad var, Mədinə. Görürəm də, uşaq dığ eləyib onu, canını boğazına yığıb. İndi üç yaşındadır. Arvada göz verir, işıq vermir. Əri də yazığı atıb gedib.

– Atıb gedib?

– Hə. Elə birinci il. Uşaq olandan altı ay sonra. Bir yandan namərdlikdir, bir yandan baxanda da, yazıq başını götürüb qaçıb. Uşaq aman vermirdi ki... Sutkada 24 saat ağlayırdı.

Aralığa yenə sükut çökdü. Dəniz hələ görünmürdü. Amma elə bil nəfəsi, havası, iyi duyulurdu.

– Uşaq olmamışdan kişi lap Mədinəni divara çıxardırmış ki, bəs, uşaq istəyirəm. Sonra bir gün Mədinə deyib ki, hamiləyəm. Kişinin az

qalıb ürəyi getsin. Başlayıb şadlığına şitlik eləməyə. Səhərisi gün qoyun kəsdirib. Mədinə deyir ki, doqquz ay başıma pərvanə kimi dolandı. Deyir, gəlib qulağını qoyardı qarnıma, qulaq asardı, görsün nə eşidir; uşaq hərəkət eləyir, yoxsa yox. Diqqətlə, deyir, qulaq asırdı, dəqiqələrlə. Lap saatsaz saata qulaq asan kimi, – adəti üzrə yenə qəfilcən susdu, söhbətini yarımçıq kəsdi. Baxışları yenə də maşının güzgüsündə toqquşdu. Təhminənin gözləri uzaqlaşmışdı. Harasa çox-çox aralı bir aləmə çəkilmişdi. Susması kimi yenidən danışmağa başlaması da qəfil, gözlənilməz oldu, – axı mənim atam saatsaz idi. Yadımdadır, xarab saatları gətirərdi. Düzəldərdi, sonra qulağına qoyub dinlərdi. Tam dəqiq işləyib-işləmədiyini səsiylə təyin edərdi. Bax, o kişi də arvadının qarnına belə qulaq asarmış. Bir kinoda görmüşəm, kəndçilər də torpağa elə qulaq asırlar. Gördüm, lap atam yadıma düşdü. Geoloqlar da bəzən yerə qulaqlarını qoyurlar. Düzdür, hə, axı, sən geoloqsan?

– Hə, düzdür.

– Yaxşı, bəs geoloq dağda-daşda olar, sən nəşriyyatda niyə işləyirsən?

– Bu, uzun söhbətdir. Sonra danışaram... Deməli, kişi arvadının qarnına qulaq asıb-asıb, nə eşidibsə qaçıb gedib.

– Yox, uşaq olandan altı ay sonra getdi. Dedim ki, bayaq sənə.

İndi dənizin nəfəsi, havası lap aydın duyulurdu.

– Bilirsən, Mədinə danışır ki, hamilə vaxtı adam içəridən uşağın istisini hiss edir... Elə bil qarnında soba gəzdirirsən.

Zaur:

– Personalnaya peredvijnaya peç, – dedi, – zapas batarei 9 mesyatsev.

– Gülmə. Gör bir sənə bu gün nə qədər bilik verdim.

– Xüsusilə ginekologiya – mamaçalıq cəhətdən. Sabahdan rahat gedib doğum evində işləyə bilərəm.

Əlini uzadıb radionu qurdu. “Araz” proqramının çağırtısı eşidildi. Sonra qadın diktorun səsi gəldi:

– Danışır Bakı! Yerli vaxtla saat 17-dir. Son xəbərlər. Nyu-York. Birləşmiş Millətlər Təşkilatının təhlükəsizlik şurası səhər iclasında...

Təhminə əlini uzadıb radionu keçirdi.

– Bilirsən, mən həmişə nə fikirləşirəm. Amma gülmə. Bax, uşaq dünyaya gələn kimi ağlayır. Hə? Görəsən bəs ana bətnində də ağlayır?

Zaur cavab vermədi. Çönüb Təhminəyə baxdı, başını buladı.

Təhminə hırıldadı:

– Təsəvvür eləyirsən? Küçədə arvad gedir, qarnı burnunda. Öz qarnını sığallayır, "ağlama, bala, – deyir, – ağlama, ağlama" – əlləriylə qulaqlarının ucunu dartdı, – Allah göstərməsin, – dedi, – Allah göstərməsin!

– Olmaz keçəsən ayrı söhbətə?

– Ayrı söhbətə? Yaxşı, bu saat sənə gülməli şey danışacam. Mədinə ərindən ayrılandan sonra...

– Yenə Mədinə?

– Yox, dayan, indi ayrı şey danışıram. Kişi Mədinədən ayrılanda, deməli, otaqları böldülər. Biri qaldı Mədinəyə, biri – kişiyə. Sonra kişi dəyişdi, amma bir müddət qonşu oldular. Hə, Mədinə danışır, deyir bir gün Rafiqi yatızdırmışam, yaydı, çıxmışam şüşəbəndə, oxuyuram özüm üçün. Yaman deyib-gülən, çalıb-oynayan arvaddır. Ölmüşün yaxşı da səsi var. Hə deyir, oxuyuram, o mahnı var e, "Ətrini yastığından alıram, sənsiz?" Bəli, oxuyuram, getmişəm özümə, bir də görürəm o biri otaqda kişi pəhəpəh bərk boğazını arıtlayır. Dayandım, fikirləşdim, dedim ağrım ürəyinə, sonra elə bilər onunçün oxuyuram, onun ətrini yastığından alıram. Külbaş həmişə tənbəki iyi verərdi. Ay sən öləsən, dedim, yalansa səni görüm torpaq səndən hündür olsun! Nə uzadım, deyir, getdim, evdə nə ki balış vardı, hamısının üzünü çıxartdım, yudum, sərdim eyvandan, lap qapısının ağzından. Niyə gülmürsən, gülməli deyil?

– Əcəb arsız arvaddır!

– Yamanca arsızdır. Görürsən deyir ərindən, kişini yaş yuyur, quru sərir, söyür, nə bilim qarğayır, ağlayır, sonra başlayır oğlunu öpməyə, dişləməyə, deyir qurban olum buna, ər nəyimə lazımdır, atam da budur, qardaşım da, ərim də. Bir də görürsən gözlərinin yaşı qurumamış götürdü uşağı, düşdü ortalığa, başladı süzüb oynamağa.

Zaur:

– Bu da dəniz, – dedi.

Hələ çəkilib bitirilməmiş rəsm kimi idi dəniz. Elə bil rəssam kətana yalnız bir neçə cizgi çəkmişdi – sahilin köbəri, üfüq xətti, nöqtə-nöqtə qayalar. Vur-tut ikicə də rəngə əl atmışdı: maviyə, səma və dəniz üçün, bir də sarıya, sahil qumları üçün. Elə bil seyrək kətanın üstündə hələ çəkiləsi çox şey vardı. Səmaya pərən-pərən buludları,

dənizə köpüklü dalğaları əlavə etmək olardı. Göydə qağayılar çəkmək olardı, yerdə əlvan köşklər, suda ağ yelkənlər. Sahildə, dənizdə adamlar çəkmək olardı. Ancaq hələ heç biri çəkilməmişdi. Nə dalğalar vardı, nə yelkənlər, nə qağayılar, nə də adamlar.

– Bax, bu yol Pirşağıya gedir, ancaq sən bu yana burul, aha, bax belə, indi tut bu yolun ucundan, sür. Gedib mən deyən yerə çıxacaqsan.

Maşın torpaq yolla atılıb-düşməyə başladı.

– Hələ çox gedəcəyik?

– Gəlib çatdıq. Saxla.

Dişdəm-dişdəm qayalar bu plyajı sahilin o biri sahələrindən ayırırdı. Bura lap xəlvət yer idi. Təpə tənha. Torpaq yol da gəlib qumlarda itirdi.

Maşını saxlayıb qumluğa düşdülər. Təhminə ayaqqabılarını çıxarıb əlinə götürdü. Ayaqlarında narın qumların xoş qıdığını duyanda elə bil vaxt uzaqlarında qalmış qərib bir diyara – uşaqlıq diyarına düşdü. Boğazında qəhərlənən ılıq, sentimental bir dalğadan boğulacağından qorxaraq, dərhal özünü ələ aldı, bütün oyanan, baş qaldıran xatirələri süpürüb atdı.

– Çantanı bəri ver, – dedi. Arxa pəncərənin qabağında fotoaparatı görüb bu mövzudan yapışdı. Uşaqlıq diyarından qaçdı.

– Sən foto çəkirsən?

– Hərdən-birdən. Aparat çoxdan yadımdan çıxıb maşında qalıb.

– Götür, şəklimi çəkərsən.

“Yox, əzizim, keçəl suya gedən deyil, – deyə Zaur düşündü.– Zaur kişi lap sən deyən uşaq deyil, şəkil sənəddir. Mənim də belə-belə sənədlərdən xoşum gəlməz”.

Ləpədöyənə çatdılar. Zaur əlini suya vurub:

– Qiyamət sudur – dedi və soyunmağa başladı.

Mis kimi qaralmış bədəni boynundan topuqlarınacan əzələ idi. Hər hərəkətində əzələlər oynayırdı. O özü də bu əzələ oyunundan və oyunun yaratdığı mənzərədən həzz alırdı.

– Bəs niyə soyunmursan?

– Mən hələ çimmirəm.

– Niyə?

– İstəmirəm.

Elə qəti səslə dedi ki, Zaur inad eləmədi. Əllərini torpağa qoyub, iki dəfə mayallaq aşdı. Bir neçə kərə tullandı, əl-qol atdı. Sonra dənizə cumdu.

Bayaqdan bəri gözlərini ondan çəkməyən Təhminə paltarını soyunmadan dənizin içinə girdi, su dizinə qalxanacan irəlilədi.

Zaur bir-iki dəfə suya baş vurdu. Həftənin, işin, yolun ağırlığı qat-qat, qabıq-qabıq canından çıxırdı. Suyun üzdə yuxu kimi ılıq, dərində soyuq axını dərisini oxşayır, əzələlərinin gərginliyini boşaldır, əsəblərini sakitləşdirirdi. Nənəsinin sözü yadına düşdü. "Xalçanı yatımına görə sığallayarlar". Elə bil dəniz onu yatımına görə sığallayır, oxşayır, dincəldirdi.

Üzüb uzaqlara getdi, sahil kiçildi, maşın sarı fonda yaşıl ləkəyə çevrildi. Təhminə görünməz oldu. Su boy vermədi. Dənizin əzəmətli hüdudsuzluğu, ləpəsiz hamarı, dəniz sakitliyinin baş gicəlləndirən ahəngi bir an vahimə kimi onu basdı, eymәndirdi.

Lakin dərhal özünü topladı. Uzun illərin idman məşqlərini, üzgüçülük məharətini xatırlayıb rahatlaşdı, toxtadı. Bildi ki, bu hiss, su boy vermədiyindən, bir də dənizin aram ləngərindən oyanır. Qollarını açdı, dənizin üzündə xaçvarı uzandı. Göyü gördü. Hardansa gəlib keçən seyrək buludlara baxdı.

Təhminəni düşündü. Onun qənirsiz gözəlliyini, boyalı dodaqlarını, sürməli gözlərini, uzun ayaqlarını. Gülüşündəki, səsindəki, qoxusundakı qadın cazibəsini. Xasiyyətindəki qəribəliyi, pərakəndəliyi, söz-söhbətinin dağınıq məntiqsizliyini...

İstədiyi və isindiyi başqa qadınları xatırladı və etiraf etdi ki, hələ heç birisi onu bu dərəcədə cəzb etməyib. Sövqi-təbii, ancaq qəti bir arxayınlıqla bilirdi ki, özü də Təhminənin xoşuna gəlir. "Yaxşı, bəs, beləysə, biz sadəcə, bir-birimizin ola bilmərikmi? Bəs nə üçün bu təbii, insani istəyə mütləq cürbəcür don geyindirmək lazımdır – nə bilim hiss, duyğu, məhəbbət, intizar, nə bilim daha nə cür təmtəraqlı, boş-boş bekara sözlər. Nə üçün, axı nə üçün bu qədər yersiz hədər, havayı söz demək lazımdır? Nə üçün bu qədər danışmaq lazımdır? Əgər biz hər ikimiz bunu istəyiriksə, bu olmalıdırsa, mütləq olacaqsa, bütün bu sözlər, nə mənim, nə də onun inanmadığı sözlər, duymadan, istəmədən kimə lazımdır? Mənə yox, ona yox. Bəs kimə? Burada bizdən başqa kim var ki? Heç kəs... Ancaq yenə də nə mənə, nə də ona lazım olan sözlər deyilməlidir, sanki burda kimsə, başqa bir görünməz var, onun xatirinə, onun başını tovlamaq üçün. Nə qəribə! Bəlkə bu da bir dəbdir, adət-ənənədir?

O, Təhminənin bütün yoldakı danışıqlarını da bax elə bu dəbin nömrələri sayırdı. Gərək mütləq əvvəl-əvvəl o yandan-bu yandan,

kənar-kənar işlərdən danışasan, göstərəsən ki, yox heç vəchlə ola bilməz ki, mənim fikrimdə bir elə o məsələ olsun. Yox, yox, əksinə, bu heç mənim ağlıma da gəlmirdi. Sən nə danışırsan? Yox, yox... Ay-hay! Bu yalan, riyakarlıq kimə gərəkdir? Dedim ki, gedək plyaja ikimiz, ha, bax mən o sözləri deyəndən, sən razılaşandan indiyəcən bütün keçən vaxt ərzində, nə danışırıq danışaq, ikimizin də fikrində bir budur. Sənin də, mənim də. Yaxşı bəs bütün uzun müqəddimələr, uvertüralar, bu cürbəcür don geyindirmək komediya deyil, nədir?

Heç olmasa mənimlə dənizə girəydi. Bəlkə dənizdə adam yarımçılpaq olanda, sözlərə, istəklərə də don geyindirib bəzəmək lazım olmur. Bəlkə dənizdə bu boş sözlərsiz də keçinmək olar. Deyərdim, gəl sənə üzmək öyrədim, toxunardım, qucaqlardım, sinəmə sıxardım. Vəssalam.

İndi sahildə gərək bütün mərhələləri keçəsən. "Saçların nə gözəldir, qoy sığallayım, bəli, əlini saçına çəkirsən, sonra boynuna, sonra birdən qəfilcən, guya ki, coşub qucaqlayırsan, bəli, ehtirasın aşıb-daşıb, sonra... tfu!

Sahilə tərəf üzməyə başladı. Təhminə görünmürdü. Sahilə çıxdı. Boylandı. "Bəli də, işimiz var!" Bərkdən çağırdı:

– Təhminə!

– Burdayam.

Başını qaldırıb qayanın zirvəsində Təhminəni gördü.

– Ehtiyatlı ol, yıxılarsan!

– Qorxma. Aparatı götür. Çək mənim şəklimi bax burda.

– Yaxşı.

Aparatı götürdü. Sayğacına baxdı. Lent çoxdan qurtarmışdı.

– Tərpənmə, – dedi, sakit dayan. – Aha, oldu.

– Belə də çək. Bax bu cür.

– Yaxşı. Aha. Oldu. Di düş bura.

Təhminə qayaların üstündən keçi kimi tullana-tullana lap aşağı düşdü.

Zaur yerə sərələnmişdi, özünü günə verirdi. Tüklü sinəsi qabarıb-enirdi. Sonra üzüstə çevrildi, torpağa sərilib quyu qazmağa başladı.

Təhminə çantanı açıb yuxa, göyərti, qırmızı turp, ağ pendir çıxartdı. Kiçik salfeti sərdi.

Həmişə kefdə-damaqda yaşayan bu məclislər gözəli elə bir evdarlıqla süfrə açırdı ki, Zaur ona sonsuz bir təəccüblə baxırdı.

– Mən heç bilməzdim ki, səndə belə evdarlıq damarı var.

– Bayaq dedim, yenə də təkrar edə bilərəm ki, sən hələ çox şeyi bilmirsən. Bax, məsələn, bilmirsən, mən bu çantada sənə nə sürpriz hazırlamışam.

Zaurun barmaqları qazdığı quyuda suya çatdı. Başını qaldırıb:

– Nə sürpriz? – deyə soruşdu.

Təhminə cavab vermədən əlini çantanın içinə salladı. Tünd rəngli bir şüşə çıxartdı.

– Moskvadan gətirmişəm, – dedi. – Bir il idi gizlədib saxlamışdım. Sənin qismətin imiş. Fransız konyakıdır. "Kamyu". Düzdür, konyakı belə zakuskayla içməzlər, amma daha keçib.

"Vallah, bəhməz almışam, bal çıxıb, – deyə Zaur düşündü və öz-özünə zarafat elədi. – bax Zaur kişi, almaq-boşamaq söhbəti olmasın".

– Nəyə gülürsən öz-özünə?

– Heç, vallah, Təhminə, səndən bircə dənədir.

Sonra Günəş qürub etməyə başladı. Paslı qürub dənizə də pas saldı. Sonra içdilər. Bir də içdilər. Bir də. Bir də. Sonra ay çıxdı.

Sonra Zaur qolunu Təhminənin boynuna saldı. Təhminə onun qolunu şarf kimi boynundan açdı.

– Dayan, – dedi, – dayan. Sən fotoqrafsan, gərək biləsən, məhəbbət də foto kimi qaranlıqda aşkar olur.

Sonra Təhminə:

– Gəl gecəni burda qalaq, – dedi.

Zaur cəmisi dörd qədəh içmişdi və düşündü ki, keçən ay iki yüz manat verib "Moskviç"inə ölüm-zülümlə dörd dənə qəttəzə "yaroslavski pokrışka" alıb. Bu çöllü-biyabanda qalsalar, gecə gəlib maşını tamam soyub-talaya bilərlər. Əlbəttə, o, idmançıdır. Ştanqadan dərəcəsi var. İkisini-üçünü şil-küt eləyə bilər. Amma birdən dəstəylə gəldilər, silahla?

Sonra o bir qədəh də içdi və:

– Gözəl fikirdir, – dedi, – qalırıq gecəni burda.

Sonra Təhminə uşaqlığından danışmağa başladı. Üçüncü sinifdə oxuyanda bir rəfiqəsi onu ərlə arvad arasındakı əlaqələrdən, uşaqların doğulmasından agah edib. – Axmağın birisi, – dedim, – sənin öz atan–anan belə eləyir, mənim atam-anam heç vaxt belə iş tutmaz. O, sırtıq-sırtıq üzümə baxdı, güldü: – Axmaq sən özünsən, – dedi. – Bəs, onda sən necə dünyaya gəlmisən, hə, necə? Mən onunla dalaşdım, küsüşdük. Amma düşünüb bildim ki, düz deyir. Cürbəcür şeylər yadıma

düşdü. Neçə gün ata-anamın üzünə baxa bilmirdim. Elə hey soruşurdular ki, qızım, sənə nə olub? Cavab vermirdim. Ürəyimdə deyirdim ki, nə olub, nə olub? O olub ki, sizdən zəhləm gedir, utanmazlar!

Sonra Zaur dedi ki, yenə ər-arvad, uşaq söhbəti salma, içirəm sənin sağlığına.

Təhminə:

– Mən də sənin sağlığına, – dedi, – uşaq istəmirəm, ancaq səndən istərdim.

Zaur dedi ki, xeyr, bağışlayacaqsan, sonra əlavə etdi ki, heyif duz yoxdur. Turpu duza batıranda ayrı ləzzətdir.

Sonra ulduzlar çıxdı və Təhminə dedi ki, elə bil göyə duz səpiblər. Duzlayıblar göyü elə bil, duzu səninçün səpiblər, batır turpu ulduzlara, ye, Zaur dedi ki, onda ulduzları hər nə istəsən, təsəvvür etmək olar, məsəlçün, tum.

Təhminə dedi ki, əlbəttə, olar, gəl götürək ulduzları çırtlayaq.

Tamam qaranlıq oldu və Zaur əlini Təhminənin paltarındakı düymələrə atdı. Təhminə onun əlini kənara çəkib dedi ki, dayan, sənə bir nağıl danışım. Zaur da dedi ki, nağıl istəmirəm, səni istəyirəm. Təhminə də dedi ki, elə bu nağıl mənim özüm haqqındadır. Bu nağılı ona nənəsi danışıb, lap çoxdan. Əsliynən Kərəmin nağılıdır. Deyir, toy günü Əslinin atası Əsliyə bir paltar bağışlayır. Bax lap bu mənim paltarım kimi yaxadan dizəcən düyməli. Sən demə bu paltar tilsimlənibmiş. Toy gecəsi Kərəm gəlib bir-bir düymələri açır, axırıncı düyməyə çatanda, bütün düymələr təzədən bağlanır.

Zaur dedi ki, çox sarsaq nağıldır. Kərəm də əfəlin biriymiş, heç vacib deyil ki, axırıncı düyməni açasan.

Təhminə dedi ki, elə əsil sarsaq sən özünsən, nağıl isə dahiyanə nağıldır, özü də lap mənim haqqımdadır. Çoxları elə bilir ki, mənim bütün düymələrimi açıblar, qalır lap axırıncı, mən isə təzədən yaxamacan düymələnib kilidlənirəm.

Zaur dedi ki, zərər yoxdur, açarıq düymələrini.

Təhminə dedi ki, belə sitizə gülmə, sənə yaraşmır, belə güləndə sən də başqalarına oxşayırsan. Amma mən istəmirəm ki, sən onlara oxşayasan. İstəyirəm sən heç kəsə oxşamayasan. İstəyirəm ki, səndən uşağım olsun. Sənə oxşasın, amma sən heç kəsə oxşama.

Zaur dedi ki, əşi, nə uşaq-uşaq salmısan! Belə uşaq istəyirsən təşkil elə də, maşallah ərinə nə gəlib. Yoxsa ərin...

Təhminə qədəhdəki konyakı Zaurun başına tökdü və dərhal peşman oldu. Dedi ki, heyf o konyakdan, sənin boş başına tökülməkdənsə, mənim qarnıma getsəydi daha yaxşı olardı, hər şeyi unudardım.

Sonra Təhminə əyilib onun üzündən öpdü və dərhal kənara sıçradı, – vəssalam, – dedi, – mənə yaxın gəlmə.

Sonra dedi ki, əgər uşaq istəsəydim on səkkiz yaşında olanda doğardım. Dedi ki, on səkkiz yaşında mən uşaq saldırmışam. Dedi ki, bu mənim ilk eşqim idi. İlk və son eşqim.

Sonra Təhminə ilk və son eşqini danışmağa başladı. Dedi ki, on altı yaşında olanda o adama rast gəlib. Onun adını çəkməyəcəyəm. Çünki onu hamı tanıyır, bəlkə elə Zaur da tanıyır. Yox, axmaq, əlbəttə, Dadaş deyil, nə yapışmısan bu Dadaşdan? Dadaş nə zibildir onun yanında? Dadaş onun heç dırnağı da ola bilməz. O, dünyalar gözəli idi, mən onu mələikə, huri-qılman, Yusifi-Kənan, nə bilim, şahzadə, allah, peyğəmbər bilirdim. Onun yolunda hər şeyə hazır idim. Onu görəndə ağlımı itirirdim, öl desəydi ölərdim, qal desəydi qalardım. Bir gün bildim ki, hamiləyəm. Axmaq canım həm qorxudan ödümü udmuşdum, həm də sevinirdim. Getdim ona da dedim, elə bildim o da sevinəcək. Axı, bilirdim ki, uşaqları yaman sevir, özü də deyirdi ki, bu yaxında ev alacam, onda evlənəcəyik. Bax, bu kağız rəngində oldu. – Nə danışırsan, – dedi, ayağıma yıxıldı, yalvarmağa başladı. – Bədbəxt eləmə məni, mənim rayonda ailəm, uşaqlarım var. Apardı məni Ermənikənddə bir həkimin yanına. Saldırdım uşağı. Bu da mənim həyat universitetim idi. Eh, nə isə, gəl içək.

İçdilər, sonra Zaur soruşdu ki, bəs Manaf?

– Eh, nə Manaf! Bilmirəm bu Manaf səni niyə bu qədər maraqlandırır? Manaf kimdir? Mənimçün Manaf bir heçdir, sıfırdır, yoxdur. Odey Tiflisdə arvad-uşağı var, getsin onların yanına.

– Uşağı da var?

– Qızı var. Yeddi yaşında. Bu il məktəbə gedəcək. Çanta-zad alıb ona aparıb. Guya mən bilmirəm. Gizlədir məndən. Vaxtilə Manaf mənim dərdimdən ölürdü. Amma ona mən heç məhəl qoymurdum. Deyirdi öldürərəm özümü, gərək səni alam. Axır bir gün lap məni cəzana gətirdi, zəhləmi tökdü, dedim, bilirsən nə var? Bax, aç qulağını eşit: səndən əvvəl mənim adamım olub, özü də onunla əməlli-başlı yaxın olmuşam. Üzünə baxdım, yazığım gəldi. Ağappaq ağarmışdı, barmaqlarını qulaqlarına tıxadı, indiki kimi yadımdadır, sonra üzünü örtdü, bir müddət heykəl kimi donub qaldı. Sonra çıxıb getdi. Üç gün ilim-ilim

itdi. Üç gündən sonra gəldi ki, bəs ölüb qurtarmışam. Doğrudan da üç günün içində gədənin ordu orduna yapışmışdı, gözləri düşmüşdü çuxura. Dedi ki, mənim üçün daha heç bir şeyin dəxli yoxdur. Qəbulumsan. Elə günü bu gün gedək ZAQS-a. Dedim xeyr, əvvəlcə şərtimi bil. Heç vaxt o adam haqqında nə məndən bir şey soruşacaqsan, nə də ayrı yerdən bilməyə çalışacaqsan. Bu bir. Heç vaxt üzümə vurmayacaqsan... – Sən nə danışırsan, – dedi. – Əlbəttə. Daha bu barədə danışmadıq. İki gündən sonra getdik ZAQS-a.

Toyumuz axşamı baxdım ona, yazığım gəldi. Gördüm çox sınıqdı. Bir gözü gülür, biri ağlayır. Dedim, bilirsən nə var, şərtimiz şərt yerində. Amma qoy sənə deyim: həmin o adam mənim nişanlım idi. Toyumuz bir həftədən sonra olacaqdı. Amma... uşaqlıq elədik... bilirsən də, olanda olur... axmaqlıq... Toyumuza iki gün qalmış getdi dənizdə batdı. Vallah, elə bil dünyanı Manafa bağışladılar. Az qala ayağıma yıxılıb ağlayacaqdı. Ay Allah, kişilər nə yaman axmaq olur!

Təhminə danışır, danışırdı. Zaur onun səsini eşidir, ancaq sözlərini qavramırdı. O, arxası üstə uzanıb ulduzlara baxırdı, saçlarında qumların gecə nəmliyini – torpağın tərini duyurdu. Uzaq ulduzlara baxır, dənizin xışıltısını, Təhminənin səsini eşidir və Məmməd Nəsirin çox sevdiyi və tez-tez təkrar etdiyi bir fikri xatırlayırdı. Düz deyir Məmməd Nəsir, dünyada ən gözəl səfər içki şüşəsinin boğazından dibinə etdiyin səfərdir. Bu səfərə ikimiz çıxmışıq. Gəlib çatmışıq lap şüşənin dibinə. Dibinə lap az qalır. İndi başqa bir aləmdəyik. İsti, mehriban, xoş, içki şüşəsinin dibi kimi kədərli bir aləmdə... xoş hara, kədərli hara? Eh, aləm başımda qatışıb! Təhminə! Təhminə!

Təhminə də düşünürdü. Danışa-danışa düşünürdü. İçməklə yox, keçmişiylə sərxoşdu. Elə bil uzaq günləri içib dəm olmuşdu. Danışıqları qarmaq kimi keçmişə ilişir, illər, aylar arxasında qalmış xatirələri çəkib çıxarırdı. Təhminə düşünürdü ki, adam heç vaxt qəlbən, ya zehnən, fikirlə, ya hisslə bəxtiyar olmur. Bəxtiyarlıq ancaq keçəri duyumların təsadüflüyüdür. Unudulmuş bir qorxunun, bir səsin, sözün, toxunuşun qəfil külək kimi yaddaşa qayıtması...

Təhminə xoşbəxt olduğu anlar haqqında düşünürdü, bu anlar o qədər tələsik, keçəyən, ötəyən idilər ki, onların xatirələrini də beyində aydın canlandırmaq olmurdu. İllah da içkiylə dumanlanmış beyində. Ancaq bir neçə cizgi, boya... yay gecəsi, Pirşağı bağı, gecə, ulduzlu göy...

Təhminə lap balacadır. Nənəsiylə axşamdan yatıb. Gecə səslərə oyanır, qatmaqarışıq səslər eşidir, adamların kim olduqlarını təyin edə

bilmir, ancaq bilir ki, qohum-qardaşdır, şəhərdən qonaq gəliblər. Deməli, səhər hamısı dənizə gedəcək. Sevincli bir hiss qəlbini bürüyür. Yenidən yuxu onu çəkib aparır...

...Hər gün düz saat on iki radələrində dənizin üfüq xəttində təyyarələr görünür. Dənizin üstüylə ucadan uçurlar. Paraşüt buraxırlar. Ağappaq paraşütlər qönçə kimi açılır, çiçək-çiçək mavi dənizə tökülür. Nənəsi hələ sağdır.

...Sahil... Güclü xəzri. Atasıyla qayanın üstündə dayanıblar. Atasının qıçına sığınıb. Dəniz dalğalarını bayraq kimi qaldırıb. Dəniz nümayiş kimi üstlərinə gəlir.

"Səni gördüm. İllərlə səni görməyə bilərəm. Təki biləm ki, sən varsan. Varlığını uzaqdan-uzağa da duya bilərəm. Sahil kəndlərinin sakinləri dənizi görməsələr də, duyduqları kimi. Ancaq, əzizim, dəhşət odur ki, bir gün gedib görəsən dəniz yox olub". – Uzun kişi barmaqları Təhminənin sağ əlinin barmaqlarını bir-bir sığallayır, bir, iki, üç, dörd, beş. Sonsuz təəccüblə Təhminədən soruşur: əzizim, sənin beş barmağın varmış?

Moskva. Biz Moskvaya gələndə may bayramının ərəfəsi idi. Aerodromdan şəhərə gəlirdik. Hər yan qırmızı geymişdi. Qırmızı bayraqlar, qırmızı şüarlar. Taksiylə mərkəzə gəlirdik və hər dəqiqə işıqforların qırmızı işığına büdrəyib dayanırdıq.

Biz Moskvadan gedəndə hər yan yaşıl geyinmişdi. Ağaclar, otlar, sarmaşıqlı eyvanlar. İşıqforun yaşıl işıqları, yaşıl yarpaqlar kimi, yağışlı-günəşli küçələrə – aerodroma tərəf yönələn maşınımızın təkərləri altına səpələnmişdi. Hər dəfə içən kimi Moskvadayam. Yağış yağır. Yay yağışı. Göy guruldayır. Adamlar qaçışırlar. Yağış kəsir. Hava açılır.

Altıncı mərtəbədə bir ev. Pəncərə. Pəncərədə uzun, ağ, qırmızı, çəhrayı qladioluslar.

Pirşağı. İlkindi çağı şəhərə gedən elektrik qatarının fit səsi uzaqlaşır, itir... Yayın son günü, payızın ilk günü. Sakit qumlar. Adamsızlaşmış bağlar. Boş boz sahil. Boz teleqraf dirəkləri, arxayın bir sükut. Səssizlik...

Moskva. İsti, yumşaq xalı döşənmiş otaq. Yarımçıq işıq. Çöldə çovğun, qar, külək. İçəridə qazla yanan soba. Radioda uzaq, kəsik melodiyalar. Öz aramını, sonunu tapa bilməyən sərgərdan bir melodiyanın yorğun, usanmış kədəri... Uzaq dənizlərin, təlatümlü okeanların ardın-

dan gələn, çovğunlu, boranlı efirdə gah itən, gah eşidilən bir səs. Ərəb qızının yanıqlı mahnısı. Elə bil oxuyan, gecə özüdür. Uzun, qüssəli Şərq gecəsi. İçini dolaşıb keçə kimi isidən konyak. Ağ yun toxunma köynəkli dünya gözəli.

– Nədən qorxursan, dəli, nədən qorxursan?

Təhminə hönkürüb ağlamağa başladı.

Zaur onu ovutmaq istədi.

Təhminə:

– Yaxşı, ağlamıram, heç, keçər, sən fikir vermə, – dedi. – Sən arvadların göz yaşlarına çox da fikir vermə, çox vaxt özümüz də bilmirik ki, niyə ağlayırıq. Gəl içək.

Son qədəhi içdilər.

– Zakuskamız da qurtarıb.

Təhminə:

– Odey, ayı görürsən? – dedi. – Konyaka ən əla zakuskadır. Sən sağ tərəfini dişlə, sol tərəfini mənə saxla.

İçdilər. Hərəsi ayın bir tərəfindən dişlədi. Təhminə: doymadıq, – dedi, – gəl ulduzlardan plov bişirək, yeyək.

Göyü dənizin üstünə tutub ulduzları süzdülər. Bişirdilər, yedilər.

Təhminə Zaurun üstünə qum səpməyə başladı:

– Gəl səni qumda basdırım.

Zaur:

– Cavanam,– dedi, – yazığam. Anamı ağlar qoyma. İndidən niyə basdırırsan, hələ muradıma çatmamışam.

Sonra yadına bir əhvalat düşdü. Təhminəyə danışdı.

Bir dəfə ər-arvad axşam tərəfi plyaja çimməyə gedirlər. Arvad xəstəymiş, qum vannası qəbul edirmiş. Kişi basdırır a

rvadı boğazınacan qumun içinə, bircə başı çöldə qalır, özü də gedir dənizə çimməyə. Hava bir az da qaralır. Arvad da qumun içində xumarlanır, mürgüləyir. Qaranlıqda plyajnan səssiz, işıqsız gedən bir maşın arvadın başını görmür, basıb üstündən keçir, heç xəbəri də olmur. Kişi dənizdən çıxıb görür ki, arvadı, bəli, xurd-xəşil olub ölüb. Az qala dəli olur, deyir öz əlimlə torpağa basdırdım.

Zaur başını qaldırıb Təhminəni görmədi. Ora-bura boylandı, qayalara, sahilə, dənizə, göylərə baxdı.

Göyə təzə ay çıxmışdı, təzə ulduzlar düzmüşdülər. Ay işığında qayaların kölgələri daha da uzanmışdı. Sarı qumlar gümüşə çalırdı. Ay

dənizə saldığı yolu pul-pul döşəmişdi. Bir səs, hənirti duyulmurdu. Bir an Zauru soyuq vahimə basdı.

Dəniz uğuldayır, uğuldayırdı. Qumlar ürpərir, ürpərirdi.

Təhminə qeyb olmuşdu.

Zaur durub üstündən qumu çırpdı, ora-bura qaçdı. Qayaların lağımlarına baxdı. Birdən dəniz tərəfdən hənirti eşitdi. Dönüb baxdı. Elə bildi yuxu görür.

Dənizdən çıl-çılpaq bir qadın çıxırdı. Elə bil ay işığından heykəl düzəltmişdilər.

Lap yaxına gələndə Zaur onun soyuqdan titrədiyini gördü. Bir an içərisində onu qolları arasına aldı. Qucağına qaldırdı. Qayaların altına apardı.

Təhminə:

– Səni istəyirəm, səninəm, – deyə odlu-odlu pıçıldayırdı. – Səndən uşaq istəyirəm.

Zaur hər şeyi – özünə çoxdan aydınlaşdırdığı, qəbul etdiyi davranış qanunlarını da, bütün qadağaları, xəbərdarlıqları, məsləhətləri, tövsiyələri, bütün ehtiyatlarını unutdu. Hər şeyi unutdu.

Bir an onun bütün varlığı, məni, keçmişdi, indisi, gələcəyi, atasının maşını, anasının şəhərdə qalmaq, nəşriyyatda işləmək təkidi, bütün keçən sərgüzəştləri, bığlarına hopmuş bütün qadın öpüşlərinin ətri, yağış altında gözləmələri, xəlvəti telefon-avtomat söhbətləri, duyduğu bütün qoxular, eşitdiyi bütün nəğmələr, oxuduğu bütün kitablar, ona gülümsünən bütün gözlər, içinə dik baxa bilmədiyi başqa gözlər, uşaqlıq dəcəllikləri, yetkinlik çağının həvəsləri, idman yarışları, institut həyatı, məşqlər, səfərlər, leksiyalar və imtahanlar, maşın sürmək ehtirası, yaddaşındakı bütün sözlər, adlar, telefon nömrələri, damarındakı bütün dadlar, çəkdiyi cürbəcür siqaretlər, qulağındakı səslər, bu gün, dünən, bu axşam, bu gecə, dənizin səsi, ay, burdakı ulduzlar – hər şey, hər şey yığılıb, bir vəhdətə çevrilmişdi. İstək, ehtiras, həyəcan dolu, gözləyən, tələsən, axtaran bir vəhdətə. Və bu vəhdət başqa bir möcüzəyə, qaranlıq, gizli, dar vəhdətə qovuşmalı idi. Başqa bir insanın bütün həyatını, keçmişini, indisini, gələcəyini, fikrini, qəlbini, kədərini, ümidini, sevincini, aldanışlarını, bezarlığını, onun – Zaurun heç bir zaman bilmədiyi və bilə bilməyəcəyi mübhəm bir aləmi özündə cəmləşdirən vəhdətə qovuşmalı idi, qovuşurdu...

Zaur Təhminənin üzünü, saçlarını, iztirablı gülüşünü qumların haşiyəsində görürdü.

Təhminə Zaurun sifətini qaranlıq göyün, ulduzların haşiyəsində görürdü. Və bu an varlığının hər hüceyrəsiylə inanırdı ki, bu ehtiras, bu intizar, bu ağrı, mütləq, mütləq nəticələnməli, sonlaşmalı, yeni bir həyata, yeni bir insana çevrilməli, onlar İkisi Üçüncünü yaratmalıdırlar. Və bu Üçüncü də hər ikisinin həyatı, acıları, sevinclərini bütün vağzallarda, aerodromlarda, otaqlarda, telefonlardakı gözləmələrini, idarədəki peşələrini, ya evdəki qayğılarını və tək bunların yox, bunlardan qabaq olanların – əcdadların da varlıqlarını, ömürlərinin son və ən vacib mənalarını, bəlkə Zaurun anasının saçlarının, bəlkə Təhminənin atasının gözlərinin rəngini özündə toplamalı, yığmalı, əks etməli, təmsil etməlidir.

İnsan nə qədər mürəkkəb olursa da, sonda o özünü nə isə çox qısa və yığcam bir düsturla ifadə edə bilir. Və bu düstur çaxmaq daşı kimi, kibrit kimi, başqa bir düstura, başqa çaxmaq daşına, kükürdə toxunub qığılcım, yeni həyat qığılcımı, yeni həyat yaradır, dünyaya Üçüncünü gətirir.

Bu Üçüncünün də öz həyatı, öz ağrıları, həvəsləri, meyilləri, anlayışları, zövqü, kədəri olacaq və o yenə başqa birisinə rast gələcək və yenə...

– Əzizim, canım, gözüm, ciyərim, varlığım, – Təhminə elə bil nəfəsiylə sözləri gözərdirdi, – sevgilim, yarım, ərim, gözəlim, bircə dənəm. – Təhminə boğulurdu. İnləyir, söz axtarırdı. – Canım, ciyərim, gözüm, – məhəbbət sözləri qurtardı, – axmaq, it, dəli, gic, pişik, dəvə...

Zaurun dodaqlarında Təhminənin dodaqlarının, dərisinin, boyasının, pudrasının ətri, bir də dəniz suyunun, küləyin, qumların dadı bir-birinə qarışmışdı.

Zaurun başını var gücüylə üzünə yapışdırdı. Siqareti divara basıb söndürən kimi qızartdaq, odlu dodaqlarını Zaurun dodaqlarına sıxıb söndürmək istəyirdi.

– Sevirsən məni, sevirsən? – deyə Zaur tələsik pıçıldayırdı.

– Oğlumuz olacaq, Zaur, oğlumuz, oğlumuz...

Maşında oturub zarıyırdı.

– Sətəlcəm olmuşam, – deyirdi. – Allah, Allah, ölürəm, – deyirdi.

Zaur "bircə düz yola çıxa bilsəydim, – deyə düşünürdü, – onda iş asandır. Bu qaranlıqda quma batsaq, köməyimizə gələn də olmaz, gərək səhərəcən qalaq".

Saat ikinin yarısı idi. Qalıb səhəri gözləmək olmazdı. Təhminənin halı xarab idi. Ehtiras sönəndən bəri konyakın dumanı Zaurun başından çəkildikcə, “bu nə iş idi mən düşdüm” – deyə sakit ola bilmirdi.

– Üşüyürəm, üşüyürəm. – Təhminə yumaq kimi büzüşür, Zaura sığınır, ancaq yenə də qızına bilmirdi. – Üşüyürəm, üşüyürəm.

Zaur əvvəlcə gözlərinə inanmadı. Qabaqda qırmızı işıq görmüşdü. Yük maşınının qırmızı dal işığı. Bu işığın ucundan tutub sürdü. Təxminən yüz metrdən sonra şoseyə çıxdılar.

Zaur rahat nəfəs aldı. Üçə yaxın şəhərə çatdılar. Yatmış şəhərin gecə vitrinləri işıqlı idi və bu işıqlarda nə isə son dərəcə mehriban, xoş, isidici bir məlhəm vardı.

Təhminənin titrəməsi də elə bil kəsildi. Daha uçunmurdu.

– Siqaret ver bura...

Zaur cibindən qutunu çıxarıb ona uzatdı.

– Al, axırıncı siqaretdir.

– Axırıncıdır? Qoy onda özünə qalsın.

– Yox, evdə varımdır, götür.

Təhminə siqareti dodaqları arasına aldı.

Hansı radiostansiya isə gecə konserti verirdi. Konsert yəqin gecə klubundan verilirdi. Kişi yumşaq səslə həzin melodiya oxuyur, konferansye hansı dildə isə zarafat edir, adamlar gülüşür, əl çalırdılar.

– Bəs kibrit?

Zaur ciblərini döyəcləyib kibrit qutusunu tapdı. Təhminəyə verdi. Təhminə bir-bir kibritləri çıxartdı.

– Hamısı yanıqdır ki, – dedi, qutunu pəncərədən tulladı.

– Ayrı yoxumdur.

“Moskviç” Təhminəgilin evinin qarşısında dayandı. Təhminə qapını açdı, çantasını götürdü və dedi ki, sonra Zaur nigaran qalar, ancaq qalmasın, lap arxayın olsun. Neçə dəfə burda həkimə getmişəm, elə Moskvaya da onunçün getmişdim. Orda özümü ən yaxşı mütəxəssislərə göstərdim. Lap qəti dedilər ki, sənin heç bir vaxt uşağın olmayacaq. Bəli, belə işlər, əzizim, al bu siqaretini, onsuz da kibrit yoxdur.

Zaur ağzını açmağa macal tapmamış Təhminə damağındakı siqareti onun dodaqları arasına soxdu.

– Ötürmə, lazım deyil, – deyə tələsik darvazaya tərəf qaçdı, çevrilib bir də əl elədi, güldü. Nə qamma çalındı, nə motosikl uzaqlaşdı...

Darvazanın qaranlığına girib itdi.

Zaur maşını işə salıb hərəkətə gətirdi. Yatmış şəhərin adamsız, səssiz-hənirtisiz küçələriylə soyuq neon işıqlı vitrinlərin yanından ötüb keçirdi. Radioda gecə konserti qurtardı. Radio da susmuşdu.

Bir an Zaura elə gəldi ki, ağzındakı bu siqaretlə bütün dünyada lap tək qalıb.

Tərs kimi kibrit də yoxdur...

## ZAURUN TƏHMİNƏYƏ MƏKTUBU

Təhminə! Mən bu məktubu indi yazıram. Səndən ayrılandan bir saat sonra. Sənə qəribə gələcək ki, biz ayrılandan bir saat sonra, özü də gecə saat 4-də məktub yazmaq nə vacib düşüb. Bəlkə də səninçün bu vacib deyil. Amma mənimçün çox vacibdir. Məktubu niyə yazıram. Çünki məktubda deyəcəyim şeyləri elə-belə, sözlə, sənin üzünə deməyə, hətta telefonla deməyə belə heç vaxt cəsarət etməzdim. Heç bilmirəm, demək istədiklərimi məktubla deyə biləcəyəmmi. Demək istədiyim odur ki, Təhminə, mən bu gün çox şeyi başa düşdüm. Gülmə, Təhminə, yəqin ki, sən məni uşaq sayırsan, hissə qapılan sadəlövh bir uşaq. Nə olar, say. Hər halda mənimçün bu çox vacibdir. Heç bilmirəm nə yazıram. Elə hey yazıram vacibdir, vacibdir, nədir vacib? Heç özüm də bilmirəm. Bircə onu bilirəm ki, bu gün mənim gözüm açıldı, elə bil çox şeyi təzədən gördüm, anladım. Bir yandan Məmməd Nəsirin təkbaşına nərd oynaması, bir yandan bizim bugünkü səfərimiz, xüsusən sənin son sözlərin (həkimlərin sənə dediyi sözlər), bütün bunlar hamısı elə bil mənim varlığımı alt-üst etdi. Bilirsən, əgər mən yazıçı olsaydım, bütün bu hissləri, bu psixoloji incəlikləri daha dəqiq təsvir edə bilərdim. Ancaq məndə bu məharət yoxdur, odur ki, fikirlərimi, hisslərimi də belə dolaşıq ifadə edirəm. Nə isə mənə elə gəlir ki, mən indiyə qədər hamını və birinci növbədə də özümü aldatmışam. Həqiqətdən qorxmamaq, həqiqət nə qədər acı olsa da, onun düz gözünün içinə baxmaq lazımdır. Bunu mənə sən öyrətdin. Doğrudan da dünyada ən murdar şey riyakarlıqdır, ruslar buna xanjestvo deyirlər. Mən də başa düşdüm ki, bundan sonra mən heç bir vaxt nə heç kimi, nə də özümü aldatmamalıyam. Bilirsən, Təhminə, səndən ayrılandan sonra maşınla boş küçələri dolaşırdım və başıma min cür fikir gəlirdi. Bir istəyirdim gedib bu saatca Manafa teleqram vuram ki, bə-

sdir bu yalan, Təhminə səni sevmir, məni sevir, biz onunla bir-birimizi sevirik. Biz evlənəcəyik. Gəl Bakıya, məhkəməylə Təhminəylə boşanın... Sonra istədim təzədən Pirşağıya dəniz qırağına, həmin o yerə gedəm. Sonra istədim maşınımı divara vurub əzəm. Sonra qərara gəldim evə gedib ata-anamı oyadam. Hər şeyi onlara danışım, deyim ki, çox sağ olun, məni dünyaya gətirmisiniz. Ancaq adam gərək iki dəfə doğulsun. Bir dəfə onu ata-anası dünyaya gətirir. İkinci dəfə o özü-özünü dünyaya gətirir, özü özünə dünyada bir yer qazanır. İndi, əziz ata-anam, mən hələ bircə dəfə doğulmuşam. Mən hələ özüm yaranmamışam. Hələ ancaq sizin yaratdığınız kimi, sizin istədiyinizə uyğun olaraq yaşayıram. Çox sağ olun əziz ata-anam, məni böyüdüb boya-başa çatdırmısınız, oxutmusunuz, saxlamısınız, geydirib-yedirtmisiniz, mənə maşın almısınız. Amma mən daha özüm yaşamalıyam. Götürün bu "Moskviç"i. O sizindir. Mənim onu öz maşınım hesab eləməyə haqqım yoxdur. Nə maşınımı, nə geyimimi, nə otağımı. Bundan sonra belə olmayacaq. Mən öz əlimin zəhmətiylə dolanmaq istəyirəm, öz iradəmlə, öz ağlımla yaşamaq istəyirəm. Yoxsa mən başdan-ayağa özümü kiminsə borcu hesab edirəm. Kiminsə qaytarılmamış borcu. Adımı siz qoymusunuz, məktəbimi, ixtisasımı, iş yerimi siz təyin etmisiniz. Bütün həvəslərim, işlərim də sizin razılığınızla olub. Bəs mən özüm nəyəm, kiməm, hardayam? İndi ilk dəfə mənim həyatıma elə bir adam daxil olub ki, o yalnız mənimdir, yəqin siz onu qəbul etməyəcəksiniz. Yəni bu keçəri bir həvəs olsaydı, siz qarışmazdınız. Siz heç vaxt mənim belə işlərimə qarışmırsınız. Ancaq biləndə ki, məsələ ciddidir, siz hay-haray qaldıracaqsınız. Ancaq mən də ondan keçməyəcəyəm. Çünki o mənim özlüyümdür, özlüyümün təsdiqidir, o mənim etirazımdır. Təhminə, gör mən nə səfeh-səfeh sözlər yazıram sənə. Oxuyub güləcəksən. Bilirsən, mən bütün bunları tamam başqa cür hiss eləyirəm, ancaq kağızda yazanda hər şey nə cürsə bayağılaşır, adiləşir, gülməli görünür. Gülmə, Təhminə, bəlkə mən bu məktubu heç sənə göndərmədim, cırıb atdım. Ancaq göndərsəm də, göndərməsəm də, mən artıq sənsiz yaşaya bilmərəm. Sən elə bilirsən mən kütəm, keyəm, heç nə başa düşmürəm. Mən sənin bütün dediklərini, duyduqlarını hiss eləyirəm. İnan mənə ki, hiss eləyirəm. Mən bilmirəm bizim uşağımız olacaq, ya yox, ancaq mən səninçün həm ər, həm də övlad olmaq istəyirəm. Sənin davamın olmaq istəyirəm, həyatının mənası olmaq istəyirəm. Mən səninçün həm İkinci, həm də Üçüncü,

Dördüncü, Beşinci, Altıncı, Yeddinci, Səkkizinci, nə bilim neçənci, neçənci olmaq istəyirəm. Məktubumu qurtarıram. Son sözü yazıb kibrit çəkib bu məktubu yandırıram. Son söz... Təhminə...

## TƏKLİK TİLSİMİ

Saat düz üç tamamda Səfdər dayı pilləkəni düşməyə başladı. Fərqinə varmadığı mexaniki bir vərdiş halını almış adəti üzrə, ürəyində pillələri saya-saya düşdü. Üçüncüdən ikinci mərtəbəyəcən on yeddi pillə idi. İkincidən birinciyəcən on səkkiz pillə...

– 17, o da 18, 35 – deyə ürəyində təkrar edib idarənin qapısından küçəyə çıxdı. 35, o da 3719, elər... yox, 35-in 3719-a dəxli yoxdur. 3719 təxmini hesablamanın balansıdır. 4012 olmalıdır. Deməli, 293 manat çatmır. Görəsən harda səhv ediblər. Keçən kvartalda 145 manat səhv etmişdilər. 145, ya 147? Yox 147. Bəs niyə 145 dedi? hə, ev nömrəsiylə çaşdırır. Ev nömrəsi 45-dir. Mirzə Fətəli, 45.

Skleroz məni birtəhər eləyib. Pensiya vaxtın çatıb, Səfdər. Yox, hələ iki ilin var. Daha doğrusu, bir il 9 ay. Yaxud 21 ay, 21 ay neçə gündür? Neçə belə gün? Deməli, yanvar otuz bir, fevral gələn il 29-dandır, mart...

Bəsdir, Səfdər, sənin lap başın xarab olub. Neynirsən bu mənasız hesablamalarla beynini yorursan. Bəsdir. Yaxşı, deməli, balans 3719 manat, əysiyi... Əşi, cəhənnəm olsun balans da, əysiyi də. Saat 3-dür. Dördə beş dəqiqə işləyib. İş günü qurtardı. Bu gün şənbədir. Sabah bazar. Bazar ertəsinə qədər bütün balansı, planı, prixodu, rasxodu, bütün rəqəmləri unut. Unut ki, mühasibsən.

Bazar ertəsi səhər saat 9-da yenə başlayarsan mühasibliyinə. İndi bəsdir. Bir dənə rəqəm yadına salma. Yaxşı, oldu. Elə bil beynimə qalaq-qalaq rəqəm yığıblar, rəqəmlər başımda elə bil tillə vurub. At hamısını. Adamlara, küçəyə bax.

Küçəni keçib gündə nahara gəldiyi balaca, darısqal yeməkxanaya girdi. Hər gün oturduğu küncdəki stolun arxasına keçdi.

Görünür, masanın dalından indicə durmuşdular, üstü kiminsə artıqlarıyla dolu idi. Bulaşıq boşqabdakı kotletin qalıqlarına papiros kötükləri basılmışdı. Süfrəyə pivə dağılmışdı.

Səfdər dayı ani hərəkətlə çığara kağızında çap olunmuş yeməklərin siyahısını götürdü. Dərhal da kənara qoydu, nə yeyəcəyini də bilirdi, yeməklərin qiymətlərini də. Borş, kotlet, kompot, bir şüşə "İsti-

su”, borş 35 qəpik, kotlet vermişeliylə 42 qəpik, on beş qəpik kompot, iyirmi qəpik “İstisu”, on qəpik çörək. Cəmisi bir manat otuz qəpik, beş-on qəpik az, ya beş-on qəpik çox, deməli, ayda...

“Səfdər, – dedi, – yenə rəqəmlər? Bəsdir, kişi, at bu rəqəmləri beynindən”.

Xidmətçi gəlib masanın üstünü yığışdırdı. Süfrəni çırpdı. Çevirib o biri üzünü saldı. Bu üzü də ləkəli idi. Amma bu ləkələr qalıb qartımış ləkələr idi, hopub solmuşdu, o biri üzdəki kimi təzə deyildi.

Səfdər dayı sifarişini elədi. İncəvara, tez gətirdilər. Borş dadlı idi. Bir az duzu çatmırdı. Ya bəlkə Səfdər dayı şor yeyən idi. Kotlet də pis deyildi. Əlbəttə, Minanın yeməklərinə çatmazdı, amma hər halda...

Səfdər dayı köksünü ötürdü. Yaxşı yumşaq ətdir, – deyə düşündü. Lap qocamalıdır. Mənim kimi dişsiz qocalar üçündür.

Ağzının müxtəlif yerlərində cəmi-cümlətanı 9 dişi qalmışdı.

Kotleti yeyib qurtardı, ağzını siləndə cıqqıltıyla yerə nə isə düşdü. Səfdər dayı baxıb “bəli, bu da belə getdi” – dedi, əyilib düyməni götürdü, döş cibinə qoydu.

Ağ parusin pencəyinin yeddi düyməsi vardı. Yuxarıdan ikinci, üçüncü və beşincisi düşmüşdü. İndi də yeddincisi düşdü.

Düymələri də dişləri kimi pərakəndə tökülürdü. Biri ordan düşürdü, biri burdan.

Kompotu içə bilmədi. Pis təmi vardı. Özü də bulaşıq suyuna oxşayırdı. Görünür, çürümüş meyvələrdən hazırlanmışdı.

Gərək gedəm özümə diş qayırtdıram. Bu dal dişimi də gərək çəkdirəm. Hərdən bir yaman zoqquldayır. Gərək mütləq gedəm. Deyirəm, amma heç getmirəm. Elə günü günə satıram.

Eh, heç adamın başı açılır ki... Gərək evin damına da qır saldıram. Yoxsa payızda yenə damacaq. Damanda adamın bütün ovqatı təlx olur. Gərək bütün otaqlara ləyənlər, vedrələr, boşqab-qazan, bankalar düzəsən. Hərəsindən də bir cür səs çıxır. Mis ləyənə damcılayanda bir səs çıxır, vedrəyə başqa, qazana başqa, boşqaba başqa... Kap, kap, kap... Çap, çap, çap... Pap, pap, pap...

Dünyada üç şey adamı lap zinhara yetirir, çəkmən sıxa, dişin ağrıya, evin dama.

Səfdər dayı minnətdarlıqla köhnə yalınayaq çəkmələrinə baxdı. Ayaqları bu çəkmələrin içində elə rahat, elə xoş idi ki... Bəzən adam öz yorğan-döşəyində belə xoş, rahat olur...

Bəli, Səfdər kişi, evin damır, dişlərin də tökülüb, düymələrin də bir– bir düşür, vaxtdır, kişi. Bəsdir dünyanın səfasını çəkdin. Deyəsən, əcəli qapının dalında bir az çox gözlədirsən axı...

– Yox, vallah, – dedi, – əcəldən qaçmıram. Ölümdən də qorxmuram. Məndən əskik adamları aparmayıb ki... Tay-tuşumun da çoxu ordadır.

Bayaqdan bəri susmuş radiocihaz birdən dilə gəldi. Xeyli xırıldadı, ayrı-ayrı sözləri deyib yenə susurdu. Ancaq anlamaq olurdu ki, rayon qəzetləri üçün mətn oxunur.

– Təkrar edirəm. Kolxoz və sovxozlarımız bu il... dövlətə... planda nəzərdə tutulmuş... təkrar edirəm, kolxoz və sovxozlarımız bu il dövlətə planda nəzərdə tutulmuş 1200 ton əvəzinə 1897 ton taxıl, 90 ton əvəzinə 105 ton barama, 370 min əvəzinə 379 min yumurta, 222 ton əvəzinə 226 ton yun satmışlar, təkrar edirəm, 1200 ton əvəzinə...

Səfdər dayı bir manat altı şahısını verdi, küçəyə çıxdı.

Gedim bir arvada baş çəkim, – deyə düşündü.

Arvadı iki ay bundan qabaq basdırmışdı. Qəbir üstünə adətən cümə axşamları gedərdi. Srağagün də getmişdi.

Amma bu gün nədənsə birdən Minaya baş çəkmək ehtiyacı duydu.

Taksi dayanacağına çatdı. Növbə tutdu.

Ondan qabaq dörd adam vardı. Küçə saatına baxdı. Əqrəblər başlarını 12-nin üstünə qoyub yatmışdı.

14-17 nömrəli bir taksi gəldi. Sonra dalbadal ikincisi, üçüncüsü gəldi. Səfdər dayının növbəsi çatmışdı. Təxminən 5-6 dəqiqə də gözlədi. Dolu maşınlar bir-bir ötürdü. Səfdər dayı qeyri-ixtiyari nömrələrə baxır, ani olaraq nömrənin birinci yarısıyla ikinci yarısını toplayırdı. 41-18, deməli 59, 22-15, eylər 37.

Tindən yaşıl işıqlı taksi buruldu. Nömrəsi 27-00. Səfdər dayı-27 üstə gəl 00 eylər 27 – deyə düşündü və bu qəribə əməliyyata təəccübləndi. Amma fikirləşdi ki, bu rəqəmi 27-00 kimi də oxumaq olar.

– Sizin növbənizdir?

– Bəli, bəli.

– Hara gedəcəyik?

– Qəbiristanlığa.

Sürücü qeyri-ixtiyari gülümsündü, amma dərhal da üzündən gülüşü sildi.

Səfdər dayı onun nəyə güldüyünü başa düşdü. “Doğrudan da yəqin, mənim görkəmim elədir ki, sürüb aparıb, elə birbaş qəbrə qoymaq olar. Yəni elə əslinə qalsa adamlar anadan olandan öz qəbirlərinə tə-

rəf getmirlər? Yolları nə qədər uzaq düşsə də, nə qədər dolama-dolama, eniş-yoxuş olsa da, axır gəlib mənzilə çatırlar. Molla Nəsrəddin demişkən, hara getsələr, axırda gəlib bura çıxacaqlar”.

Sayğacda rəqəmlər bir-birini təqib edirdi. 12 qəpik, 13, 14, 15 qəpik...

Pəncərələrin dalında Qız qalası, bulvar, Azneft meydanı arxaya qaçırdı. Elə bil onları sayğacın rəqəmləriylə nömrələmişdilər: Qız qalasının nömrəsi 12, bulvarınkı 13, Azneft meydanınkı 14.

Maşın şəhərin hündürünə dırmaşdı.

Minanın qəbri içərilərdə idi. Maşın yolundan çox kənar. Səfdər dayı maşını saxlatdırıb on şahısını verdi, düşdü. Qəbirlərin arasıyla arvadının son məskəninə tərəf addımlamağa başladı. Həmişəki kimi yenə də qəbirlərin üstündəki yazıları oxuyurdu.

Əskər Teymurov
1905-1957

Tofiq Babayev
1927-1946

Adlar və rəqəmlər. Adlar və rəqəmlər. Yəni bu rəqəmləri bura yazmaq vacibdir? Yəni adamdan elə bu iki şey qalır? Adı və bu iki tarix? Axı, niyə belə? Axı, əslinə qalsa bu yazıların adamın şəxsən özünə dəxli də yoxdur. Adını özü qoymayıb. Familini də həmçinin, təvəllüdü, ölümü də özündən asılı deyil. Olmaz ki, bura adamın şəxsən özünə dəxli olan şeylər yazsınlar, məsələn, kim idi, bu dünyada nə iş görüb, nə iş qoyub gedib, ya məsələn, tutalım, xasiyyəti necə idi? Kimə nə yaxşılığı, nə pisliyi keçib? Övladı olub, yoxsa yox, öləndən sonra kimi qalıb? Yoxsa quru rəqəmlərdən nə çıxsın?

Faiq Mərdanov
1912-1959

Bəhmən Salayev
1938-1965

Qeyri-ixtiyari rəqəmləri toplamağa başladı. 1912+1959=3871. Sonra fikirləşdi ki, burda toplamaq düz olmaz, çıxmaq lazımdır. 1959-1912=47. Deməli, biçarə Faiq Mərdanov 47 il ömür sürüb. 1965-

1938=27. Vay, bədbəxt, Bəhmən Salayev 27 yaş yaşayıb. 27 yaşında ölüb. Görəsən nədən ölüb?

Əşi, əcəl göznən-qaş arasındadır. Bayaqkı fikri bir də beyninə qayıtdı. Deməli, belə çıxır ki, adam əcəlin qurduğu tələlərdən bir-bir qaçıb qurtarır ki, bura, bu son mənzilə sağ-salamat gəlib çıxa bilsin. Yüz cür təsadüfi ölümdən qorunur ki, özünü axırda böyük ölümə yetirsin.

Qədim bir əfsanəni xatırladı. Deyir, qoca bir səyyah gəlib qürbət ölkəyə çıxır. Qəbiristanlığa gedir. Görür qəbirlərin üstündə adamların yaşları yazılıb. Hamısı da bir yaş, iki yaş, çoxu beş yaş. Özü kimi piranə bir kişiyə rast gəlib soruşur ki, bəs bu nə olan işdir? Sizin camaat hamısı yəni körpə yaşında tələf olub? Qoca deyir ki, xeyir a, məsələ başqadır, məsələ ondadır ki, biz burda həmin bu adamların xoşbəxt yaşadıqları vaxtı yazmışıq. Qalan günlərini, illərini ömürdən saymırıq. Onda səyyah da deyir ki, bəs mənim də ömrümün axırına az qalıb, bu gün sabah öləcəm, vəsiyyət eləyirəm ki, məni də elə burda basdırın, qəbrimin üstündə də yazın ki, bəs bu adam elə anadan ölü doğulub. Minanın qəbrinə çatdı.

Minəvvər Mədət qızı
1909-1965

Söz vermişdi ki, bu səfər özünü tox tutacaq, kövrəlməyəcək. Amma qəbri görəndə birdən hardansa Minanın gecələr yuxuda danışması yadına düşdü. Özü də belə hətərən-pətərən danışıb sayıqlamazdı. Sözləri elə aydın, mükəmməl tələffüz eləyirdi, elə bil ayıq vaxtı oturub səninlə söhbət edir.

Özünü saxlaya bilmədi, qəhərləndi, ağladı.

“Niyə belə vəfasız çıxdın, ay arvad, məni bu qoca yaşımda kimə tapşırıb getdin?”

Cibindən dəsmalını çıxartdı, eynəyini götürdü, gözlərini sildi. Bir müddət sakit dayandı. Sonra çevrilib getdi. Şəhərə piyada düşdü. Evə getməyi gəlmirdi. Gecəyə hələ çox vardı. Evdə təkbaşına gecəni gözləməkdan qorxurdu.

Gecələr işi düzəlirdi. Hər gecə yuxu görürdü. Yuxuları da elə tünlük olurdu ki... o qədər adam olurdu yuxularında, gəl görəsən! Taytuşları, dost-aşnaları, curları-kişilər, məktəb vaxtının yoldaşları, uşaqlıq, gənclik dostları gəlib əllərini onun çiyninə vurur, ay Səfdər, yenə

bu çötkəni qoymusan qabağına, hesabla görək dünyanın axırı haçandır? – deyirdilər. Yuxusuna çoxlu arvad da gəlirdi, anası, bacıları, bibisi qızları. Düyməsini tikər, paltarlarını yuyar, ütüləyər, xörəyini asardılar. Hər gecə Minanı görürdü, hər gecə də səhərə yaxın Mina başqa şəhərə köçür, ya da onu qoyub harasa gedirdi. Səfdər nə əlac eləyirdisə, saxlaya bilmirdi onu. Saat yeddini vuranda gözlərini açar, durub geyinərdi. Görəsən yuxuda ölənləri harda basdırırlar.

Tez-tez yuxuda qızı Nərminəni görürdü. Nərminəni iki il idi əriylə bir yerdə Afrikaya göndərmişdilər. Qvineyada sovet xəstəxanasında işləyirdilər. İkisi də həkim idi. Səfdər dayı xəritəyə baxmışdı. Qvineya lap dünyanın o başındaydı. İldə iki-üç məktub yazırdılar. Səfdər Minanın ölümünü hələ qızına yazmamışdı. Bu da bir çətin iş idi, gözünə durmuşdu. Qərib yerdədir, ərindən başqa bir qohum, bir yaxın adamı yox...

Səfdərin yuxusunda Nərminə içəri girib anasını soruşurdu:

– Bazara gedib, gələr.

– Yox, ay kişi, sən mənə düzünü de, lap düzünü de, anam necə olub, hardadır?

Hər dəfə Nərminə Səfdər dayının yuxusuna gələndə elə bu sualı verərdi: sən mənə düzünü de, lap duzünü de!

Yuxu görmək Səfdərə lap cavanlıqdan qalmışdı. Görürsən adam olur ayda-ildə bir yuxu görməz. Səfdər allahın ver günü yuxu görərdi. Mina da hər gecə yuxu görərdi. Səhər oyananda yuxularını bir-birinə dınışardılar. Elə bil hərəsi bir uzaq səfərdən qayıtmışdı. Qürbət ölkələrdə yedikləri, içdikləri özlərinin olmuş, gördüklərini, eşitdiklərini, bir-birinə danışırdılar.

Küçədəki qəzet lövhəsinin qabağında ayaq saxladı. Qəzetin dördüncü səhifəsinə elə bil yuxarıdan aşağıyacan rəqəm səpələnmişdi, istiqraz cədvəli çap olunmuşdu.

3... 5... 6... 9... – rəqəmlər, rəqəmlər, rəqəmlər. Uduşlar. Peşmançılıq.

Səfdər dayı düşündü: bunlar nədir ki, adicə quru rəqəmlər, amma bax, məsələn, 3 altıdan yox, 7-dən sonra gələndə kiminsə bəxti gülür, kiminsə hıçqırığı içində qalır. Bu rəqəmləri belə yox, belə düzsən kimsə umsuq olur, kimisə bir xal yandırır, amma başqa birisinin birdən-birə kefini duruldur.

Dönüb saata baxdı. Yox. Hələ evə getmək tezdir. Adi günlər işdən beşdə çıxırdı. Bu gün qısa gündür, deməli, gecə də iki saat gec gələcək.

"Gəlsənə vağzala gedim, – deyə düşündü, – vağzal qiyamət yerdir. Gələnlər, gedənlər! Heç yerdə o qədər deyib-gülən görmək olmaz. Aerodrom da elədir. Amma aerodrom uzaqdır".

Vağzalın təzə keçidindən perrona çıxdı. Birinci və ikinci perron bomboş idi. Üçüncü perronda çoxlu adam vardı. Bəziləri əllərində iri gül dəstələri tutmuşdular.

İri lövhədə qatarların gəlib-getmə cədvəli asılmışdı, 11 30... 16. 45... 19. 05. Rəqəmlər, rəqəmlər...

Reproduktordan paslı bir səs eşidildi:

– Moskvadan gələn 20 nömrəli qatar 3-cü yola qəbul olunur.

Perrondakılar hərəkətə gəldilər. Parovozun səsi eşidildi. Burnu göründü. Vaqonlar bir-bir ötdü, 4, 5, 6, 7...

Yük xidmətçiləri vaqonlara tərəf yüyürdülər. Yaxalarındakı nömrələr zınqırov kimi atılıb-düşür, bərq vurub parlayırdı: 15, 52, 38, 40...

Səfdər dayı çevrilib pillələrlə aşağı düşdü, vağzalın qarşısındakı meydana çıxdı. İzdihamlı, səs-küylü küçəylə yavaş-yavaş gedirdi. Bankın tanış binasının yanından keçərkən, işin qızğın vaxtında bura gəldiyi saatları xatırladı və düşündü ki, indi bank bağlıdır, işləmir, içindəki bütün rəqəmlər də yatıb. İstiqrazlardakı, pullardakı, növbənöv mühasibat kağızlarındakı rəqəmlər hamısı yatıb. Torpağa səpilmiş toxumlar kimi səssiz, sakit uyuyur. Həftənin birinci günü oyanacaq, qalxacaq, cücərəcəklər.

Küçə saatına baxdı. Saatın əqrəbləri sınıb içinə tökülmüşdü. Elə bil saatın içi vaxtın xarabalığı idi.

Əqrəbsiz saata baxanda adam nədənsə eymənirdi, adamda nə isə anlaşılmaz, müdhiş və vahiməli bir hiss oyanırdı. Elə bil burunsuz bir sifət görürsən.

Saatın yalnız rəqəmləri qalmışdı: 1, 2, 3, 4, 5, 6, 7, 8, 9, 10,11,12...

Birdən Səfdər dayıya elə gəldi ki, küçədəki adamlar da rəqəmlərə oxşayır. Bax o dar kəmər bağlamış kök arvad 8-ə oxşayır, o iri başlı kişi 9-a, hamilə arvad 6-ya oxşayır. Uzun dimdikli papaq qoymuş oğlan 7-yə bənzəyir. O tərəfdən iki arıq, kəkilli oğlan gəlir – 11. Başqa bir arıq oğlan yumru-matan bir arvadla yanaşı addımlayır – 10.

Səfdər dayı öz-özünə güldü: "Yox, deyəsən bu gün mənim lap yəqin başım xarab olub. Yaxşısı budur, nə qədər gec deyil, gedim evə".

Açarı çıxarıb qapısını açdı. İşığı yandırdı. Keçib pəncərənin pərdəsini araladı. Çayniki suyla doldurub odun üstünə qoydu.

Divardakı təqvimə yanaşdı, diqqətlə baxdı.

5 iyun. 1965. Şənbə:
Günün çıxması saat 3.15 dəqiqə,
batması 21.07 dəqiqə.

"Pah atonnan! – dedi, – zalım uşağı, günü də cədvələ salıblar. Batıb-çıxmasını hesablayıblar. Hər şeyi, hər şeyi inventara salıblar, günü, ayı, göydə neçə ulduz var, hamısını. O gün biri danışırdı, deyir, siçanları, taxtabitiləri, birələri də hesablayıblar. Hansı şəhərdə neçə siçan, neçə taxtabiti, neçə birə var. Hamısını hesablayıb, inventara salıblar. Pah atonnan, a kişilər..."

Səfdər dayı diksindi. Çoxdan bəri otağında eşitmədiyi bir səs eşitdi – zəng səsi.

Evində telefonu vardı, amma lazımsız qutu kimi bir qıraqda atılıb qalmışdı. Yuxuya getmiş tənbəl, qara pişik kimi səssiz-səmirsiz, kirimişcə xumarlanırdı. İndi isə zəngi zəngə calayırdı. Kim ola?

Dəstəyi götürdü.

– Allo!

– Aydını çağırın, pojalyusta!

– Hara zəng eləyirsən, qızım?

– Ağayevgilin evi deyil?

– Xeyr, bala, Atayevin evidir.

– Oh, bağışlayın.

Asdı. Du, du, du, du, du...

Səfdər də telefonun çəngəlini basdı. Amma dəstək əlində qaldı. Nədənsə onda qəribə bir həvəs oyanmışdı. Kimləsə telefonla danışmaq istəyirdi. Elə bil ancaq indi ağlına gəlmişdi ki, telefonu var və bu telefonla danışmaq olar. Kimə zəng eləyim görəsən?

Dəstəyi yerinə qoydu. Telefonun altındakı masanın pərçim olmuş siyirtməsini açdı, oradan tozlu mixəyi bir dəftər çıxartdı. Dəftəri açdı.

Elə birinci səhifədəcə Minanın xəttini görüb kövrəldi.

A. hərfində Minanın xəttiylə "Atayev Səfdər" sözləri və onların telefon nömrəsi yazılmışdı. 4-15-20. Mina həmişə zarafatla üç şahı bir abbası deyərdi.

İkinci səhifəni açdı.

B. hərfində Babanın telefonu yazılmışdı. Yazıq Baba. Davadan qayıtmadı. Elə bil lap Babayçün deyiblər ki:

Sən ki bir od-yalovdun,
necə yatdın yerdə sən?

Şir, pələng kimi oğlan idi, yazıq.

V. hərfində iki ad yazılmışdı: “Validə”. Validə Minanın kiçik bacısı idi. İki ildir əriylə Nuxaya köçüb gediblər. Bir də “Vahidov”. Vahidov kimdir? Səfdər dayı nə qədər fikirləşdisə də yadına sala bilmədi.

Q. hərfində yazılmış ad bərk-bərk qaralanmışdı. Mina qaralamışdı. Yazıq yaman kölgəsindən qorxan idi. Əlbəttə mənimçün qorxurdu.

Qulamı aparanda qaralayıb, 55-ci ildə Qulam qayıtdı gəldi. Amma daha o 20 il bundan qabaqkı nömrəsini qaytarmayacaqdılar ki... Yəqin, təzə nömrə veriblar.

D. hərfində Dadaşın nömrəsi yazılmışdı. Səfdər dayı Dadaşa zəng eləmək istəmirdi. Cavanlıqda bərk dost idilər. Sonra aralandılar. Bayaq Məmməd Nəsir nə gəvəzələyirdi? Ay səni, Məmməd Nəsir. O vaxt Dadaşı gündə çağırırdılar. Yaxşı, məni niyə çağırmırdılar, Məmməd Nəsiri niyə çağırmırdılar? Əlbəttə. Dadaş gedənlərin çoxuyla daha artıq bağlıydı. Bəlkə ona görə çağırırlarmış. İndiki kimi yadımdadır, bir gecə bizə gəldi. “Arağın var?” “Bilirsən içən deyiləm"– dedim. “Bilirəm, – dedi, – onunçün də özüm gətirmişəm. Barı bir şey ver”. Pendir-çörək gətirdim, bir az da göyərti. Oturdu yarım litrəni təkbaşına içdi. Özü də dinməz-söyləməz. Bir kəlmə dinib danışmır. Mən də oturub buna baxıram. İçdi, şüşəni başa çatdı. “Eh, ay Səfdər, – dedi, – birini bilirsən, birini bilmirsən”. Sözləri indiyə kimi qulağımdadır: – “Sənə nə var ki, xoşbəxt adamsan”. Papağını qoydu getdi. O gündən gördüm, bəli, deyəsən mənə bir az suçlu baxır, belə bir cür gen gəzir. Mən də özümü heç o yerə qoymadım. Daha heç soruşub, eləmədim ki, bəs nə olub? Salaməleyküm, əleykəsalam, Vəssalam, Dadaş belə Dadaşdı.

E. hərfi boş idi.

Ə. hərfi “Əliyev Tahir”. Əliyev Tahir? Hə, hə, yadıma düşdü. Bir vaxt qonşu idik. Amma neçə ildir bir-birimizə rast gəlmirik. Küçədə görsəm heç tanımaram. Yəqin, mənim heç adım da onun yadında deyil.

İ. “İdris”. Maşallah, İdris. Məndən üç yaş böyükdür, amma turp kimidir. Həmişə dağda-daşda. İndi də eşitmişəm Zaqatala tərəfdə qızıl axtarır. Bu telefonu niyə çəkdirib bilmirəm. Heç vaxt Bakıda tapılmırlar, nə özü, nə arvadı. “Geoloq babayam, – deyir,– şəhərdə nə işim var? Mənimki dağdı, daşdı”. Bəlkə indi mənim bəxtimdən şəhərdə ola? Qoy bir zəng eləyim.

Dəstəyi götürüb nömrəni yığdı. Uzun zaman aralı siqnallara qulaq asdı. “Hardan olacaq? İndi görəsən hansı dağda, hansı meşədə çadır qurub oturub?!”.

M. Məmməd Nəsir. "Ay onun başı batsın. İndi yəqin, lül atəşdi. Fağır oğlu məhv elədi özünü, zay oldu bu içkiylə. Əvvəllər yenə bir əndazası vardı. İndi lap ağ eləyib. Adama nə qədər deyərlər, nə qədər öyüd-nəsihət eləyərlər. Uşaq deyil ki, sinli kişidir, saçı, saqqalı ağarıb. Ağlayır, söz verir, üç gündən sonra yenə görürsən lülqəmbərdir. Özü də kimnən gəldi içir, başlayır, ağzını Allah yoluna qoyub axvayı-axvayı danışmağa. Uşaqlar yaxşı deyirlər ki, Məmməd Nəsirin qarnını doldur, ürəyini boşaltsın.

N. "Nəbiyev Əsgər" Əsgər yazıq da bildir öldü. Evə gəlib pencəyini çıxardıb. "Arvad, mənə bir çay" deyib, elə oradaca canı çıxıb. Bu ürək zəhrimarın da belə işi var da!

R. Rəhim. "Yox, bala. Rəhim indi böyük adamdır. Əli böyüklərin ətəyindədir. Zəng eləyəcəyəm, deyəcək görəsən nə işi düşüb. Bir də ki, yəqin, heç bu nömrə də düz deyil. Axı böyük adamlar vəzifəyə keçən kimi o saat telefonlarını dəyişirlər.

S. "Səfdər Atayev" 4-15-20. Bu səhifədə nömrəsini öz xəttiylə yazmışdı.

T. "Teyyub". Şənbə günü Teyyub Bakıda qalan deyil. Mərdəkanda beli alıb əlinə, düşüb bağın canına. Bu il də yəqin, mütləq bir səbət üzüm göndərəcək. Yadından çıxan deyil.

X. H. Ç. – səhifələr ötdükcə Səfdəri qüssə basırdı. Elə bil yeganə kibrit qutusunda ancaq yanıq kibritlər qalmışdı.

F. "Fərhad". Fərhad Moskvadadır.

U. "Ulduz". Ulduzgil təzə evə köçüblər. Yəqin, hələ telefon çəkdirməyiblər.

Dəftər köhnə orfoqrafiya vaxtından qalmışdı. Hələ iki hərf durur-du. Ö və Ə.

Ö hərfi boş idi:

Səfdər dayı aramla, ehmallıca son səhifəni açdı.

Ə səhifəsində "Yaşar" sözü yazılmışdı, amma nədənsə telefonunu yazmaq unudulmuşdu. Telefon nömrəsi yox idi, – elə yalın-yalxı Yaşar.

Dəftəri qapadı və birdən gözü arxa cilddə yenə Minanın xəttinə sataşdı. Mina iri çap hərfləriylə:

Yanğın 01
Milis 02
Təcili yardım 03

yazmışdı.

Səfdər dayı öz-özünə gülümsünüb dəstəyi qaldırdı.

Sıfırı çəkdi, əlini birə uzatdı, birdən ağlına gəldi ki, yanğın idarəsiylə zarafat eləmək olmaz. Adamın atasını yandırarlar. Hər halda, telefonu lap yəqin kəsdirərlər.

İstəmirdi ki, telefonunu kəssinlər. Dinməsə də qoy bir qıraqda durub qalsın. Necə olsa bir həyandır.

02 ilə də zarafat etmək olmazdı. 03-nən də həmçinin.

Bəs, 04? Görəsən, 04 telefon varmı? Görəsən, haradır? Bəlkə bu nömrəni yığıb elə-belə danışmaq olar? Səni sorğu-suala tutmadan iki-üç kəlmə xoş söz deyərlər, hal-əhval tutarlar, kefini soruşarlar, ürəkdirək verərlər?

Səfdər dayı 04 yığdı. Telefondan heç bir səs çıxmadı. Nə uzun siqnallar, nə də qısa! Heç bir səs gəlmədi. Sanki bu, mövcud olmayan bir ərazi idi.

05-i çəkdi. Yenə səs çıxmadı.

06-da hay vermədi.

07-də tez-tez qısa siqnallar eşidildi. Məşğul idi.

08 də məşğul idi.

Səfdər dayı son nömrəni – 09-u çəkdi və dəstəkdə dərhal səs eşidib özünü itirdi, karıxıb:

– Salaməleyküm, Səfdərdir, – dedi.

Quru bir səs eşidildi:

– Kim? Familini aydın deyin.

– Famili?.. Atayev. Atayev Səfdər.

– Ünvan?

– Mirzə Fətəli, 45.

– Gözləyin.

Məsələ Səfdərə sonra çatdı. Başa düşdü ki, məlumat bürosuna zəng eləyib, arvad da elə bilib bu telefon nömrəsini istəyir.

Onu gülmək tutdu, amma dəstəyi asmadı. Dəstəkdən səs gəldi:

– 4-15-20. Səfdər:

– Lap düzdür, – dedi, – üç şahı, bir abbası.

Ancaq qız onun sözlərini eşitmədi. Dəstəyi qoymuşdu.

Səfdər dayı da dəstəyi qoydu. Pıqqıldayıb güldü.

Birdən fikirləşdi ki, görəsən, adam öz telefonuyla öz nömrəsinə zəng eləsə nə olar?

Görək. Dəstəyi götürüb nömrəni çəkdi. 4, 1, 5, 2, 0... Aha. Tələsik, aramsız, kəsik siqnallar eşidilməyə başladı.

– Du, du, du, du, du, du, du...

Səfdər dayı:

– Məşğuldur, danışır,– dedi. Güldü, sonra nədənsə bir az tutulan kimi oldu.

Dinləməyə başladı. Bir xeyli qulaq asdı.

Dəstəkdən zahlətökən bir ardıcıllıqla səslər eşidilirdi: du, du, du, du, du...

Elə bil payız günü evin damır...

## NƏRMİNƏNİN ATASI SƏFDƏRƏ VƏ ANASI MİNAYA MƏKTUBU

Mənim əzizlərim! Ana və ata! Uzaq Qvineya diyarından sizə çox-lu-çoxlu salam göndərirəm. Sizinçün burnumun ucu göynəyir. Əvvəlcə, sizə bir şad xəbər vermək istəyirəm: hər ikiniz baba və nənə olmusunuz. Özüm qəsdən bu barədə sizə heç nə yazmırdım ki, anam nigaran qalmasın. Bilirəm axı, yaman vasvasıdır. İndi hər şey yaxşı qurtarıb və on gün bundan qabaq balaca bir oğlan nəvəniz dünyaya gəlib. Hüsü deyir ki, atama oxşayır, ancaq burnu lap səninkidir, ay ana. Adını hələ qoymamışıq. Ay ata, mən istəyirəm sənin adını qoyaq; ancaq Hüsü deyir ki, iraq-iraq, sağ olan adamın adını qoymazlar. Dedim, sizlərdə qoymurlar, amma bizlərdə qoyurlar. Dedim bizlərdə belə qayda var ki, birinci uşağa babasının adını qoyurlar. Heç özüm də bilmirəm belə qayda var, ya yox, ancaq hər halda Hüsünün başını tovlamaq üçün belə dedim. Çünki çox istəyirdim sənin adını qoyam, ay ata. Uşağın adını çağıranda elə bilərəm siz də yanımdasınız bu qərib yerdə. Qız olsaydı sənin adını qoyacaqdım, ay ana. Ay ana, qurbanın olum, səndən yaman nigaranam. Hər gecə səni yuxuda görürəm. Elə qatmaqarışıq yuxular görürəm ki, heç olmasa mənə bir əlcə kağız yazaydın. Atama bax, gözünə su ver, hər ay müntəzəm mənə məktub yazır. Bizim əhvalımızı xəbər alsanız, güzəranımız pis keçmir. Hüsünün burda yaman hörməti var. Burda həkimlərə çox ehtiyac var. Elə xəstələr, elə xəstəliklər var ki, Allah göstərməsin. Camaat çox mehribandır. Amma çox kasıbdırlar yazıqlar.

Hə, balaca Səfdər oyandı, başladı bağırmağa. Yəqin acıb, köpəkoğlu yaman qarınquludur.

Öpürəm sizi bərk-bərk:

P.S. Hüsü sizə çoxlu salam göndərir.

Qızınız Nərminə

## BİR DƏ MƏN GÖRSƏM Kİ...

*Yazılana pozu yoxdur(?)*

Nemət düyməni basdı:

– Hə, bir şey deyin.

Sürəyya: yazır?

Nemət: Hə. Bir şey deyin.

Sürəyya: nə deyək?

Nemət: nə bilim, bir şey deyin də.

Sürəyya: aha... Demək, mən demək istə... Yox, demək mən demək, yaxşı çıxmadı. Dayan... hə... Deməli...ıhı, ıhı, (öskürür). Deməli, mən demək istəyirəm ki... Bu gün ayın 5-dir. İyunun. 65-ci il... Demək, sən almısan maqnitofon.

Bikə: neçə vermisən buna?

Nemət: yüz doxsan manat. Bikə xala, yaxın gəl. Sən də bir şey de bax bura, maqnitofona.

Bikə: Alyagildə də bundan var. Amma bundan böyük olar. Murtuz Moskvadan gətirib. Deyir 4000 manata almışam. Köhnə pulnan.

Nemət: Karmen, Cilda, Nərgiz! Gəlin, siz də bir şey deyin. (Addımlar).

Karmen: nu çto?

Nemət: qızım, gəl bura. Cilda, sən də yaxın dur. Bax bura de.

Karmen: əşi, nə deyim e...

Nemət: bir şey deyin də...

Karmen: xoxma e... çto skazat?

Sürəyya: əşi, bir şey deyin də. Atanız təzə maqnitofon alıb gətirib.

Karmen: çuvak poşel samıy zadrıpannıy maqnik kupil i teper seans ustraivaet.

Cilda: ne qovari.

Gülüşdülər.

Sürəyya: kəs səsini, axmağın qızı. Zadrıpannıy! Lap yaxşıdır.

Karmen: o, maxani polnostyu poddercivaet paxana. Troqatelnoye edinoduşiye starşeqo pokoleniya.

Cilda: ne qovori.

Bikə: Murtuzgil pəncərənin qabağına qoyublar. Bundan azı iki dəfə böyük olar.

Karmen: çuvixa v vostorqe ot maqnitofona Murzika, nikak ne uspokoitsya.

Nemət: Nərgiz, qızım, quzum, gəl sən bura.
Nərgiz: mən gəldim.
Sürəyya: qızım, o şeiri denən. Əzbər deyirdin ha...
Bikə: Murtuz deyir dörd min manat vermişəm. Köhnə pulnan.
Nərgiz: istəmirəm.
Sürəyya: əşi, istəmirsən istəmə. Hamısı özünü naza qoyub. Bəsdir Nemət. Saxla görək necə yazıb.
Nemət: Nərgiz, sən yenə mənim ruçkamı götürmüsən? Deməmişdim sənə ona əl dəymə? Bir də mən görsəm ki, o ruçkanı götürmüsən, özündən küs.
Nemət düyməni basdı. Lentin hərlənməsini saxladı:
– Görək necə yazıb, – deyə ikinci düyməni basdı. Lenti geri hərlətdi.
– İndi qulaq asaq, – dedi və üçüncü düyməni basdı.
Səslər gəldi:
Nemət: hə, bir şey deyin.
Sürəyya: yazır?
Karmenlə Cilda qışqırışdılar.
– Maxanın səsidir.
Nemət: hə, bir şey deyin də.
Sürəyya: nə deyim?
Sürəyya:
– Mənim səsimdir? – dedi, – heç oxşamır.
Nemət: nə bilim, bir şey deyin də.
Sürəyya: aha... demək, mən istə... yox, demək mən demək, yaxşı çıxmadı, dayan...
Hamısı gülüşdü:
Karmen:
– Demək, mən demək istə, – deyə anasının səsini yamsıladı.
Sürəyya:
– Əşi, qoyun qulaq asaq da, – dedi. Maqnitofondan səsi gəldi:
– Bu gün ayın 5-dir. İyunun. 65-ci il. Demək, sən almısan maqnitofon. Nemət:
– Lap tatar kimi danışırsan, – dedi. "Demək, sən almısan maqnitofon".
Maqnitofondan Bikə xalanın səsi gəldi:
– Necə vermisən buna?
Nərgiz:
– Nənə, sənsən, ay nənə, – deyə cır səslə çağırdı.

Karmen:

– A çuvixa ne mojet, – dedi – obyazatelno doljna spravitsya o sene.

Yenə gülüşdülər.

Bikə xala:

– Murtuzgil də səsimi yazmışdı, – dedi, – lap öz səsimə oxşayırdı. Amma burda heç oxşamır.

Maqnitofondan yenə Bikə xalanın səsi gəldi:

– Alyagildə də bundan var. Amma bundan böyük olar.

Alya Bikənin böyük qızı, Sürəyyanın böyük bacısı idi.

Bikə: Murtuz Moskvadan gətirib.

Karmen:

– Vot eto maq, ya ponimayu, – dedi.

Bikə: deyir 4000 manata almışam. Köhnə pulnan.

Nemətin səsi gəldi:

– Karmen, Cilda, Nərgiz, gəlin siz də bir şey deyin.

Maqnitofondan addım səsləri eşidildi. Sonra Karmenin səsi gəldi:

– Nu çto?

Karmen təəccüblə:

– Mənəm, – dedi.

Cilda:

– Yox, bəs mənəm, – dedi, – koneçno tı.

Karmen: xoxma e... çto skazat?

Sürəyya:

– Xoxma-moxma. Bunların danışığına bax, – dedi. Maqnitofondan səsi gəldi:

– Əşi bir şey deyin də... Atanız təzə maqnitofon alıb gətirib.

Karmen: çuvak poşel samıy zadrıpannıy maqnik kupil...

Nemət:

– Qızım, – dedi, – vallah, mənə dedilər ki, bu pis marka deyil.

Cilda: ne qovori.

Maqnitofonda gülüş səsi eşidildi. Sonra Sürəyyanın səsi gəldi:

– Kəs səsini, axmağın qızı...

Karmen:

– Doğma qızınla gör necə danışırsan, – dedi. – İ uçti, eto uje zapisano. Daha sözüvü obratno götürüb dana bilməzsən. Dokazatelstvo na litso.

Maqnitofondan səsi gəldi:

– O, maxani polnostyu podderjivayet paxana.

Cilda:

– Ne qovori, – dedi və həmin andaca onun səsi maqnitofonda təkrar edildi:

– Ne qovori...

Bikə xala:

– Alyagilinki bundan böyük olar. – deyə sözə başladı, amma elə bu an öz səsini eşidib susdu:

– Bundan azı iki dəfə böyük olar.

Karmen: çuvixa v vostorqe ot maqnitofona Murzika.

Sürəyya:

– Bay, biabırçılıq, – dedi. – Murzik nədir, az, eşidər, inciyər. Biabır olarıq.

Karmen:

– Nə var ki, – dedi, – tyotya Alya ona həmişə Murzik deyir.

Bikə xala:

– Alya arvadıdır, – dedi, – o başqa, sən başqa.

Maqnitofondan Nərgizin səsi gəldi:

– İstəmirəm.

Sürəyya: əşi, istəmirsən, istəmə. Hamısı özünü naza qoyub. Bəsdir. Nemət, saxla görək necə yazıb.

Nemət: Nərgiz, sən yenə mənim ruçkamı götürmüsən. Deməmişəm sənə ona əl dəymə? Bir də mən görsəm ki...

Birdən-birə sükut başlandı. Lent səssiz-səmirsiz hərlənirdi. Yazı burda qurtardı. Nemət düyməni basdı:

– Vəssalam, – dedi.

Sürəyya.

– Əntiqədir, – dedi, – nə cür danışmışıq, hamısı düşüb.

Karmen:

– A çto tı dumala. – dedi, – sən bir şey danışacaqsan, orda başqa şey düşəcək?

Gülüşdülər.

Sürəyya:

– Allah haqqı, lap möcüzədir, – dedi.

Karmen:

– V kakom veke vı jivyote, lyudi? – dedi, – camaatçün maqnitofon proydennıy etap. A bunlar indi ayılıblar. Potryasenı çudom texniki.

Cilda: – Ne qovori, – dedi, – xoxma e...
Nemət:
– Balam, özünüz maqnitofon istəmişdiniz, – dedi, – Başımı keçəl eləmişdiniz. Mən də alıb gətirmişəm də.
Sürəyya:
– Lap yaxşıdır, – dedi. – sən bu sırtıqlara fikir vermə, qələt eləyirlər.
Bikə xala məzəmmətlə:
– Heç nəyi bəyənmirlər, – dedi. – Alyanın uşaqları da belədir.
Sürəyya:
– Amma doğrudan qiyamət şeydir, – dedi. – Mən heç öz səsimi tanımazdım. Elə bil özgə adamdır.
Nemət:
– Heç kəs öz səsini tanımır, – dedi. – Çünki elə belə həyatda biz səsimizi olduğu kimi eşitmirik.
Sürəyya:
– Sən mənim canım, qoy bir də qulaq asaq, – dedi.
Karmen:
– Nu uje prostite, – dedi. – Eto ispıtaniye vışe moix sil.
O da, Cilda da o biri otağa keçdilər. Nərgiz də onların dalınca qaçdı. Nemət düyməni basdı. Dinləməyə başladılar. İlk sözlər, cümlələr ötdü.
Maqnitofondan Sürəyyanın səsi eşidildi:
– Demək, mən istə...
O biri otaqdan Karmen qışqırdı:
– Demək, mən istə...
Nemət başını buladı:
O biri otaqdan Karmenin səsi gəldi:
– Seyças çuvixa naçnyot rasxvalivat maqnitofon Murzika.
Dərhal maqnitofondan Bikə xalanın səsi eşidildi:
– Alyagildə də bundan var. Amma bundan böyük olar.
O biri otaqda qəhqəhə vazları cingiltiylə sınıb dağıldı.
Axıra qədər qulaq asdılar. Qızlar o biri otaqdan replikalar atır və maqnitofon onların sözlərini tutuquşu kimi təkrar edirdi: artıq onlar yazını əzbər bilirdilər.
Əslinə qalsa, Nemət də hansı sözdən sonra hansı sözün, kimin səsindən sonra kimin səsini eşidəcəyini bilirdi. Dil yanıltmacları, danışıq büdrəmələri, nəfəslər, öskürəklər, gülüşlər, hamısı cağbacağ öz yerində sabit və dəyişilməz donub qalmışdı.

Maqnitofondan Nemətin səsi eşidildi:

– Bir də mən görsəm ki...

Sonra lentlərin sükutu hərlənməyə başladı.

Nərgiz o biri otaqdan qaçıb gəldi. Qaçanda iki nazik hörüyü siçan quyruğu kimi çiynində atılıb-düşürdü.

– Ata, – dedi. – Bir də görsən nə edərsən?

Nemət:

– Ay şeytan, – dedi. – Bir az tez saxlamışam, sözüm yarımçıq qalıb. Amma bax deyirəm: bir də mənim ruçkamı götürsən, atanı yandıracağam.

Nərgiz dinməzcə mətbəxə getdi. Kibrit gətirib atasına uzatdı.

– Yandır, – dedi.

Nemət gülüb qızını qujağına götürdü. O üzündən, bu üzündən öpdü. Yerə qoydu.

Qapı döyüldü.

Açdılar.

Mürşüdün daz başı göründü. Mürşüd:

– Döy taxta qapımı, döyərəm dəmir qapını, – dedi, – gülmə qonşuna, quyuya özün düşərsən, – bu, onun danışıq manerası idi. Qəsdən müxtəlif zərb-məsəlləri bir-birinə calayıb deyər, ya da təhrif edərdi.

İki qatar qızıl dişləriylə gülə-gülə içəri girdi.

– Ay salaməleyküm, ay hər vaxtınız xeyir. Necəsiniz? Yaxşısınız. – Bu da onun zarafat formalarından biri idi. Özü sual verib özü də cavab verərdi: “Saat neçədir? Beşin yarısı. Hardan gəlirsən? İşdən”. Sonra da gülərdi.

Mürşüd Nemətgilin qonşusu idi. Özü də diş həkimiydi. Kimsə haçansa demişdi ki, bu Mürşüd yaman baməzə oğlandır və bu sözlərlə onun evini yıxmışdı. Məzəlilik, necə deyərlər, ağır bir yük kimi onun boynuna düşmüşdü. Hər yerdə, hər məclisdə, hər saniyə, hər dəqiqə məzəli olmaq yolunda yeddi qat qabıqdan çıxardı. Mürşüd gələndə səsi otağı başına alardı, otağı güclü radiostansiya efiri dolduran kimi doldurardı.

– Nizami demişkən, cücəni payızda sayarlar, – dedi.– İndi gəlmişəm, Nemət qağa, səndən qisas alım.

Dünən Nemət şahmatda onu dörd əl dalbadal udmuşdu.

– Dünən xoruzumu verdin qoltuğuma. Arvad sübh tezdən məni oyadıb ki, get bir toyuq da al evdə ptisaferma düzəldək. Dedim, arvad

heç elə söhbət yoxdur, – əlini daz başına çəkdi, – eşitməmisən keçəl suya getməz. Bu xoruz əmanətdir. Nemət qağadan əlborcu almışam. Sabah şəxsən aparıb qağamın qoltuğuna verəcəm. Nizami demişkən: borclu borclunun sağlığını istər.

Nemət:

– Nizami müəllimin bir başqa kəlamı da var, – dedi. – Rəhmətlik yaxşı deyib ki, daldan atılan daş dəysə-dəysə, topuğa dəyər, – o da Mürşüdün yumoruna alışmış və onu mənimsəmişdi.

Mürşüd:

– Ay Allah ölənlərinə rəhmət eləsin, – dedi. – İndi mən səni elə udacam ki, heç Nizaminin Gəncədə ruhu da inciməsin.

Nemət:

– Məni şahmatda udmaq, tul işdir, – dedi. – Mən yaxşı məktəb keçmişəm. Müharibə vaxtı, uşaq idim onda, anamdan gizlin qonşunun oğluyla marqarinə oynayardıq. Bilirdim ki, ölsəm də gərək udam. Doğrudan bir dəfə də uduzmadım.

Mürşüd:

– O ki qaldı mənkuhatın müəzzəm faidələrinə, burada mətləb bir az tuldur, – dedi.

Mürşüddən beş dəqiqə sonra Mənzər gəldi. Mənzər Mürşüdün arvadı idi. Həmişə də belə edərdilər. Ya əvvəl ər gələrdi, beş dəqiqədən sonra arvad təşrif buyurardı. Ya da tərsinə.

Mənzər:

– A kişi, hardasan, səhərdən səni axtarıram, – dedi. – Salaməleyküm. Nemət qardaş.

– Hardayam? Çəkməmin üstündə, papağımın altında, köynəyimin içində.

Mənzər şaqqıldayıb əliylə ağzını yumdu,

– Aa, aa, – dedi. – Bacı, deyəsən, xəmir yoğurur. Mürşüd, səsivi çıxarma, düşbərə-qutaba qonağıq.

Mürşüd:

– Mən srağagündən hazır, – dedi, – mən düşbərə-qutabın köhnə Məcnuniyəm.

Sürəyya:

– Gözümüz üstə yeriniz var, – dedi. – Sabah üçdə buyurub gəlin.

Mürşüd:

– E, yox, – dedi. – Nisyə girməz kisəyə. Sabah nisyə söhbət oldu. Çərxi-dövranı bilmək olmaz. Zəifcanlı oğlanam. Qan təzyiqim yüksək,

özüm də radikulit. Nə bilim sabaha salamat çıxacağam, yoxsa yox. Nizami yaxşı deyib ki, bu günün işini sabaha qoyma:

Mənzər:

– A, bacı, mübarək olsun, – dedi. – Deyəsən, təzə priyomnik almısız.

Mürşüd iki əlini daz başına vurdu:

– Vaxsey, vaxsey, arvad, – dedi. – Məni biabır elədin. Ağız, bu ki maqnitofondur, priyomnik deyil, çox mübarək, sağlığınıza qismət olsun, mən də bayaqdan görmürəm.

Mənzər:

– Nə bilim, a kişi, – dedi, – evimizdə bişməyib, qonşudan gəlməyib...

Mürşüd "ciddiləşdi".

– Yox, arvad, sən lap ağ elədin. Qonşun sənə düşbərə– qutab bişirir, bəs deyil, hələ üstəlik maqnitofon da bişirsin?

Mənzər şaqqanaq çəkdi:

– Ay kişi, heç bəndə sənin dilinə düşməsin.

Mürşüd:

– Yox da, – dedi, xeyli gülüb birtəhər sakitləşdi. – Mən ölüm, düz demirəm, Nemət qağa? Kişisən, vur bura. Deyir, qonşuda bişməyib. Balam hansı vilayətdə görünüb ki, qonşu-qonşuya maqnitofon alsın?

Bikə xala:

– Sizin kimi qonşuya adam lap canını da qurban eləyər, – dedi. – Vallah, xeyirdə, şərdə qonşu adama qohumdan yaxın olur.

Nemət: "Qonşu mövzusu,– deyə düşündü, – on beş dəqiqə çərənləyəcəklər".

Mürşüd:

– Can Bikə xala, – dedi,– varam sənin o bal kimi şip-şirin şəkər dilinə. Belə dili olan adamın dişləri də gərək cabaca olsun. Sabah gəl sənə müftəcə düz otuz iki dənə təzə diş qoyum. Amma, Nemət, zarafat bir yana dursun, qonşuluq ki var, doğrudan ayrı aləmdir.

Nemət: "Yox, deyəsən tab gətirə bilməyəcəyəm", – deyə düşündü. – "Mürşüdün yumoruna birtəhər davam gətirmək olar, amma üstəlik izhari-məhəbbətinə də qulaq asmaq!".

– Əlbəttə, Mürşüd, – dedi, – söz ola bilməz ki, qonşuluq ayrı aləmdir, – Birdən gözü maqnitofona sataşdı. – Bilirsən, dedi, indicə səsimizi yazmışdıq. Qiyamət çıxıb, qulaq asmaq istəmirsiniz?

Mürşüd:

– Bax, bu olar, rəhmətlik Nizami demişkən əmiri. Qur, qulaq asaq, Nemət qağa. Yaxşı deyiblər ki, hər şeyin köhnəsi, maqnitofonun təzəsi.

Nemət maqnitofonu qurdu. Hər adamın səsi gələn kimi Mənzər içini çəkirdi:

– Vaxsey, vaxsey, Nemət qardaşdır, Mənzər canı, Nemət qardaşdır. Sürəyya bacı. Sürəyya bacıdır. Oh, Bikə xala, canımçün, Bikə xaladır, – elə bil maqnitofondan ən azı Nəsrəddin şahın səsi gəlməli idi, onun yerinə Nemət, Sürəyya, Bikə xala danışıb Mənzəri mat-məəttəl qoyurdular.

Mənzərin kəşfləri davam edirdi:

– Karmeniçka, Cildiçka! – deyə çığırırdı.

Mürşüd:

– Murzik,– deyə dik atıldı. – Murtuz, Balayeviçi deyir? Evinəcən, Karmen bala! Ay sənin oyunun olsun.

Maqnitofondan Nemətin səsi gəldi.

– Bir də mən görsəm ki...

Sonra sükut başlandı.

Nemət:

– Vəssalam, – dedi, düyməni basdı.

Mürşüd:

– Görsən neyləyəcəksən, Nemət? – dedi. – Mən ölüm, qulağıma pıçılda.

– Heç nə, əşi...

Mənzər:

– Vaxsey, vaxsey, qiyamət imiş, – dedi. – Nemət qardaş başına dönüm, ver bir də qulaq asaq.

Nemət düyməni basdı. Bir də qulaq asdılar.

Mənzər yenə səsləri tanıyır:

– Sürəyya bacı! Bikə xala! Vay evinəcən, – deyə qışqırırdı:

Yenə Nemətin səsi gəldi.

– Bir də mən görsəm ki...

Nemətlə Mürşüd şahmat oynamağa başladılar.

Mürşüdün adəti vardı. Oynayan vaxtda aramsız danışır, oxuyardı.

– Deyir, çünki oldun dəyirmançı, çağır gəlsin dən Koroğlu. Yaxşı, Nemət müəllim, mən burdan sənə şah desəm, hara gedərsən? Aha, bura, çox gözəl, çox da pakizə, deyir qızım sənə başmaq alım, al dədə, qurbanın olum. Al, bir dənə də şah. Deyir şax, şax, uşaqsan, uşax. Dərsə gedən bir uşaq, çıxdı buz üstə qoçaq, durdu qoçaq neylədi, buza belə söylədi. Nə söylədi, söylədi ki, mən bu topu götürürəm, bu atla, soruşsan niyə deyərəm neçin ki, lazımdır, Deyir, dağlar dağımdı mənim,

qəm oylağımdı mənim, dindirmə, deyir, qan ağlaram, çünki yaman çağımdır mənim, hə... ki... qızı verdilər keçələ, bəs bir gün gördülər... nə gördülər, gördülər ki... şah, bir də şah deməli, belə getdin, çox yaxşı, indi sən mənə şah deyirsən, lap əcəb eləyirsən, – birdən-birə elə bil Mürşüdün söz axını qurudu, bir az tutulan kimi oldu, başını qaldırıb maddım-maddım Nemətə baxdı, – boy, mən matam ki, – dedi, – ə, bu necə oldu, ə? Bu biri topu görmədim zəhrimarı, ay sənin saqqalın ağarsın, pah atonnan, udmuşdum e, əməlli-başlı səni sıxışdırırdım, tfu, andıra qalasan belə oyun. Yaxşı, birini də düzək.

Dəhlizdən səslər gəldi.

Sürəyya:

– Xoş gəlmisiz, keçin içəri, – deyirdi.

Nemət səslərindən gələnləri də tanıdı. Sürəyyanın ortancıl bacısı Tahirə və onun əri Cabbar idi.

Nemət ayağa durub onların qabağına çıxdı.

Cabbar Allahın fağırı idi. Vur qapazı başına, al çörəyi əlindən. Tahirə isə atmaralı idi.

Ər də, arvad da kimyaçı idilər. Ər elmlər namizədi. Arvad elmlər namizədi. Ər indi doktorluq dissertasiyasını yazırdı.

Cabbar sözləri çox aydın və təmkinlə tələffüz edər və sırf ədəbi dildə danışardı: "Mən və Tahirə artıq beş ilə yaxındır ki, nikahdayıq. Biz mütəmadiən hər axşam dənizkənarı bağa gedib təmiz hava qəbul edirik" və b. k.

Sısqamətən bir oğulları vardı. Nemət onu görəndə ürəyindən qara qanlar axırdı. Çünki haçan görsəydi Tahirə ritorik suallarla uşağın canını boğazına yığırdı: "Alik necə çörək yeyir? Alik pis çörək yeyir. Bəs, Fatik necə yeyir? (Uşağın adı Fuad idi) Fatik yaxşı yeyir. Alik mamasını neyləyir? Alik mamasını incidir. Bəs, Fatik? Fatik mamasının sözünə baxır".

Uşaq bütün bu ritorikanı çox laqeyd və biganə görkəmlə dinləyirdi. Mənfur Alikin kim olduğunu heç kəs bilmirdi. Tahirə özü də bilmirdi. Nemətə elə gəlirdi ki, bu mifik bir varlıqdır. Fatikin mələkliyiylə müqayisə üçün peyda olmuş bir iblisdir.

Bir həftə bundan qabaq Cabbargil təzə mənzilə köçmüşdülər.

Amma köçməyə çoxdan hazırlaşırdılar. Altı ay söhbətlərinin əsas mövzuları mənzil məsələsi idi.

Bundan əvvəl isə düz üç il ayrı mövzuları vardı. Üç il bundan qabaq Dunayla səyahətə çıxmışdılar, altı ölkədə olmuşdular. Nemət

düşünürdü ki, özlərinə bilmirəm, amma camaata bu səyahət çox baha oturdu. Kim, harda, nədən danışsaydı Tahirə dərhal onun sözünü ağzında qoyub deyərdi:

– Yadında, Caboş, biz Rumıniyada olanda...

(Ümumiyyətlə, onda bu xasiyyət vardı, birinci növbədə ərinin, sonrakı növbələrdə başqalarının sözünü yarımçıq kəsib ya etiraz edər, ya təshih edər, ya da tamam başqa, heç dəxli olmayan bir məsələdən danışmağa başlardı).

Cabbar da təmkinlə:

– Bəli, Tahirə, – deyə cavab verərdi. – Lap yaxşı yadımdadır.

Tahirə ərini Caboş çağırırdı. Bilmirəm bu bacılarda nə adətdir. Alya da o boyda zırpı kişiyə Murzik deyir.

– "Caboş, Murzik! Yaxşı ki, Sürəyya mənə belə bir ad qoymayıb".

Nemətin yanında Caboş, ya Murzik deyəndə əti tökülürdü. Çimkinirdi, elə bil qapının dalından açıq-saçıq bir səhnə, ya başqasının yığışılmamış yorğan-döşəyini, yad adamın alt paltarını, ya nə bilim nələr görürdü.

Tahirə:

– Caboş, – dedi, – görürsən. Sürəyyagil təzə maqnitofon alıblar.

– Bəli, görürəm. Çox mübarəkdir. Sağlıqlarına qismət olsun.

– Sağ ol.

– Yadında, Caboş, Avstriyada maqnitofon gördük e, belə sarı qutuda?

Nemət: "Aman Allah", – deyə düşündü.

– Təzə eviniz necədir? – deyə soruşdu. Hər halda ev söhbəti nisbətən təzə idi, qulağı yağır eləməmişdi.

Cabbar:

– Yaxşıdır, – dedi. – İki balkonu var. Hündürlüyü üç metr. Köhnə layihəylə tikilib. Qəşəng. – "Qəşəng" onun ən çox işlətdiyi söz idi. – Çox yaxşı oldu, mən elə bilirdim tualetlə hamamı bir yerdə olacaq. Təzə evlərdə belə olur axı... Amma baxtımız gətirib. Qəşəng.

Sürəyyanın içəri girdiyini görüb bir də təkrar elədi:

– Hamam ayrı, tualet ayrı. Qəşəng.

Əliylə qəribə bir hərəkət elədi. Güman ki, tualetin formasını təsvir edirdi.

– Qəşəng, – dedi, – ağ kafel. Mətbəx də, hamam da. Duşu bir balaca...

Tahirə onun ağzından vurub.

– Bilmirəm, nə duş, duş salmısan, – dedi. – Yaxşı, qərara gəldik axı ki, usta çağırıb dəyişdirəcəyik.

Cabbar:
– Əlbəttə, – dedi, – amma mən...
Tahirə:
– Çox evdə kafel vurmurlar, – dedi, – gərək özün vurdurasan.
Cabbar:
– Nemət, – dedi, – bir təmiz, keyfiyyətli kafeldir ki, Tahirənin, Sürəyyanın canıyçün. Baxanda adamın ağzı açıq qalır.
O, həmişə arvadının canına and içirdi. Nemətlə danışanda Sürəyyanı əlavə edərdi. Murtuzla danışanda Alyanı.
Sürəyya:
– Nemət, – dedi, – maqnitofonu qursana! Tahirəgil qulaq assınlar.
Nemət düyməni basdı, dərhal da səsi eşidildi:
– Hə, bir şey deyin.
Tahirə:
– Sənsən? – dedi.
Nemət başını yellədi.
Sürəyyanın səsi gəldi:
– Yazır?
Tahirə:
– Caboş, Sürəyyadır e, – dedi.
Cabbar:
– Qəşəng,– dedi.
Sürəyyanın səsi gəldi:
– Demək, mən demək istə...
Gülüşdülər.
Cabbar:
– Qəşəng, – deyə təkrar etdi.
Karmen "Murzik" deyəndə yenə gülüşdülər.
Mürşüd:
– Murtuz Balayeviçin qulağına çatar, yaxşı düşməz, – dedi, – inciyər.
Tahirə Sürəyyanın qulağına tərəf əyilib Alyagildən nə isə danışmağa başladı.
Cabbar gözlərini qırpmadan diqqətlə qulaq asır, vaxtaşırı:
– Qəşəng, qəşəng, – deyirdi.
Nemətin səsi gəldi:
– Bir də mən görsəm ki...
Sükut.

Mürşüd Cabbarı yeni mənzilləri haqqında sorğu-suala tutmuşdu. Nemət qulağının ucuyla Cabbarın sözlərini eşidirdi.

– ...ayrı, hamam ayrı. Qəşəng.

Cabbargil gedəndə dəhlizdə Sürəyya dedi ki, sabah saat üçdə nahara bizə gəlin. Elə-belə. Özümüz olacağıq.

Bir azdan Mürşüdgil də durdular. Dəhlizdə Sürəyya dəvətini təkrar etdi.

Mürşüd:

– Qapını ayağımızla açaq, əlimizlə? – dedi.

Sürəyya başa düşmədi.

Mürşüd:

– Sürəyya bacı, lap dilbilməzsiniz, – dedi, – deyirəm yəni əlidolu gələk?

Sürəyya:

– Yox, yox, nə danışırsınız, – dedi, – ayıbdır.

Sürəyya boşalmış fincanlar, mürəbbə qabları düzülmüş süfrəni yığışdırmağa başladı.

– Alyagilə özün zəng eləsən yaxşıdır, – dedi. – Murtuzun xasiyyətini bilirsən ki. Mən zəng eləsəm çestinə dəyər.

Nemət dəstəyi götürüb zəng elədi.

– Murtuz Balayeviç, – dedi,– çox xahiş edirik sabah Alya xanımla birlikdə bizə təşrif buyurasınız. Saat üç üçün. Elə-belə, özümüz... Yox, heç bir münasibəti-zadı yoxdur. Öz canımçün düz deyirəm. Vallah, yox. "İşə düşmədik! Xeyr a, gərək anket dolduram". – Əşi, yox, Karmenin yaşı apreldədir. Cildanınkı noyabrda, Nərgizinki mayda, Sürəyyanınkı da maydadır. Mənimki? Mənimki heç bilirəm ki... Hər halda lap yəqin sabah mənim yaşım deyil... Aha... Di sağ olun.

Murtuz Karmenlə Cildanın atası Əsədin cəbhə dostu idi: Bəlkə elə buna görə Nemətlə heç ulduzu barışmırdı. Nemət yazıq ona hər cür ehtiram göstərirdi. Necə olsa böyük bacanaq idi. Nemətdən də, Cabbardan da neçə yaş böyük idi. Özü də çox zəhmli adam idi. Lap, "ağır oturub batman gələnlərdən idi". Boy-buxun, bazburut, maşallah! Çal saçlar. İstefaya çıxmış polkovnik Murtuz Murtuzov.

Orden-medallarının hamısını taxanda sinəsində iynə sancmağa yer qalmazdı. Zövcəsi də özü kimi boylu-buxunlu, gözəl arvad idi.

Firəngiz adlı bir qızları və Spartak adlı bir oğulları var idi.

Nemət:

– Yaxşı, mən gedim yatım,– dedi, – sabah tezdən duracam. Mənzər dəhlizdən içəri boylandı:

– Hələ yatmamısınız ki? Siz allah bağışlayın ha. Mürşüdlə spor eləmişik. Deyir orda Bikə xalanın səsi yoxdur. Qurban olum, Nemət qardaş, qoy ona bir də qulaq asım, özüm öz qulağımla.

Nemət maqnitofonu qurdu:

– Qurtaranda bu düyməni basın, – dedi.

Özü o biri otağa keçdi. Öz səsini eşitdi.

– Hə, bir şey deyin.

Soyunub yerinə girdi. Əliylə çarpayısının yanında divara vurulmuş xəritəni sığalladı. Barmaqlarını qoyduqca qaranlıqda Qazaxıstandakı yer adlarını yada salırdı. Qaratal, Ağsuat, Ayaquz...

Səhra, çöllər, alaçıqlar... O yerləri təsəvvüründə canlandırmağa çalışdı. Yavaş-yavaş xumarlandı. Yuxu aramla onu öz girdabına, bataqlığına çəkib apardı. Alaoyaq halda o biri otaqdan öz səsini eşitdi:

– Bir də mən görsəm ki...

Sonra sükut və qaranlıq qovuşub qapandı...

Birinci Dadaş gəldi. Düzdür, Mürşüdgil ondan qabaq gəlmişdi. Ancaq daha onlar qonşu idi, onlar heç. Dadaş həmişə məclisə tək gələrdi. Nədənsə arvadını adam içinə çıxarmazdı.

– Qiyamət evin var ki, – dedi, – elə bu pəncərə nəyə desən dəyər. Axar-baxarı qiyamətdir.

Nemətlə pəncərənin qarşısında dayanıb şəhəri seyr edirdilər. Nemət izahat verirdi:

– Odur Qız qalasının təpəsi görünür. Sağ tərəfə baxın. Dənizdən beləsinə. Aha, o, Nizami muzeyidir. Yox, kino bu tərəfdədir. Bax belə, barmağımın tuşuyla baxın.

Mürşüd:

– Dadaş Mamedoviç, – dedi Nemət onu Dadaşla on dəqiqə bundan qabaq tanış etmişdi. Ancaq Mürşüd artıq Dadaşın atasının adını bilirdi, ümumiyyətlə, Mürşüdün ata adlarına xüsusi hafizəsi vardı. Az çox üzdə olan adamların hamısının atasının adını bilirdi.

Dadaşın eşitmədiyini görüb bir az ucadan təkrar etdi:

– Dadaş Mamedoviç, eşitdiz də, Xosrov Teyyuboviçi keçirtdilər Azprodsovetə.

Mürşüdün başqa bir keyfiyyəti inzibati dairələrdəki dəyişiklikləri əvvəlcədən yerli-yataqlı bilməsi idi.

Dadaş bir an maddım-maddım Mürşüdə baxdı.

– Xosrov Teyyuboviç kimdir? – deyə soruşdu.

Amma Mürşüd ondan da artıq məəttəl qalmışdı.

– Xosrov Teyyuboviçi tanımırsınız? Qaçayev Xosrov Teyyuboviçi də. Bir vaxtlar Şamaxıda prokuror işləyirdi, sonra keçirtdilər Maştağıya ispolkom. Bu saat deyim sizə, yaxın olsun tanıyasınız. Qardaşı Əsgər Süleymanov Maarif Nazirliyində işləyir. Əsgər Teyyuboviç. Doğma qardaşdırlar, amma familləri ayrıdır. Tanıdınız indi?

– Hə, hə, qara Əsgərin qardaşıdır?

Mürşüd irişdi:

– Düzdür, düzdür. Qara Əsgər də deyirlər ona, hə, Xosrov Teyyuboviç onun doğma qardaşıdır. Amma araları, deyəsən, bir az sərindir.

Dadaş:

– Qardaşını tanımıram, – dedi, – ancaq qara Əsgər cüvəllağının, badalağın biridir.

Mürşüd yenə irişdi:

– Lap düz deyirsiniz, lap düz.

Mürşüd hündürboylu idi. Ancaq bir balaca rütbəli adam görən kimi elə bil zahirən də kiçilir, cürübbəzləşirdi. Nemət düşündü ki, yaltaqlıq çox pis şeydir, ancaq uzun-hoqqar adamın yaltaqlığı lap dəhşətdir.

Zəng çalındı.

Cabbarla Tahirə gəldilər.

Murtuzgil ən azı bir saat gecikəcəkdir. Bir saat onların gecikmək reqlamenti idi.

Qapı açılanda mətbəxdən otağa iy doldu.

Mürşüd Dadaşa baxdı, hırıldadı və ləzzətlə əlini-əlinə sürtüb:

– Deyirəm plovu nimçələrə çəkək, – dedi. – Daha gələn olmaz.

Dadaş aciz-aciz gülümsündü. Hələ Mürşüd yumorunun çəmini tapa bilməmişdi.

Mənzər:

– Eh, ay kişi, nə plov-plov salmısan, – dedi. – Plova çağırmayıblar ki, səni.

Nemət düşündü ki, bir az nalayiq çıxır. Dadaş elə bilər ki, əsas qonaq o deyil, Murtuzgildir. Ona görə də hamı yığışıb onları gözləyir...

Dadaş doğrudan da, deyəsən, darıxırdı. Deyəsən, Mürşüdün inzibati dəyişikliklər söhbəti onu çox da maraqlandırmamışdı. Bəlkə də o belə məlumatları daha yüksək dairələrdən alır və ancaq özünə tay bildiyi adamlarla müzakirə edirdi. Nemət kişinin başını qatmaq məqsədiylə:

– Dadaş müəllim, – dedi, – maqnitofon almışıq. Səslərimizi yazmışıq. Qulaq asmaq meyliniz var?

– Hə, nə olar...

Nemət düyməni basdı.

– Hə bir şey deyin.

Tanış sözlər, cümlələr, gülüşlər, çoxdan bələd olduğun yolun mənzərələri kimi ötüb gedirdi...

...– Demək, mən demək istə...

...– Alyagildə də bundan var...

...– Ne qovori...

...– Bir də mən görsəm ki...

Dadaş:

– Yaxşıdır, – dedi, – çox maraqlıdır.

Qapı döyüldü. Alya, Murtuz və uşaqları gəldilər.

Bikə xala:

– Bu saat gətirərəm, – dedi. – Keçin oturun.

Dadaşla Murtuz tanış oldular.

Murtuz:

– Maqnitofon almısınız? – deyə soruşdu:

Tahirə:

– Bir qiyamət sözlər yazıblar. ki, – dedi. – Nemət, qur da, Alyagil də qulaq assın..

Nemət: “İlahi, sən saxla”, – deyə düşündü.

– Bu saat, – dedi, düyməni basdı.

Öz səsi eşidildi. Sürəyyanın səsi. Birdən yadına düşdü ki, lentdə yasaq bir söz var: “Murzik” kəlməsi. Saxlamaq olmazdı, gecdi. Yerini yada salmağa çalışdı. Deməli, Bikə xala Murtuzgilin maqnitofonunu tərifləyir, onda Karmen deyir: Murzik. Yaxşı, Bikə xala bəyəm bir yerdə tərifləyir, elə kəlmə başı deyir də...

Elə bu an Karmenin səsi eşidildi:

– Çuvixa v vostorqe ot maqnitofona...

Nemət var səsiylə:

– Murtuz Balayeviç, – deyə çağırdı, – sabah futbola baxırıq da.

Sürəyya təəccüblə ərinə baxdı.

– Daha niyə qışqırırsan?

Nemət fikirləşdi ki, səbəbini bilsən, sən məndən bərk çığırardın, səsi maqnitofondan eşidildi:

– Nərgiz, qızım-quzum...

Rahat nəfəs aldı. Qıl körpüsünü salamat keçmişdilər. Heç kəs bir şey duymadı, başa düşmədi, eşitmədi.

Murtuz:

– Bəs necə ki, – dedi, – mütləq.

Alyayla Tahirə nə barədəsə pıç-pıç edirdilər. Ancaq Alyanın ayrı-ayrı cümlələri Nemətin qulağına çatırdı:

– Az, ağrım onun ürəyinə, az, bir ağız-burun bəhəm eləyib gəl görəsən... Gədəni girinc eləyib.

Nemət söhbətin kimdən getdiyini dəqiq bilmirdisə də, başa düşürdü ki, Alya xanım yenə Spartakın növbəti eşq-məhəbbət macərasından danışır. 24 yaşlı Spartak əhli-kef oğlanlardan idi, yaxşı gəzib, dolanıb, yeyib-içən cayıl idi. Atasının "mən ölüm-sən ölüylə" bildir birtəhər medinstitutu qurtardı. Vay o xəstənin halına ki, pənahını Spartaka gətirə! Spartakın bütün fikri-zikri gününü xoş keçirmək idi. Arvadları qalstuk kimi dəyişirdi. Murtuz oğlunun bu cəhətinə gizli bir ata qüruruyla göz yumar, daxilində fərəhlənərdi. "Ot kökü üstə bitər, mən də cavan olanda arvadlardan qaçıb qurtara bilmirdim".

Alya üzdə Spartakın sərgüzəştlərindən guya bərk narazı idi. Telefonla Spartaka zəng eləyən saysız-hesabsız, "cananlara" kobud cavab verib, dəstəyi asardı. Ancaq Nemət bilirdi ki, daxildə o da, Murtuzun ordenləriylə, Firəngizin gözəlliyi, əlaçıqlığı, isməti və məsumluğuyla fəxr etdiyi kimi, Spartakın erkək şöhrətiylə də qürurlanır.

Alya xanım özündən də xeyli bədgüman idi. Danışığında qəribə bir təzad vardı. Gah Murtuzun adından-sanından, yüksək dairələrdə hörmətindən, ailələrinin səadətindən danışırdı, gah da xırda bir şey üstündə bəxtindən şikayətlənərdi: "Ey, ay Sürəyya, vallah, hərdən deyirəm neynirdim bu gözəlliyi, bu ağlı, bu fiquranı? Bundansa Allah mənə bir bəxt verəydi".

Otağın o başında Mürşüd Murtuza bərk girişmişdi. Mürşüdün bayaq Dadaşla tutmayan söhbəti indi Murtuzun canına kərə yağı kimi yayılırdı.

– Bildiz də, Murtuz Balayeviç, Mahmud İsrafiloviçi zamministr qoydular.

– Sən nə danışırsan? Bəs onun yerinə kimi qoydular?

– Turab Qurbanoviçi.

– Yox əşi? Bəs Turabın yerinə?

– Turab Qurbanoviçin yerinə Zakir Zülfüqaroviçi qoyublar. Zakir Zülfüqaroviçin yerinə də elə Mahmud İsrafiloviç gəlib.

– Keçəl Həsən, Həsən keçəl?

– Necə? – deyə Mürşüd irişdi, – lap düz deyirsiniz. Bir balaca dəyiş-düyüş olub. Yerlərini dəyişiblər.

İnzibati dəyişikliklər Murtuzun da azarı idi. Özü də həmişə bu dəyişikliklərdən narazı qalardı. "Filan yerə filankəsi qoydular. Pah atonnan, gör dünyanın nə yeridir! Əşi, heç belə şey olmamışdı..."

Onu da qeyd etmək lazımdır ki, istefaya çıxmış polkovnikin mənsəb ehtirasları heç də sönməmişdi.

Sürəyya:

– Buyurun süfrənin başına, – dedi.

Nemət başını sındırırdı. "Yaxşı, əsas mən Dadaşı çağırmışam. Birinci dəfədir bizə gəlib. Amma di gəl ilk badəni Murtuzun yox, onun sağlığına qaldırsaq, Murtuz Balayeviç mısmırığını sallayacaq. Alya xanımın qaşqabağı yernən gedəcək, Sürəyya pörtəcək, mənim də günüm qaralacaq. Amma o tərəfdən də..."

Birdən çıxış yolu tapdı. Dahiyanə çıxış yolu... Caboş demişkən: qəşəng.

Badəsinə çaxır töküb ayağa qalxdı:

– Mən təklif edirəm, – dedi, – ilk badəni içək tamadanın sağlığına. Murtuz Balayeviçin sağlığına. Onun ailəsinin sağlığına. Arzu edək ki, bu xudmani məclisimizə əsil sərkərdə kimi rəhbərlik eləsin.

Gülüşdülər.

Nemət:

"Bu belə, – deyə düşündü. – Göz dəyməsin, bu bəla da sovuşdu".

Nemət Murtuzgilin inciməsindən yaman qorxurdu. Özü də ən pis o idi ki, Murtuzun nədən, haçan və nə səbəbə inciməsini fələk özü də gəlsə təyin edə bilməzdi. Görürsən adi bir söz, bir zarafat elə böyük bir incikliyə, kinə-ədavətə səbəb olurdu ki, Alyagilin ailəsi aylarla küsü saxlayır, Bikə xala isə evin içində Nemətin gününü göy əsgiyə bürüyürdü. Əsəd rəhmətə gedəndən bəri Bikə xalanın ən istəkli, ən əziz kürəkəni Murtuz olmuşdu. Eyni zamanda o, Nemət üçün göz dağı idi. Bəli, belə bir fövqəladə (yəni elə tez-tez olurdu ki, bir fövqəladəliyi də qalmamışdı) hadisə baş verən kimi Bikə xala başlayırdı: "Qızım sənə deyirəm, kürəkənim sən eşit" prinsipiylə görürsən Nemətin qulağının dibində Sürəyyayla danışırdı: "Getmişdim bu gün Alyagilə, Murtuzun qanı yaman qaradır, deyir, Bikə, nə ədəb qalıb, nə ərkan, dünənin lüməyi görürsən elə söz deyir, qalırsan baxa-baxa, nə böyük tanıyan var, nə kiçik. Saça-saqqala hörmət eləyən kimdir? Elə tutuqu-

şu kimi bir-iki söz əzbərləyib, üç-dörd kitab oxuyurlar, elə bilirlər dünyada bunlardan alim adam yoxdur. Deyir, qoyaydılar onları mənim ixtiyarıma, verəydim əllərinə lapatkanı, di qaz bu yeri, görüm necə qazırsan transey, bu səninçün kitab oxumaq deyil, arvad kimi kağız-kuğazla əlləşib cızmaqara eləmək də deyil". Bu söhbətlər onunla nəticələnirdi ki, Sürəyyanın təkidiylə Nemət bahalı konyaklardan bir şüşə alıb, yanında da bir qutu şokolad konfeti, gedirdi Murtuzgilə, oturub içir, barışırdılar.

Murtuzun səsi Neməti fikirlərindən ayırdı:

– Etimadınıza görə təşəkkür edirəm. – Nemət fikirləşdi ki, elə bil seçicilərlə görüşdə nitq irad eləyir. – Mən hərbi adamam, – boğazını arıtladı, – boş-boş danışmağı sevmirəm. Hər şeydən əvvəl nizam-intizam, rus demişkən, dissiplina prevışe vseqo. Kimə söz versəm, gərək, artıq-əskik söz danışmadan, durub, söz danışsın. Vəssalam.

Nemətə elə gəldi ki, nitqini "əmri icra edin. Gedə bilərsiniz" sözləriylə qurtaracaq. Amma Murtuz "vəssalam" kəlməsindən sonra qıvraq bir hərəkətlə stula çökdü.

Bir an Nemət düşündü ki, xudanəkərdə, əsgər olaydı, özü də Murtuz Balayeviçin əsgəri. Aman Allah. Adama qan uddurardı. Səhərdən axşamacan şaqqama günün altında o baş-bu başa qovardı: addımla marş! Raz, dva! Raz, dva!

Mürşüd:

– Müəllim, – dedi, – Murtuz Balayeviç. Müsaidə etsəydiniz... Bir–iki kəlmə... hi, hi, hi...

Murtuz ötkəm səslə:

– Edirəm, – dedi. – Danış, görüm nə deyirsən?

Mürşüd Molla Nəsrəddindən başladı. Nemət nə qədər cəhd edirdisə də, diqqətini toplaya bilmirdi. Beynindən nə qədər çıxarmaq istəyirdisə, bu yaxınlarda aldığı gözlənilməz bir məlumatı unuda bilmirdi. İki-üç həftə bundan qabaq Sürəyya böyük bir sirr kimi Nemətə xəbər verdi ki, Alyanın dediyinə görə, Murtuz Balayeviç şeirlə beş pərdəlik bir pyes yazıb. Babək üsyanı haqqında. Bu xəbəri alanda Nemət qarnını tutub uzun müddət sakit ola bilmədi. Sürəyya tutulan kimi oldu: "Başa düşmürəm, burda gülməli nə var?" – dedi. Nemət boğula-boğula: "Murtuz Balayeviç, pyes yazıb... şeirlə" – dedi və qəşş edəcək hala düşdü. İndi də bu məlumatı yada salıb pıqqıldayıb gülməkdən özünü güclə saxlayırdı. Xoşbəxtlikdən Mürşüd Molla Nəsrəddin əhvalatını danışıb qurtardı, hamı gülüşdü və Nemət fürsətdən istifadə

edib ürəkdən bir qəhqəhə çəkdi. Onun bu boyat lətifəyə belə bərk gülməsi deyəsən Murşüdün özünü də təəccübləndirdi. Mürşüd bir an dayanıb sözünə davam elədi:

– Hə, indi zarafat bir yana qalsın, birinci dəfədir ki, Dadaş Mamedoviçlə bir məclisdəyik, amma necə deyərlər, ürəkdən ürəyə yollar görünür. Yəni, Dadaş Mamedoviçi çoxdan tanıyırdım. Nemətdən onun haqqında çox eşitmişdim, bilirdim ki, bizim bu qonşu qağanı alıb qanadının altına. Amma Dadaş Mamedoviç, onu deyim ki, yəni özünüz də məndən yaxşı bilirsiniz, bizim bu Nemət ayrı oğlandır, sizin xətrinizi mən bilirəm necə istəyir. Bir Dadaş Mamedoviç deyəndə beş eşidir, sizdən danışanda, vallah, ağzına çullu dovşan sığmır. Deyir, Mürşüd, sən hələ o kişini tanımırsan, belə deməknən qurtaran deyil e, gərək Dadaş Mamedoviçlə özün oturub-durasan ki, bu adamın necə adam olduğunu dərk eləyə biləsən lazımınca. Elə bil onunçün deyiblər ki, çelovek – eto zvuçit qordo.

Nemət fikirləşdi ki, görəsən, bu büllur qrafinin qiyməti neçədir? Görəsən, Sürəyyaya söz versə ki, lap bu qrafinin cüt ekizindən tapıb alar, onda bu stolun üstündəki qrafini Mürşüdün başına vurmaq olarmı? Yox, içindəki çaxır süfrəyə tökülər, qiyamət qopar. Ağ süfrədən çaxır ləkəsi getmir, gərək üstünə dərhal duz səpəsən. Amma onda da tamam təmizlənmir. Bəs, persol necə? Görəsən, persol ləkəni tamam aparırmı?

Mürşüdün uzaqlaşmış səsi yenə yaxınlaşdı:

– Hə, onu deyirəm axı, mən Dadaş Mamedoviçi çoxdan tanıyıram, hərçənd o məni tanımırdı, biz balaca adamıq, həkim babayıq. Ancaq, Dadaş Mamedoviç, bilirsiniz də, məsəl var, dağın dağa işi düşməz, adamın adama işi düşər. Məsəl var: arvadın pisdi, boşa getsin, hə, arvad, sən qulağını yum görək (ümumi gülüş), dişin ağrıyır, çək qurtar. İndi, Allah eləməmiş, şər deməsən, xeyir gəlməz. İşdi-şayəd Dadaş Mamedoviç, dişiniz ağrısa-eləsə, bax bu lələşiniz qulluğunuzda hazır, haçan istəsəniz, necə diş istəsəniz, səhər, axşam, gecə, bahar, yay, qış, payız...

Nemət düşündü ki, bu, lütfkarlığın ən yeni və orijinal formalarındandır: dişin ağrısın, gətir çəkim.

Mürşüd qədəhini Dadaşa tərəf uzatdı:

– Sağ olun, Dadaş Mamedoviç, sizin sağlığınıza.

– Sağ ol, əziz olasan, çox sağ olun, hamınız, sağ olun. Sonra növbəylə, Cabbargilin, Mürşüdgilin, Nemətgilin sağlığına içdilər. Allah-

verdisi arvadlara, uşaqlara. Ayrıca Bikə xalanın sağlığına içdilər, dedilər ki, yeməklər qiyamətdir.

Sonra Nemət durdu:

– İçək tamadanın sağlığına, – dedi. Uzun-uzadı nə isə danışdı. Nə danışdığını özü də bilmirdi. Bircə fikrində onu tutmuşdu ki, mümkün qədər təmtəraqlı danışsın. "İnsanlıq, vüsət, zəka, istiqbal, hünər, müzəffər...". Lap qafiyə çıxdı. İstədi "əsər" də əlavə etsin, ancaq qorxdu.

Alya:

– Bəsdir, sən allah, ay Nemət, – dedi, – bu oldu lap kult liçnosti.

Murtuz bir balaca keflənmişdi, bu sözləri eşidəndə ayağa sıçradı.

– Nemət burda çox danışdı, – dedi. – Belə yaxşı-yaxşı, yağlı-yağlı sözlər dedi. Mən, əlbəttə, belə-belə sözləri bilmirəm. Belə qırıldada bilmərəm. İndi neyləyək kulturamız çatmır, – son cümləni deyib Alyaya baxdı. Alya da ona baxdı. Bu mənalı baxışmanın mənası bu idi ki, "kulturanın çatmaması" rişxənd təbiriylə deyilmişdi, təki hamının mədəniyyəti bizimkiycən olaydı.

– Hə, bir sözlə, hörmətinizə görə sağ olun. Məni çox təriflədiz, bəlkə layiqindən də artıq, – bu yenə eyni priyom idi. – Mən indi bacardığımdan xalqıma xidmət eləmişəm. Cəbhənin odunda-alovunda qanımızı tökəndə, elə biz sizin kimi çavanların bugünkü firavan gününü fikirləşmişik ki, siz belə-belə oturasız, kef çəkəsiz, xoşbəxt dolanasız. İndi sizin də borcunuz odur ki, bu yolda qan tökən adamlara lazımi hörmət-izzət göstərəsiniz. Böyüyün böyük yeri var, kiçiyin kiçik, yoxsa ara qarışıb məzhəb itsə, bu, yaxşı nəticə verməz. Alya, o ki qaldı, sən deyirsən kult liçnosti, deyir, vallah, o liçnostə də canım qurban, onun kultuna da.

Murtuzun əqidəsi qəlbinin dəruni guşələrində gizlənir. "Ararat" konyakının beşinci qədəhindən sonra isə atlanıb ordan çıxırdı. Müddəaları da çox dəqiq idi...

Deyir dəryalarca qan töküb, adam qırıb? Əcəb eləyib. Xalq düşmənlərini qırıb qurtarmasaydı Hitleri məğlub edə bilərdi?

...Masanın arxasından durdular.

Dadaş yenidən pəncərənin qabağına gəldi. Nemət onun yanında durub:

– Ora Akademiyanın təzə binasıdır, – deyirdi. – Köhnə binası görünmür. Ora dəyirmandır. O, bankın qabağıdır.

Sonra kimsə təklif etdi ki, maqnitofonu qursunlar.

Nemət düyməni basdı:

– Hə, bir şey deyin, – dedi. Bir neçə dəqiqədən, bir neçə səsdən sonra isə:

– Bir də mən görsəm ki... – dedi və susdu.

Qonaqlar vidalaşıb dağılışdılar.

Çarpayısında uzanan kimi yuxuya getdi. Bu gün çox yorulmuşdu. Çox da həyəcan keçirmişdi.

Qızlar da yatdılar. Bikə xala da. Sürəyya da.

Gecənin bir yarısında elə bil kimsə qəfilcə Neməti oyatdı.

Gözlərini açdı. Gördü ki, kefliliyi də keçib. Tamam ayıq idi. Tamam da oyaq. Yuxusuzluğa alışmış bir adam təcrübəsiylə dərhal başa düşdü ki, təzədən çətin yata.

Elə bil kimsə onu oyatmış və beynini fikirlə doldurmuşdu. Yaman da yanğısı vardı. Durub su içdi.

Fikirlərini qovmaq istədi. Divara tərəf çevrildi. Əlini xəritəyə çəkdi: Ağcatau, Sasık göl, Ağcal...

Amma fikirlər qayıtdı. Onları dağıtdı. Yenə qayıtdılar. Yenə. Yenə...

Dünən səhərdən bəri başında oyanan fikirlər elə bil yenidən rəsm-keçidə gəlmişdi.

Əvvəlcə atası haqqında düşünməyə başladı. Düşündü ki, bax, anam deyirdi atanın Samuxda yaman hörməti vardı. Evlər tikmişdi, yol çəkdirmişdi. Sonra düşündü ki, Samux indi Mingəçevir dənizinin dibindədir. Evləri, yolları, hamısı...

Bəs, Samuxda yaşayan adamlar? O adamlar ki, atası onların hörmətini qazanmışdı? Hərəsi bir yana dağılıb. Bəlkə atasının surətini, xatirəsini, bağışlanmış fotoşəkillər kimi, hərəsi bir tərəfə aparıb. Bəlkə də...

Sonra hardansa beynində qafiyələr dolaşmağa başladı: azsa, pozsa, yazsa...

Sonra nədənsə pəncərənin axar-baxarı haqqında düşünməyə başladı: Qız qalasının təpəsi, Akademiyanın təzə binası. Bank, dəyirman.

Sonra marşrutlu avtobus haqqında dünənki fikirlərini xatırladı.

Sonra qulaqlarında maqnitofon yazıları canlandı:

"Bir də mən görsəm ki..." – bu cümlə nəbz kimi beynində döyünməyə başladı.

O biri otaqda saat üç dəfə vurdu və qəfilcə bir an içində Nemət hər şeyi başa düşdü.

Fikirləri durulub aydınlaşdı və Nemət hər şeyi birdən anladı.

Anladı ki, pəncərənin axar-baxarı nə qədər cazibəli, mənzərəli, gözəl olsa da, o, Nemət bu görünüşə nifrət edir. Nifrət edir, çünki o, bu mənzərəyə məhkumdur. Ömürlük məhkumdur. Heç bir zaman bu pəncərə, qatar pəncərəsi kimi hərəkətə gəlib dəyişməyəcəkdir. Bu pəncərəni xalça kimi dörd mismarla onun həyatına mıxlayıblar. Ömrü boyu o bu pəncərədən baxıb Qız qalasının təpəsini, Akademiyanın yeni binasını, bankı, dəyirmanı görəcək.

Adam öz həyatını qadını atan kimi ata bilmir, insan öz həyatını axıracan yaşamalıdır. Həyat yükünü axıracan daşımalıdır...

Nemət dəhşət içində anladı ki, bir də onun həyatında heç bir vaxt heç bir şey olmayacaqdır. Nə ürkək duyğuların nigaranlığı, nə gözləmə, nə aldanış, nə ümid, nə bahar gecəsi son tramvayın pəncərəsində diksinən ulduzlar...

O, həyatını, gündə oynadığı rolundan bıqmış bir aktyor kimi, qatarlara qoşulub dəyişməz relslərlə gedən parovoz kimi son mənzilə, son pərdəyə, son dayanağa, son sükuta çatdırmalıdır. Son qaranlığa, son səsin susduğu yerə...

O qanunların, qadağaların, normaların əsiridir.

Onları poza bilməz.

Poza bilməz, aza bilməz. Aha, indi tapdı ki, bu qafiyə hardandır. Yazıq, biçarə, zavallı marşrutlu avtobus!

Pozsa, azsa, yazsa...

Yazılana pozu yoxdur. Bunu bayaq kim dedi? Bayaq yox, dünən. Dadaş dedi, hə, bir də yadımdadır, vaxtilə Bikə xala demişdi.

Dünən Karmen də nə isə buna bənzər, bir şey deyirdi, hə, dedi ki, yazılıb, pozulmayacaq. Nə pozulmayacaq? Hə, maqnitofon yazısı...

– Hə, bir şey deyin...

– Demək, mən demək istə...

Bir dənə söz, bir dənə hərf dəyişə bilməz. Donub qalıb.

– Bir də mən görsəm ki...

Heç kəs bilmir ki, bir də sən görsən ki... nə edəcəksən?

Sabah yenə yığışıb bu yazıya qulaq asacaqlar. Sabah olmasın, birisi gün olsun. Ya bir həftə sonra. Yenə qulaq asacaqlar. Hamısı – özləri də, qonşuları da, qohumları da, Mürşüd, Mənzər, Tahirə, Caboş, Alya...

Sabah da qulaq asacaqlar. Hə, hə, lap yəqin bil. Biri gün də, o biri gün də.

Hər gün Bikə xala təkrar edəcək ki, Alyagilin maqnitofonu iki də-fə böyükdür. Hər gün Karmen rişxənd edəcək ki, Nemət "zadrıpan-nıy" maqnitofon alıb, hər gün Sürəyya ona acıqlanacaq və hər gün də sonda Nemət bir də mən görsəm ki, – deyə kimisə hədələyərək, sözünü yarımçıq qoyub sükut, səssizlik uçurumuna yıxılacaq.

Heç kəs də heç bir vaxt bilməyəcək ki, Nemət bir də görsə nə olacaq... Nə olacaq? Heç nə, hədəsiz hədə...

Sabah, biri gün o, birisi gün. Ay keçəcək, il keçəcək.

Heç nə dəyişməyəcək, ilahi, heç nə, heç bir şey.

İyirmi-otuz il sonra Nemət qocalıb öləcək. Ancaq ölənə qədər həyatında heç bir dəyişiklik olmayacaq. Arvadı. Üç qızı. Eyni qohum-lar. İş yoldaşları, qonşular. Eyni söhbətlər, zarafatlar, qayğılar, təlaş-lar. Eyni məclislər, tostlar...

Eyni pəncərə. Eyni avtobus. Eyni yazı...

Bir də mən görsəm ki...

Yazılana pozu yoxdur. Vəssalam. Qurtardı. Kitab bağlandı. Nöqtə.

Nöqtə? Bəlkə vergüllü nöqtə? Daha doğrusu, nöqtəli vergül? Bəl-kə dalı var, izahı var...

Bir də mən görsəm ki... Nə görsən, ay yazıq? Nə görmüsən? Nə görəcəksən? Görsən nə edəcəksən? Heç nə...

Yazılana pozu yoxdur.

Yaxşı, bəsdir, yat getsin, Nemət. Sabah tezdən işə gedəcəksən. Yüzə qədər say: yuxuya gedəcəksən. Ya da yum gözlərini, təsəvvür elə ki, yolla gedirsən, gedirsən, gedirsən bir də görəcəksən yatdın. Əsas yuxulamaqdır. Adam yuxuda olanda vaxt məfhumu yox olur. Ya-tırsan, yuxu səni hoppadan götürüb qoyur səhərə. Vəssalam. Yaxşı, yataq. Bir, iki, üç, dörd, beş, altı...

Təhminə! Təhminə? O hardan yadıma düşdü? O hardan gəlib çıx-dı? Hardan gəlib düşdü bu obraz, durdu gözlərimin qabağında? Dümdüz uzun qıçlı. Qara saçları şəlalə kimi çiyinlərinə axmış. Dişləri tən bir boyda – qarğıdalı dənələri. Gözləri... Nə rəngdəydi Təhminə-nin gözləri? Qara? Qonur? Göy? Yaşıl? Yox, yaşıl deyildi. Göy, şaba-lıdı, qara, qonur? Göy? Yaşıl? Yox, yaşıl deyildi. Nə rəng idi? Nə cür olub ki, indiyəcən diqqət eləməmişəm? Doğrudan qəribədir. Yaxşı, yat, Nemət, sabah işdə fikir verərsən. Yox, qəribədir. Nə rəngdir axı, qara, qonur, şabalıdı? Bəli də, indi də beyninə bu düşdü? Bu gecə vaxtı

hardan öyrənəcəksən? Görəsən kim bilər bunu? Dadaş. Zəng eləyəsən, Dadaşdan soruşasan. Neməti gülmək tutdu. Pis olmaz. Gecə saat üçdə zəng eləyib Dadaşı yuxudan oyadasan: bağışlayın, Dadaş müəllim, sizə bir sualım var: Təhminənin gözləri nə rəngdədir? Təsəvvür edirəm Dadaşın sir-sifətini: Dadaş tuman-köynəkdə yuxudan avara olunub, telefonla şöbəsinin bir işçisi Nemətə başqa işçisi Təhminənin gözləri haqqında məlumat verir. Nə səhnədir! Doğrudan nə olardı, indi götürüb Dadaşa zəng edəsən?! Eh, nə boş-boş danışırsan, heç eləyərsən? Niyə eləmirəm? Ay elədin ha! Vallah, dəli şeytan deyir, dur elə. Ay elədin ha! Yaxşı. Nemət, yat. Hə, nə oldu, əzizim, deyirəm axı, sən dəli şeytanın sözüylə durub-oturan oğlanlardan deyilsən. Sən həmişə ağıllı şöbə müdirinin qoyduğu qayda-qanunlarla yaşayan oğlansan. Elə bu tutduğun yolnan da get. İşin yaxşı olar. Deməli, belə? Yaxşı, baxarıq.

Nemət ayağa durdu. Gecə məstlərini geydi, pijamasını düymələdi, dəhlizə çıxdı. Telefonun dəstəyini qaldırdı. Vaxt gec olduğundan, telefondan dərhal aydın "zummer" eşidildi. Nemət özünə belə qəribə görünən bir etinasızlıqla Dadaşın nömrəsini yığdı. "Beş siqnal gözləyəcəyəm, cavab çıxmasa asacam". Dördüncü siqnaldan sonra Dadaşın səsi gəldi:

– Allo!

Səs yuxulu səs deyildi. Həmişəki aydın, təmkinli səs idi. Nemət bir an susdu, sonra cəld:

– Mənəm. Nemətdi, – dedi. Daha geriyə yol yox idi.

– Buyur, Nemət.

– Bağışlayın. Dadaş müəllim, sizi yuxudan oyatdım.

– Yox, yox, yatmamışdım, işləyirdim.

Birdən-birə Nemət özünü aciz və miskin hiss etdi. Yatmış bir mötəbəri gecə saat üçdə yuxudan oyadıb qəribə sual vermək ürək istəyirdi! Amma gecənin bu vaxtında oturub işləyən bir adamı belə axmaq bir sualla işindən ayırmaq yüngüllük idi, uşaqlıq idi, sataşmaq idi. "Təcili surətdə ayrı bir bəhanə tapıb işin içindən çıxmaq lazımdır".

– Dadaş müəllim, sizdən bir şey soruşmaq istəyirəm. – Bunu vaxt qazanmaq üçün dedi.

– Buyur.

"Aha, tapdı".

– Dadaş müəllim, mən belə şeylərdə yaman vasvasıyam. Yata bilmirəm. Sabaha qədər yerimdə qovrulacaqdım. Siz allah, bir məni sakit eləyin. İnciyib eləmədiniz ki?.. Bizim bu qonşu, Mürşüd bir az şitlik edirdi. Murtuz Balayeviç də bir az kobud adamdır... Deyirəm bəlkə...

Dadaş onun sözünü yarımçıq qoydu:

– Yox, yox, nə danışırsan, Nemət, dəli olma. Hər şey lap əla idi. Niyə inciyirəm? Adamlar cürbəcürdür. Hərəsinin öz duzu, öz ləzzəti var. Elə adamlar olmasaydı, həyat maraqsız olardı. Sən lap arxayın ol. Rahat get yat. Gecən xeyrə qalsın, – cavab gözləməmiş dəstəyi yerə qoydu.

"Vəssalam, Nemət müəllim. Bu da sənin qiyamın. Bu da sənin meydan oxumağın. Bu meydan oxumaq olmadı, meydan sulamaq oldu. Qiyam olmadı, mütiliyinin yeni ifrat bir təsdiqi oldu. Di get yat. Eşitmədinmi, Dadaş sənə rüsxət verdi. Yat".

Nemət otağa keçib qaranlıqda pencəyini tapdı, cibindən siqaret çıxarıb iki qullab vurdu, dəhlizə qayıtdı. Telefonun, dəstəyini qaldırıb nömrəni yığdı. Du, du, du...

– Bəli, – Dadaşın səsi yenə də sakit və təmkinli idi.

– Mənəm, Nemətdir.

– Eşidirəm.

– Dadaş müəllim, sizdən bir şey soruşmaq istəyirəm. Təhminənin gözləri nə rəngdədir? – birnəfəsə dedi.

Dəstək sükuta qərq oldu. "Hə, elə olarsan, müəllim. Deyəsən söz boğazında qaldı. Bir udqun görək. Hə, indi cavab ver. Həmişəki tək sakit və təmkinlə gecə saat dördə iyirmi dəqiqə işləmiş işçin Nemətə, işçin Təhminənin gözlərinin rəngi barəsində məlumat ver görüm".

– Nemət, – səs əvvəlki kimi sakit idi, – deyəsən, biz gedəndən sonra xəlvətə salıb təkbaşına içmisən.

Nemət bu sözlərin mənasını da, Dadaşın sakitliyinin səbəbini də anladı. Bu vəziyyət Dadaşçün qəribə, qeyri-adi bir şey deyildi. Ömrü boyu Dadaş elə növbənöv qəribəliklər görmüşdü ki, Nemətin əcaib sualı onu təəccübə gətirib halından çıxarda bilməzdi. Sualın vaxtına – gecə saat dördün yarısına gəldikdə isə, buna da vərdişli idi: Məmməd Nəsirin vizitləri də təxminən gecənin bu radələrində olurdu. "Bizdən sonra xəlvətə salıb içmisən". Dadaş, Nemətə Məmməd Nəsir kimi baxırdı. Əlbəttə, Nemət Məmməd Nəsir deyil, ağlı, dərrakəsi var. Həm

də ailəsi, arvadı qoymaz. Amma ömründə bir gecə Məmmədnəsirlik edirsə, dünya dağılmaz. Dadaş təmkinlə və çox soyuq:

– Nemət, get yat, – dedi, – gecdir. Yaxşıca əl-üzunü yu, sonra yat.

– Dadaş müəllim, əgər elə bilirsiz ki, mən sərxoşam, çox səhv edirsiniz. Əgər məni təzə başlayan Məmməd Nəsir hesab edirsinizsə, yenə də səhviniz var. Mən tamamilə ayığam. Axşam da az içmişdim. Sizdən sonra da dilimə vurmamışam. Mən bircə sizdən onu bilmək istəyirəm ki, Təhminənin gözləri nə rəngdədir.

Dadaş kəskin və sərt bir ədayla:

– Nə demək istəyirsən? – dedi.

– Heç nə. Bircə Təhminənin gözlərinin rəngini bilmək istəyirəm.

Dadaş daha da sərt və əsəbi bir tərzdə:

– Bu sualı mənə niyə verirsən? – dedi.

“Aha, deyəsən özündən çıxırsan. O mötəbərlik maskan yerindən oynayır. Kişisən, bir kəlmə sərt söz de, cavabını elə verim ki, ölənəcən yadından çıxmasın. İstəmirəm sənin müqaviləni, avansını da. Mən elə kişinin oğlu deyiləm ki, sən mənə atalıq eləyəsən. Hə, de görüm, bir söz de...”

Dadaş heç nə demədi. Ancaq birdən-birə güldü. Bərkdən güldü. Bəlkə ondakı yumor hissi əsəblərinə və hirsinə üstün gəldi və o, vəziyyətin komizmini dərk etdi. Ya da özünü ələ ala bildi, kinini içəri salıb, bu qəribə söhbəti zarafata çevirmək istədi.

– Bilirsən nə var, Nemət, – dedi, – zəng elə özündən soruş.

“Bu adam sabun kimidir, – deyə Nemət düşündü. – Onu tutmaq mümkün deyil. Sürüşüb əlindən çıxacaq”.

– Telefon nömrəsini bilmirəm.

Dadaş əvvəlki kimi sakit və təmkinlə Təhminəgilin telefon nömrəsini dedi.

– Çox sağ olun. Bağışlayın zəhmət verdim.

– Xoşdur. – Ani bir sükutdan sonra əlavə etdi: – Mən gec yatıram. İşçilərdən hansı birinin gözləri, ya burnu haqqında məlumat lazım olsa, utanma, zəng elə. Xudahafiz.

Dəstəyi hər ikisi eyni vaxtda asdı. Nemət öz-özünə: “Bir: sıfır, Dadaşın xeyrinə” – dedi.

Təhminənin telefonu uzun zaman cavab vermirdi. Nemət uzun siqnallara qulaq asır, Təhminənin yatdığını anlayır, ancaq dəstəyi asmırdı. “Səhərə qədər gözləməli olsam da, asmayacağam”.

– Allo. – Təhminənin səsi yuxulu və boğuq idi.

“Sanki səsi duman içindədir”.

– Gecən xeyir, Təhminə, Nemətdir.

– Kim? Nemət? Hə... Bay, xeyir ola?

– Xeyirdir, qorxma. Səni yuxudan oyatdım, hə?

– Hər halda bu vaxt yəqin, tərəqqipərvər bəşəriyyətin əksəriyyəti yatır. Bəs sən niyə yatmamısan. Nemət? Kefli-zad deyilsən ki?..

– Görəsən niyə hamının başına məhz eyni bir fikir gəlir: keflilik?

– Yəni hamı deyəndə, məndən başqa da çox adama zəng eləmisən?

– Yox, bircə Dadaşa zəng eləmişdim. Ondan sənin gözlərinin rəngini soruşdum, demədi, amma sənin telefonunun nömrəsini verdi. Dedi, zəng elə özün soruş.

Təhminə güldü:

– Hardan danışırsan?

– Evdən.

– Bəs külfətin yatıb?

– Hə, hamı yatıb. Bütün şəhər yatıb, bir sən oyaqsan, bir mən. Bir də Dadaş oturub işləyir.

– Görürsən, bax, əsil zəhmətkeş Dadaş kimi olar.

– Təhminə, bilirsən Füzuli nə deyir?

– Nə deyir axı?

Deyir ki:

> Ey Füzuli, şami-qəm əncamına yoxdur ümid
> Bir təsəllidir sənə ol söz ki, derlər var sübh.

– Başa düşdün?

– Az-maz.

– Bir bu “derlər” sözünə bütün dünya poeziyasını dəyişmərəm. Başa düşürsən, derlər, yəni görməyib, eşidib, deyirlər. Kimsə deyib ki, hardasa sübh var, bircə bu təsəlli olmasa, şami-qəmdən, yəni axşam qəmindən yaxa qurtarmaq olmaz.

– Əzizim, əgər sən elə bilirsən ki, gecə – saat dördün yarısı Füzuli qəzəllərini şərh etmək üçün ən münasib vaxtdır, onda...

– Dayan, Təhminə, sən allah, boşla zarafatı. Mən səninlə ciddi danışmaq istəyirəm. Qəlbimi sənə açmaq istəyirəm.

– Nemət, dola məni əzizlərinin başına, əgər sən də desən ki, bir qəlbdən min qəlbə mənə aşiq olmusan, mən daha başımı götürüb gərək bu vilayətdən qaçam...

– Yox, əzizim, ürəyini buz kimi elə, arxayın ol. Mən sənə izhari-məhəbbət və etirafi-eşq eləmək fikrində deyiləm.

– Allah ölənlərinə rəhmət eləsin. Yenə bu da qənimətdir.

– Hə, indi qulaq as. Mən səninlə məsləhət eləmək istəyirəm. Bu gün mən bir çox şeyləri anladım, anladım ki, mən daha bundan sonra indiyədək yaşadığım kimi yaşaya bilmərəm.

– İndiyədək necə yaşamısan ki?..

– Bilmirəm. Təhminə, heç bilmirəm keçmiş həyatıma nə ad verim. Durğunluq, ətalət, meşşanlıq bataqlığı.

– Pah atonnan!

– Gülmə. Artıq bu cür yaşamaq mümkün deyil. İş, ev, ailə, maaş, qonorar, mebel, televizor, maqnitofon... Mən bu çərçivədə boğuluram. Təhminə.

– Nemət, əzizim, qonorar da, televizor da, maqnitofon da pis şeylər deyil. Ancaq gərək onların əsiri olmayasan.

– Elədir. Bax, bayaq evimin pəncərəsindən baxırdım. Pəncərənin axar-baxarı, mənzərəsi çox gözəldir. Bütün şəhər görünür. Qız qalasının təpəsi, Akademiyanın təzə binası. Ancaq mən düşündüm ki, bu mənzərə artıq mənim qəlbimi titrətmir, çünki bu mənzərəyə məhkumam. Ömürlük məhkumam. Heç bir zaman bu pəncərə qatar pəncərəsi kimi hərəkətə gəlib dəyişməyəcək. Bu pəncərəni xalça kimi dörd mismarla mənim həyatıma mıxlayıblar. On ildir mən bu pəncərədən baxıb Qız qalasının təpəsini, Akademiyanın yeni binasını, bankı, dəyirmanı görürəm. Ömrüm boyu da görəcəyəm. Amma...

– Dayan, dayan bir görək, bir nəfəsini dər. Maşallah bu kəlama! Elə bil əyalət teatrında monoloq söyləyirsən.

– Yox, əgər sən məni dolamaq fikrindəsənsə...

– Dolamıram, o saat da inciyirsən. Dəymədüşər olma. Düz demirsən axı. Qatar pəncərəsi-filan, bütün bunlar gəlişi gözəl sözlərdir, ancaq həqiqət deyil. Dünyada hər şeydən yüksək isə həqiqətdir.

– Niyə həqiqət deyil?

– Niyə? Bu saat deyim. Bax, deyirsən ki, on ildir pəncərədən baxıb Akademiyanın təzə binasını görürəm. Düz deyil. On il yox, heç üç

il bundan qabaq da bu bina tikilməmişdi. Bu bir. İkincisi, deyirsən ki, ömrüm boyu eyni mənzərəni görəcəm. Bu da yalandır. Çünki bir ildən sonra, məsələn, tutaq ki, sirkin yeni binası hazır olacaq, onu görəcəksən. Ayrı təzə-təzə binalar tikiləcək. Yəni sənin pəncərən özü tərpənməyəcək, ancaq ordan görünən mənzərə, həyat dəyişir, dəyişəcək, başqalaşacaq. Sən pəncərəni rəmzi mənada deyirsən, mən də rəmzi mənada deyirəm ki, pəncərədən diqqətlə baxsan, görərsən ki, həyat necə qaynayır, dəyişir. Hə, susursan? Görürsən, mən haqlıyam, indi qulaq as mənə, bir şey də deyim. Bu gün səhər radioyla bir verilişə qulaq asırdım. Heç bilmirəm nə veriliş idi, ancaq orda bir şey dedilər, mənim yaman beynimə batdı. Təxmini deyirəm, dəqiq yadımda deyil. Üç obrazı əsas götürmüşdülər. – Pəncərə, qapı, güzgü, məcazi mənada, əlbəttə. Deyir bəzi adamlar otaqlarında pəncərələri, qapıları güzgülərlə əvəz eləyir, yəni hara baxır, özünü görür. Belə adamçün yalnız tək bir özü mövcuddur. Onun üçün nə pəncərədən görünən mənzərə var, nə də qapının dalındakı həyat. Ancaq güzgü. Ancaq özü. İkinci qisim adamlar pəncərədən baxır. Pəncərədən dünyanı, həyatı seyr edirlər, seyrçidirlər. Pəncərədən gördükləri yaxşılıqları, pislikləri ancaq kənardan müşahidə edirlər. Və nəhayət, üçüncü qisim adamlar qapını açıb həyata, insanların yanına çıxanlardır. Pəncərədən gördüyü yaxşılıqlara qapıdan çıxıb qəhmər dururlar, pislik görəndə yenə qollarını çirməyib davaya girişirlər. Pəncərə, qapı, güzgü. Mən qapının tərəfdarıyam, – bir qədər susub güldü və əlavə etdi: – Əlbəttə, o demək deyil ki, mən çantamda güzgü gəzdirmirəm.

Küçədən maşın keçdi gecənin səssizliyi parçalandı, maşın səsi uzaqlaşanda, sükut yenə qapandı.

– Bilirsən, Təhminə, sənin dediklərin çox doğru və gözəl fikirlərdir. Ancaq məsələ ondadır ki, bütün bunlar yenə də abstraksiyalardır, mücərrəd məfhumlardır. Mənə isə konkret cavablar lazımdır. Başa düşürsən, mən bilmək istəyirəm ki, şəxsən mən – Namazov Nemət nə üçün yaşayıram, hansı amalla, hansı məqsədlə? Məni düzgün başa düş. Mən nihilist və skeptik deyiləm. Yüksək amala da inanıram. Böyük mənada məqsədim də var. Cəmiyyətin məqsədlərini başa düşürəm. Xalqımın problemlərini də anlayıram. Ədalətli, azad, gözəl bir cəmiyyət. Bərabərhüquqlu insanlar, bərabərhüquqlu millətlər. Nə əzən

var, nə əzilən. Bütün dünyada sülh və əmin-amanlıq. Ən uzaq ölkələrdə belə aclıq, fəlakət, xəstəlik olmasın. Mən bütün bunları arzu edirəm. Bu məqsədlərin yolunda, necə deyərlər, canımı, qanımı verərəm. Çox yaxşı. Amma, bax şəxsən mənim, otuz üç yaşlı tərcüməçi Nemət Namazovun konkret məqsədi, işi nə olmalıdır? Mənim nə xüsusi bir parlaq istedadım, nə böyük bir bacarığım var ki, xariqülадə işlər görüm. Mənim elədiyim işi isə, başqası da lap gözəl, bəlkə də məndən yüz dəfə yaxşı, ya məndən bir az pis, fərqi yoxdur, hər halda mənim işimi başqası görə bilər. Bəs mənim necə deyərlər, mütləqliyim, əvəzsizliyim nədir, mənim öz yerim hardadır ki, o yerdə məni heç kəs əvəz edə bilməz? Şəxsən mənim məqsədim, konkret olaraq mənim məqsədim nədir? Maşın almaq? Kooperativ evə yazılmaq? Ya bütün ömrüm boyu Murtuz Balayeviçin atmacalarına göz yummaq, Dadaşa yarınmaq, Mürşüdün şitliyinə gülmək? Hə?

– Mürşüd kimdir, Murtuz Balayeviç kimdir, ay Nemət?

– Tanımasan yaxşıdır, mənim durub-oturduğum adamlardır...

– Pis adamlardır?

– Nə bilim? Pis adam, yaxşı adam. Məgər bilmək olar, pis adam kimdir, yaxşı adam kimdir?

– Aman Allah! Ay Nemət, dünən həmin bu sözləri mən özüm bir nəfərə deyirdim. Amma, Nemət, axı, vallah, belə deyil. Hər halda, yaxşı adam yaxşı adamdır, pis adam pis adam...

– Yaxşı, onda bax, mən, pis adamam, yoxsa yaxşı adam?

– Mən səni az tanıyıram, Nemət.

– Çox sağ ol, Təhminə, belə dediyin üçün sənə çox minnətdaram, mərdliyin üçün sağ ol. Desəydin ki, yaxşı adamsan, inanmayacaqdım. Amma düz deyirsən ki, adama yaxşı, ya pis demək üçün onu gərək tanıyasan. Bax, məsələn, o Murtuz Balayeviç ki deyirəm, mənim böyük bacanağımdır, özü hərbçidir, polkovnikdir. Belə bir az köntöy adamdır, namərbutdur e... Sözünün, danışığının yerini bilən deyil, odur ki, məni həmişə əsəbiləşdirir. Ancaq indi fikirləşirəm ki, onu ittiham etməyə mənim nə haqqım var? Kişi oddan-alovdan çıxıb. Müharibədə yaralanıb, qan töküb. Ölümün gözünün içinə baxıb. Hər halda həyatda müəyyən bir yeri, rolu olub ki, orda onu heç kəs əvəz edə bilməzdi. Yaxud o biri bacanağım Cabbar...

– Bacanaq sarıdan deyəsən bolsan.

– Hə, Cabbar, onun arvadı. Elə-belədə söhbət eləyirsən, dayaz adam təsiri bağışlayırlar. Amma axı deyirlər öz sahələrində yaxşı mütəxəssisdirlər. Mühüm dövlət əhəmiyyəti olan bir obyektdə işləyirlər.

Təhminə qəfilcə soruşdu:

– Nemət, neçə uşağın var?

Nemət də qəfilcə cavab verdi:

– Bir, – həyatında ilk dəfə belə cavab verdi.

– Bir?

– Bir, – deyə qətiyyətlə təkrar etdi. – Qızdır. Nərgiz.– Sonra əlavə etdi: – İki böyük qız yoldaşımın birinci ərindəndir.

– Allah saxlasın, hamısını.

Az qaldı desin, səninkilərnən. Sonra yadına düşdü ki, Təhminənin uşağı yoxdur. Qəribə bir həvəslə Nərgizdən danışmağa başladı. Sözlərindən, oyunlarından, marka toplamasından.

– Dünən oturub özü Xoruz babaya uzun bir məktub yazıb. Deyir Xoruz baba keçən səfər tapşırdı ki, hansı quş adlarını bilirsiniz yazın mənə. Bu yazıq şəhər uşağı, quşların adını hardan bilsin? Bəli, oturub buna bir-bir quş adlarını demişəm yazıb. İndi bu gün də səhərdən oturub radionun qabağında ki, Xoruz baba mənim adımı deyəcək. Deyirəm, qızım, məktubu dünən yazmısan, hələ heç gedib Xoruz babaya çatmayıb. Kimə deyirsən? Bəli, axıra qədər qulaq asdı, adını demədilər, bir də gördüm, dodağını büzüb doluxsundu. Deyirəm, qızım, sən lap arxayın ol, gələn həftə mütləq sənin adını deyəcək.

Təhminə səssiz qulaq asırdı. Bir an Nemətə elə gəldi ki, Təhminə yuxuya gedib.

– Təhminə, – dedi.

– Hə... elə bil səsi uzaq bir aləmdən qayıtdı. – Eh, ay Nemət, – dedi. – Belə qızın ola-ola yenə həyatının mənasını axtarırsan...

– Bilirsən mən bu barədə də düşünmüşəm. Deyirəm bəlkə həyatda mənim varlığımın yeganə mənası körpü olmaqdır. Bütün əcdadımın, baba-nənələrimin, atamın, anamın həyatını körpü kimi öz üstümdən keçirib övladlarıma yetirməkdir? Hə? Susursan. Deyəsən yaman naqqalladım, səni lap yordum. Yuxun gəlmir ki...

– Yox.

– Bilirsən, ürəyim yaman dolu idi. Danışdım səninlə bir, az ürəyim yüngülləşdi. Əşşi, dünən maqnitofon almışam. Səsimizi yazmışıq. Da buna neçə dəfə qulaq asarlar? Beş dəfə, on dəfə, yüz dəfə... Hər qonaq gələndə təzədən qurulur. Eyni sözlər, ibarələr, gülüşlər. Məni dəhşət basdı. Mənə elə gəldi ki, bu elə mənim həyatımın rəmzidir. Dəyişməz, durğun, donub qalmış. İndi də dəhşətlə fikirləşirəm ki, sabah yenə qulaq asacaqlar. Adam istəyir lap başını götürüb qaçsın.

– Daha niyə qaçırsan, ondansa yazını poz.

– Pozum?

– Hə. Nədi, bu ağlına gəlməmişdi?

– İnanırsan ki, yox? Ağlıma hardansa bir fikir düşmüşdü ki, yazılana pozu yoxdur.

Hər ikisi güldü.

– Yox, əzizim, maqnitofon yazısını pozmaq çox asandır. Hansı markadır maqnitofonun?

– Yauza.

– Hə, mənimki də ondandır. Dördüncü düyməni bas, vəssalam. Pozulsun getsin.

– Ay sağ ol. Əməlli-başlı başıma ağıl qoydun. Deməli, dördüncü düymə. Çox sağ ol.

– Sən də sağ ol, – əsnədi, – hələlik...

– Dayan, dayan. Yaxşı, axı əsas məsələ yaddan çıxdı.

– Hansı məsələ?

– Sənin gözlərinin rəngi.

Güldü.

– Gözlərim elə rəngdədir ki, heç bir sözə, tərifə sığışmaz: Gərək özün görəsən. Sabah işdə baxarsan.

– Sabah yox, bu gün... Eşidirsən, tramvaylar başladı işləməyə.

– Bizim küçədən tramvay keçmir. Oy, babamın babası, – əsnədi, – doğrudan a, səhərdir. Dan yeri sökülür. Düz deyirmiş Füzuli: “Var sübh”. Gedim heç olmasa bir az yatım, yoxsa işdə mənim sifətimə baxıb qorxarsınız.

– Qoy görək əşi, istəyirsən sənə kompliment deyim?

– De də, nə olar ki? Hansı qadın komplimentdən imtina edər?

– Deyim də... sən çox gözəl, çox yaxşı, çox ağıllı qızsan. Bu gecəki söhbətimizi mən heç vaxt unutmaram. İndi sən də axırda mənə bir söz

de ki, gedim yaxşı yuxu görüm. Yoxsa elə biməzmun yuxular görürəm ki...

– Qoy sənə öz yuxumu danışım, sən də onu gör.

– Danış.

– Bu yuxunu tez-tez görürəm. Eyni bir yuxunu. Bayaq sən zəng eləyəndə də görürdüm. Görürəm ki, dəniz sahilindəyəm. Aydın, işıqlı bir gündür. Sahil bomboşdur. Bircə mənəm. Təpə-tənha. Dəniz gömgöydür. Uzaqda, lap uzaqda, üfüq xətti tərəfdə ağ bir liman görünür və bu ağ limanda qıpqırmızı gəmilər dayanıb.

– Əcəb yuxudur. Çox sağ ol, əzizim. Gecən, yox, səhərin xeyrə qalsın. Bağışla məni.

– Sən də sağ ol. Dördüncü düymə, unutma.

Dəstəyi asdı. Papiros yandırdı. Bir müddət telefonun yanındaca oturdu, sonra səs, hənirti eşidib otağa keçdi. Pəncərələrdən süzülən hələ solğun səhər işığında balaca Nərgizin cizgiləri daha da məsum görünürdü. Səs də onun səsiydi. Nərgiz yuxuda danışırdı: turac, qırqovul, kəklik, sora göyərçin. Nemət bir müddət qızının başı üstündə dayandı. Onun indi gördüyü yuxusunu təsəvvüründə canlandırmağa çalışdı. Buludsuz göy, yaşıl budaqlar, qanadlı quşlar. Nərgiz yenə də ad-da-budda sözlər deyirdi: toyuq, xoruz, sora bülbül, sora...

Dördüncü düymə. Nemət cəld o biri otağa keçdi. Maqnitofona yanaşdı. Dördüncü düymə, vəssalam. Nə Alyagilin iki dəfə böyük maqnitofonu qalacaq, nə Sürəyyanın dolaşıq cümlələri, nə Karmenin istehzası. Nə də "bir də mən görsəm ki..."

Hamı yatıb. Pozsan, gərək indi pozasan. Bilsələr qoymayacaqlar. Onlara izah da edə bilməyəcəyəm. Özüm özümə izah edib aydınlaşdıra bilmədiyim bir şeyi onlara necə izah edəcəm?

Maqnitofonu işə saldı. Qızdırdı. Sonra dördüncü düyməni basdı.

– Vəssalam, – dedi. – Burda bir elə hikmət yox imiş.

Lenti tərsinə – fırladıb qulaq asmağa başladı. Sükutu, səssizliyi dinlədi. Xoşlandı. – Basırıq tramvayın konduktoru bürkü yay gününün gecəsi adamsız reyslərin – seyrək sərinliyindən xoşlanan kimi.

– Vəssalam, – deyə təkrar etdi. – Qurtardı. Nöqtə.

Küçədən tramvay keçdi. Nargin tərəfdən gələn gəminin uzaq fit səsi eşidildi.

Nemət maqnitofonu söndürüb öz otağına qayıtdı. Soyunub yerinə girdi. Yuxuladı.

Yuxu gördü.

Gördü ki, böyük bir dənizin sahilindədir. Sahil bomboşdur. Dəniz uzandıqca uzanır.

Sahil sapsarıdır. Sarı qumlar.

Dəniz gömgöydür. Ləpəsiz.

Ancaq birdən gördü ki, dənizin, göy dənizin lap, lap uzağında nə isə ağ bir şey görünür: ağ liman.

Ağ... Ağ...

Ağappaq. Və bu ağ limanda qırmızı gəmilər dayanıb. Qırmızı... Qırmızı...

Qıpqırmızı...

*1965*
*Bakı – Kislovodsk*

## Birinci fəsil

*Bu vüsala yuxu əhvali demək mümkün idi,*
*Əgər olsaydı yuxu dideyi-giryanimizə*.*

...amma qəfilcən sükut çökdü. Yuxunun seyrək toranlığı içində Zaur, hətta bir qədər təəccübləndi də. Axı necə oldu ki, böyük otelin bütün hay-küyü, yad, özgədilli danışıqların hənirtisi, haradansa, çox uzaqlardan eşidilən musiqi sədaları (saksafon, royal, zərb alətləri çalırdılar), liftin hərəkəti-bütün başqa səslər – qəfilcən qeyb oldu və bütün bu tanış səslərlə birlikdə okeanın da uğultusu kəsildi...

Gecəyarıdan keçmişdi. Vaxt cədvəli, adamların yatıb-durma məqamları bütün dünyada təqribən eyni cürdür və bu cədvəlin hökmü insanların icad etdikləri maşınların, mexanizmlərin, alətlərin səsləriylə bərabər təbiətin möhtəşəm xilqəti – okeanın da səsini qısmışdı elə bil.

Yuxunun yapışqantək çiriş horrasında (buraların havası kimiydi bu horra) çapalayıb ayıqlığa çıxmağa cəhd edərkən Zaur düşünürdü: yəqin, Firəngiz otağın pəncərəsini örtüb, vəssalam: səskeçirməz pəncərələr dişarıdakı bütün səsləri, küyləri, danışıq-hənirtiləri eşidilməzləşdirib, Zaurun yarıyuxulu-yarıoyaq şüurundan kənar edib.

Elədir ki, var, qu desən qulaq tutulan cingiltili sükutdan sonra otaq həm də qaranlığa qərq oldu; Firəngiz pəncərəni bağlayıb işığı da keçirtdi. Zaur örtülü göz qapaqları arasından qaranlığın müxtəlif mərhələlərini duyurdu – əvvəlcə otaq alaqaranlıq oldu – vannanın açıq qapısından kvadrat şəklində işıq şüləyi düşürdü döşəməyə. Qapı bağlanandan sonra otağa güclə sezilən ətir kimi – gecə çırağının zəif şöləsi yayıldı. Firəngiz bu çırağı da söndürdü və o zaman ətraf qaranlıq içində həll oldu.

Zaur ağır-ağır göz qapaqlarını qaldırdı, otağın qatran kimi qatı qaranlığında bir an gerçəklik hissini itirdi – bilmədi haradır bura, hardadır özü? Ancaq bir an. Bir an sonra gözləri zil qaranlıqda heç nəyi seçib ayırmasa da artıq harda olduğunu dəqiq dərk edirdi – bilirdi ki, bu otaq otelin nömrəsidir, indi gecədir və uzun məsafələrdən, uçuşdan, hərəkətdən, müxtəlif yad lövhələrdən calaq olunmuş gecə-gündüz bitib, ömrünü yeni bir gecə-gündüzə təhvil verib. Bu təhvil-təslim də-

---

[1] Epiqraflar Füzulinin "Leyli və Məcnun"undan və "Divan"ından alınmışdır.

qiqələri Zaurun gözünün çimirini almaq üçün qısaca mürgü döydüyü anlara düşüb. İndi isə gecəyarını ötüb – təqvimin başqa tarixidir. Amma nə tarix, nə təqvim? Moskvadan Afrikaya on bir saatlıq uçuş ərzində-onlar Avropanın, Aralıq dənizinin, Saxaranın üstündən keçmişdilər – bütün vaxt-zaman anlayışları qarışıq düşmüş və Zaurgilin ömrünə üç saat əlavə olunmuşdu. Bakıyla Moskva arasındakı bir saatlıq fərqi də bunun üstünə gəlsən – ömürlərindən dörd saatlıq hədiyyə almışdılar. Doğrudur, bu hədiyyəni qaytarmaq lazım gələcəkdi – üç saatını buradan Moskvaya uçanda, bir saatını da Moskvadan Bakıya qayıdanda...

Yer kürəmiz zaman zolaqlarına bölünüb, Qərbdən Şərqə getdikcə hər zolaqda bir saat irəli düşürsən. Moskvada saat on bir olanda. Bakıda on ikidir... Daima üzü Qərbə doğru gedəsən, elə bir sürətlə ki, bir saat içində bir vaxt zolağından o birinə keçəsən – hamısında da, məsələn, saat on bir olsun? Vaxtı bu sayaq aldatmaq mümkündürmü?

Adamın ağlına nə qəribə fikirlər gəlir. Fantastika! Halbuki ən böyük fantastika elə real gerçəklikdir, bax, elə məsələn, onların bugünkü günü: zarafat gəlməsin sənə, dünyanın o biri başına gəlib çıxıblar. Afrikada, Dakar şəhərindədirlər. 17 mərtəbəli “Enqor” otelindədirlər və bu otel Atlantik okeanının əlli metrliyindədir...

Bu son üç günün təəssüratı, məsafə ölçüləri, məkan dəyişkənliyi də ağlasığmaz bir gerçəklik idi... Əlbəttə, hər bir şey şüurla dəqiq izah olunurdu, amma, hər halda beyinə sığışdırmaq zor idi ki, cəmisi on beş saat bundan qabaq Moskvadaydılar. Moskvada qar yağırdı, onları Sverdlov meydanından Şeremetyevo aeroportuna aparan avtobusun pəncərələri buz bağlamışdı. On bir saatlıq uçuşdan sonra isə təyyarə Dakarda yerə endi və onlar trapa çıxanda sifətlərini sanki odlu bir nəfəs qarsıdı – Afrikanın nəfəsi. Bu qəribə bir nəfəs idi, Afrika torpağında hər şeyə çökmüşdü; elə bil, havada da, yemək-içməkdə də duyulurdu... Bu həm ətir, qoxu, iy idi, həm dad-tam... Müəyyən bitkilərlə-manioka, araxis – onlardan alınan yağlarlamı bağlıydı – bu qoxu, tam, ya okeanın törəmələrinə – balıqlarla, yosunlarlamı? Kim bilir... Amma bu ağlasığmaz dəhşətli isti – adamın sanki bədənini əridib paltarına yapışdıran bu isti də Afrika idi, şirintəhər iy-dad da Afrika idi, aeroportda ilkin gördükləri adamlar da – göyümtülə çalan zil qara bənizli zəncilər də...

Adamı çaşdıran təbiət mənzərələriydi. Bəzən, illah da axşamçağı, ala-toranlıqda adamsız sahələr – ağaclar, otlar, yol Abşeron peyzaclarını andırırdı. Uzaqdan ləpələrin uğultusu və cırcıramaların səsi gəlirdi,

fikirlərə dalıb yolla gedirdin və birdən diksinirdin: belə tanış "Abşeron yoluyla" uzun Afrika paltarı geymiş qıvrımsaç zənci qadınları addımlayırdılar. Qıvırcıq saçları qısa-qısa hörüklərə hörülüb, başlarında iri əmmaməyə bənzər bir sarıq. Bu qədər tanış mənzərənin, belə tanış səslərin fonunda tamam başqa bir xalqın, başqa irqin, başqa dünyanın adamlarını görmək zehni sarsıdırdı...

Otelin qabağında okean sahili də qəribə təsir bağışlayırdı: bütün çimərlik boyu bir-birindən müəyyən məsafələrdə dirəklər basdırılmışdı. Uzaqdan qəbiristanlığa oxşayırdı bura. Eyni boylu-biçimli əsgər məzarlarına... Kimləri basdırıblar bu çimərlikdə – dənizdə batanlarımı? Yox, bu dirəklər sərhəd dirəkləriydi – çimərliyin ayrı-ayrı sahələri "Enqor" otelinin ayrı-ayrı nömrələrinə mənsub idi: bu nömrələrin sakinlərinə... Sahil qarış-qarış parçalanmış, bölünmüş, paylanmışdı, okean isə sərhədsiz, azad idi...

Üç gün qaldılar Dakarda, Atlantik okeanında çimdilər, şəhəri dolaşdılar, – uca, ağappaq binaları, qamışla samandan quraşdırılmış komaları gördülər, Kermel bazarını və əsrlərdən bəri qolu bağlı qulların zindanı olan Qore adasını gəzdilər...

Sabah isə geri, vətənə qayıtmalıydılar.

Zaur: "Vallah, sağ olsun anam, – deyə düşünürdü, – axı, bu səyahətə çıxmağımızı o təkid elədi. "Sonra oğul-uşaq basacaq sizi, macalınız olmayacaq belə-belə səyahətlərə, nə qədər cavansız, əliz-qoluz bağlı deyil, gedin gəzin də"... Anası düz deyirdi, – belə səyahət insana ömründə olsa-olsa bircə kərəm düşür... Anası onu çox dilə tutdu.

Zaur etiraz eləmirdi, amma doğrusu, çox elə meyili də yox idi. Axır vaxtlar hər şeyə necə yanaşırdısa, bu səyahətə də eyni cür münasibət bəsləyirdi – tam bir biganəlik, laqeydlik... "Nə olar, gedərik-gedərik, getmərik-getmərik"... Bir yana baxanda, səyahətlər, xoş günlər, həyatın bütün başqa naz-nemətləri – məgər Zaur bütün bunların xətrinə dəyişməmişdimi ömrünü? Amma indi bu barədə düşünmək istəmirdi, ümumən heç bir şey düşünmək istəmirdi.

Qaranlıqda pıçıltıyla arvadını çağırdı:

– Yatmısan? – Cavab çıxmadı. Bilirdi ki, cavab çıxmayacaq. Firəngizin nə zaman yatdığını sakit, dinc nəfəs almasından bilirdi. "Firəngiz heç zaman xoruldamır". Bu, nikahlarının ilk ayında Zaurun elədiyi ən böyük və xoş kəşflərdən idi. Doğrudan da, Firəngizin xoruldaya biləcəyini təsəvvür eləmək də mümkün deyildi. Zaur fikrində həmişə Firəngizi çox bahalı şüşədən cilalanmış şəffaf güldana bənzə-

dirdi. Ağla sığışdırmaq olmurdu ki, belə bir güldan xoruldaya bilər, qışqıra bilər və bir də Zaurda belə bir təsəvvür vardı ki, qəfilcən bu güldana naqolay toxunmaq, onu salıb sındırmaq olar... Özündən altı yaş kiçik olan bu qıza, onun arvadı olmuş Firəngizə münasibətində dolaşıq bir duyğu kələfi vardı – həm nəvaziş, həm qayğı, həm də qalın bir pərdə... Firəngiz çox utancaq idi, kimsə onun haqqında danışanda qıpqırmızı qızarar, yanaqlarını puçur-puçur həya təri basardı. Bu, bəzən Zauru əsəbiləşdirərdi, nədənsə dərhal Firəngizin ailəsi – atası Murtuz, anası Alya, qardaşı Spartak gəlib dururdu gözlərinin qarşısında: o zaman Zaura elə gəlirdi ki, Murtuzun kobudluğu, "mənəm-mənəmliyi", Alyanın özündən müştəbehliyi, Spartakın cüvəllağılığı kimi Firəngizin isməti, məsumluğu da yapma bir naxışdır, aləmə nümayiş etdiriləsi zahiri bir dəyərdir. Amma Firəngizi təklikdə, ailəsindən ayrı-ayrılıqda qavrayanda, Zaur qıza daha mehriban münasibət bəsləyirdi, onun, doğrudan da, çox təvazökar, utancaq olduğuna inanırdı, saflığına və uşaq təmizliyinə, sadəliyinə həsəd aparırdı: düşünürdü, nə yazıq ki, mən özüm daha heç bir vaxt belə saf və sadədil, dinc və arxayın ola bilməyəcəyəm...

Bəlkə də Zaurun nicatı məhz bundaydı – özüyçün deyil, başqalarıyçün, Firəngiz üçün, gələcək övladları üçün yaşamaqda... Və elə bir həyat qurmaqda ki, zahirən belə həyat hamıya – o cümlədən Firəngizə və gələcək övladlarına bəxtiyar bir yaşayış kimi görünsün... Və bəlkə o zaman – Firəngizin, gələcək övladlarının gözlərində bu xoşbəxtliyi, arxayınlığı, qayğısızlığı görərkən Zaur özü də səadətin yoluxucu təsirini duyacaq, öz içində ailə sevincinin əks-sədasını eşidəcəkdi.

Zaur gələcək güzəranlarını, mənzillərinin quruluşunu, avadanlığını xəyalında canlandırmağa çalışdı, amma hiss elədi ki darıxır, ürəyi qısılır. Ayrı bir şey haqqında düşünmək istədi, fikri bir məsələdən başqasına qaçdı, bilmədi nə barədə düşünsün və ümumiyyətlə bir şey haqqında düşünmək vacibdirmi... Bəlkə də yox, amma onda da bilmirdi ki, qəfil ayıldığı bu gecə saatlarını – yata və dura bilmədiyi bu qeyri-müəyyən vaxt boşluğunu nəylə doldursun... Görəsən aşağıda, otelin qarşısındakı eyvanda neçə dənə gün çətiri var? Azı iyirmi – otuz dənə... Nə rəngdədirlər onlar? Qırmızı, sarı, yaşıl, göy, mavi, çəhrayı, sarı... yuxu doğrudan da onu çəkib apardı...

Bu iyi yuxuda duydu və yuxuda da dərk elədi ki, yuxudadır, ayılmayıb. Amma yuxuda da tanıdı bu iyi. Bu iy tək bircə idi, təkrarsız idi. Afrikanın iyi kimi. Amma bu Afrikanın iyi deyildi.

Zaur hələ də yuxu içində idi, yuxu içində fikir eləyirdi: hardan gəlib çıxdı bu qoxu bura, Dakara, otelin 17-ci mərtəbəsinə? Yuxuda fikirləri elə bil qıc olub tutulmuşdu, silkinib yuxudan çıxa, ayıla bilmirdi və buna görə də daha da eymənirdi. Bu iyin nə iy olduğunu, bu qoxunun kimin qoxusu olduğunu bilirdi axı... hələ də yuxudaydı, amma bu qoxudan başqa – Təhminənin qoxusundan başqa – müxtəlif fransız ətirlərinin qarışığından yaranan bu təkrarsız qoxudan başqa – heç bir şey duymurdu. Bu ətir qarışığının sirrini bircə Təhminə bilirdi və həmin sirri hamıdan gizli saxlayırdı. "Hər hansı bir ətiri, ən nadir tapılan ətirləri belə almaq olar, – deyərdi Təhminə. – Deməli, bu ətirləri hər hansı bir qadın vura bilər. Amma hər qadının öz təkrarsız qoxusu olmalıdır. Odur ki, həmin ətirləri bir-biriylə qarışdırmaq lazımdır, hərəsindən bir azacıq qarışdırmaq lazımdır. Nə qədər? Bu, sirdir və bu sirri bircə mən bilməliyəm".

Röyasız yuxu içində – sönmüş ekran qarşısındaymış kimi – Zaur intizarla gözləyirdi. Budur bax, bu saat ekran işıqlanacaq, yuxu rənglərə boyanacaq, səslərlə dolacaq və Təhminə canlanacaqdır – onunçün nə var ki, məsafələri qət etsin, qitələri, okeanları aşsın, sərhədləri keçsin. Əgər dünyanın o başında güclə duyulan, zərif və zəif qoxusu Zauru haqlamışdısa, sifətinin, səsinin, nəfəsinin, gülüşünün bura gəlib çıxması çətinmi iş idi? Yuxunun dolaşıq, qarmaqarışıq məntiqinə dayanaraq düşünürdü: hansı reyslə uçub gəlib bura, axı Moskvadan bura təyyarə həftədə bir uçur? Yuxuda belə bunu unutmamışdı və yuxuda düşünürdü ki, axı bu yuxudur, gərək oyanam, gərək cəhd eləyəm oyanmaqçün, gərək əlimi uzadıb gecə çırağını yandıram. Əlini uzadırdı, gecə çırağını yandırırdı, amma çıraq yanmırdı və Zaur başa düşürdü ki, hələ də yuxudadır, yuxuda uzadıb əlini çırağa, əslində isə heç uzatmayıb da, yuxuda yandırıb çırağı, əslində heç yandırmayıb da, yuxuda ayılıb yuxudan, əslində heç ayılmayıb da...

Ayılmayıbsa, deməli, indicə görəcək onu... Və o gündən bəri birinci dəfə görəcək Təhminəni. Neçə ay keçmişdi o gündən? Yox, arada bir dəfə görmüşdü Təhminəni. Yuxuda yox, real həyatda da yox, – televizorda görmüşdü... Bircə dəfə, vəssalam. İndi isə... buyur, Qərbi Afrikada, müstəqil Seneqal respublikasının paytaxtı Dakar şəhərində gəlib duracaqdı gözləri qarşısında:.. Nə tez də sənədlərini toplayıb təhvil verib: tibbi arayış, anket, üç imzalı xasiyyətnamə, viza... hamısı da belə təcili, tez... Bütün bunları toplayıb düzəldib, bütün bunlardan keçib. Hər şeyin çəmini, yolunu tapıb ki, tez-tələsik uçub bura gəlsin.

Burada, dünyanın o başında Zauru yaxalasın və hər şeyi geriyə döndərsin. Bütün olub keçənlər, ötüb-itənlər yenidən qayıtsın, dirçəlsin, yenidən başlansın. Amma axı başlamamalıydı hər şey təzədən. Olan olmuş, keçən keçmişdi, biryolluq, həmişəlik, dönüb-qayıtmaz bir mütləqlikdir. Bəs onda... Axı, bu, yuxudur, – deyə düşünürdü... – Yuxunun nəyindən qorxursan, yuxunun nə təhlükəsi var? – deyə düşünürdü. – Ayılıb oyanacam, hər şey keçib gedəcək, – deyə düşünürdü və onu da düşünürdü ki, yuxudamı, oyaqlıqdamı, bu dünyada Təhminənin nəvazişlərindən qorxulu heç nə yoxdur onunçün. Təhminənin nəvazişləri, sığalları, beyni dumanlandıran oxşamaları, çılğın pıçıltıları, deyilməmiş gileyləri... Bir də qapqara, uzun, sıx kirpikləri – o kirpikləri elə qaldırırdı, elə bil qədim bir kitabın ağır səhifəsini açır və o kirpiklər Təhminənin sifətinin tən yarısına kölgə salırdı. Bir dəfə Zaur içmişdi, dedi ki, sən kirpiklərini qaldıranda elə bil bəşəriyyət tarixində yeni bir səhifə açılır...

...Yuxuda, iradəsi zəifləyib möhkəm şüur, məntiq buxovları boşalanda Zaur onun, Təhminənin alaqaranlıq istəklərinə tabe olacaqdı. Axı bu istəklər həm də onun özünün, Zaurun istəkləri idi. Bir gün Zaur iradəsini toplayıb bütün hiss-həyəcanlarını ürəyindən birdəfəlik qoparıb ata bilmişdi. Ancaq yuxunun öz qanunları var, daha doğrusu, yuxu bütün qanunlardan azaddır. Zaur isə indi heç bir azadlığa hazır deyildi, istəmirdi heç bir azadlıq-filan. Yalnız bircə şey istəyirdi – yuxudan ayılmaq. Ən çətini göz qapaqlarını qaldırmaq, gözünü açmaq idi... Bir cəhd elədi, güc-bəlaynan göz qapaqlarını açdı, amma bu da yuxu idi – yuxuda cəhd eləmişdi, yuxuda açmışdı gözlərini. Bunu anlayıb bir də cəhd elədi və bu səfər, doğrudan da, oyandı... Bir an, ayılandan sonra düz bircə an ona elə gəldi ki, bu otaqda – Afrikanın iyi hopmuş bu otel nömrəsində başqa bir qoxu, Təhminənin rayihəsi də qalır hələ. İndicə canını qurtardığı yuxu girdabının cazibəsi qəlbini limhəlim doldurmuşdu, amma Zaur bilirdi ki, xilas olmalıdır bu hisslərdən; rahat, dinc yaşamaqçün bütün bunları biryolluq özündən iraq eləməlidir və bu gecəni də sakit başa vurmaq istəyirsə, indicə durub geyinməlidir, nömrədən çıxıb aşağı düşməlidir, fikirlərini yayındırıb, düşüncələrin yönünü dəyişib, sonra qayıtmalıdır otağına. Yalnız bundan sonra sakit uzanıb yata bilərdi.

Qaranlıqda ayaqqabılarını axtararkən Firəngiz səsə oyandı. Bir şey demədi, amma nəfəsinin dəyişməsindən Zaur arvadının ayıldığını bildi.

Zaur:

– Nədənsə yata bilmirəm, – dedi, – çıxıb bir az okeanın qırağında gəzmək istəyirəm.

Firəngizdən səs çıxmadı. Nə hə, nə yox. Zaur düşünürdü ki, eyni tərzdə "istəyirəm gedib özümü dənizə atam" – deyə də bilərdim və yenə də Firəngiz etirazını bildirməzdi... Bəzən Zaura elə gəlirdi ki, Firəngiz laldır. Bəzən tanış-bilişlər deyəndə ki, hələ heç bir vaxt Firəngizin səsini eşitməyiblər, Zaur fikrə gedirdi: o özü haçan eşidib arvadının səsini? Nə isə yadına sala bilmir. Ancaq ayrı-ayrı sözlər... – hə, yox. – Gedək – hə, qalaq – yox. Yataq – hə, duraq – yox... ya da əksinə... hə, yox, vəssalam...

Zaur çəkmələrini, şalvar-köynəyini geyinib nömrədən çıxdı... Düyməni basdı, lift gəldi. Lifti idarə edən oğlan – otelin xidmət paltarını geymiş balaca zənci Zauru görüb gülümsündü, fransızca nə isə dedi. Zaur da başını yelləyə-yelləyə gülümsündü, amma oğlanın nə istədiyini başa düşmədi: bəlkə pul istəyirdi ondan, yaxud xoş gecələr arzulayırdı, ya saatı soruşurdu, ya liftin yavaş getməsindən şikayətlənirdi? Kim bilir?

Gecənin bu vaxtında okeanın sahili bomboş idi... Əslində okeana da, dənizə də baxanda onların ucu-bucağı görünmür, amma birbaşa təəssürata beynin məlumatı əlavə olunanda, okeanın hüdudsuzluğu adama daha müdhiş, daha əfsanəvi görünürdü.

Sahilə yaxın yerlərdə, ləpədöyəndə otelin çimərlik çıraqlarının şöləsiriylə işıqlanmış okeanın uzaqları get-gedə qatı və qorxunc bir qaranlığa qarışırdı, haradasa zülmətin qovuşduğu üfüqlərdə itib gedirdi, amma o intəhasız ucqarlarda, getdikcə uzaqlaşan üfüqün o tayında okeanın başqa sahili də var idi – Amerika sahili...

Zaur:

"İnşallah, bir vaxt Amerikaya da səyahət eləmək lazımdır. Firəngiznən bir yerdə – deyə duşündü və birdən-birə bütün bunların puçluğunu, heçliyini dərk elədi. Nə qədər mənasız idi bütün bu şeylər. Amerikaya səyahət etmək istəyi, bura, Afrikaya gəlmələri, burada, bu yad okeanın yabançı sahilində dinclik, aram axtarması, hər şeyi unutmaq niyyəti... Axı heç bir təyyarə, heç bir gəmi, heç bir nəqliyyat vasitəsi insanın özünü özündən uzaqlaşdıra bilmir, keçmişindən ayıra bilmir və "səadət axtarmaq ifadəsi" o demək deyil ki, səadəti axtarıb tapmaq üçün düzə-dünyaya düşməlisən... Xoşbəxtlik, ya bədbəxtlik insanın öz içindədir, onları yük kimi özünlə daşıyırsan belədən-belə,

hara gedirsən get, lap dünyanın o başına; bu etibarlı yükdür – hara gedirsən get – nə itəcək, nə batacaq, nə azalacaq, nə artacaq...

Zaur əyildi, barmaqlarıyla soyumuş, narın sahil qumlarına, dalğaların yaladığı irili-xırdalı, hamar daşlara toxundu və qəsdən, bilərəkdən bu duyğunu yenidən oyatmağa çalışdı – bu duyğu xatirəsi barmaqlarının ucundan əllərinə keçdi, əllərindən qollarına, çiyinlərinə, köksünə, bədəninin bütün hüceyrələrinə. Bir gizilti kimi gəzdi bütün varlığında bu duyğunun xatirəsi... xoşbəxtlik xatirəsi... Sonralar yalanı üzə çıxsa da, yaşadığı an əsil bəxtiyarlıq kimi duyulan o uzaq anların xatirəsi. O xoşbəxt anların ki, Zaur onları da sahildə, narın qumlarla, balıqqulaqlarıyla, yosunlarla, dalğaların uğultusu, mehin nəvazişləriylə sərt, sal qayalarla, ulduzlu göylə birgə yaşamışdı... Qumuyla, mehiylə, səsləriylə, göyünün ulduzlarıyla bura oxşayan başqa bir sahildə... Okeanın yox, dənizin sahilində... Buralardan çox-çox uzaq bir dənizin...

## İkinci fəsil

*Ey xoş ol günlər ki, mən həmraz idim canan ilə,*
*Neməti-vəslin görüb, nazın çəkirdim can ilə.*

Bu ensiz sahil uzandıqca uzanırdı... Sahil xəttinin əyri-köndələn köbəri gah ləpələri yumruqlar kimi əzən qayalar boyu, gah dümdüz hamar çimərliklər boyu çəkilmişdi. Dəniz balaca, xudmani körfəzciklərdə sahilin bətninə girir, sivri, nazik, qumlu burunları öz altına çəkir, gah qabarıb sahili, qayaları qamarlayır, kiçicik qum adalarını basıb içinə alır, gah da çəkilir – yenidən üzə çıxmış qumlu sahələri – burunları, adacıqları mülayim ləpələriylə tumarlayırdı. Sahilin dənəvər qızılı qumlarını yavaş-yavaş sığallayır, oxşayır, pişik balasını yalayan kimi yalayırdı. Xırda daşları, qumları, balıqqulaqlarını təsbeh kimi bir-bir çevirirdi, sonra qəfilcən rəftarını dəyişir, dalğaları dəli rüzgarlarla qamçılanmış kimi şahə qalxırdı, bayaqkı nəvazişdən, sığaldan əsər-əlamət qalmırdı, külək qumları havaya sovurur, dəniz elə bil yüyürüb qan-tər içində qayalara çatmaq, daşların yalçın sərtliyinə çırpılıb çilik-çilik olmaq istəyirdi.

Bu sahil – Pirşağı tərəflərdəki Mayakdan Mərdəkandan o yana ucalan QRES borusuna qədər uzanmış bu sahil, sahil qəsəbələriylə – Buzovna, Zuğulba, Bilgəhlə Xəzər arasında qalmış bu sahil, qərbə doğru getdikcə Nardaranın, Sarayın, Coratın yanından keçib Sumqayı-

ta çatır və Sumqayıtdan da yuxarı – şimala doğru uzanırdı. Dənizin uzaq üfüqündə tülu edən günəş bütün sahilin üstüylə kos kimi dığırlanıb keçir və axşamtərəfi Zuğulba təpələrinin ardında qürub edirdi. Amma günəş təpələrin dalında gözdən itəndən sonra belə onun maili şüaları – projektor işığı kimi – səmaya sancılırdı və bu şüaların əksi dənizin səthinə qızılı-paslı talalar salırdı. Şüalar get-gedə qısalır, hava get-gedə qaralır və dənizin üzündə qəribə kölgələr dolaşırdı – təpələrin, buludların, qayaların əcaib kölgələri. Sahil evlərinin qızılı rəngə çalan pəncərələri ətrafa həzin bir qəriblik hissi çiləyirdi elə bil. Axşamın bu çağında sahilə kədərli bir dinclik hakim idi – dənizin gecə həyatı başlanmazdan qabaq qısa bir müddət belə olurdu – təkəmseyrək adamlar hələ də çimirdilər, dənizdən çıxmışdılar, onların siluetləri bir qara ləkə kimi görünürdü. Sahildə bir-iki maşın yubanıb qalmışdı... Ala-toranlığın gecə qaranlığına keçdiyi bu son dəqiqələrdə çılpaq bir kişi oğrun-oğrun ətrafa boylanaraq – görən olmasın – qurulanır, geyinir, başını darayırdı... Yubanmış maşınlar səssizcə-səmirsizcə çimərliklə hərəkət edirdi. Çimməkdən qayıdan axırıncı dəstələrin hənirtisi, gülüşü artıq tam qaranlıqlaşmış havada eşidilib itirdi... Çimərlikdən çıxıb uzaqlaşan maşının arxa işıqları iki qan-qırmızı lent kimi maşının ardınca sürünüb gedirdi.

Bu sahil Zaurçün dünyanın ən cazibədar bir guşəsi idi və heç bir tərifli təbiət mənzərəsi-sıldırım dağlar, sıx kölgəli meşələr, gur şəlalələr, köpüklü çaylar, yaşıl vadilər, dərin dərələr, sərin təpələr – heç nə, heç yer qızmar günəşin yandırıb-yaxdığı bu quru, ağacsız-bitkisiz sahilin gözəlliyinə tay ola bilməzdi...

Təhminə: – Havalar soyuyub ha, – dedi.

Zaur uzun tiftikli iri sarı qətfəni maşından ona uzatmışdı. Təhminə qurulanırdı. Dənizdən indicə çıxmışdı və sulardan maşına qədər gəldiyi yolboyu damcı-damcı zəncirvarı iz salmışdı, maşının içinə isə ayağından səpələnən qumları gətirmişdi.

– Day çimmək olmaz... Axırıncı dəfədir bu.

Zaur:

– Hə, – dedi və siqaretini sümürdü, – payızdır...

– Üç ay nə tez keçdi Zaur, hə? Yadında birinci dəfə bura gəlməyimiz. Onda iyun idi, hə?

Zaur:

– İyunun beşi idi, – dedi, – mənim dəqiq yadımdadır...

– 5 iyun 1965-ci il. Gərək bu tarixi qayalarda bir yerə həkk eləyəydin. Gələcək nəsillərə yadigar qalsın.

Zaur:

– Altında da yazaydım: Zaur Təhminə və oxla dəlinmiş ürək şəkli çəkəydim, hə?

Təhminə:

– Bəli, – dedi, – bu yay da belə keçdi... Bizim yay...

Zaur çevrilib arxaya baxdı: Təhminə saçlarını darayırdı.

– Gedək?

– Gedək.

Zaur motoru işə saldı və maşını qumlu sahil yollarıyla şoseyə tərəf sürməyə başladı.

Susmuşdular. Təhminə birdən-birə:

– Zaur, – dedi, – bilirsən ki, mən işdən çıxıram?

– Nə?

– Dəyişirəm iş yerimi.

Zaur maşının sürətini azaltdı, elə bil lap saxlamaq istəyirdi, çevrilib Təhminəyə baxdı:

– Necə yəni? Hara belə?

– Televiziyaya. Təsəvvür eləyirsən, məni diktor götürürlər. Bir dostum var, o düzəltdi... Neçə ildi elə hey məni dilə tuturdu ki, gəl televizorda bizimlə işlə, amma onda nədisə fikir vermirdim. İndi birdən yadıma düşdü onun təklifi, o gün götürdüm zəng elədim... Orda işləyir, amma vallah, belə tapşırıqsız-zadsız özüm öz gücümlə getdim, məni sınaqdan keçirtdilər, mətn verdilər, oxudum – azərbaycanca da, rusca da – bəyəndilər... Görünür, məqamına düşmüşəm, elə diktor axtarırlarmış, Moskvadan deyir, verilişimiz olacaq, elə lap yerinə düşdü. Böyüklərdən biri məni təriflədi də: hər iki dildə, deyir, mükəmməl danışırsınız, zahiri görünüşünüz də münasibdir.

Zaur Təhminənin indicə ona verdiyi bu təzə xəbər haqqında düşünür və özü də təyin edə bilmirdi ki, sevinir, yoxsa heyifsilənir. Təhminənin belə bir qərara gəlməsinin səbəblərini bilmirdi, amma hər halda başa düşürdü ki, bu qərar müəyyən dərəcədə onun özüylə – Zaurla, onların münasibətləriylə bağlıdır...

– Niyə birdən-birə bu qərara gəldin axı?

Bilirdi ki, Təhminənin cavabı dəqiq və dürüst olacaq, nə varsa, onu deyəcək.

Təhminə:

– Sənə görə, – dedi.

– Mənə görə?

– Əlbəttə. – Sonra əlavə etdi: – Gündə səni görmək mənə çətin olardı.

– Məni görmək yəni belə məşəqqətdir səninçün?

– Eşitməmisən, aşıq deyib: nə gözlərim səni görsün, nə könlüm qubar eyləsin. Hər gün səni görəcəydim, fikirləşəcəydim ki, daha mənimki deyilsən.

Zaur az qala dilindən qaçırtmışdı: "Məgər mən haçansa səninkiydim ki, indi daha səninki deyiləm", amma demədi bunu, həmin fikri başqa cür ifadə elədi:

– Nə dəyişib bizim münasibətlərimizdə?

Təhminə səssiz gülümsündü. Zaur görməsə də, elə bil bu təbəssümü kürəyiylə hiss elədi, maşının güzgüsündə Təhminənin sifətinə baxdı. Təhminə təbəssümünü hələ silib atmamışdı üzündən.

– Zaurik, yəni doğrudan sən heç nə başa düşmürsən? – dedi: – Doğrudan, başa düşmürsən ki, bizim axırıncı görüşümüzdür?.. Yaxşı, tutalım, axırıncı görüşümüz deyil, bir şəhərdə yaşayırıq, yəqin bir-birimizə rast gələcəyik təsadüfdən-təsadüfə... amma bu son görüşümüzdür. O mənada ki, – yenə gülümsündü, – bir daha bu cür görüşməyəcəyik.

"Niyəsini" soruşmaq istədi Zaur, amma dinmədi, səbəbini özü tapmaq istədi. Axı, Təhminə onu hey məzəmmət edirdi ki, həssas deyilsən, zərif deyilsən, qadınla kişi münasibətlərinin bütün incəliklərini duya bilmirsən. Hiss edə bilmirsan ki, bu əlaqələr nəylə düyünlənir və nədən qırıla bilər... Amma hər halda Təhminənin bu qərarı Zauru çox da sarsıtmırdı. Hətta, müəyyən biganəliklə qarşıladı bu sözləri. Bəlkə də bu, sırf fizioloci bir halla əlaqədar idi. Bir az qabaqkı ehtiraslı, çılğın məhəbbət görüşündən sonra Zaur özündə bir laqeydlik, boşluq, toxluq hiss edirdi. Axır vaxtlar çox tez-tez görüşürdülər, bir də bundan idi bəlkə bu doyğunluq. Bəlkə Təhminə bu xəbəri bir neçə saat bundan qabaq, onlar çimərliyə gələrkən, öpüşlərdən, ağuşlardan, pıçıltılardan və nəvazişlərdən qabaq desəydi, Zaur daha çox narahatlıq keçirərdi. Bir neçə gün, Təhminəni yenidən ağuşuna almaq istəyi çılğın, dözülməz bir ehtirasa çevrilincəyə qədər bu fikrə – "ayrılmaqları", "bir daha görüşməyəcəkləri" fikrinə nisbətən sakit və biganəliklə baxa bilərdi. "Nə yaxşı ki, o axmaq məktubu cırıb atdım. Təhminəyə göndərmədim – deyə düşünürdü. – İlk yaxınlığın təsiri altında, həm də dəm vaxtımda yazdığım o kağızda nələr qırıldatmamışdım, ilahi... İndi bütün o fikirlər necə də gülməli gəlir mənə, məhəbbət-filan, sənsiz

yaşaya bilmirəm, getmə gözümdən, gedərəm özümdən. Nə sevgi, nə filan, əşşi?.. İstək var, ehtiras var, arzu-kamına çatmaq intizarı var, bir də istədiyinə nail olandan sonra doyğunluq, bezginlik, biganəlik var, vəssalam. Qalan hamısı sözdür, havayı söhbətlərdir...”

– Bilirsən bu kimin bağıdır?

Təhminənin səsi Zauru fikirlərindən ayırdı.. Yolun sol tərəfində nahamvar boz daşlardan hörülmüş uca barının arxasında ikimərtəbəli, əyri-köndələn eyvanlı bir ev vardı. Eyvan bulanıq yaşıl rəngə boyanmışdı.

– Yox.

– Murtuzovgilin. Sizin qonşularınızın.

Zaur təəccüblə:

– Murtuz Balayeviçin? – deyə xəbər aldı. – Sən hardan onu tanıyırsan?

– Oğlunu tanıyıram.

– Spartakı? – dedi və elə bil içində nə isə titrədi. Spartakı yaxşı tanıyırdı. Bilirdi nə yuvanın quşudur, qadınlara, illah da gözəl qadınlara nə gözlə baxır. Ümumiyyətlə, bilirdi nə oyunlardan çıxır Spartak. Ağzını Allah yoluna qoyub, qadınlar haqqında nələr danışdığından da xəbərdar idi, Təhminənin Spartakla tanışlığı Zauru heç açmırdı. Amma qəsdən biganəliklə:

– Bəs Spartakı hardan tanıyırsan? – deyə soruşdu.

– Mənim bir rəfiqəm var, onun tanışıdır.

“Tanışıdır” sözü Zaurun bütün içini qaynatdı, axı bilirdi Spartakla tanışlıq qadınçün nə deməkdir.

Təhminə birdən:

– Saxla, – dedi. Zaur əyləci basdı və maşın iri dəmir darvazanın düz qabağında dayandı.

– Nədir?

– Gəl düşək. Bilirsən bu eyvandan nə gözəl mənzərə görünür. Adamın ürəyi açılır.

– Bircə elə bu çatmırdı. Özgənin bağında nə işimiz var?

– Tərsliyinə salma, bircə dəqiqəliyə düşək.

Zaur könülsüz-könülsüz maşından çıxdı.

– Deyəsən, sən bu eyvandan çox seyr eləmisən mənzərəni, – dedi. – Heç ağlıma da gəlməzdi ki, sən Murtuzovgilə gedib-gəlirsən? Bakıda da gəliş-gedişiniz var? Bəs nə əcəb heç rastlaşmamışıq bizim həyətdə?

– Əşi, yox, canım. Bakıda heç evlərini tanımıram. Bu bağda da bircə dəfə olmuşam... Qonaqlıq idi, çoxlu adam vardı, mən də haradansa gəlib düşmüşdüm onların kompaniyasına...

– Kim verirdi qonaqlığı, Spartak, ya Murtuz Balayeviç?

– Murtuz Balayeviç kimdir. Spartakın atası? Heç onun sifətini də görməmişəm. Qonaqlığı Spartak düzəltmişdi... O vaxt mənim rəfiqəmlə gəzirdi. Deyəsən, Spartakın ad günü idi, yadımda deyil, bir söz, məni də dartıb gətirdilər.

– Sən əlbəttə, tək idin, ərsiz...

– Allahu-əkbər. Nə belə məni sorğu-suala tutmusan? hə, Manaf, deyəsən, doğrudan da, Bakıda yox idi.

Zaur:

– Tiflisdəydi, – dedi və dərhal da dediyinə peşman oldu... Elə bil Təhminə birdən-birə söndü, içinə çəkilib büzüşdü. Axı hər ikisinin yadında idi: Təhminə Zaura özü demişdi ki, Manafın Tiflisdə aşnası var, ara-sıra bəhanə tapıb onun yanına cumur. İndi Zaur ona məhrəmliklə açılmış bu sirri şapalaq kimi çırpmışdı Təhminənin üzünə.

Təhminə qəmli-qəmli başını buladı.

– Özün bil, – dedi. – Mən istəyirdim ki, eyvandan baxasan, dəniz, kənd çox qəşəng görünür. İstəmirsən baxma, daha məni sancmaq nəyə lazımdır?

Zaur günahını yumaq üçün yumşaqlıqla:

– Axı qapı bağlıdır, – dedi və nəvazişlə Təhminənin gözlərinin içinə baxdı.

Təhminə, doğrudan da, elə bil yumşaldı.

– Bəs, uşaqlıqda heç üzüm oğurluğuna getməmisən? – dedi.– Bir yandan da idmançısan hələ, aş görüm bu barını.

Zaur da bu yarızarafat danışıq və davranış tərzini saxlamağa çalışdı, odur ki, qıvraq bir hərəkətlə tullanıb barının üstündən yapışdı, dartınıb hasarın üstünə çıxdı və o tərəfə aşdı... Darvazanı taybatay açdı və Təhminəni içəri dəvət elədi.

– Buyuracaqsınız, xanım, – dedi.

Axar-baxarlı eyvandan dənizin, sahilin, qəsəbənin geniş mənzərəsini seyr edirdilər. Eyvanın döşəməsində azı bir on cüt köhnə, yırtıq çəkmə, məst vardı. Onların arasında nimdaş dikdaban qadın ayaqqabıları da vardı,

Təhminə:

– Vaxtilə bu ayaqqabılar dəb idi, – dedi və qəfilcən xəbər aldı. – Bacısını necə, tanıyırsan? Spartakın bacısını.

– Firanı? Əlbəttə, tanıyıram. Dedim axı – bizim qonşularımızdır. Nədir ki?

– Heç. Deyirlər, çox gözəl qızdır, mən görməmişəm...

– Bilmirəm, – dedi, – fikir verməmişəm: gözəldir, ya yox.

Zaur bunu müəyyən əsəbiliklə dedi, çünki xoşu gəlmirdi Murtuzovlardan. Doğrudur, Fira haqqında bunu deyə bilməzdi, bu cavan qızcığazdan nə xoşu, nə acığı gəlirdi. Elə bil o heç yoxmuş, amma ata-anasından, illah da qardaşından zənd-zəhləsi gedirdi.

– Hər halda, – dedi, – Fira ailələrinin başqa üzvlərindən bir cəhətcə üstündür ki, dinib danışmır, heç olmasa həmişə susur...

– Deyəsən, onlarla aran yoxdur, hə? Doğrudan a, heç ağlıma gəlmir, – harda görünüb ki, qonşu-qonşuyla yola getsin... Mətbəxdə yəqin, gündə dava-mərəkədir, xəlvətə salıb bir-birinizin qazanına çəngəllə duz atırsız, elədi?

Zaur quru tərzdə dedi:

– Çox üzr istəyirəm, amma bizim mətbəxlərimiz ayrı-ayrıdır, mənzillərimiz də başqa-başqa mərtəbələrdədir.

– Belə de. Onda deməli qonşuyla ədavət daha yüksək zəmindədir? Murtuzovgil təzə fin mebeli alıblar, amma bizimki, Zeynalovlarınkı köhnə ərəb mebelidir, dad-bidad!

Zaur:

– Adamı sancıb-dalamaqdan ləzzət alırsan? – dedi,

– Yaxşı, yaxşı, mısmırığını sallama, canım-ciyərim, – dərindən nəfəs aldı, – ciyər demişkən, dərindən nəfəs al, Zaur, – dedi, – çək bu havanı ciyərlərinə, məcundur bu... Oxqay...

Zaur siqaret çıxartdı. Təhminə:

– Çəkmə, – dedi, – özünü zəhərləmə. Bir bu təmiz dəniz havasını doyunca ud.

Zaur siqareti qutusuna qoydu.

– Ay səni Zaurik, qiyamət oğlansan.

– Yaxşı, söhbətimiz yarımçıq qaldı axı... Başa salmadın məni ki, niyə bu axırıncı görüşümüzdür və nə səbəbdən ayrılmalıyıq.

– Nə səbəbdən? – Təhminə çiyinlərini çəkdi. – Bunu izah eləmək uzun çəkərdi. O qədər səbəb var ki... Məsələn, belə bir səbəb: birdən bir səhər yuxudan durarıq, görərik ki, bir qəlbdən min qəlbə aşiq olmuşuq bir-birimizə. Hər halda ikimizdən birimiz, tutalım elə mən, aşiq oldum sənə, vuruldum. Onda necə olsun?.. Kimə lazımdır bu – sənə, mənə?.. Bir də ki... ümumiyyətlə, axı, həyatı qəlizləşdirmək neçin, hə? Onsuz da cəncəldir bu həyat...

Zaur düşündü ki, onu düz deyir, həyatı qəlizləşdirmək nəyə gərək?

– Axı belə məlum oldu ki, bu cəhətdən arxayınçılıqdır, – dedi. – Sən aşiq olub eləyən deyilsən, olsaydın olardın da, üç aydır görüşürük – vurulub eləməmisən ki? – "Aşiq olmaq", "vurulmaq" sözlərini hər ikisi yüngül bir istehzayla tələffüz edirdi. – Hə, vurulmamısan ki, mənə? Düz demirəm?

Təhminə:

– Bəs, sən? – dedi.

– Mən!

– Bəli, sən. Sən necə, vurulmusan?..

– Əlbəttə. Bu nə sözdür. Mən elə birinci görüşümüzdən dəli-divanəyəm... Axı sənə də ilk görüşdən dedim ki sevirəm səni... Məcnun kimi, mən nə bilim, Kərəm kimi, Fərhad kimi...

– Dayan, dayan, küyə basma... Demək – bir şeydir, duymaq, dediklərini doğrudan-doğruya hiss etmək – başqa şey... Bir də ki, sən bütün bu yağlı dilləri o vaxt, üç ay bundan qabaq tökürdün, onda aramızda heç bir şey yox idi. Bəs indi, indi də bu sözləri təkrar eləyə bilərsənmi. Belə yarızarafatnan, lağ-lağıya sala-sala, masqaraya qoya-qoya yox, ciddi-ciddi, tam ciddiliklə... dilinə gətirə bilərsən bu sözləri?..

– Dəli olmusan, Təhminə?.. Əlbəttə, mən zarafat eləmirəm, ciddi sözümdür, doğrudan da sevirəm səni... vurulmuşam sənə...

Zaur bu sözləri deyirdi, amma özü də hiss edirdi ki, tamamilə tutumsuz, içi boş sözləri tələffüz edir, bu sözlərin dalında duran duyğuların heç birini həqiqətdə yaşamadan deyir. Hətta bu yarızarafat tərziylə də gizlədə bilmirdi yalanını və Təhminə də bunu dərhal duydu: tükü-tükdən seçərdi Təhminə...

– Yaxşı, di boşla, Zaur, – dedi. – Adamın lap ürəyi qalxır sənin bu sözlərindən... havayı-havayı danışdıq, bəsdir.

Zaur əlini Təhminənin üzünə çəkdi. Bilirdi ki, sözlər kara gəlməyəndə, gücsüzləşəndə köməyə hərəkətlər, əllərin nəvazişi, sığal, təbəssüm yetir. Təhminə onun əlindən yapışdı, bir qədər öz sifətində saxladı Zaurun əlini, sonra üzündən araladı, çevrilib ovcunun içinə baxdı. Elə baxdı, elə bil Zaurun əlinin içini birinci dəfəydi görürdü.

– Əllərin nə iridir, Zaurik! – dedi.

Haradansa, çox uzaqlardan elektrik qatarının səsi gəldi və bu səs uzun müddət havada qaldı, sonra yavaş-yavaş əriyib itdi...

Təhminə şəhadət barmağını Zaurun ovcunun içinə dirədi, yumşaq, pişik cırmağı kimi iti bir hərəkətlə dırnağını Zaurun ovcundakı cızıqlara çəkdi və dedi:

– İstəyirsən falına baxım?

– Baxa bilərsən?

– Əlbəttə. O biri əlini də aç görüm.

Zaurun hər iki əlini əlləri arasına aldı, uzun-uzadı ovuclarının içinə tamaşa elədi.

– Sağ əl keçmiş və indiki vaxtdır. Ona görə ki, sağ əl fəaldır, işdədir, olmuş və indi bu saat olacaq işləri göstərir. Sol əl isə gələcəkdir, hələ olacaq hadisələri xəbər verir, odur ki, hələ hərəkəti azdır, passivdir... Bax, bu xətlər xoşbəxtlik, yalqızlıq, kədər xətləridir... Bu gözləmədir, bu xətt isə qəribə, gözlənilməz işlərə qadir olub-olmamağını göstərir. Görək indi səndə necədir? Bax bu, şöhrət xəttidir, səndə var bu xətt. Bu xətt Ay xəttindən başlanır, yəni real həyatdan daha çox fantaziyalara qapılırsan... Amma bu xətt də real həyat xəttinə qovuşur. Bunu görürsən, bax, bu xətt... Aha... İşə bax, iki, ya üç uşağın olacaq – hər halda ikisi mütləq oğlan uşağıdır...

– Yəni bunu da təyin eləmək olur?

– Bəs necə? Elə bilirsən halvaymış səninçün... Bax, bu xətti görürsən – sənin bir bacarığın varmış – bütün hisslərini, düşüncələrini işə, zəhmətə yönəldə bilirsənmiş... Şüurun dəqiqdir, müstəqimdir, bir balaca, lap belə cüzi dərəcədə xəyala, fantaziyaya meyil edirsən... Lap qoca yaşlarınacan ömür sürəcəksən və axıra qədər də həyatı sevəcəksən... Dövlətin çox olmayacaq. Başqa şəhərə köçüb eləməyəcəksən... Aha,.. bu xətt mübarizə xəttidir, amma o heç bir başqa xəttə qovuşub eləmir. Bax, bu da Venera kəməridir – sevmək və aldanmaq bacarığı... Bu xətt də yarıda qırılır... Bütün xətlər elə bil yarımçıqdır e, Zaurik!

– Dad yarımçıq əlindən...

– Dalına qulaq as... Ən çətin sınaqdan orta yaşlarında keçəcəksən... Ömrün haçalanacaq – bax, görürsən, bu haçalanmış xətt – tale xəttidir – haçansa iki od arasında qalacaqsan... Sinnə dolduqca xasiyyətin daha mülayim olacaq, amma zəhmin, zabitən artacaq... Kaş sənin sinli çağını, zəhmli-zabitəli vaxtını görəydim. Zaurik, heç səni bu sifətdə təsəvvür edə bilmirəm...

– Yaxşı, mənim məsələmi bildik. İndi öz falına bax.

– Yox, nə danışırsan, qorxuram, heç vaxt öz falıma baxmaram, qoymaram da ki, başqası baxsın. Bir dəfə baxdırmışam, bəs eləyib.

– Baxdırmısan, nə çıxıb ki?

– Demərəm.

– Yaxşı, de görək, ürəyimizi çəkmə...

– Yox, yox...
– Özün bil...
Zaur təkid eləmədi və həmişə olduğu kimi indi də inadından vaz keçən kimi Təhminə özü razılaşdı:
– Yaxşı, deyərəm, ancaq bircə şərtlə, – dedi, – bu sirri heç kəsə verməyəsən. Bir sən bil bunu, bir də mən. Ovcumun içinə bax, bu xətti görürsən, burada qırılır, görürsən?
– Hə...
– Bilirsən niyə qırılır burda?
– Yox.
– Bu mənim ömrümdür. Qırılması da ölüm. Erkən ölüm... Bir qoca falçı vardı, o baxıb falıma, o dedi...
– Utanmırsan, ali təhsilli qızsan, başını belə cəfəngiyatla doldurursan.
Elə bil eşitmədi Zaurun sözlərini:
– Bəzən düşünürəm, Zaur, – dedi. – Birdən, doğrudan da, bütün bu sən demiş cəfəngiyat düz oldu, necə deyərlər, çin çıxdı. Günü sabah azarladım öldüm, təyyarədə, ya maşında qəzaya düşdüm, nə bilim, min cür səbəbdən insan ölə bilər... Bəzən belə fikirlər dolur başıma, öz-özümə yaman yazığım gəlir, az qalıram ağlayım... Düşünürəm ki, sabah yıxılıb ölsəm, kim mənimçün yanacaq? Ərim? Tutalım bir ay, üç ay heyifsiləndi, sonra hər şeyi unudacaq gedəcək... Başqa kim – qonşumuz Mədinə, o da tutalım bir ay, yox, bir ay da yox, iki həftə yas saxladı mənimçün... Başqa kim? Sən? Yaxşı, sən də iki həftə, ya bağışla, iki həftə çox uzun müddətdir, bir həftə üç gün mənimçün matəm saxladın, dərdə-qəmə batdın, lap saldın ürəyinə... Sonra? Sonra axı sən də unudacaqsan, elə deyil?.. Hər şeyi unudacaqsan... Bu görüşlərimizi də, o sahili də, bax həmin bu eyvanı da... Düz demirəm?
– Səfeh-səfeh danışmaqdan yorulmadın? Nədi elə başına qara-qura fikirlər salırsan, gah ayrılmağımızdan dəm vurursan, gah ölümdən. Gəl yanıma...
Otağa keçdilər. Otaqda içində neçə vaxtdan bəri insan yaşamayan mənzilin səliqəsizliyi vardı – küncdə sement qutuları qoyulmuşdu, bir qırağa mismarlar, çəkiclər, mişar və rəndə atılmışdı, qab-qacaq pəncərə ağzına yığılmışdı, qarğıdan hörülmüş həsir səbətlər üst-üstə qalanmışdı, sınıq-salxaq şkafın rəflərində sirkə, abqora şüşələri düzülmüşdü, zivənin dalına döşəklər, üzsüz balışlar və yorğanlar yığılmışdı...
Zaur Təhminəni öpdükcə, oxşadıqca Təhminə:

– Qəsdən, qəsdən səni bura gətirdim, – deyirdi, – axırıncı dəfə, son dəfə, son dəfə səninlə olmaq istəyirdim...

Zaur etiraz eləmirdi, amma çox yaxşı bilirdi ki, sözdür bütün bunlar hamısı, axırıncı görüşləri-filan deyil, yenə görüşəcəklər, yenə sevəcəklər bir-birlərini, çünki Təhminə onsuz – Zaursuz yaşaya bilmir. Buna lap qəti əmin olmuşdu Zaur, odur ki, sakit idi... Deyir, axırıncı görüşümüzdür, çox gözəl, mən daha görüşmək üçün heç bir təşəbbüs göstərməyəcəyəm, desə, deyəcəyəm ki, "balam, özün qərar vermədin, axır görüşümüzdür?". Özü məni axtaracaq, özü tapacaq, mən ancaq gözləməliyəm, vəssalam...

Maşına minəndə Təhminə:

– Amma səni o bağa aparmağımın bir səbəbi də var idi, – dedi. – Bu səbəbi heç vaxt bilməyəcəksən.

– Nə səbəbdir ki?

– Deməryəm.

Zaur inad eləmədi. Bilirdi ki, təkid eləməsə Təhminə özü deyəcək. Amma bu səfər belə olmadı. Təhminə heç bir şey demədi. Nə onda, nə sonra.

...Və Zaur bağa gəlmələrinin bu ikinci səbəbini heç bir vaxt bilmədi.

Bəlkə də heç yox imiş belə bir səbəb, Təhminə elə-belə, onun marağını cəlb eləmək üçün demişdi bunu. Kim bilir?..

Evlərinin tininə burulmamış maşını saxladı. Təhminə elə maşının içindəcə Zaurun boynundan öpdü:

– Əlvida, – dedi və tələsik maşından çıxıb iti addımlarla evlərinə tərəf addımladı.

"Əlvida. Sağ ol. Hələlik". Vida sözlərinin heç bir fərqi yoxdur. "Hələlik" deyib ömürlük ayrılmaq olar. "Əlvida" deyib üç gündən, üç saatdan, on beş dəqiqədən sonra yenidən görüşmək olar... Bu belədir, əlbəttə, amma hər halda evdə, çimmək otağına keçib, soyuq çiləyin altında yuyunanda Zaura birdən elə gəldi ki, suyun güclü iynələri onun bədənindən sahilin qumu, dənizin duzu, isti günün təriylə birlikdə Təhminənin öpüşlərini, sığallarını, əllərinin təmasını da həmişəlik yuyub aparır. Sözlərini, pıçıltılarını, saçlarının iyini... Bir də heç bir zaman Təhminəylə görüşməyəcəklər, saçlarını əliylə alnından atdığını, dodaqlarında tükənmiş təbəssümün, gözlərinin dibində sönən son qığılcımlarını Zaur heç vaxt görməyəcək. "Əlbəttə, belə deyil, – deyə düşündü. – Əlbəttə, yenə görüşəcəyik. Gözləmək lazımdır. Gözləmək, vəssalam".

## Üçüncü fəsil

*Yaxşı görünür surəti məhvəşlərin, əmma*
*Yaxşı nəzər etdikcə, sərəncamı yamandır!*

Zaur valideynlərini çox istəyirdi. Həm də yaşa dolduqca daha artıq istəyirdi onları. Daha doğrusu, yetkinlik yaşında o, öz valideynlərini lap körpə vaxtında sevdiyi kimi sevirdi – təbii və təmənnasız bir məhəbbətlə... Körpəliklə yetkinlik yaşı arasında qalan qısa bir dövrdə – beş-altı il çəkmişdi bu müddət – Zaurun təqribən 14-15 yaşından 19-20 yaşına qədər – valideynlərinə münasibəti başqa cür idi. Əlbəttə, sevirdi onları, amma bu sevgidə bir bəyənməzlik, üstüörtülü, bəzən də açıqdan-açığa rişxənd, istehza da var idi – valideynlərinin yaşayış tərzinə, köhnəlmiş anlayışlarına və zövqlərinə bir növ ağız büzərdi. Amma, eyni zamanda, bu bəyənmədiyi həyat tərzinin bütün niyaz-imtiyazlarından da bolluca istifadə edirdi, bahalı hədiyyələrdən – ali məktəbə daxil olduğu il atası ona, "Moskviç" bağışlamışdı – imtina eləmirdi. O illər Zaurun bütün marağı idmanla, caz musiqisiylə, rəqslərlə və qızlarla, xarici geyim-gecimlərlə və xarici filmlərlə bağlı idi.

Valideynləri ev-eşiklərini ağır, zəhmli, tünd mixəyi rəngli köhnə mebellə doldurmuşdular. (Belə mebel sonralar yenə dəbə mindi, amma o illər geriliyin, pis zövqün rəmzi kimi görünürdü Zaura). Valideynləri bufetlərinin üstünü, servantlarının içini bahalı qab-qacaqla doldurmuşdular, masanın, hətta röyalın üstünə də iri büllur güldanlar, mürəbbə vazaları, gülqabılar düzülmüşdü. Valideynləri hind filmlərindən zövq alırdılar, atası saatlarla radiocihazı qurdalayıb ərəb və İran musiqisinə qulaq asardı – ləzzətlə gözlərini də yumardı, qulağını dirəyərdi cihazın dinamikinə, necə deyərlər, "çorta gedərdi" və yalnız hərdən-birdən ağzını marçıldadıb "bəh-bəh" deyərdi. Valideynləri böyük cah-cəlallı məclislər düzəldərdilər, bu məclislərdə uzun-uzadı, adamın ürəyini çəkən duzsuz sağlıqlar deyilərdi. Və valideynləri elə bil iynə üstündə otururdular: amandır, birdən qonaqların yeri səhv düşər, başda oturmalı qonaq aşağı düşər, aşağıda oturmalı adam başa keçər, amandır, birdən bir adam yaddan çıxıb qalar, sağlığına badə qaldırmazlar, amandır, birdən siyahının sırası, ardıcıllığı pozular: kiminsə ünvanına əvvəlcə sağlıq deyilər (halbuki onun sağlığı sonra deyilməliydi), kiminsə sağlığı sonra deyilər (halbuki əvvəl deyilməliydi) və belə məclislərdə tamadalığa məhkum olmuş bədbəxt, yu-

mordan məhrum biçarə, dəridən-qabıqdan çıxardı ki, məzəli bir söz desin və dediyinə də bircə özü gülərdi, amma qonaqlar da başa düşəndə ki, bu yerdə gülmək lazımdır, birtəhər, zornan irişərdilər... Valideynlərinin bütün bu həyat sistemini Zaur öz-özlüyündə "müsəlmançılıq" adlandırardı və heç fikirləşməzdi ki, bədbəxt müsəlmanlar haçandan sağlıq deyiblər görəsən, haçandan bəri tamada seçiblər?

Bir də ki, saysız-hesabsız qohum-əqrəbaları vardı və tez-tez onlara təşrif gətirən bu yad adamlarla kəlmə kəsmək, xoş-beş eləyib, hal-əhval tutmaq məcburiyyəti vardı... Bir də evlərinə gələnlərlə anasının daimi söhbətləri, qeybətləri vardı: kim necə yaşayır, kimi hara qabağa çəkiblər və məlumdur ki, nə yolla çəkiblər, kim kimin adamıdır, kim kimin arxası, dayağıdır, kim kimin yerlisidir, filankəs filankəslə gəzir, filankəs də filankəslə, filankəs filan qədər qazanır, filankəs filan şeyi alıb, filankəs arvadını döyür, ya filankəs ərinin başına min fırıldaq açır...

Bütün bunlar Zaurçün yad və yabançı idi, onun sevmədiyi, bəyənmədiyi, bəzən, hətta nifrət bəslədiyi başqa bir aləmin bəlirləri idi. Və bu aləmin təzahürləri Zaurun canını lap boğazına yığan vaxtlarda o, hətta öz valideynlərinə də xor baxırdı. Amma qəribədir, bu cür münasibətin nəticəsi tamam başqa olurdu. Zaur bu anlarda valideynlərinə az qala ikrah hissi ilə yanaşsa da, onların sədəqələrindən imtina etmirdi, əksinə, elə bil daxilində valideynlərinə qarşı bir növ ifrat, təmənnaçılıq hissi oyanırdı: müxtəlif şəkillərdə, müxtəlif bəhanələrlə valideynlərindən elə hey bir şey çəkib qoparmaq istəyirdi. Valideynlərindən deyəndə – anası evdar qadındı, atası idi qazanan, amma atasına birbaşa müraciət etməyə cəsarəti çatmırdı, atasıyla aralarında müəyyən pərdə saxlanırdı, odur ki, tələblərini, istəklərini anasının vasitəçiliyi ilə edirdi: "palto, kostyum, almaq istəyirəm", "səfərim var" və sairə səbəblər gətirirdi. Bəzən ürəyinin sözünü zarafata salıb deyirdi: "kiminçün saxlayırsız bu pulları, bilmirəm, tək bircə balanıza da xərcləməyəndə kimə xərcləyəcəksiniz professorun var-dövlətini?"

Hər istəyinə, hər arzusuna əməl olunurdu Zaurun və qəribədir – valideynlərinin oğullarına qarşı bu səxavəti, bu əliaçıqlığı oğullarında minnətdarlıq hissi oyatmırdı, olsa-olsa içi istehza qarışıq məmnun bir təbəssüm qonurdu dodaqlarına...

O illərdə Zaur su pərisinə oxşayan sarışın saçlı Tanya adlı bir qızla gəzirdi. Tanya idmançı idi, yelkənli qayıqları sürmək üzrə çempion idi. Məlum deyil ki, hansı yollarla Zaurun anası oğlunun kiminlə gəz-

diyini iyləyib-çüyləyib bilirdi. Bu əlaqə heç ürəyindən deyildi Zivər xanımın və nədənsə həmişə o qız haqqında cəm halında danışardı:

– Yenə sənin Tanka-mankaların zəng eləmişdi...

Tanka-manka həmin o Tanya adlı qız idi, həmin o su pərisinə oxşayan qayıq çempionu. Və həmin o su pərisinə oxşayan sarışın qayıqçı qız günlərin bir günündə ata-anasıyla Lvova köçdü və Zaurun həyatından həmişəlik qeyb oldu... Zaur az-az xatırlardı onu, hər dəfə xatırlayanda elə bil yaddaşına ilıq bir bahar mehi əsirdi – uzun sarı saçları islanmış Tanyanı gözləri qarşısına gətirən kimi dərhal xəyalında dənizin sonsuz maviliyi – qızın gözləri rəngdəydi bu mavilik – bir də dalğaları yarıb aşan iri ağ yelkənli qayıqlar canlanırdı.

Zaurun atası, geoloji-mineraloji elmlər doktoru, professor Məcid Zeynallı nə qazanmışdısa öz əlinin zəhmətilə, uzun və çətin həyat mübarizələrində qazanmışdı. 30-cu illərdə ucqar bir dağ kəndindən Bakıya gələndə Məcid Zeynallının yamaqlı çəkməsi, bircə dəst boz şalvar-köynəyi və şalvarının cibində cəmi-cümlətanı üççə manat pulu vardı... Məcid mədənlərdə qara fəhlə işlədi, vağzalda hambal işlədi, hətta bir müddət yeməkxanada aşpaz köməkçisi işlədi. Rabfakın axşam şöbəsində təhsil aldı. Xüsusi bir qabiliyyətə malik olmasa da zəhmətsevərlik, yuxusuz gecələr, inad gücünə universitetə daxil oldu, oranı əla qiymətlə bitirib Leninqrada aspiranturaya getdi... 1936-cı ildə Leninqradda dissertasiya müdafiə elədi, elmlər namizədi oldu. Bakıya qayıtdı və elə həmin il işə düzəldiyi institutun makinaçısı Zivərlə evləndi... Zivərgilin Dağlı məhəlləsində dədə-baba evləri vardı. İkimərtəbəli evin ikinci mərtəbəsini kirayə verərdilər, birinci mərtəbəsindəki iki otaqda isə Zivərin anası və bacılarıyla bir yerdə Məcidlə Zivər düz bir il yaşadılar. Bir il sonra Məcidgil şəhərin mərkəzində azad olunmuş mənzillərdən birinə köçdülər, sonralar qonşularındakı iki otağı da öz mənzillərinə qatdılar və indiyəcən də burada yaşayırdılar...

Qırxıncı ilin sentyabrında Zaur dünyaya gəldi...

Dava düşdü və topçu-zabit Məcid Zeynallı Sevastopolda yaralandı, qospitaldan sonra təcili Bakıya çağrıldı və bir dəstə geoloqla bir yerdə İrana göndərildi. Davanın axırınacan İranda qaldı. İrandan gətirdiyi şeylər içində Zaurun ən çox yadında qalan laklı çəkmələr və əlvan şokolad qutuları idi... Davadan sonra Məcid Zeynallı doktorluq müdafiə elədi, kafedra müdiri təyin olundu və Qırmızı Əmək Bayrağı ordeni aldı.

Təhminənin falında bir şey həqiqət idi: yaşa dolduqca Zaur, doğrudan da, yumşalırdı, mülayimləşirdi. Əvvəla, valideynlərinə qarşı

mehribanlaşmışdı. Elə bil münasibəti daha təmənnasız olmuşdu. Doğrudur, yenə də hərdən-birdən anasına: “yaxşı, bir əlivizi cibivizə atın görək, – deyirdi, – professorun pulları kif atıb”, amma indi ata-anasından pulu da elə bil bir növ utana-utana, çəkinə-çəkinə alırdı... İşə girəndən sonra özü də qazanırdı. Doğrudur, donluğu xərcinin onda birini də ödəməzdi, amma, buna baxmayaraq, hər dəfə anasından pul alanda deyirdi ki, borc götürürəm, maaşda qaytaracağam: hər ikisi bilirdi ki, bu günü-gündən artan borc heç bir vaxt ödənilməyəcək...

Bir dəfə isə lap pərt oldu. Əslində bu pərtlik də deyildi, nə isə bir başqa hiss idi. Zaur biləndə ki, atası onun adına üçotaqlı kooperativ mənzil yazdırıb və pulunu da verib, həm bir qədər əsəbiləşdi – “kim bilir haçan hazır olacaq bu mənzil, ondansa bu pulları verəydi, indi xərcləyəydim” – deyə düşündü, həm bir az şəstinə dəydi – deməli, mənim gələcək mənzilim də atamın hesabınadır, amma bir tərəfdən də sevindi – hər halda özünün ayrıca evi olacaq... Belə ayrıca otaq həsrətində olurdu çox vaxt, tez-tez lazım olurdu ona belə bir məxsusi mənzil... Amma hər halda... Bir dəfə atası özü bu barədə söhbət saldı. Bu söhbəti açmaq üçün atası qəsdən elə vaxt seçmişdi ki, Zivər xanım evdə olmasın.

– Əlbəttə, – dedi atası, – biz istərdik ki, həmişə səninlə bir yerdə yaşayaq, amma bilirsən özün də, – bunu gizlətməyin nə mənası var – ananın xasiyyəti tünddür. Sənin gələcək arvadın lap mələikə olsa da, ikisi bir yerdə yola getməyəcəklər. Ailədə narazılıq, dedi-qodu nəyə lazımdır, ondansa bu başdan işimizi elə tutaq ki, arada hörmət-izzət qalsın... Vaxtdır, sən də gərək evlənmək barədə fikirləşəsən. Bizim də daha baba, nənə olmaq yaşımızdır. Əməlli-başlı fikirləş, hər cəhətcə götür-qoy elə. O vaxta ev də hazır olar... İnşaallah, o vaxta gərək müdafiə də eləyəsən...

Atası heç bir vaxt onunla belə danışmamışdı. Ümumiyyətlə, az-az danışırdılar, atası elminə – kitablar aləminə qapılmış qaradinməz bir adam idi, arvadıyla nadir hallarda danışar, oğluyla isə demək olar ki, heç danışmazdı. Bu cür açıq sözləri isə Zaur, ümumiyyətlə, birinci dəfə eşidirdi ondan. Elə buna da mat qalmışdı. Amma bundan daha artıq başqa bir şeyə mat qalmışdı Zaur. Mat qalmışdı ki, atası neçə illər bundan qabaq öz həyatını dəqiq qrafik üzrə qurduğu kimi, indi onun, Zaurun da həyatını bu cür dəqiq planlaşdırmışdı: ali təhsil, dissertasiya, mənzil, evlənmə, övlad... Doğrudur, bəzən görürsən gözlənilməz hadisələr də olur, məsələn: İkinci Dünya müharibəsi. Qrafik müəyyən

dərəcədə pozulur. Amma hər halda İkinci Dünya müharibəsi də, ağır yaralanması da Məcid Zeynallının çox gənc yaşlarında müəyyənləşdirdiyi həyat cədvəlini – qarşıya qoyulmuş bir məqsəddən yeni bir məqsədə gedən dümdüz yolu dəyişə bilməzdi. Və bu dümdüz yol üzrə gedən hərəkəti Məciddən sonra onun oğlu Zaur davam etdirməli idi. Sonra isə, inşalllah, Zaurun oğlu qədəm qoymalı idi bu yola...

***

Şam yeməyindən sonra atası öz iş otağına çəkildi, Zaur jurnalları vərəqləyirdi ki, birdən Zivər xanım:

– Bura bax, – dedi, – qulağıma cürbəcür sözlər çatır ha...

Zaur "Oqanyok"dakı krossvordu gözdən keçirərək laqeydcəsinə:

– Nə sözlər?

– Səni tez-tez bir xanımla görürlər.

"Oqonyok"u bir qırağa qoydu:

– Nə xanımla?

– Nə bilim, nədir onun adı – Nərminədi, Təhminədi nədi...

Zaur hiss elədi ki, qızarıb pörtür və qulaqları od tutub yanır. Özünü ələ alıb:

– Nədir ki? – dedi.

– Yaxşıdır yenə sifətində bir az həya qalıb, – dedi anası, – bir gözümün içinə düz bax görüm.

Zaur güclə gülümsündü və anasının gözlərinin içinə baxdı.

– Düzdür ki, onu maşınına mindirib bütün Abşeronu gəzdirirsən?

"Aman Allah, hər şeyi yerli-yataqlı çatdırıblar".

– Bilmirsən ki, yerin qulağı var?.. Heç ağlın var, heç bir beynivə vurursan? Ərli arvaddır axı... Sənin Tanka-mankalarından deyil...

– Kimdir bu xəbərləri sənə çatdıran?.. Camaatın işi-gücü qurtarıb...

– Yox, görünür sənin işin-gücün qurtarıb... Heç əməllərindən utanıb eləmirsən... Bura bax, gör nə deyirəm, sən day balaca uşaq deyilsən. Bığlı, saqqallı yekə kişisən... Mən heç vədə sənin işlərinə qarışmamışam ki, hə, de də, qarışmamışam, yox? Amma bu səfər, bax, deyirəm, aç qulaqlarını yaxşı-yaxşı eşit, gör nə deyirəm. Nə qədər ki, atovun qulağına çatmayıb, biryolluq bu işdən əl çək. Bildin?

Məsələnin bu cür qoyuluşu özündən çıxarırdı Zauru: nə ultimatumdur bu belə, o südəmər körpə-zaddır bəyəm? Amma dinmədi... Bəlkə elə Zivər xanım da gərək söhbətini burada xətm eləyəydi. Sözünü bununla qurtarsaydı Zivər xanım, hər şey bəlkə ayrı cür olar-

dı. Amma Zivər xanım harın arvad idi, içində hikkəsindən qaynayırdı və dilini dişləyib demək istədiklərini ürəyində saxlaya bilməzdi. Və dediyi sözlər də bütün sonrakı hadisələr üçün təkan oldu... Zivər xanım üz-gözünü elə turşutdu ki, elə bil çimçəşirdi, iyrəndiyi murdar bir şey haqqında danışırdı:

– İndi də sənə ilişib, – dedi, – idarəvizin bütün kişiləriylə fırıldaq çıxarıb doyub, indi növbə sənə çatıb?!

Zaur yerindən sıçradı:

– Bəsdir, – dedi, – ayıbdır səninçün, bu cür sözlər danışmaq... onun-bunun ara söhbətlərini təkrar eləmək yaraşmaz sənə...

Yəqin bunu çox sərt dedi, çox əsəbi dedi, anası elə bil barmağını dişlədi, sövq-təbii bir hisslə elə bir şeyi duydu ki, o hələ Zaurun özünə də tam aydın deyildi. O vaxt, Zaurla Təhminənin əlaqələri, Zaurun fikrincə, qeyri-ciddi, yüngül bir şey olduğu vaxtda Zivər xanım qadınlıq və analıq intuisiyası ilə bu əlaqələrin ciddiliyini dərk eləmişdi.

Kinayəylə:

– Ara söhbətləri?! – deyə təkrar elədi. – Əcəb ara söhbətləridir! Bütün şəhər danışır da bu söhbətləri... Bircə sənin kimi uşağı ələ salıb aldada bilərlər ki, bütün bunlar ara söhbətləridir, boş qeybətlərdir... Bütün şəhər bilir ki...

– Bütün şəhər... Anket paylamısan bütün şəhərə?

– Anket-zad lazım deyil... Hamı bilir də... Özü də onunçün təfavütü yoxdur kim olsun... nə idi o kişi, o yaşlı kişi var e, dədəsi yerindədir, əşi sizin idarədə işləyir, nədir o köpəkoğlunun adı, balaca dazbaş kişidir e, burnunda da ziyil var...

Bilirdi ki, anası kimi nəzərdə tutur, amma boğazına ip də salsaydılar Zaur Dadaşın adını çəkməzdi...

Zivər xanımın özünün yadına düşdü:

– Hə, Dadaş, deyirəm axı, adı Dadaşdır. Utanıb yerə girmir, həyasızın qızı... Denən, cavan gəlinsən... Sir-sifətdən də babatsan – bu, Zivər xanımın Təhminə haqqında dediyi birinci və axırıncı yaxşı söz oldu: “babatsan” – cavan ərin var... Amma di gəl, gör kimnən eşqbazlıq eləyir – qoca idbar kişiynən...

Zaur dəqiqləşdirməyə çalışdı:

– Deməli, belə çıxır ki, eşqbazlıq eləməyi günah deyil, günahı ondaymış ki, qoca idbar kişiylə eşqbazlıq eləyir?

– Sən mənimlə burada söz güləşdirmə... Kimnən eşqbazlıq eləyir – öz işidir. Bir də o əri qurumsağın işidir. Kül onun başına ki, bu cür

arvadı evində saxlayır. Amma, bax, səndən əl çəksin. Yoxsa, Allaha and olsun, onun başına bir oyun açaram ki, öz adını da yadından çıxarar. – Zivər xanım Təhminəyə nə edəcəyini daha da dəqiqləşdirərək əlavə elədi. – Gözlərini çıxararam o it qızının...

Zaur anasının xasiyyətinə bələd idi, bilirdi ki, anası dediyini eləyəndir, bütün bu əhvalat da, görünür, Zivər xanıma möhkəm toxunmuşdur. Zaur məsələni daha da gərginləşdirmək istəmirdi, odur ki:

– Sən allah boşla görək, ay ana, – dedi. – Aramızda heç nə yoxdur. Bir idarədə işləyirik, tay-tuşuq, bəlkəm indi işdən çıxanda bir-iki dəfə onu maşınla aparmışam, vəssalam... Nə böyük bir məsələ imiş ki bu? Əgər belə ürəyinə salırsansa, yaxşı, söz verirəm ki, bir də onu maşınıma mindirməyim, qoy trolleybusla getsin. – Həmişəki kimi yarızarafat tərzində danışırdı, amma elə bil daxili bir nigaranlıq hissi keçirirdi, nədənsə ona elə gəlirdi ki, Təhminəni bir növ satır və məhz elə buna görə, özünə vicdanı qarşısında bəraət qazandırmaqçün Təhminəni müdafiə eləmək istədi:

– O ki qaldı, Dadaş, – dedi, – səni yüz faiz əmin edə bilərəm ki, bu, yalan sözdür, böhtandır, vəssalam. Mən lap yəqin bilirəm, Dadaşla onun arasında heç bir şey olmayıb, ola da bilməz.

– Sən hardan bilirsən? Özü sənə deyib?

– Yox, özü deməyib. İntəhası mən də həmin o idarədə işləyirəm və çörəyi burnuma yemirəm axı... Bu söhbət ağ yalandır.

Amma Zivər xanım heç cür razılaşmaq istəmirdi:

– Tək Dadaşdır bəyəm? Odey bizim qonşu da neçə vaxt onunla “dostluq” eləyib.

Zaur:

– Hansı qonşu? – deyə xəbər aldı və hiss elədi ki, bütün içi donub buz bağlayır.

– Alyanın oğlu da... Spartak... Alya danışırdı, deyir, yazıq gədəyə aman vermirdi. Telefonumuzu, deyir, day yerindən çıxardırdı. Gecə bilməz, gündüz bilməz, zəngi zəngə calayır... Ciyəriyanmış hardan zəng vururmuş görəsən, öz evindən? Bəs, əri balqabaq harada itib qalıbmış?.. Əh...

İçi elə bil don bağlamışdı Zaurun, elə bil beyni ağırlaşmış, qıc olub qalmışdı, yavaş-yavaş özünə gəldikcə bircə istək hakim kəsilirdi qəlbinə: bu saatca Təhminəylə görüşsün, lapdan, aman, macal vermədən soruşsun Spartak barəsində və cavabından asılı olaraq ya münasibətləri birdəfəlik qırılsın, ya da... Sanki anasının səsini də artıq eşitmirdi.

Anası elə hey üyüdüb tökürdü, deyirdi ki, axır Alya dözməyib, özü işə qarışıb, amma Alya mənim kimi oğluynan danışmayıb, axı oğlu da elə avaranın, yelbeyinin biridir, yox, Alya o çərhəyanın özüylə danışıb, zəng eləyib hədələyib ki, bax, əl-ayağını yığışdır, yoxsa, gəlib saçlarını keçirdərəm əlimə, bircə-bircə yolub tökərəm tüklərivi. – Zivər xanım güldü. – Saçları da deyir, heç özününkü deyil o lotunun, qoymadır, parik taxır başına.

Zaur elə bil bu hədələri artıq icra olubmuş kimi görürdü, elə bil gözləri qarşısında canlanırdı. Təhminənin gözlərinin Zivər xanım tərəfindən deşilməsi, tüklərinin, (bu tüklər parik-zad deyildi, özününkü idi – bunu Zaur yaxşı bilirdi) uzun saçlarının Alya xanım tərəfindən yolunmasını...

– Çıxıram bir az havaya – dedi Zaur.

Küçəyə düşən kimi avtomatdan Təhminəyə zəng elədi.

– Bəli... bəli, eşidirəm sizi. – Telefondan yumşaq kişi səsi gəldi. – Manaf idi – Təhminənin əri.

Zaur dəstəyi asdı...

Axşam düşmüş, hava qaralmışdı. Zaur şəhəri gəzirdi. İki dəfə də zəng elədi. Manafın səsini eşidib asdı. Əlbəttə, salamlaşa bilərdi, öz adını deyə bilərdi və xahiş edərdi ki, Təhminəni telefona çağırsın: axı hər halda, bir idarədə işləyirdilər, neçə müddətdi tanışdılar. Amma belə etmək istəmirdi: əvvəla, ona görə ki, ümumiyyətlə, Təhminənin əriylə danışmaq heç ürəyindən deyildi. İkincisi, bəlkə Manafın qulağına da bir şey çatıb, həm də Manafın yanında Təhminə necə ona izahat verəcəkdi – Spartakla "dostluq" eləyib, ya yox? Bütün bu fikirləri beynində dolaşdıra-dolaşdıra şəhəri gəzirdi və gəzdikcə də elə bil sakitləşirdi. Lap tutalım Dadaş, ya elə Spartak Təhminənin adamı olub? Mənə nə? Nəyimdi mənim Təhminə? Arvadım, qızım, bacım? Tamam özgə bir adamdır. Gözəldir, cazibəlidir, məni də cəlb edir, çəkir. Çox gözəl, mən ki, niyyətimə çatdım, yaxınlığımız oldu onunla... Xoş dəqiqələr, saatlar keçirdik... İndi də, özünün dediyi kimi, ayrılmalıyıq. Çox əcəb... Daha iztirab keçirmək, qısqanmaq niyə?.. Nəyimdir mənim?.. heç nəyim... Onun qeyrətini mənmi çəkməliyəm?.. Həm də bütün bu əlaqələri – əgər doğrudan da olubsa bu əlaqələr – bizim münasibətlərimizdən qabaq olub... Mənə nə? Doğrudur, Təhminənin məhz Spartakla olması fikri Zaurun təpəsindən tüstü çıxarırdı. Kim olur-olsun, Spartak olmasın. Spartakı görməyə gözü yox idi. Hələ uşaq yaşlarından, həyətdə bir yerdə oynadıqları, dalaşdıqları vaxtlardan

Spartakdan zəhləsi gedirdi. Spartak satqın idi, daima onları satırdı, həm də qorxaq idi. Zaur uşaqlıqda o qədər əzişdirmişdi ki, Spartakı. Alya xanım, əlbəttə ki, yalan danışır: Təhminə, dünya gözəli Təhminə Spartak kimi bir dəyyusla "dostluq"mu edə bilər?.. Əlbəttə ki, Spartak Təhminəyə heç yaxın da düşə bilməyib və məhz buna görə də ağzını Allah yoluna qoyub artıq-əskik danışmağa başlayıb. Başqa səviyyədə Dadaş da bu cür davranmırdımı? Təhminə özü Zauru başa salmışdı ki, Dadaş necə edir bunu və nə səbəbdən edir? İndi də Spartak? Yəqin söz düşsəydi, Təhminə Spartak məsələsini də dəqiq-dürüst izah edərdi Zaura. Zaurun da ürəyində heç bir şəkk-şübhə qalmazdı...

Axırıncı dəfə 12-nin yarısında zəng elədi, yenə də Manafın səsini eşidib dəstəyi asdı... Evə dönərkən düşünürdü: doğrudan, qəribədir, bax indicə bu saat Manafın səsini eşitdim. Gecədir. Yəqin Təhminəgilin pəncərələri də qaranlıqlaşıb. Onlar bir yerdədirlər, qaranlıq otaqda, gecəni bir yerdə keçirəcəklər, ər-arvaddırlar. Amma bu fikir Zauru Spartak haqqındakı şübhələri qədər incitmir...

Yağış çisələyirdi, Zaur evlərinə tərəf addımlayarkən birdən ağlına gəldi ki, sabah Təhminənin təzə iş yerinə zəng eləyə bilər. Telefonunu bilmirdi. Dadaşdan öyrənə bilər. Bəlkəm elə indi gecəyarısı Dadaşa zəng vurub öyrənsin? Məzəli bir əhvalat yadına düşdü, bu əhvalatı Təhminə danışmışdı ona: bir gecə Nemət içib dəm olub, gecə saat üçdə zəng eləyib Dadaşdan Təhminənin gözlərinin rəngini soruşub.

– Yox, mən belə etməyəcəyəm, – deyə düşündü Zaur. – Gecə zəng eləməyəcəyəm Dadaşa. Səhər idarədə xəbər alaram.

Sabahısı gün uzun zaman Dadaşa yanaşa bilmədi, otaq adamla dolu idi. Təhminənin yerində təzə bir işçi – qara bir qız oturmuşdu. Zaur Nemətlə bir-iki kəlmə ordan-burdan danışıb çıxdı otaqdan. Fasilə zamanı gələndə gördü ki, Dadaş otaqda təkdir... Dadaş iri şişman portfelini açmışdı, stolunun üstünə qəzet salıb evdən gətirdiyi yeməyini çıxartmışdı. Toyuq yeyirdi, otaq istiydi və Dadaşın sir-sifətindən tər axırdı, tər damcıları toyuğun yağına qarışırdı və bir an Zaurun bu görünüşdən ürəyi qalxdı...

Dadaş Zauru görüb:

– Buyur, buyur, – dedi, – gəl çörək yeyək...

Zaur:

– Nuş olsun, – dedi, kənardakı stolun dalına keçdi. Dadaş başa düşdü ki, Zaurun onunla işi var. Ağzındakı iri tikəni udub:

– Mənə sözün var? – dedi.

– Bəli. Təhminənin təzə işində telefonunu bilmirsiz ki?

Dadaş:

– Bilirəm, – dedi və barmaqlarının yağını silmədən əlini pencəyinin içəri cibinə saldı, oradan balaca telefon dəftərçəsini çıxartdı, ovulub didilmiş vərəqləri çevirdi, telefon nömrəsini tapdı və Zaura dedi, Zaur yazmadı. Bu nömrə də, Təhminənin ev nömrəsi kimi yaddaşına həkk olunacaqdı.

Daha Dadaşla bir işi yox idi, öyrənmək istədiyini öyrəndi, həm də şahidsiz-filansız, artıq söz-söhbət nəyə gərək? İndi gedə bilərdi, amma bir az yubandı, nədənsə birdən soruşmağı qərara aldı:

– Bəs, niyə getdi axı burdan Təhminə?

Dadaş ağzındakı loxmanı uzun zaman çeynədi, nəhayət, uddu, bundan sonra da cavab vermədi, hələ bir müddət də tikəsini həzm eləyə-eləyə, udquna-udquna, səssiz-səmirsiz başını buladı. Axır ki:

– Əşi, bu qızın işi uzun həngamədir, – dedi. – Elə ömrü boyu belə olacaq – kəpənək kimi ordan bura, burdan ora uçacaq... – Dadaş kəskin və sərt danışırdı, amma sonra sakitcə əlavə elədi: – Yəqin köhnə məhəbbəti yadına düşüb.

Zaur mat-məəttəl qalıb:

– Nə məhəbbət? – dedi.

– Nə bilim, nədir o oğlanın adı, Muxtardır deyəsən. Məhərrəmov Muxtar. Televiziyada rejissordur nədir... Bilmirəm, aralarında nə haqq-hesab var, amma yüz faiz əminəm ki, Təhminəni o dartıb apardı televiziyaya. Diktor eləyəcək onu. Bu qız guya filosofdur, diplomu var, universitet qurtarıb, indi gedib diktor olacaq. Ay-hay... Nə olub deynən, nəyin əskikdi burda?! Maaş kimi maaşın vardı, qonorardan-zaddan da yazırdıq hərdən, kefin istəyəndə gəlirdin, kefin istəyəndə gedirdin...

Dadaşın sözlərindən açıq hiss olunurdu ki, Təhminədən yanıqlıdır, möhkəm inciyib onun bu gözlənilməz hərəkətindən. Yəni, doğrudan, görəsən, Dadaş Təhminəni sevirmiş ki, bu etibarsızlıq ona belə ağır təsir eləyib? İndi nə idi onu danışdıran?! – İnciklik, yanıq, qısqanclıq, ya da sadəcə himayədarlıq hissi, – heyifsilənirdi, yanırdı bəlkə Təhminəyə ki, öz qədrini bilmir, həyatda yerini tapa bilmir... Ya da elə bütün bu hisslərin hamısı bir yerdə hakim idi Dadaşa? Yaxşı, bəs bu Məhərrəmov deyilən kimdir belə, bu hardan çıxdı, bu nə yuvanın quşudur görəsən? Köhnə məhəbbət... Bəlkə “köhnə tanışım dəvət eləyirdi məni televiziyaya” deyəndə Təhminə məhz elə o Məhərrəmovu

nəzərdə tuturdu. Köhnə tanış. Elə hara baxsan bunun köhnə tanışlarıdır. Belə də qadın olar, ilahi?

Dadaş yeyib qurtarmışdı, toyuğun sür-sümüyünü yığışdırıb qəzetə bükürdü. Zaur da ayağa durmuşdu ki, otaqdan çıxsın, amma bu vaxt Dadaş qəfilcə dedi:

– Zaur, bala, sənin atavı yaxşı tanıyıram, hörmətim var o kişiyə. Sən də elə mənim oğlum, incimə sözümdən, amma mən sənə məsləhət eləyirəm: Bir əmi kimi. O arvada baş qoşma.

Zaur heç belə söhbət gözləmirdi, bir an özünü itirdi elə bil. "Deməli, belə, – deyə düşündü. – Deməli, bu xəbər hamıya yayılıb. Anası düz deyirmiş, yerin qulağı var. Yaxşı, əgər belədirsə, onda, deməli, Dadaş həmin o Muxtar Məhərrəmovdan söz salanda hər şeyi bilirdi, – bilirdi Zaurla Təhminənin münasibətlərini. Elə çıxır ki, acıqcan deyirmiş bu sözləri Zaura, ondan hayıf çıxmaq üçün, intiqam almaq üçün... Axı bütün bu şayiələr düzdürsə, onda, deməli, Zaur Dadaşın da rəqibidir, məqsədinə nail olmuş rəqibi".

– Yaman afətdir o qız. İnan mənə. Mən hər şeyi başa düşürəm: gözəldir, həddən ziyadə gözəldir, cazibəlidir. Sən də cavan oğlansan... Amma ondan mümkünsə gen gəz. Səni lopp eləyib elə udar ki, heç ruhun da inciməz...

Zaur ifadə tərzinə mümkün qədər çox zəhər qataraq:

– Bəs mən elə bilirdim, siz ona yaxşı münasibət bəsləyirsiz, – dedi.

Bu səfər Dadaş tutuldu, amma dərhal özünü ələ aldı və sakit-sakit sözünə davam elədi:

– Mən, doğrudan da, ona pis münasibət bəsləmirəm. Yazığım gəlir ona. Bir insan kimi yaxşı cəhətləri də var. Amma nə olsun? Özü özünü məhv eləyəcək... Onunçün heç bir qanun-kitab yazılmayıb, – kefi necə istəyir, elə də yaşayır. Dünya-aləm vecinə deyil... Axı, belə də olmaz... Qayda var, adət var...

"Yaxşı, ay kaftar haramzada, bəs sən, sinli, həm də evli kişi altdan-altdan Təhminəyə maz gedəndə – bu hansı qayda-qanuna, hansı adət-ənənəyə görə idi, hə? Özü də sənin işçin idi, tabeliyində idi", – Zaur belə düşündüsə də dinmədi, maddım-maddım Dadaşın sifətinə baxırdı. Dadaş isə get-gedə daha çox cuşa gələrək danışırdı:

– Onunçün heç bir təfavütü yoxdur, kimiynən dostluq eləsin... Kimdir onun tanış– bilişləri? Baza müdirləri, nə bilim alverçilər, filan... Nə var, nə var, təzə bir parça alacaq, ya şuba, ya nə bilim, üzük-sırğa...

Zaur bu bulanıq söz selinin qarşısında tam bir köməksizlik duyurdu, axı, hissə qapılıb çılğın etirazlardan başqa nəylə-hansı dəqiq fakt-

larla, dəlil-sübutlarla bu axının qarşısında dura bilərdi. Dadaş ancaq gülərdi onun çılğınlığına, "Ürəyi təmiz uşaqsan, onunçün də aldanırsan, onunçün də səni aldadıb barmağına dolaya bilib" – deyərdi, deməsə də düşünərdi. həm də axı Zaur özü əmin deyildi ki, Dadaşın sözləri tək bir quru böhtandır. Təhminənin hər yerdə tanışları vardı, – doğrudan da, beləydi bu – ən müxtəlif adamlar, cürbəcür peşə sahibləri düşməzdi dilindən. Gərək paltarlarını Bakının ən yaxşı dərzisində tikdirəydi, gərək şəkillərini beynəlxalq konkurslarda mükafatlar almış məşhur fotoqraf çəkəydi, bərbəri də gərək şəhərdə birinci bərbər olaydı, diş həkimi də. Nə deyirsən de, belə şeylərin dəlisiydi Təhminə. Belə şeylər, bu cür həyat tərzi isə müəyyən adamlarla, əksər hallarda kişi xeylaqlarıyla əlaqədar idi və belə olan surətdə, bütün bu imtiyazları havayı qazanmırdı ki, Təhminə. Təmənnasız olunmurdu ona bu lütfkarlıq – tapılmayan geyimlər, növbəsiz biletlər, qıt şeylər...

Dünəndən bəri ikinci dəfədir ki, Zaur Təhminə haqqında dəhşətli şeylər eşidirdi və onu ağrıdırdı eşitdikləri. Amma məgər üç ay bundan qabaq – yaxınlıqlarından əvvəl də eşidib qulaqardına vurmurdumu ara-sıra aralığa düşən bu cür söhbətləri?.. Onda niyə bu söhbətlər Zaurun zərrəcə vecinə deyildi? Əksinə, bəlkə bu söhbətlər bir növ Zauru şirnikdirmişdi də. Bəlkə də haradasa, qəlbinin dərinliklərində fikirləşmişdi ki, əgər Təhminə, doğrudan da, belə "yüngülməcazdırsa", ayağı sürüşkəndirsə, mən niyə kənarda qalım? Zaur istədiyinə nail oldu, daha indi ağrımaq, nəyisə ürəyinə salmaq neyçün? Olan olub, keçən keçib... Mənim nə borcuma? Təhminə kimdir ki, mənimçün? Üç ayın xoş xatirələri, vəssalam.

Belə düşünürdüsə də, haradansa xəstə diş kimi hovutqayıb zoqquldayan ağrını da ovuda bilmirdi. Hər halda Dadaşın cavabını verməli idi:

– Mən heç bilməzdim ki, – dedi, – siz Təhminə haqqında belə pis danışarsız.

Dadaş quru bir tərzdə:

– Mən olanı deyirəm, – dedi. – Səni də xəbərdar edirəm. Çünki sən də mənim oğlumsan. Əmin kimi sənin...

Çox gülməli çıxdı: "Mən sənin əminəm, sən mənim oğlum" və Zaur qəhqəhə çəkdi. Əsəbi bir gülüş idi bu, Dadaşın düz gözlərinin içinə baxa-baxa gülürdü. Və gülə-gülə də:

– Nə siz mənim əmimsiniz, – dedi, – nə də mən sizin oğlunuz. Mən uşaq deyiləm... Nə elədiyimi özüm bilərəm...

Düz üzünə dedi bunu Dadaşın və özünün də xoşuna gəldi ki, fikrini necə də açıq, mərd-mərdanə bu burnu ziyilli kişinin üzünə çırpdı.

“Mənimlə ömürlük düşmən olacaq, cəhənnəmə ki, olur-olsun. Əlindən gələni beş qaba çəksin” deyə düşündü və xudahafizləşmədən şəstlə otaqdan çıxdı...

## Dördüncü fəsil

*Həm vüsali vurur od canıma, həm hicranı*
*Bir əcəb şəm ilə düşdü səri-karim bu gecə.*

Hər bir insan yaşadığı evin içinə nə sayaq alışır, məhrəm olursa, maşın sürən adam da şəhərə, şəhərin küçələrinə, meydanlarına, dalan və döngələrinə, enişinə-yoxuşuna o cür alışır, məhrəm olur. Evlərin sakinləri mənzillərinin hər əyər-əskiyinə bələd olduqları kimi, maşın sürən adam da yolların hamarına, çuxuruna bələd olur. “Dünən burada keçidi bağlamışdılar, bu çəpərin üstündə “sağa burulmaq olmaz” nişanı vurulub, bu yolayrıcında işıqfor pis işləyir, bu döngənin dalında çuxur var” – bütün bu əlamətlər sükan arxasına keçmiş adamçün gündəlik qayğılardır – daman dam, xarab olmuş su kəməri, sınmış pəncərə, cırıldayan döşəmə – ev sahiblərinin gündəlik qayğıları olduğutək. Mənzilinə alışmış adam otağının içində qaranlıqda da yeriyə bildiyi kimi Zaur da şəhərin avtomobil yollarını, küçələri, döngələri gözübağlı da seçə, tapa, burula bilərdi... Əlbəttə, gözübağlı sürmürdü maşını, diqqətlə başqa maşınları, piyadaları, işıqforları, yönəldici milisin hərəkətlərini izləyirdi. Amma şəhəri beş barmağı kimi tanıdığı üçün maşını sürərkən müəyyən istiqamət barəsində düşünmürdü, fikirləri tamam başqa, kənar məsələlərə yayınırdı... İndi isə o yalnız Dadaş haqqında fikirləşirdi – gündüz elədikləri söhbət haqqında...

Dadaşın sifətini gözləri qarşısında dönə-dönə canlandırır, ona getgedə daha artıq nifrət edərək, hey söyürdü kişini: “Adam satan köpəkoğlu... Gör bir nə ağızdolusu danışırdı: “onunçün heç təfavütü yoxdur, – alverçilər, baza müdirləri...” Yaxşı, madam ki, heç təfavütü yoxdur, səni niyə mağmın qoyub? Yeddi həndəvərinə buraxmayıb, odur ki, belə salveylənmiş küçük kimi zingildəyirsən də. Ağzıgöyçəklik eləyib, özgənin üstünə min çirkab atırsan!”

Amma ən dəhşətlisi o idi ki Zaur yüz faiz əmin ola bilmirdi: doğrudanmı Dadaşın atdığı çirkab ancaq onun öz uydurmalarıdır, real gerçəklik deyil? O, Təhminə haqqında Dadaşın sözlərindən təcrid oluna-

raq düşünmək istəyirdi və heç bir şey müəyyənləşdirə bilmirdi. Elə bil iki Təhminə vardı – biri Zaurla görüşlərdə mövcud olan Təhminə – Zaur onun hər sözünə inanmağa hazır idi – biri də başqa, Zaura yad, Zaurun tanımadığı, amma bir çox adamların fikrində, dilində, təsvirində mövcud olan Təhminə... Hansı Təhminə daha real, daha həqiqi idi? Bəlkə elə ikisi də. Biri əsil Təhminə... biri də onu yamanlayanların, onu istəməyənlərin öz təsəvvürlərində, xəyallarında yaratdıqları, bəzədikləri Təhminə...

Axı onu bəzəyən, onun haqqında olmazın iftiralar uyduranların özləri də Təhminəyə biganə deyildilər – kəsirdilər ondan, ya nifrət edirdilər ona, ya kiməsə qısqanırdılar Təhminəni, ya paxıllıq edirdilər, ya hayıf çıxmaq istəyirdilər. Onun gözəlliyinin tamarzısında olanların çoxusu isə əslində istəyinə çatmayıb, heç olmasa uzun dilləriylə, bayağı söhbətləriylə, müfəssəl təsvirləriylə qurdlarını öldürmək istəyirdilər.

...Və bütün bu şeylər haqqında fikirləşdikcə Təhminəyə zəng eləmək həvəsi get-gedə sönüb gedirdi. Hələ dünən bu zəngin bir mənası vardısa, bu gün, Dadaşla söhbətdən sonra tamam yersiz bir iş olardı. Zəng eləyib nə barədə soruşacaqdı? Spartak barədə, ya o televiziya rejissoru barədə? Yaxud baza müdirləri, alverçilər barədə? Təhminə nə cavab verərdi bütün bu sorğu-suala? "Əgər məni fahişə hesab eləyirsənsə, onda nə təfavütü var sənin üçün, – deyə bilərdi, – yox, əgər hesab eləmirsən, necə ağlıva sığışdıra bilirsən bütün bu şübhələri?" Bəlkə də hər şeyi inkar edəcəkdi, bircə o televiziya rejissorunu boynuna alacaqdı... Ya Spartakı... Nə isə, yenə qarışırdı Zaurun fikirləri. Yox, özünü ələ almalıdır. Bütün bu şeylər haqqında düşünməməlidir. Gözləməlidir, vəssalam. Heç kəsnən Təhminə barəsində söhbət aparmaq lazım deyil. Özünə də zəng eləmək olmaz... Gözləmək lazımdır vəssalam... Gec-tez özü zəng eləyəcək, buna Zaurun şəkk-şübhəsi yox idi. Özü zəng eləsə, özü görüş təyin eləmək istəsə, görüş təyin eləsə, o zaman sözü açmaq olar.

***

...Günlər bir-bir ötürdü. Təhminədən səs-soraq yox idi...

***

Bir axşam Zivər xanım sözarası dedi ki, Zaurun kooperativ mənzili bir-iki aya hazır olmalıdır. Zaur bu eyhamın gizli mənasını başa düşürdü: mənzildən söhbət salanda, anası ardınca evlənmə barəsində

söz açardı... Zaur düşünürdü ki, doğrudan, təəccüb qalası işdir. Axı lap yaxşı bilirdi ki, anası gələcək gəliniylə yola getməyəcək, aralarında dedi-qodu olacaq, sancıb-dalayacaq gəlinini, yox əgər gəlin də dilli-dilavər olsa, söz götürməyəcək, cavabını verəcək, dava-mərəkə ərşə qalxacaq, sözgap düşəcək aralığa və bütün bunlara baxmayaraq, Zivər xanım oğlunu evləndirməyə, qayınana olmağa can atırdı, tələsirdi... Ərşdən-kürşdən, o yandan-bu yandan başlanardı bu söhbət, filankəs oğlunu evləndirdi, peşmankəs qızını ərə verdi, filançün elçi gediblər. Sonra Zivər xanım hərləyib-fırlayıb gətirərdi sözü Zaurun üstünə, başlardı ki, bəs, daha yekə oğlansan, evlənmək vaxtındır, nə çağacan subay gəzib dolanacaqsan, bizim də day o yaşımız deyil, atan iki dəfə infarkt keçirib, mənim özümü bu andıra qalmış astma lap əldən salıb, rəvadırmı ki biz bu dünyadan nisgilli, nakam köçək, oğlumuzun şad gününü görməyək, bircə balamızçün elçi düşməyək, könlü istəyən, gözü tutan bir təmiz qızın "həri"sini almayaq, toyunda sındıra-sındıra oynamayaq, totuq-motuq nəvələrimizi atıb-tutub oynatmayaq və s. qəbildən sözlər, sözlər, sözlər... boş-boş sözlər. Xeyr, bağışlayacaqsan, boş-boş sözlər deyil bunlar... Bizim cavanlığımız çətin keçib, aclığa, kasıbçılığa, ehtiyaca, sıxıntıya dözmüşük, amma bir arzumuz olub, atanın da, mənim də ki, barı balamız xoşbəxt olsun, bu dünyada heç nədən korluq çəkməsin, halal südəmmiş, pak, təmiz bir qıza rast gəlsin, evlənib oğul-uşaq sahibi olsun, biz də qoca yaşımızda baxıb fərəhlənək, ürəyimiz böyüyüb dağa dönsün, o səadət ki, cavanlığımızda bizə nəsib olmadı, oğlumuzun, nəvələrimizin qismətinə düşsün, elə bizim xoşbəxtliyimiz də onların xoşbəxtliyidir də...

Zaur bütün bu bəlağətə səbirlə tab gətirər, bığaltı qımışar, nə "hə", nə "yox" deyərdi, amma bu səfər anasının nitqinə təzə bir cəhət əlavə olundu, uzun-uzadı və mücərrəd arzuları bu səfər konkret bir adla bağlandı. Əvvəl Zaura elə gəldi ki, səhv eşidib.

– Nə? – deyə xəbər aldı, – hansı Firəngiz?

– Qonşumuzu deyirəm də, Alyanın qızını...

Bu ad, bu təklif o qədər gözlənilməz idi ki, Zaur hətta özünü itirdi:

– O ki lap uşaqdır.

– Uşaq niyə olur, on doqquz yaşı var. İnstitutda oxuyur. Səndən cəmi-cümlətanı beşcə yaş kiçikdir. Elə-belə də olmalıdır da, ər gərək arvaddan bir az böyük olsun.

Əlbəttə, Zivər xanım özüylə əri arasındakı yaş fərqini nəzərdə tuturdu – səkkiz yaş kiçik idi ərindan.

– Ata-anasının əməlli-başlı könülləri var e... Alya neçə kərəm işarə vurub mənə... Deyir, sən xoşbəxtsən, bir oğlun var, oğlanın işi nədir ki, halva... Odey, mənim də oğlum var, bir qırnıq nigarançılığın çəkmirəm onun. Amma qız ayrı məsələdir. Rastına kim çıxacaq anası ölmüşün, hansı evə, hansı ocağa düşəcək... Mənim qızım, deyir, bir açılmamış qönçədir, tale, deyir, görən kimin bağına salacaq balamı... Adam, deyir o vaxt ürəyin buz kimi eləyir ki, qabaqcadan qızıvı köçürdüyün ailəni tanıyasan. Day mən də lap key Balaxanım deyiləm ki, bilirəm bu sözləri bizimçün deyir... Başa düşürəm bu xalı hara vurur...

– Yaxşı nə qaçhaqaçdır, nə olub belə, qızı qarıyıb evdə qalıb ki? 19 yaşı var da qızın, anası nə belə əl-ayağa düşüb?

– Ay-hay... Mən nə deyirəm, bu nə deyir... Əşi başa düşmürsən nə məsələdir? Nə olsun 19 yaşı var? Bu gün-sabah ərə gedəsidir. Alya xanım da ondan nigarandır ki, kimə gedəcək, hansı evə, hansı ocağa düşəcək. Bir yandan da bizə, bizim ailəyə bələddir, səni tanıyır, gözünün qabağında böyümüsən, hansı ana istəməz ki qızı nəcib yerə düşsün?

– Yaxşı, bəs sənə nə düşüb bu cür canfəşanlıq eləyirsən. Xalqın dərdi-səri sənə qalıb?.. Cavan, göyçək qızdır, vaxtı gələr, gedər ərə də. Sən niyə onun dərdini çəkirsən?

– Mən bəyəm onun dərdini çəkirəm? O qız evdə qalmayacaq, mən səni fikirləşirəm... Belə qızlar çöldə tökülüb qalmayıb ki... Gözəllik deyirsən – gözəllik, ağıl deyirsən – ağıl, yaxşı, hörmətli ailə deyirsən-yaxşı hörmətli ailə, abır-həya, ismət, adamı görəndə pul kimi qızarır, day sənə nə lazımdır?.. Belə qıznan evlənərsən ömrün boyu ürəyivi buz kimi eləyərsən, heç kimin yanında da başın aşağı olmaz... Sən, deyəsən, belə-belə şeyləri hələ əməlli-başlı qanıb eləmirsən?

Qəribədir ki, Zivər xanım Firəngizin bütün məziyyətlərini bir-bir sadaladıqca qeyri-ixtiyari Təhminə gəlib dururdu Zaurun gözləri qarşısında və Zaur bu saatca durub Təhminəyə zəng eləmək, onunla görüşmək istəyini güclə boğurdu.

Zivər:

– Sabah sənin ad gününə gələcəklər, – dedi.

Zaurun fikirləri tamam başqa yerdə olduğu üçün bu xəbərdən diksindi:

– Gələcəklər? Kim gələcək?

– Necə yəni kim? Bəs səhərdən bəri kimdən danışıram... Qonşularımız – Alya, əri... qızlarını da gətirəcəklər.

Zaurun elə bil içində çıraq alışdı: necə olub ki, bunu nəzərə almayıb. Sağ olsun anası, yadına saldı: axı, sabah ad günüdür. Təhminə-

də də bilir bu günü, dəftərçəsinə da yazıb. Deməli, bax, bu günü gözləyirmiş, ona görə zəng eləmirmiş. Bəhanə lazım imiş ona zəng eləməkçün, yenidən görüşməkçün, bütün əlaqələrini yenidən bərpa eləməkçün... Əlbəttə ki, belədir,

İndi Zaur sevinclə düşünürdü bu barədə: çoxdan bəri, ta lap uzaq körpəliyində qalmış uşaqlıq illərindən bəri heç bir zaman ad günü haqqında belə bır intizarla düşünməmişdi. Uşaqlıq illərindən bəri həmişə bu gün – Zaurun ad günü onu darıxdırardı, axı, bu gün onunçün tamamilə yad və yabançı olan qohumlar toplaşar, bayağı söhbətlər edər, duzsuz sağlıqlar deyərdilər, sentyabr ayı olduğu üçün hələ isti olardı. Hamının pal-paltarı islanıb bədəninə yapışardı, otaqlarından tər iyi gələrdi və Zaur səbirsizliklə məclisin qurtarmasını, qonaqların dağılışmasını gözlərdi. İndi isə sabahkı gün haqqında xoş bir intizarla düşünürdü. Ona qiymətli bir hədiyyə bəxş edəcək gün kimi... Gözlənilməz sevinclərlə dolu olan bir gün kimi... Uşaqlıqdakı kimi...

***

Ad günü deyil, ad gününün axşamı zəng elədi... Daha doğrusu, gecəsi. Gecə yarını keçmişdi və təqvimdə, doğrudan da, sentyabrın 23-ü idi – Zaurun ad günü. Zaur yatağına girmişdisə də, hələ yatmamışdı. Evin hər yerində işıq sönməyincə və bütün səslər kəsilməyincə yuxulaya bilmirdi. Atası həmişə erkən yatar, səhər də ertədən durardı. Anası isə Bakının televiziya verilişləri qurtaran kimi gedərdi yatmağa... Bu gecə də atası çoxdan yuxulamışdı, amma anası hələ oyaq idi. Qonşu Sitarəylə birlikdə mətbəxdə əlləşirdi, sabahkı qonaqlığın hazırlığını görürdülər. Mətbəxdən şirni və ədviyyat qoxusu gəlirdi – paxlava, şəkərbura, şəkərçörəyi... Cürbəcür piroqlar, pirojnalar, tortlar hazırlamaq sarıdan Zivər xanımın tayı-bərabəri yox idi. Amma sabahkı gün öz adi məharətini də vurub keçməliydi, – axı, onun məclisinə Alya kimi tələbkar bir hakim qiymət verəcəkdi. Mətbəxdən anasıyla Sitarənin yavaş səsləri gəlirdi, professorun və Zaurun yuxusuna mane olmamaqçün qadınlar xısın-xısın danışırdılar. Zaur onların hər kəlməsini dəqiq eşitməsə də, söhbətlərinin məzmunundan agah idi: qadınlar xəmirin yaxşı qalxmasından, layların nazik yoğrulmasından, qoz-fındığın narın əzilib şəkərlə qarışdırılmasından, paxlavaya vurulacaq ədviyyatın miqdarından danışırdılar. Sabahkı məclisdən, qonaqlardan danışırdılar – kim paxlavanı, şəkərburanı daha çox sevir, kimin hansı tortdan, hansı piroqdan, hansı pirojnadan daha çox xoşu gəlir, hansı ki-

şi dəlisidir şirniyyatın, hansı qadına heç bir şey bəyəndirmək olmur, halbuki keçən səfər öz evlərində aşının qazmağı yanıb kösöy olmuşdu... Olanda olur da, ay Zivər bacı, işdi, düşməknəndi də. Orası da elədir e, ay Sitarə, doğrudan, böyük məclis yola salmaq zor işdir, adamın lap kələyi kəsilir, əldən düşürsən, amma bir yana baxanda bircə balavın məclisində də qoluvu çırmalamayıb zəhmət çəkməsən, bəs nə vaxt çəkəcəksən... Əlbəttə, ay Zivər bacı, maşallah, Allah saxlasın, belə oğul böyütmüsən, indi gərək hər əziyyətinə də dözəsən. Bəs necə, ay Sitarə, onun boyuna qurban olum, qızıldır onun xasiyyəti, ipək kimi yumşaqdır, ürəyi də elə təmizdir, elə təmizdir, sanasan şüşədir, odur ki, xətərəliyəm də, ay Sitarə, bu cür ki təmiz uşaqdır, ürəyi şüşə kimi safdır, hər şeyə, hər sözə, hamıya inanandır, elə qorxuram ki, keçsin bir afətin cənginə, sap kimi dolasın barmağına balamı. Eh, ay Zivər bacı, ağzıvı xeyirliyə aç, dünya bəgəm dərəbəylikdir-zaddır, nə danışırsan, Zaur elə aciz-avara deyil, demə, maşallah ağıllı-mərifətli oğlandır, hər şeyin yerin biləndir, ürəyinə-zada salma, sən allah, vaxsey, vaxsey, piroq yandı, başımız söhbətə qarışdı...

...Və bu vaxt telefon zəng çaldı. Zaur yerindən sıçradı, – bu vaxt ancaq ona zəng eləyə bilərdilər: kim ola? Dəstəyi qaldırdı:

– Allo!

Dəstəyə qarmaqarışıq səslər doldu, – açıq havadan zəng olunmuşdu – küçəydimi, meydandımı – müxtəlif hənirtilər gəlirdi, sonra bu hənirtilərin içindən uzaq bir səs duruldu, aydın eşidildi, Zaur dərhal bu səsi tanıdı.

– Mənəm, Zaurik, – dedi Təhminə. – Bağışla ki, belə gec zəng eləyirəm... Danışa bilirsən?

– Əlbəttə.

– Bütün günü sənə zəng eləmək istəyirdim, amma başım elə qarışdı ki, macal tapa bilmədim... – Səs arada kəsilirdi, xətlərin, cihazların xırıltısına qarışıb itirdi, amma Zaur hər halda Təhminənin dediklərini dəqiq qavrayırdı.

– Sənə aeroportdan zəng vururam. Yarım saatdan sonra uçuram.

Zaur susub dinləyirdi, nəinki cavab vermirdi, heç “hə”, “yox” da demirdi. Təhminə təəccüblə:

– Eşidirsən məni, Zaur? – deyə xəbər aldı. – Hə, eşidirsən?

– Eşidirəm...

– Səni təbrik eləyirəm... Yadımdadır, axı, – bu gün ad günündür. Sənə hədiyyə də almışam. Sabah sənə çatdıracaqlar, – tələsə-tələsə

danışırdı, elə bil qorxurdu ki, birdən telefon əlaqəsi qırılar və demək istədiyi əsas şeyi deyə bilməz, – balaca bir şeydir hədiyyəm, amma həmişə sənin yanında olacaq ki, məni həmişə yada salasan... Sabah sənə çatdıracaqlar... Mədinə, qonşum gətirəcək... işivə.

Zaur:

– Təşəkkür edirəm, – dedi. – Yaxşı, soruşmaq ayıb olmasın, hara uçursan belə, nə münasibətlə? – Hiss elədi ki, mətbəxdə susdular, yəqin onun danışığına qulaq verirdilər. Təhminə sevinclə:

– Moskvaya, – dedi. – Moskvadan sabah bizim verilişimiz var. Proqramı mən aparacağam. Baxarsan. – Sonra tələsik əlavə etdi. – Yaxşı, Zaurik, hələlik, mənə əl eləyirlər ordan, təyyarəyə minik başlayıb...

Aeroport Zaurun gözləri qarşısında canlandı: gecəyə qərq olmuş uçuş meydanı, rəngbərəng siqnal işıqları, qapısı açıq təyyarə, trap və trapda Təhminənin təzə dostları – televiziya işçiləri, qapının ağzında kiçik, cib fənərini yandırıb biletləri yoxlayan stüardessa. Bir azdan Təhminə də trapla dırmaşacaq, sonra təyyarənin qapıları kip bağlanacaq, propellər hərlənəcək, təyyarə yerlə bir az qaçıb havaya yüksələcək. Bir dəstə televiziya işçiləri deyib-güləcək, zarafatlaşacaq, sabahkı verilişlərindən, ümumi işlərindən danışacaqlar.

...Və Təhminə də onların içində olacaq. O köhnə dostu – televiziya rejissoru, nədir onun adı, Muxtardır, nədir, – o da yəqin oradadır, Moskvaya gedir o da... Bəlkə trapdan əl eləyən, Təhminəni çağıran da elə odur. Ya bəlkə indi lap Təhminənin yanındadır, telefonun böyründə, Təhminənin Zaurla söhbətini dinləyir. Mətbəxdən anasıyla Sitarə Zaurun söhbətini dinləyən kimi...

Təhminənin bu gecə zəngi Zaurun ürəyini müxtəlif qatmaqarışıq hisslərlə doldurmuşdu, – açıq təyyarə meydanının nəfəs genişliyi, təyyarənin qalxacağı göylərin ulduzlu qaranlığı vardı bu telefon zəngində. Təhminənin səsi, nəvazişi, ona – Zaura diqqəti vardı... Amma bir də Zaura yabançı olan özgə sevinci vardı, uzaq səfər fərəhi – başqa həyat, yeni tanışlıqlar, münasibətlər kələfi vardı və bütün bunlar Təhminənin yeni işi, yeni həyatı idi. – Zaurun gözündən iraq, ömründən uzaq olan yad bir dünyadan gəlirdi bu soraqlar...

– Salamat qal, Zaurik, bol-bol səadət arzulayıram sənə...

– Sənə də yaxşı yol, – dedi. Zaur. – Neçə vaxta gedirsən?

– Üç günlüyə, – dedi, sükut çökdü, görünür, bu sükut ərzində götür-qoy edirmiş: desin, deməsin, nəhayət, qərara gəlib yavaş səslə

(doğrudanmı görəsən yanında kimsə vardı, ona görə yavaşdan dedi bunu) – pıçıltıyla əlavə etdi: – Sən də uç gəl Moskvaya, Zaurik... Yaxşı, mən qaçdım, hələlik...

Sonra dəstəkdən kəsik-kəsik siqnallar eşidildi. Zaur Təhminənin son təklifi barəsində düşünürdü: doğrudanmı Təhminə bu sözləri dedi – son görüşlərində “daha ayrılmalıyıq” qərarını verəndən sonra, onların idarəsindən, Dadaşın ləng işləyən şöbəsindən çıxıb hay-küylü, əsəbi, daim hərəkətdə və tələsmədə olan televiziya dünyasına düşəndən sonra, təzə dostları-tanışlarıyla bir yerdə Moskvaya uçarkən, məhz ona, Zaura təklif elədi ki, dalınca gəlsin... Yox Zaur yanılmırdı, elə-beləcə demişdi Təhminə:

– Zaurik, uç gəl Moskvaya...

– Kim idi o? – mətbəxdən anasının səsi gəldi.

– Heç, – dedi. – Bir tanışım idi.

## Beşinci fəsil

*Degildim mən sənə mail, sən etdin əqlimi zail.*
*Mənə tən eyləyən qafil səni görcək utanmazmı?*

Zaurun təqribi hesablamalarına görə Bakıda, Azərbaycan Respublikasının başqa şəhər, kənd, şəhər və kəndtipli qəsəbələrində onların yetmiş yeddi nəfər qohumu vardı. Atasının və anasının hesablamaları etibarlı deyildi. Keflərinin kök vaxtlarında bir-birilərinin qohum-əqrəbasını saymağa başlayanda atası ortalığa bir rəqəm çıxarırdı, anası ayrı. Anasının hesablamalarına görə atasının qohumu daha çox idi, atasının hesablamalarına görə əksinə. Anası: “Bibim nəvəsinin ögey əmisi oğlu haradan mənim qohumum oldu ki...” – deyərdi, amma özü Məcidin dayısı qızının baldızı oğlunu ərinə yaxın qohum sayardı. “Hər halda ali məktəbə girəndə sənin yanına gəlmişdi ki, yaxın qohumusan, sən də ona kömək elədin... Doğrudur, işi düzələndən sonra bir də üzünü görmədik, amma hər halda..”.

Əslində, ata və ana qohumlarından başqa bir də vardı, Məcid demiş, “sezon qohumları”. Məlum deyildi ki, onlar kimin tərəfindən hardan qohum idilər, amma elə ki, imtahan mövsümü başlanırdı, bu haradansa peyda olmuş “sezon qohumları” qapılarını kəsdirirdilər. Nizamidən, Firdovsidən, Sədidən tutarlı misallar gətirib isbat edirdilər ki,

qohum-əqrəba dar gündə gərək olar va əgər Məcid uşağa kömək eləməsə, deməli, böyük şairlərin hikmətli kəlamlarının bir qəpiklik mənası yoxmuş... Adətən bu müdrik beytlər Məcidgilin evlərində yay aylarında, sınaq imtahanları dövründə daha çox səslənirdi, amma başqa mövsümlərdə də cürbəcür qohumların cürbəcür xahişlərindən, təvəqqələrindən asudə deyildi Məcidin başı... Məcid ürəyiyumşaq adam idi, əlindən gələn yaxşılığı qohumlarından da, qohumu olmayan, tanıyıb-tanımadığı adamlardan da əsirgəməzdi və heç bir vaxt da elədikləri yaxşılıqların müqabilində heç bir şey gözləməzdi, heç quru "sağ ol"un da təmənnasında deyildi. Amma hərdən-birdən, görürsən düşürdü belə bir iş ki, yaxşılıq elədiyi adam, dar günündə qolundan tutduğu şəxs məqsədinə çatan kimi birdəfəlik yox olurdu, ilim-ilim itirdi, nə izi, nə tozu qalırdı, belə məqamlarda Məcid də görürsən, hərdən segah üstündə dodaqaltı zümzümə edərdi: "Bağda ərik var idi, salam-məlik var idi, bağdan ərik qurtardı, salam-məlik qurtardı".

Bu, atasının əzbər bildiyi yeganə şeir misralarıydı və yeganə musiqi motivi idi, professor bunu, özfəaliyyət iştirakçıları kimi, özü özüyçün, öz dilxoşluğu üçün oxuyurdu. Amma, hər halda bu müvəqqəti üzə çıxıb birdən-birə də qeyb olan təmannalı qohumlardan savayı əsil yaxın qohumları da vardı və bu qohumlarla daimi sıx əlaqə saxlayırdılar. Belə yaxın qohumlar Zivər xanımın bacıları, xalası və xalası qızlarından ibarət idi və bir də Məcidin, Bakıda yaşayan yeganə yaxın qohumu – məşhur cərrah, professor Bəhram Zeynallı. Şübhəsiz, Bəhram Zeynallının ailəsi – arvadı Rüxsarə xanım, oğlu Rasim də yaxın qohumlardan sayılırdı, amma Bəhramın davada həlak olmuş qardaşının oğlu Qiyasla gediş-gəlişləri yox idi... Məcid bilirdi ki, Qiyas Dilarə adlı bir qızla evlənib, bir oğulları var, amma nə özü, nə də Zivərlə Zaur Qiyasın ailəsiylə heç tanış da deyildilər. Ömürlərində bir-birilərinin qapısını açmamışdılar, deyəsən Qiyasın əmisi Bəhramla gediş-gəlişləri vardı, amma Məcidgil Bəhramgildə tez-tez qonaq olsalar da, bir dəfə də onlarda Qiyasgilə rast gəlməmişdilər... Adətən Bəhramgillə, başqa qohumlarla görüşləri də müəyyən hadisədən-hadisəyə, tarixdən-tarixə olardı – ad günlərində, toy-nişanda, ya, Allah eləməsin, hüzr məclislərində... Bu gün – Zaurun ad gününə də beş-altı nəfər qohum gəlmişdi – Zivərin iki bacısı, bir xalası qızı, (o biri xalası qızı gəlməmişdi, xalası xəstəydi, qızı da onun keşiyini çəkirdi), Bəhram Zeynallı arvadı Rüxsarə xanımla, (onlar da oğulları Rasimsiz gəlmişdilər...) Məcidin iş yerindən də iki nəfər gəlmişdi və o cümlədən atası-

nın kafedrasında assistent olan Şahin. Şahin Zaurla həmyaş idi və onların ailələri üçün əvəzsiz bir adam idi – nə lazım olsaydı yerin deşiyindən tapardı. – Bax, elə bugünkü məclisçün bütün gərək olan sursatı – sədri düyüsündən, təzə balıqdan, kürüdən tutmuş hər cür xırım-xırdayacan – nə bilim borcomdu, yaşıl noxuddu, mayonezdi-filandı – hamısını Şahin "təşkil eləmişdi"... Qonşularla elə mehribançılıqları yox idi, qonşulardan bircə Murtuzovgil idi qonaqları – Murtuz özü – istefaya çıxmış polkovnik Murtuz Murtuzov bütün orden, medallarını taxmışdı, – arvadı Alya və qızları Firəngiz. "Qızlarını bizimkilərə – qohumlarımıza göstərməyə gətiriblər" – deyə düşünmüşdü Zaur. Amma məsələ ondadır ki, Murtuzovlarla bir yerdə Zaurun tanımadığı başqa bir ər-arvad da gəlmişdi, necə deyərlər, çağırılmamış qonaqlar. Alya xanım izahmı eləyirdi, üzrmü istəyirdi, hər halda qeyri-müəyyən bir tonla:

– Tahirəylə Cabbar da gəlib çıxdılar bizə, dartdım onları da gətirdim, – dedi.

Tahirə Alyanın ortancıl bacısı idi. Çünki kiçik bacısı da vardı – Sürəyya, Nemətin arvadı. Nemət tərcüməçi idi. Zaurla bir nəşriyyatda işləyirdi və Zaur onu son dərəcə duzsuz-dadsız bir adam hesab eləyirdi.

Amma Cabbarla Tahirəni Zaur birinci dəfə görürdü.

Tahirə də Zivər xanıma:

– Sən allah, bağışlayın,– dedi. – Alya qır-qıc oldu ki, gərək siz də gedəsiz, heç bilmirdim ki, Zaurun ad günüdür bu gün... hədiyyə bizim boynumuza. – Guya Tahirə üzrxahlıq eləyirdi, amma bu sözləri elə böyük bir təşəxxüslə deyirdi ki, onların mənası tamam başqa cür çıxırdı: yəni sizin minnətiniz olsun ki, biz təşrif gətirib sizə qonaq gəlmişik.

Zivər xanım:

– Eyib deyilmi, nə danışırsız, öz evinizdir, xoş gəlmisiniz, – deyirdi.

Amma Zaur ona da fikir verdi ki, anası da tələffüz elədiyi sözlərə tamam başqa məna verdi. Anası da hiss eləmişdi Tahirənin forsunu, özündən müştəbehliyini və imkan tapan kimi onu yerində otuzdurasıydı...

Zaur bunu da başa düşürdü ki, qonşuların bu nümayəndə heyəti yalnız. Firəngizi göstərməkçün gəlməyib, həm də Zaura baxmağa gəlib. Daha doğrusu, yalnız tək bir Zaura yox, oğlanın ailəsinə, qohum-əqrəbasına, evlərinə-eşiklərinə, dolanacaqlarına və davranışlarına, bir söz, "bizim Firoçkanın" düşə biləcəyi mühitə... Tahirə, görünür, Alyanın yalnız bacısı deyildi, həm də ən yaxın məsləhət-məşvərətçisi idi, odur ki, onun rəyi, fikri, təəssüratı vacib idi... Zaur, içində bütün bu bayağı oyuncaqlara nəinki gülürdü, müəyyən ikrah hissi də duyurdu,

amma bu duyğularını ört-basdır etmək, üzə çıxarmamaq, hamıya xoş sifət göstərmək, mehribanlıq eləmək istəyirdi. Özü də bu halına təəccüb qalmışdı. Adətən bu sayaq münasibətlər, ümumiyyətlə, ad gününün saxta şadyanalığı onu əsəbiləşdirərdi. Zaur bu günün tez qurtarıb getməsini arzulayırdı. Amma bu gün səhərdən bəri bütün içini doldurmuş ilıq, xoş bir duyğu, elə bil onun bütün insanlara münasibətini də mülayimləşdirmişdi: heç kəs onu əsəbiləşdirmirdi...

Dəqiqəbaşı əlini cibinə atır, "Ronson" alışqanını çıxarıb odlayırdı və ona elə gəlirdi ki, onun sevincinə, fərəhinə hamı şərikdir. Bu alışqanı bu gün işə Təhminənin qonşusu Mədinə gətirmişdi. Təhminənin dünən dediyi hədiyyəsiydi bu "Ronson" alışqanı, bir dəstə gül və üstündə təbrik sözləri yazılmış kağız... Zaur elə bil qəribə yuxu içində idi və ona müraciətlə deyilən sözləri də əməlli-başlı eşitmirdi, nəzakətsiz görünməmək üçün arabir "bəli, əlbəttə", yaxud "xeyr" deyirdi, amma özü də bilmirdi ki, "bəli-xeyri" yerində deyir, ya yox. Tahirənin əri Cabbar da nə barədəsə onunla qızğın söhbətə girişmişdi. Zaur da onu dinləməyərək hey başını yelləyir, "bəli, bəli, əlbəttə" deyirdi, amma özü də bilmirdi ki, nəylə razılaşır, nəyi belə qeydsiz-şərtsiz qəbul edir... Arabir diqqətini toplayıb Cabbarın fikrini almaq, nədən danışdığını təyin eləmək istəyirdi. Cabbar yanında oturmuşdu, amma elə bil səsi hardansa, çox uzaqlardan gəlirdi:

– Başa düşürəm, atanızın işlədiyi institutda müdafiə eləmək yaxşı düşməz, söz-söhbət ola bilər. Amma istəsəz, mən danışaram, bizim institutda müdafiə edərsiz.

Zaur: "bəli, bəli, əlbəttə" deyirdi, özü də bilmirdi ki, Cabbar dəqiq surətdə ona nə təklif edir. Cabbarın səsinə başqa səslər – atası Məcidin, anasının, xalalarının, Murtuzun, Alyanın, Bəhram əminin, Tahirənin, Rüxsarə xanımın, Şahinin səsləri də qarışırdı... Bircə Firəngizin səsi gəlmirdi... Firəngizin yanaqları qıpqırmızı alışıb yanırdı. Zaur fikirləşirdi ki, doğrudan da, çox gözəl qızdır Firəngiz və elə bil onun susub dinməməyini qavrayır, sükutunu eşidirdi. Firəngizin sükutu yəqin ki, Zaur haqqında, onunla quracağı gələcək xoşbəxt ailə həyatı haqqında təsəvvürlərlə dolu idi – ola bilməz ki, bütün bu xəyalları Alya xanım yavaş-yavaş, altdan-altdan qızına təlqin eləməsin. Səslər bir-birinə qarışırdı, amma ayrı-ayrı cümlələrə diqqət etsən, kimin nə danışdığını təyin etmək olardı.

– Əşi, mənim ştabımda idi, əlaltım idi, şunu götür, şunu qoy, indi bir gör nə ağız bəhəm eləyib, küçədə görəndə adam-zad tanımır. – Murtuz deyirdi bunu...

– Keçən il Londondan qayıdanda Varşava qəbul eləmədi, Praqaya uçmalı olduq, mən idim, professor Speranski idi. – Bəhram Zeynallı deyirdi bunu...

– Apardı məni sklada, mama, dedi, seç hansın bəyənirsən, vallah, Rüxsarə xanım, nə gizlədim, gözüm dörd oldu, day könlün nə istəyir – nə rəng, nə fason, nə biçimdə – hamısı var. – Alya deyirdi bunu. Həmişəki kimi oğlu Spartakın şücaətindən basıb-kəsirdi. Spartak haçansa onu cürbəcür qıt mallarla ağzınacan dolu olan qeyri-adi anbara aparıbmış, – bu əhvalatı Alya xanım azı bir on dəfə danışıb Zivər xanıma və Zivər xanım da azı bir yeddi dəfə Zaura. Spartak Alya xanımın sevimli mövzusu idi, amma yeganə mövzusu deyildi. Spartak mövzusundan başqa iki daimi mövzusu da var idi – əri Murtuzun xidməti və qızı Firəngizin isməti...

– Lazım gəlsə mən elmi katiblə də danışa bilərəm, mənim xətrimi çox istəyir, təşkil edərik sizi də müdafiəyə buraxarlar. – Bunu Cabbar deyirdi və Zaur da:

– Bəli, bəli, əlbəttə, – deyirdi ona.

Zivər xanım mətbəxdən otağa gəldi:

– Ay Zaur, – dedi, – qonaqlarımız darıxmır ki, bəlkə televizoru qurasan...

Zaur televizoru qurdu və bir azdan sonra qonaqların canlı səslərinə televizorun səsi də əlavə olundu. İdman şərhçisi:

– Voleybolçu qızlarımız inadla mübarizə aparıb layiqli qələbə qazandılar, – deyirdi...

Bəhram Zeynallı:

– Praqada da mühazirə oxumalı oldum, – deyirdi.

Murtuz Murtuzov:

– O gün axır yaxaladım küçədə, – deyirdi.

Alya xanım anbardakı dublyonkalardan, Rüxsarə xanım komisyondakı servizdən, Tahirə yayda dincəldikləri kurortdan danışırdı. Cabbar:

– İstəyirsiz, lap rektorun özüylə danışaram, – deyirdi. – Məncə etiraz eləməz...

– Praqadan daha qatarla gələsi oldum. Speranskiylə bir kupeyə düşmüşdük...

– Yapışdım yaxasından, adə, qırışmal, məni tanımırsan sən?

– Day bir şey götürmədim, bax, bu paltarı, Firoçkayçün fransızski sapojki, iki dənə yorğan örtüyü – Firoçkanın cehizliyi, bir də bir-iki

xırda-xuruş. Spartak deyir, mama, dünyanın axırı ha deyil, haçan kefin istəsə yenə gətirərəm səni bura...

– İstəyirəm alım o servizi, bizim bir dostumuz var – Şamxal, müstəntiqdir, onun arvadı Tamaranın ad günüdür, ona hədiyyə aparmaq istəyirəm...

– Mən Krımda da olmuşam, Soçidə də... amma bura başqa aləmdir... Qum mirvari kimi, dəniz tərtəmiz, korpuslar elə rahat, elə səliqəlidir ki...

– Kişi voleybolçular isə bu mövsümdə hələ ki, müvəffəqiyyət qazana bilməyiblər...

– Rektor nə deyəcək ki?.. Bizim institutda, hətta, Tiflisdən, Yerevandan gəlib müdafiə edirlər...

– Buyurun, stolun başına keçin!

– Şahin, zəhmət olmasa, badələri doldur.

– Bəs, Spartak niyə gəlməyib?

– Allah bilir haradadır indi...

– Yaxşı, tamadamız kim olacaq?

– Murtuz Balayeviç, polkovnik Murtuzov...

– Xeyr, heç elə söhbət yoxdur, professor, professor yaxşıdır...

– Hansı professor, professor burda ikidi.

– Zeynallı...

– Zeynallı da ikidir.

– Yox, əlbəttə, professor Bəhram Zeynallı, Məcid day ev yiyəsidir, ev yiyəsindən tamada olmaz ki...

– Çox sağ olun, Zivər bacı, deməli, mən ev yiyəsi deyiləm, mən özgəyəm?

– Yox, ay Bəhram qardaş, siz də ev yiyəsisiniz, əlbəttə, öz evinizdir bura, elə ona görə də xahiş edirik ki, Zaurçikin məclisini siz aparasınız da.

– Yox, Murtuz yaxşıdır, – dedi Bəhram.

– Heç elə söhbət yoxdur, əsil tamada Bəhram müəllimdir, – dedi Murtuz.

– Onda içək Bəhramın sağlığına, – dedi Məcid.

– Yox, madam ki, mənim boynuma qoyduz tamadalığı, sözümə qulaq asın. Zaurun sağlığına içək, – dedi Bəhram.

– Sağ ol, Zaur, – dedi Şahin.

– Sağ ol, bala, – dedi Zivər.

– Sağ ol, – dedi Məcid.

– Sağ olun, Zaur, – dedilər. Rüxsarə xanım, Alya xanım, Tahirə xanım... Firəngiz heç nə demədi...

– Sizin sağlığınıza, Zaur, – dedi Cabbar.

– Dobrıy veçer, doroqie telezriteli, – dedi Təhminə.

Zaur diksinib televizora tərəf çevrildi... Hamı qədəhlərini Zaura tərəf uzatmışdı, hamı qədəhlərini bir-birinə vururdu "sağ olun, sağ olun" deyib içirdi. Zaur isə elə bil bütün məclisi duman içində görürdü və bu dumanın içində bircə sifət durulub aydın seçilirdi – Təhminənin sifəti, bu hay-küydə bircə səs aydın eşidilirdi – Təhminənin səsi:

– Mı naçinaem proqrammu azerbaydcanskoqo televideniya. Mı privezli vam iz naşeqo solneçnoqo Baku...

Zaur artıq sözlərin də fərqinə varmırdı. Təhminənin nə danışdığını da əməlli-başlı qavramırdı, yalnız səsinin ahəngini dinləyir və dodaqlarına qonmuş xəfif təbəssümü görürdü... Təhminə otaqdakıların da diqqətini çəkmişdi:

– Buna baxın, Moskvadan verirlər, bizim Bakı verilişidir.

– Hə qəzetdə yazmışdılar da...

– Bu kimdir, təzə diktordur?

– Hə də, nədi onun adı?

Alya xanım quru bir tərzdə:

– Təhminə, – dedi, – indi də diktor olub...

Murtuz:

– Bu ki, həmin o arvaddır, bizim...

– Hə, hə, – deyə Alya ərinin sözünü kəsdi və Zaur bilirdi ki, kəsməsəydi Murtuz Balayeviç Spartakın adını çəkəcəkdi.

Təhminə danışırdı, gülümsünürdü, milyon-milyon tamaşaçıya gülümsünürdü, tək bircə Zaura gülümsündüyü kimi, plyajda, maşının içində, Murtuzovların bağlarında gülümsündüyü kimi...

Otaqda isə hamı bir ağızdan Təhminənin geyimini, sir-sifətini, durub-oturmasını, bütün həyatını müzakirə edirdi. Kişilər dodaqaltı qımışırdılar, qadınlar paltarına, saçının burumuna ağız büzürdülər, bir-birilərinin qulaqlarına əyilib nə isə pıçıldaşırdılar və yeni məlumat almış hər adam "vay, vay, vay" deyə məzəmmətlə başını bulayırdı... Kimsə dedi ki, Təhminənin əri Manafı tanıyır, əməlli-başlı abırlı adamdır yazıq, indi başına nə kül töksün ki, bütün şəhərdə biabır olub. Kimsə cavab verdi ki, qadam onun ağzına, o da adını kişi qoyub, başına papaq geyir... Kimsə dedi ki, Təhminə elə bəzənib-düzənib, elə bil bayram xonçasıdır... Kimsə dedi ki, bəs görəsən adamı televizornan

milyon adamın qabağına çıxardanda bir maraqlanmırlar tərcümeyi-halıynan, kimdir, nəçidir, nə yuvanın quşudur... Bu vaxt qapılarının zəngi çalındı. Şahin gedib açdı, Spartak içəri girdi, salamsız-kalamsız anasına:

– Qapını bağlayıb getmisiz, mənim açarım səndədir axı, – dedi. Alya xanımın tənbehindən sonra ("Zaurun yaşıdır, niyə təbrik eləmirsən") çevrilib Zaura baxdı, Zaurun əlindəki “Ronson"a xüsusi bir diqqətlə nəzər saldı, mənalı-mənalı gülümsündü və hamının televizora tamaşa elədiyini görüb Spartak da ekrana tərəf çevrildi:

– Oho, – dedi, – əhsən, Taxmuşa...

Sonra Spartak çıxıb getdi. Təhminə də ekranda yerini ifaçılara verdi, mahnılar səsləndi və qonaqlar konserti dinləyə-dinləyə oxuyanlar, çalanlar barədə danışmağa başladılar... Filan xanəndə Parisdən nə gətirib, filan bəstəkar ayda nə qədər qazanır, filan rəqqasənin neçə yaşı olar...

Tahirə deyirdi ki, Emin Sabitoğlunun mahnılarını sevir, Caboş deyirdi ki, Zaur mütləq onların institutunda müdafiə eləməlidir. Murtuz deyirdi ki, bütün bu xanəndələr, oxuyanlar müftəxordurlar, ortada yeyib qıraqda gəzməyi sevirlər, dava vaxtı çoxusu ön cəbhəyə getməkdən canını qurtarırdı, amma ad almaq-filan gələndə özlərini birinci qabağa dürtürdülər... Bəhram deyirdi ki, indiki oxuyanlar dava vaxtı çoxusu heç anadan olmamışdı, olanları da südəmər uşaqlar idi.

Tahirə dedi ki, Polad Bülbüloğlunun mahnılarından da çox xoşu gəlir. Rüxsarə xanım dedi ki, paxlavaya söz ola bilməz, bilmirəm niyə gizlədir Zivər xanım bunun sirrini bizdən. Alya dedi ki, gərək bir xəlvət gəlib göz qoyam, öyrənəm Zivər xanımın sirrini. Zivər xanım da güldü, dedi peşkəşdir sizə bütün reseptlər. Murtuz Balayeviç də dedi ki, hə, nədi bu oxuyan gədə, bir belə saçın uzadıb qız kimi, bu moddu, nədi yəni belə?! Cabbar dedi ki, yüz faiz arxayın olun, mən bu müdafiə məsələsini boynuma götürürəm və Təhminə dedi:

– Naşa peredaça okonçena. Do novıx vstreç. – Bir an duruxdu və əlavə etdi: – Mne xoçetsya pozdravit tex telezriteley, u kotorıx seqodnya den rojdeniya.

Zaur bir an donub qaldı və nədənsə dərhal anasına baxdı. Anası da cəld ona baxdı və Zaur başa düşdü ki, anasıyla Zaurdan başqa bu otaqda heç kəs Təhminənin son cümləsinin fərqinə varmamışdı. Bircə anası bunun kimə aid olduğunu başa düşmüşdü və Zaur bir buna görə anasını bağrına basıb öpmək istəyirdi...

...Üç-dörd qədəh içmişdi Zaur, beyni dumanlanmışdı, ya nəydi, amma birdən ona elə gəldi ki, Təhminəni sevir, heç kəsi heç vaxt sevmədiyi və sevməyəcəyi kimi sevir.

Cabbar:

– Günü sabah elmi katiblə danışaram, – dedi...

***

Bütün gecəni gözünü qırpmadı Zaur. Səhər işə də hamıdan ertə gəldi. Mühasib Səfdər kişi gəlib çıxanacan özünə yer tapa bilmirdi.

– Səfdər dayı, bu gün maaş verəcəksən?

– Bəs necə? Günün ikinci yarısında...

– Bayramlarda növbətçi olmuşam, üç gün otqulum var, götürə bilərəm?

– Gərək direktor müaviniylə danışasan bu barədə.

Direktorun müaviniylə danışdı. Müavin təəccübləndi, amma Zaurun ərizəsinə dərkənar qoydu. Saat ikidə Zaur cədvələ qol çəkib, 52 manat 30 qəpiyini aldı. İndi cibində 95 manatı vardı. Gedib aeroflotun kassasından gündüz reysinə bilet aldı, sonra poçta girib teleqram vurdu: Moskva, Sentralnoe televidenie, Taxmine Aliyevoy. Leçu k tebe v pryamom i perenosnom smısle slova. Zavtra budu v Moskve. Reys 852, seluyu, Zaur”.

***

– Mən bilirəm sən niyə Moskvaya gedirsən... Dünən sənə qaş-göz eləyirdi televizordan, elə bilirsən başa düşmədim... Heç hara getməyəcəksən... Yalan deyirsən, heç bir işin-filan, heç bir komandirovkanzad yoxdur... Guya bilmirəm, zəng eləyib idarədən soruşaram bu saat, görüm, nə təcili işdi belə səni əlimyandıda göndərirlər. Gördün, deməli yalan deyirsənmiş, heç eyib etməz, əlbət indi aton gəlib danışar səninlə. Necə, atovu da gözləməyəcəksən? Nə reys, nə bilet, a gədə, bu saat biletivi də götürüb cıraram, nə mənim başımı tovlayırsan a virananın balası, bu saat mən atova zəng eləyim. Necə, onsuz da gedəcəksən, deməli, vecinə deyil, atan da, anan da, deməli, o həyasız köpəkqızı səninçün atondan-anondan əziz olub. Budu bizim haqq-sayımız, bütün əzab-əziyyətlərimizin, çəkdiyimiz zəhmətin əvəzi budu verirsən bizə, deməli, anavın göz yaşı da səninçün bir qoz imiş, gör bir o çərhaya bunun başını neçə fırladıb, sən allah; çərhaya deyil nədir, çərhaya da deyərəm, ləçər də, ondan onqat betərini də, hələ sən məni

yaxşı tanımırsan, götürüb zəng eləyərəm onun o əri qurumsağa. Mənə yazığın gəlmir, barı xəstə atava yazığın gəlsin. Sənin heç insafın-mürüvvətin yox imiş, ə nə təhər adamsanmış sən. Yaxşı get, lütkomun biri lütkom, get görüm hansı pula gedirsən. Elə bilirsən elə əvvəlki kimi atan-anan cibinə xərclik qoyacaq, asta ye boğazında qalar, gedirsən elə get ki, bir də qayıtma, gözüm səni görməsin, naxələf övlad... Gedirsən, ay oğul, ay bala, gözümün işığı, anan ayağının altında ölsün. Necə yəni nigaran olma, axı ana ürəyidir, necə nigaran olmasın, bilmirəm hara gedirsən, kimin yanına, nə olsun ki, üç günə qayıdacaqsan?! Bu üç günə vacibdir o lotubeçənin yanına gedəsən?! Yaxşı, demirəm, demirəm onun haqqında pis söz, amma axı, görürəm axı, başını hərlədib sənin, dünya-aləm gözündə deyil sənin bu saat, mən bu dərdə necə dözüm, ilahi?! Gəlib mənim meyitimi görərsən, heç olmasa bu plaşı at çiynivə, şərfi dola boynuva, soyuqdur indi oralar yəqin?! Aman Allah, bu nə müsibət idi bizim başımıza gətirirsən. Öləydim bu günü görməyəydim, barı bir əlcə teleqram vur görüm necə gedib çatdın? Cadu eləyib sənə, Allaha and olsun cadu eləyib, görüm sənə cadu eləyənin əli-qolu qurusun, dili tutulsun. Görüm onu gözü ağlar qalsın, necə mənim gözüm ağlar qalır balamın dalınca. Dayan görüm, adə, qoy bir su atım barı dalınca... Allah, nə günahımız var ki, sən bizim başımıza belə müsibət açırsan, teleqramı yaddan çıxartma ha...

## Altıncı fəsil

*Canlar verib sənin kimi canana yetmişəm*
*Rəhm eylə kim, yetincə sənə cana yetmişəm.*

Naş samolet poşol na snijenie. Proşu vas zasteqnut remni i vozderjatsya ot kureniya.

Leysan yağışdan sonra Moskva səması tərtəmiz və açıq idi. Havada saflıq duyulurdu. Yağış elə bil dərbədər buludları süpürüb, göy üzünü tərtəmiz yuyub silmişdi və ətrafa çökmüş mavilik aerovağzalın şüşə qalereyasını da əhatə eləmişdi: şəffaf qalereyanın içində adamlar görünürdü – qarşılayanlar, yola salanlar; uçub gedənlər, uçub gəlmişlər... Təyyarədən düşüb qalereyanın içiylə gedən sərnişinlər içində Zaur da addımlayırdı və qalereyanın o biri başında, qarşılayanlar içində Təhminə dayanmışdı. Zaur onu lap uzaqdan gördü, əl elədi. Təhminə də Zauru gördü və ona tərəf atılmaq istədi, amma tünd-göy rəngli xidmət paltarı geymiş qız təbəssümlə onu saxladı – qarşılayanların

qalereyaya keçməyə ixtiyarı yox idi... Zaur bunu gördü, qaçdı Təhminəyə sarı, yeddi-səkkiz metrdən sonra Təhminə onun boynuna atıldı:

– Zaurik, – dedi, – nə yaxşı ki, gəldin...

Çox-çox illər sonra, qoca yaşlarında, hərdənbir ömrünün acı və xoş xatirələrini fikrində arıtlayanda, şadlıq və kədər günlərini yada salanda Zaur düşünürdü: əgər həyatı boyu bəxtiyar illəri, ayları, günləri, saatları, dəqiqələri olmuşdusa – xoşbəxt dəqiqələrinin ən xəşbəxti bax bu bir neçə an idi – Domodedova aeroportunun şəffaf qalereyasında – uzaqdan Təhminəni görəndə, ona tərəf qaçanda, Təhminəni qolları arasına alanda və Təhminə deyəndə:

– Zaurik, nə yaxşı ki, gəldin...

***

– Baqaj nədi, dəli olmusan?.. Elə-beləcə gəlmişəm. Gedək. Taksilər harda dayanır?

Təhminə:

– Yox, – dedi, – mən bura tez gəlmişəm, – sənin təyyarəni gözləyən vaxt buradakı meşədə gəzdim. Bilirsən nə gözəl meşədir... Gedək göstərim sənə...

Şosedən çıxıb şam meşəsinə girdilər. Zaur Təhminəni öpmək istədi, amma Təhminə barmağını dodaqlarına qoyub:

– Sss, dayan, bir qulaq as, – dedi...

İnanılası deyildi, amma Zaur həqiqətdə də eşitdi... Adamın ağlına sığışmırdı ki, burada, təyyarə uğultusundan qulaq batan müasir aerovağzalın yaxınlığında, üstündən vıyıltıyla elədən-belə maşınlar keçən şosenin lap böyründə – quşlar cəh-cəh vururdu, elə bil bütün bu hay-küyü vecinə almırdılar...

Zaur:

– Lap bülbül kimi cəh-cəh vururlar, – dedi.

– Doğrudan, adam heç inana bilmir, hə? Gül-bülbül, aşiq-məşuqə gülməlidir eləmi?.. Orta əsr qəzəllərindən çıxıb gəliblər elə bil... Amma Zaurik, bu ki, yalan deyil, əzizim, doğrudan da, elə bil bülbül oxuyur. Özü də zalım gör nə baş alıb gedib, gör necə cəh-cəh vurur... Bizimçün oxuyur, e, Zaur, eşidirsən.

Qollarını Zaurun boynuna doladı. – Qulaq as, Zaurik. – Təhminə indi pıçıltıyla danışırdı. – Gərək mən sənə bu sözü deməyəydim. Bilirəm bunu demək düz deyil, gərək deməyəm... amma... sevirəm səni, Zaurik... dəli kimi sevirəm... Sənsiz dura bilmirəm... Səndən başqa heç kəs lazım deyil mənə... bilirəm gərək deməyəydim bütün bunları sə-

nə... – güldü. – İndi quduracaqsan yəqin, dartıb özüvü qoyacaqsan dağ başına... amma neyləyim, demək istəyirdim bunları sənə...

Zaur da pıçıltıyla dedi:

– Təhminə, yəqin, mən də sənə deməməliyəm bu sözləri, amma mən də deyəcəyəm: ölürəm səninçün, Təhminə... Sənsiz bir saat, bir dəqiqə qala bilmirəm... Bax, indi bu saat yıxılıb ölə bilərəm xoşbəxtliyimdən. İstəyirsən çıxım şoseyə, özümü atım maşının altına, bax bu saat, bu dəqiqə...

– Dəli, maşının altına niyə atırsan özünü.

Onlar meşənin içiylə gəzirdilər və Zaur elə hey danışırdı. Təhminəni televizorda görməsindən, öz ad günündən, qonaqlardan, qonşulardan, hətta Firəngizi ona ərə vermək niyyətlərindən... Zaur indi yaşadıqları anların səadətiylə o dərəcədə sərxoş idi ki, bu xəbərin Təhminəni ağrıda biləcəyini heç ağlına da gətirmirdi: içi bəxtiyarlıqla limhəlim elə dolmuşdu ki, bu bəxtiyarlığın bütün ətrafdakılara da sirayət edəcəyinə, onları da xoşbəxtlik dəryasına qərq edəcəyinə şübhəsi yoxdu... Doğrudan da, bu xəbəri eşidəndə ani bir kölgə keçdi Təhminənin sifətindən, amma o dərhal gülümsündü və Zaurun Firəngizlə evlənməsini zarafata saldı.

Təhminə onu öpürdü. Moskvaya gəlmələrindən, verilişdən danışırdı, deyirdi ki, burada yaman bəyəniblər verilişi də, Təhminənin veriliş aparmasını da... Meşədən çıxıb şoseylə addımladılar. Moskvayacan piyada getmək istəyirdilər, – Moskvaya isə yetmiş kilometr qalırdı...

Zaur indi sevdiyinə də əmin idi, sevildiyinə də və sevgi onu elə qüvvətli bir xoşbəxtlik duyğusuna bürümüşdü ki, heç bir şey bu səadəti yaralaya bilməzdi və ona görə də Zaur Spartak söhbətini də eləbelə, sözarası saldı, dedi ki, bu qeybətlər neçə gün məni dəli-divanə eləmişdi... neçə gecə yuxumu qaçırmışdı.

Təhminə:

– Ay səfeh, gör bir kimə qısqanırsan, – dedi. – Adam da hər axmaq sözə, hər iyrənc qeybətə inanar?.. Spartak gicbəsərin biridir... heç ağlıva sığışdıra bilərsən ki, onunla mənim aramda bir şey ola bilər? Yəni heç məni tanımırsan? Ya onu tanımırsan bəlkə? Demişəm sənə ki məsələ necədir. Spartak mənim bir rəfiqəmlə görüşürdü və həmin o rəfiqəmin xahişi ilə bir-iki dəfə zəng eləmişəm Spartakgilə, bu, düzdür! Anası da yəqin sonra bilib ki, zəng eləyən mənəm... Amma mənimlə ömründə iki kəlmə kəsməyib anası, o da ki, qalsın davamız ola... Mən yəni o günə qalmışam ki, onun anasıyla ağız-bağıza verim?.. Əcəb fikirdəsənmiş mənim haqqımda.

Zaur indi, Spartak sarıdan tam bir arxayınçılıq duyarkən Dadaşın dediyi o televiziya rejissoru haqqında da soruşmaq istədi, heç olmasa bilsin görək o da burada Moskvadadırmı. Amma bunun nə mənası vardı, madam ki, Təhminə Zauru bura, yanına çağırmışdı və Zaur gəlmişdi, – onda deməli, həmin o rejisorun Moskvada olub-olmamağının Təhminəyçün heç bir təfavütü yox imiş... Yaxşı, bəs Dadaşın dediyi o baza müdirləri, alverçilər – Təhminənin tanış-bilişləri, o barədə necə, söz salsınmı? Amma Təhminə, sanki Zaurun fikirlərini oxuyubmuş kimi özü danışmağa başladı:

– Zaurik, – dedi, – bunu bil: mənim barəmdə çox şey danışırlar və bundan sonra, məhz bax elə sənə daha çox iftiralar uydurub deyəcəklər... Əgər ürəklərinə damsa ki, biz səninlə doğrudan-doğruya xoşbəxtik, bunu heç bir vaxt bağışlamayacaqlar bizə... Yüz çirkab tökəcəklər başımdan və çalışacaqlar ki, bunların hamısı sənin qulağına çatsın. Amma mən istəyirəm ki, sən bir neçə şeyi dəqiq biləsən, Zaur. Birincisi odur ki, mələkə-zad deyiləm, bu barədə heç bir illüziyan olmasın. Amma bu da həqitətdir ki, mən hələ heç kəsi səni sevən kimi sevməmişəm və indiyəcən hələ heç kəsə də deməmişəm ki, onu sevirəm... Bax ən böyük, ən əsas həqiqət budur... Zaurik, dünyada bir həqiqət, bircə həqiqət var – qəlbin həqiqəti və səadət, xoşbəxtlik də elə budur, vallah. Bax, bu axşam var dünyada, bu meşə var, quşlar oxuyurdu bu meşədə, sən varsan, mən varam, bir-birimizi sevirik, bir yerdə olanda bəxtiyar oluruq, – budur bax həqiqət və bundan başqa heç bir ayrı həqiqət yoxdur. Sən uçub Moskvaya gəlmisən, orada aerodromun qalereyasında uzaqdan səni görüb bilirsən necə sevindim! Bəs sən?..

– Mən də...

– Görürsən... Bax bu dəqiqələr var e, bu şoseylə Moskvaya gedirik ikimiz – sən və mən, – bəxtiyarlıq budur, Zaurik, həqiqət, ən böyük həqiqət də budur... Ayrı bir həqiqət arama bizim münasibətlərimizdə... Bir yerdə olduğumuz dəqiqələrin xoşbəxtliyi ilə yaşa... Budur əsil həqiqət...

...düz deyirmiş Təhminə...

***

Uzun zaman şoseylə piyada getdilər, sonra yoruldular, avtobusa mindilər, avtobus adamla dolu idi – balıq ovundan qayıdan tilovlu adamlar da çox idi avtobusun içində. Nogin meydanında düşdülər... Moskva çayının sahili ilə addımladılar...

Təhminə:

– Bu da mənim iqamətgahım, – dedi. "Rossiya" otelinin pəncərələrindən axşam işıqları şölələnirdi, çəhrayı pərdələr işıqları öz rənginə boyayırdı...

Frunze sahilinə çatdılar, damında aeroflotun reklamı yanan üçmərtəbəli evin həyətindən keçib Krım körpüsünə çıxdılar...

Onlar heç kəsin tanımadığı böyük və şən şəhərdə azadlıq, asudəlik duyğularında məst kimiydilər, qol-boyun olub halay-valay vura-vura gəzirdilər. Elə bil illərin yükünü də atmışdılar üstlərindən, – elə bil on altı-on yeddi, ən çoxu on səkkiz yaşındaydılar, tanımadıqları adamlarla salamlaşırdılar və bu adamlar da təəccüblə onlara cavab verirdi, gül alırdılar və cavan oğlanlarla qızlara bağışlayırdılar, telefon avtomatlara girib Bakı nömrələriylə Moskva abonentlərinə zəng vururdular və Dadaşın nömrəsinə cavab verən boğuq səsli kişidən Dadaşı xəbər alırdılar. Mübahisə edirdilər: eyni telefon nömrələrinin Bakıdakı və Moskvadakı sahiblərinin səsləri oxşayır bir-birinə, ya yox... Oteldəki liftlərin üstündə də mərc çəkirdilər. Hansı tez gələcək. Zaur ikinci, Təhminə üçüncü deyirdi. Üçüncü əvvəl gəldi və Zaur Təhminəyə bir manat uduzdu... Məlumat köşkünün qarşısında növbəyə durdular, növbələri çatanda soruşdular: "Moskvada xoşbəxt adamın ünvanını verə bilərsinizmi", məlumatçı qız mat-mat onlara baxırdı və hər ikisi "Soruşsalar, bizim ünvanımızı verin", – dedilər... Tirə girdilər... Zaur sərrast nişan atıb ətir uddu. Təhminəyə bağışladı. Təhminə dedi ki, mütləq bu ucuz ətiri də bahalı fransız ətirlərinin tərkibinə qatacaq, – onda qoxusunun sirri lap açılmaz olacaq – səadət qatılacaq bu qoxuya – deyirdi... Dondurma satan arvaddan dondurma alarkən ona Mixail Vasilyeviçdən çoxlu salam dedilər... Arvad gözünü döydü, hansı Mixail Vasilyeviç?.. Küçəni düz keçmədilər, milis saxladı onları, üç manat cərimə istədi. Zaur pulu uzadandan sonra milis qəbz verdi... Təəccüblə qəbzi aldılar, serjant Trofimovun imzasından, cərimənin səbəbindan və məbləğindən başqa orada bugünkü tarix də yazılmışdı – 25 sentyabr. Zaur qəbzi cırıb atmaq istəyirdi. Təhminə qoymadı, səliqəylə büküb çantasına atdı...

– Heç bunu cırmaq olar? – dedi. – Bu bizim ən xoşbəxt günümüzün qəbzidir. Serjant Trofimov özü təsdiq edib bu tarixi... Qoy yadigar qalsın... Dünyada yeganə təqsirimizin – Kutuzov prospektini düz keçməməyimizin şəhadəti kimi qalsın.

Zaur:

– Yaxşı, – dedi.

– Gedək mənim nömrəmə...

– Sənin nömrənə?

– Hə, mən təkəm nömrədə.

– Məni buraxarlar?

– Növbətçiylə danışmışam... Dost olmuşuq onunla, məni görübmüş televizorda...

Elə bil nə isə sancdı Zaurun ürəyində. Təhminənin belə asanlıqla növbətçiylə dil tapıb yad adamı nömrəsinə gətirməsi nə isə pis təsir bağışladı ona. Təhminə elə bil onun ürəyindəkiləri oxuyaraq.

– Amma, sən allah, yenə ilan-qurbağa gəlməsin fikrinə, – dedi: – İntəhası mən bu gün gündüz sənin teleqramını göstərdim növbətçiyə, hər şeyi olduğu kimi dedim və arvad məni başa düşdü.

***

– Dayan, elə yox, yavaş, dayan, özüm soyunum... İşığı keçir... Gəl bura... darıxmışam səninçün yaman... Canımsan mənim... Ay Allah, dəli olacağam mən... Zaurik, mənsiz necə dözürdün bu qədər vaxt... əzizim mənim, canım...

Gecənin ən gizlin, ən isti sözlərini deyirdi Təhminə, ən çılpaq sözlərini. Nömrədəki reproduktordan musiqi eşidilirdi. Qadın müğənni həzin və yorğun səslə kədərli bir mahnı oxuyurdu...

Sonra onlar sakit uzanıb siqaret çəkəndə Təhminə dedi:

– Bilirsən bu nə mahnı idi, Zaur?

– Yox.

– Qədim gürcü mahnısı.

Bütün bu gün və bu gecə ərzində ilk dəfə olaraq yavaşdan və qəmli-qəmli əlavə etdi:

– Mən olmayanda birdən bu mahnını eşitsən hər şey yadına düşəcək. Moskva, bu gecəmiz...

“Mən olmayanda”, – deyə Zaur onu yamsıladı. – Yenə başladın?

– Bilirsən, həyatdır, hər şey ola bilər. Sən başqa qadınlarla da ola bilərsən və lap yəqin olacaqsan da... Amma bu cür olmayacaq Zaur, heç kəslə olmayacaq bir də, mən bilirəm.. Ayrı cür ola bilər, bəlkə bundan da yaxşı, amma bu cür yox... Ola bilməz ki, hər şey bax beləcə təkrar olsun. Domodedovo meşəsindəki quşlar da, o küçədəki cərimə də, bu qədim gürcü mahnısı da... Bu bizimdir, ancaq bizim... Başqa heç kəsin... Onunçün də mən arxayınam...

...düz çıxdı Təhminənin sözləri...

***

Səhər saat 10-da Mayakovski metrosunun yanındakı yeraltı keçiddə Bakı təyyarəsinə bilet aldı... Aşağıda, perronda ayrıldılar. Təhminə telestudiyaya getdi, məşqi vardı...

– Axşam 9-da, Şabolovkada, televiziyanın qabağında gözlə məni, – dedi və uzaqlaşan qatarın pəncərəsindən Zaura əl elədi...

Zaur eskalatorla yuxarı qalxdı. Mayakovski meydanına çıxdı, Qorki küçəsiylə Baş Teleqrafa tərəf addımladı... Dünəndən bəri heç nə yeməmişdi, yatmamışdı, amma nə yorğunluq hiss eləyirdi, nə yuxusuzluq... Qısamüddətli səhər yağışının yuyub islatdığı səkilərlə yeriyir və bir saat, beş saat, səkkiz saat bundan qabaqkı kimi yenə də Təhminənin pıçıltılarını eşidir, sığallarının, əllərinin, saçlarının, dodaqlarının təmasını duyurdu... Moskvanın bütün gözəl qadınları – payız küçəsinin bütün qadınları Təhminəni xatırladırdı Zaura və heç biri ona tay ola bilməzdi... Zaur dünən Təhminəylə keçdiyi yerlərdən indi tək keçmək istəyirdi, amma bu təkliyində tənha deyildi, Təhminə də onunlaydı – sözləri, nəvazişləri, pıçıltıları, ən çılğın məhəbbət anlarında gah yumşaq, gah ehtirasdan boğulmuş kəsik gülüşləri, dodaqlarının istisi, uzun incə barmaqlarının sərinliyi, küçədə, liftin, eskalatorun, ya avtobusun basabasında qeyri-ixtiyari, qəsdənmi, təsadüfənmi Zaurun köksünə qısılması, belinin, dizlərinin toxunuşu yalnız fikrində, xəyalında deyil, bədəninin hər hücrəsində yaşayan, nəbz kimi döyünən xatirələr – Zauru indiyə qədər heç bir vaxt duymadığı, yaşamadığı bir səadət burulğanına qərq edirdi və bu burulğan içindən yenə də Təhminənin sifəti, gülüşü, danışıqları durulub çıxırdı. Nə qədər söhbətlər etmişdi Təhminə bu gecə. Elə bil indiyəcən dəniz sahilindəki yay görüşlərində deməmdiyi, danışmadığı, ürəyində saxladığı bütün sözləri, bütün söhbətləri bu ılıq Moskva gecəsində deyib qurtarmaq istəyirdi... Uşaqlığından danışırdı ən çox. Pirşağıdakı bağlarından, yayın son günlərindən, çimərlikdə düzülmüş əlvan pioner dəstələrindən, bazar günləri həmişə saat ikidə verilən muğamat konsertlərindən – aram melodiya dənizin, qızmar sahilin, odlu qumların üstündən tüstü kimi uçub gedirdi. Uşaqlığından əbədi tərk olunmuş diyar kimi danışırdı, elə bil, didərgin, itkin düşmüşdü bu diyardan... Qızmış qumlar günorta çağı yalın ayaqlarını yandırardı, axşamlar isə qumlar soyuq və nəm idi. Gecə qonşularıgildən evlərinə qayıdanda üzüm meyvələrinin arasından hoppanarkən qorxurdu ki, birdə gümüşü ayın ziyasında, boz qumların içində görünməz olmuş ilanı basdalar, ilan qayıdıb çalar onu. Qonşu-

larıgildə aşiq olmuş ilanlar haqqında əfsanələr danışırdılar, and içirdilər ki, ilanın bir qıza bənd olub onu təqib etməsini öz gözlərilə görən olub... Qonşuda onun tay-tuşları balaca uşaqlar çox idi... cürbəcür oyunlar oynardılar, bir-birinə qorxulu əhvalatlar danışardılar, gecəyarısı balaca Təhminə evlərinə qayıdanda bu qorxulu nağılların vahiməsindən xoflanardı, aylı gecədə qarışıq kölgələrdən eymənərdi, əti ürpəşərdi... Eyvanlarına ayaqlarının ucunda qalxardı ki, atasını və nənəsini oyatmasın, ehmallıca miçətkənin altına girərdi, amma yuxulamazdı, iri ulduzlarla bəzənmiş açıq yay səmasına baxar və uzaqdan – neftçilərin istirahət evindən eşidilən musiqi səslərinə qulaq verərdi. Orada rəqs edərdilər. Cürbəcür musiqi havaları çaldırardılar, amma hər gecə ən axırda eyni tanqoyla bitirərdilər bu konserti, həmin tanqo indiyəcən Təhminənin qulaqlarındadır, sözlərini də xatırlayır... Bu tanqoda deyilirdi ki, batan günəş həzin-həzin dənizlə vidalaşır. İndinin özündə də təsadüfən bu tanqonu eşidəndə gözləri dolur, uşaqlığı, bağları, atası yadına düşür. Neftçilərin istirahət evində Təhminədən on-on iki yaş böyük oğlanlar və qızlar rəqs edərdilər, onların aləmi özgə bir aləm idi, musiqi, tanqolar, aylı gecələrdə sahil gəzintiləri, görüşlər və ayrılıqlar, sevgi və şirin ağrılar vardı bu aləmdə. Təhminə sevinirdi ki, bu aləm onunçün hələ irəlidədir...

Anası yadına gəlmirdi, yaş yarımında itirmişdi anasını, onu yalnız köhnə, saralmış fotolarına görə xəyalında canlandırırdı, lap uşaq yaşlarında möcüzəyə inandırmışdı özünü ki, anası ölüb eləməyib, hardasa uzaq bir yerdədir, bir gün gəlib çıxacaq. Təhminəyə iri, yaraşıqlı kukla, çoxlu konfet və – nədənsə bunu həmişə düşünürdü – sarı, güllü iri çətir gətirəcək... Anasını uzun ağappaq paltarda təsəvvür eləyirdi həmişə, özü də həmişə onu lalələrlə dolu olan ucsuz-bucaqsız bir düzənlikdə görürdü. Anasının səsini, danışıq tərzini heç cür xəyalında canlandıra bilmirdi, odur ki, anası haqqında düşünəndə onun səsini tanış qonşu qadınlarından birinin səsi, danışıq tərzi kimi qavrayırdı. İllər keçdikcə yaşı artdıqca Təhminə bu xəyalların puçluğunu başa düşürdü. Nənəsi bir dəfə ona anasının qəbrini də göstərmişdi. Artıq dərk edirdi ki, anası doğrudan-doğruya ölüb və heç zaman gəlməyəcək. Amma buna baxmayaraq, ulduzlu yay gecələrində yenə də anası haqqında düşünürdü, indi daha gələcək zamanda yox, keçmiş zamanda... Anasının bir gün diriləcəyini, qayıdıb gələcəyini fikirləşmirdi, anasının bir vaxt necə, nə sayaq diri olduğunu, yaşadığını təsəvvüründə yaşatmaq istəyirdi... Xəyalında canlandırırdı anasının və atasının cavanlıqlarını –

lap gənc vaxtlarını. O çağı ki, o vaxt heç Təhminə də yer üzündə yox imiş, hələ atasıyla anası təzə-təzə gəzməyə başlayıblarmış. Təhminə gözlərini yuman kimi aylı gecə, dəniz sahilini görürdü və cavan atasıyla cavan anası məhz bu sahildə görüşürdülər, ay da məhz bax elə indiki kimi işıqlandırırdı qumları, suları, uzaqdan da məhz elə bu musiqi – bu kədərli tanqo eşidilirdi və atasıyla anası – ikisi-boş sahildə onlardan başqa heç kəs yox idi – uzaqdan gələn musiqi sədaları altında tanqo rəqsini oynayırdı və ikisi də bilirdi ki, bu son rəqsləridir, indi, bu an – xoşbəxtdirlər, amma bu xoşbəxtlik bitməyə, qurtarmağa, bir daha qayıtmamağa məhkum olmuş bir bəxtiyarlıqdır. Sonra Təhminə dedi ki, lap bu yaxınlarda, bir ay bundan qabaq yenə yuxuda ata-anasını görmüşdü, anası uzun ağ paltarda, atası isə yaxası açıq apaş köynəkdə idi, aylı gecədə, həmin o sahildə rəqs edirdilər. Yuxuda həmin tanqonu da eşidirdim: "Utomlennoe solnse nejno s morem proşalos". "Yuxuda elə ağlayırdım, hıçqırıq boğurdu məni, bütün yastığım göz yaşlarından islanmışdı, – bir an susub, əlavə etdi. – Manaf oyatdı məni ki, nə olub sənə belə"...

İlk dəfə Manafın adını çəkdi, amma heç bir şey danışmaq istəmirdi əri haqqında. Qonşusu Mədinə haqqında danışırdı, deyirdi ki, Mədinə əsl dostdur, qadınlar arasında bu cür etibarlı dost tapmaq çətin məsələdir. Mədinə heç bir vaxt məni satmaz, deyirdi, Dadaş haqqında danışırdı, deyirdi ki, Dadaşdan qurbağadan, siçandan çimçişən kimi çimçişir, o idarədə stollarının yaxın olmasına belə güclə tab gətirirdi, çünki belə məsafədə də Dadaşdan həmişə tər iyi gəlirdi, lap ürəyim bulanırdı... Nemətdən danışırdı, deyirdi ki, bir dəfə Nemət gecə saat dörddə mənə zəng eləmişdi, yox, ay axmaq, əlbəttə, eşq elan eləmək üçün yox, kim gecənin bu vaxtı eşq elan eləmək üçün zəng vurar, yox, ürəyinin dərdlərini danışırdı. Nemət, deyirdi ki, həyat onu sıxır, boğur, mən nə bilim nə, insandır da... Spartak? Əşi, nə yapışmısan bu Spartakdan? Axmağın, yelbeyinin biridir Spartak... Amma deyim sənə, o qədər də axmaq deyil ha, hər halda yaxşıca pul qazanmağın fəndin bilir... Bilirsən heç necə dövlətlidir Spartak? Atasının pulu! Ay-hay, atası pensiyaya dolanan adamdır, atasının o qədər pulu hardandır, əksinə, Spartak dolandırır atasını da, anasına da, elə bacısını da geyindirib-gecindirən Spartakdır, hə, tamam yadımdan çıxmışdı, axı, onun bacısı sənin gələcək adaxlındır, baxtın kəsib, Zaurik, Spartak bacısıyçün bir cehiz verəcək, gəl görəsən, bütün ömrün boyu Spartakın hesabına kef-nən yaşaya bilərsən, yaxşı, yaxşı, qaşqabağını sallama, zarafat eləyi-

rəm də, zarafatdan inciməzlər ki, sənə qurban olum. Spartak kimdir? Spartak sənin dırnağına da dəyməz, o niyə səni saxlasın ki... Amma zarafat bir yana qalsın, Spartak pula pul demir... Moskvaya gələndə üç-dörd oteldə nömrə saxlayır. Niyə? Nə bilim niyə, harınlıqdan, varlığa nə darlıq. "Rossiya"da da həmişə beşotaqlı lüksdə qalır, bir dəfə bərk pərt idi ki, həmin o beşotaqlı lüksə düşə bilməyib. Çünki o vaxt həmin lüksda arxiyepiskop Makstios qalırmış. Spartak zəncir çeynəyirmiş lap.

– Yaxşı, soruşmaq ayıb olmasın, sən bütün bunları hardan bilirsən?

– Özü danışıb... Rəfiqəmə danışırmış, o da mənə söhbət eləyib... Əlbəttə, Spartak gopçudur, birinin üstünə beşin qoyub danışır, amma hər halda dili varsa, dilçəyi də var... Pul olandan sonra...

– Yaxşı, hardandır axı, bu qədər pulu?

– Demişəm sənə, alverçidir də..

– Bəs qazamata düşməkdən qorxmur?

– Əlbəttə, gec-tez ilişəcək... Amma dindirsən gör sənə nə cavab verir. Onsuz da hamı ölüb gedəcək, deyir. Dünya beş gündür, nə qədər imkan var, kef çəkəcəm, harda qırıldı-qırıldı...

– Görürəm, sən Spartakın həyat fəlsəfəsinə əməlli-başlı bələdsən.

– Zaurik, yəni doğrudan sən belə səfehsən ki, məni Spartak kimi bir əyyaşa qısqana bilərsən?

– İnanmıram ki, fikri pul və qadın olan bu əyyaş sənin kimi gözələ biganə qalsın... Yəni heç sənə girişməyə cəhd eləməyib?

– Necə yəni əlbəttə, eləyib... Lap sino gedirdi mənimçün... Nə vədlər vermirdi, ilahi, şuba, daş-qaş, nə bilim daha nələr... Amma çox tez başa düşdü ki, mən o deyən yuvanın quşu deyiləm, belə-belə şeylərlə mənim başımı tovlamaq olmaz. Onda... ilahi, sən özün saxla. – Təhminə qəhqəhə çəkib güldü – Spartak ayrı üsula əl atdı. Mənə şeir oxumağa başladı... Allahu-əkbər... ha, ha, ha...

– Nə oldu bəs?

– Necə nə oldu? Şeirlərinin təsiri də elə şuba, daş-qaş vədləri kimi... Spartak da, baxma, o qədər də axmaq deyil, başa düşdü ki, bir şey çıxmayacaq, amma onda da... başladı ağzın boş qoyub orda-burda danışmağa, guya ki, mənimlə arasında nə isə var... Bax, sən bayaq danışanda ki, anası belə deyir, mən o saat barmağımı dişlədim, lap yəqin anasının beyninə bu fikri Spartak salıb. Anası axı onun məhəbbət macəralarıyla bərk fəxr eləyir... Elə ki, Manaf Bakıdan bir yerə getdi, Spartak o saat gətirib maşınını bizim evimizin qabağında saxlayır, bəzən gecənin yarısınacan, səhərə qədər maşın orda durur. Özü, Allah bilir, hara gedir, bəlkəm də elə evlərində yıxılıb yatır... Bir anekdot var

e, eşitmisən, hərəmxana haqqında... Hərəmxana sahibi arvadlarının hər birinə deyir ki, o biri arvadımın yanına gedəcəyəm bu gecə, özü də gedib tək yıxılıb yatır.

– Niyə?

– Nə niyə? Hərəmxana sahibi niyə tək yatır?

– Yox, Spartak niyə maşını sizin evin qabağında qoyur?

– Məlumdur niyə... Şəhərdə hamı onu tanıyır axı, maşınını da tanıyırlar. Hamı da bilir ki, o evdə mən yaşayıram və ərim də bu vaxt Bakıda yoxdur... İndi gecə bizim evin qabağında Spartakın maşınını görəndə nə düşünəcəklər... Bir yandan da özünün dili bir belə...

– Yaxşı, sən niyə buna son qoymursan, demirsən ona?

– Nə deyəcəm? Zaurik, neçə dəfə demişəm ki, sənə: mənim barəmdə nə danışırlar qoy danışsınlar, vecimə deyil. Mən elə hesab edirəm ki, insanın öz daxili əxlaqı olmalıdır və əgər bu əxlaq varsa, insan öz daxili əxlaqına sadiqdirsə, bütün zahiri şeylərin heç bir əhəmiyyəti yoxdur – kim nə bilim nə dedi, nə fikirləşdi.

– Yaxşı, bir şeyi başa düşmürəm: bütün bunları bilə-bilə Spartakla haqq-salamı niyə kəsmirsən?

– Nə haqq-salam, əşi? İldə-ayda bir dəfə rast gəlirəm ona... Hərdən görürsən Spartakdan da adama xeyir dəyir, bir şey-zad lazım olanda deyirəm, o saat tapıb gətirir. Bax, məsələn, elə sənin bu "Ronson"unu o tapıb gətirdi mənə.

Zaur ad günündə Spartakın alışqana mənalı-mənalı baxmasını yada saldı, bu baxışın səbəbini ancaq indi başa düşdü və pərtləşdi.

– Əgər mən bilsəydim...

– Yaxşı, yaxşı özündən çıxma. Öz puluma almışam bu hədiyyəni, intəhası tapmağına Spartak tapdı. Pulun almaq istəmirdi, gücnən verdim... Adamın Allahı var: Spartak nə cür həllöyüş olsa da, hər halda xəsis adam deyil.

"Xəsis olmaz da – deyə Zaur fikirləşdi. – Bu qədər müftə qazancın olanda, səxavətli olmağa nə var ki. İllah da gözəl qadının yanında..."

Spartakın əliaçıqlığı, ciblərinin dolu olması, Təhminənin bu barədə ağızdolusu danışması Zauru incidirdi, əlbəttə... Zaur deyəndə ki, Spartak atasının pullarını xərcləyir, Təhminə gülmüşdü də, əksinə, demişdi, bütün ailə Spartakın hesabına dolanır, Spartakın puluna, Spartakın səxavətinə. Bu da dəyirdi Zaura. Təhminə qeyri-ixtiyari onun zəif damarına toxunurdu, axı, Zaur özü, 24 yaşında ali təhsilli gənc olsa da, hələ də atasının hesabına geyinib-gecinirdi, gəzib-dolanırdı. Amma hər halda bütün bunlara baxmayaraq, Təhminə Zauru se-

virdi... Spartakın var-dövləti, səxavəti, hətta şeir oxuması da Təhminəni cəlb eləməmişdi, bu Moskva gecəsində, hotel nömrəsində Təhminə məhz Zaurun boynunu-boğazını öpüşlərə qərq edir:

– Sevirəm səni... sən hamıdan yaxşısan... mənim canımsan, əzizimsən, – deyirdi...

İndi gündüz Moskva küçələrini dolaşıb bütün gecəki sözləri, xatirələri bir daha yaddaşında oyatdıqca, çək-çevir elədikcə Zaur ancaq və ancaq bəxtiyarlıq hissi keçirirdi, heç bir xalla, heç bir fikirlə ləkələnməmiş tam bir xoşbəxtlik duyğusu. Və bu duyğu o qədər qüvvətli idi ki, aşıb-daşıb içindən çıxırdı, başqalarına, küçədən keçən yad adamlara da yoluxurdu. Zaura elə gəlirdi ki, bu hissin gücü qarşısında heç nə dayana bilməz, bu hiss hamını inandırmağa və bütün maneələri dəf etməyə qadirdir. O əmin idi ki, hətta ata-anası belə bu hissin şiddətini bilsələr, heç bir etirazları qalmaz. Məgər öz oğullarının düşmənləri idi ata-anası, məgər arzuları onu xoşbəxt görmək deyildi və əgər belədirsə, Zaur ömründə birinci dəfə olaraq sözün əsil mənasında xoşbəxt ikən nə deyə bilərdilər axı? Bu xoşbəxtlik nəinki ata-anasına, hətta qonşularına, Alya xanımgilə də sirayət etməliydi. Zaur inanırdı ki, Murtuzovlar belə, Firəngizi nə qədər Zaura ərə verməyi arzulasalar da, onun indiki xoşbəxtliyi qarşısında çəkilməliydilər, “qismət bu imiş” deyib Zaurla Təhminəyə uzun birgə ömür arzulamalıydılar. Və bütün başqa tanış-bilişlər də belə... və o cümlədən Təhminənin əri Manaf da belə... “Mənimlə xoşbəxt olmadı, barı Zaurla xoşbəxt olsun” deyə qırağa çəkilməliydi Manaf və ümumiyyətlə, bütün adamlar bu dünyada belə nadir şey olan həqiqi səadəti görüb ona qibtə eləməliydilər. Firəngiz, doğrudan, yaxşı qızdır, fağır.. Evlənmək olardı onunla, ala bilərdim onu, yaxşı ailə qura bilərdik. Amma nə edəsən ki, bu dünyada Təhminə var və Zaurun bəxtinə də məhz belə qəliz və xoşbəxt sevgi düşüb.

## Yeddinci fəsil

*Yar ilə əğyarı həmdəm görməyə olsaydı səbr*
*Tərki-qürbət eyləyib əzmi-yar etməzmidim?!*

Axşam doqquzda Şabalovkaya gəldi, telestudiyanın qarşısında var-gəl eləməyə başladı. Studiyanın çöl qapılarından içəri elə hey adam girib-çıxırdı. Zaur da bir on beş dəqiqə bayırda gözləyib içəri

girdi. İçəri foyedə də adam çox idi, dəmir məhəccərin yanında milis durmuşdu və foyenin o biri tərəfinə keçənlərin buraxılış vərəqələrini yoxlayırdı. Zaurun, təbii ki, buraxılış vərəqi yox idi, odur ki, foyenin o biri tərəfində qaldı... Foyenin bu tərəfi tüstü içində idi və hətta divardakı lövhədə də göstərilirdi ki, papiros çəkmək yeri məhz elə buradır. Lövhənin altında, döşəmənin üstündə dairəvi sink qutu qoyulmuşdu, belə qutularda lent saxlayırlar, indi isə həmin qutunun yarısı külqabı olmuşdu, papiros, siqaret kötükləri ilə dolu idi. Arabir bu qutunun yanına gəlirdilər, acgözlüklə bir-iki dərin qullab vururdular və siqareti divara basıb (divar kül ləkələrindən qapqara idi) qutuya atırdılar... Qara cemperli qız çiyninə palto ataraq küçəyə çıxdı, kimisə harayladı, geri qayıtdı... Başqa bir eynəkli qız telefonla harasa zəng eləməyə cəhd edirdi. Qara cemperli qız növbətçi milisə yanaşaraq kağız verdi ona: – Vot, pojaluysta, spisok akterov, oni seyças proydut, – dedi.

Sallaq bığlı oğlan foyeyə çıxdı və bayırdan gəlmiş meşin pencəkli, özü kimi sallaq bığlı başqa bir gənci görüb:

– Privet, starina, – dedi, – uqosti siqaretoy. Kakie u tebya?

– Bete. Nu kak tebe?

– Çto?

– Nu, vçera. Fellini.

– Nu, starik, qrandiozno. Ya oçumel, starik, ssena v tunele – eto oboldet mojno.

– Da, koneçno, starik... No vse je znaeş, pomoemu, Fellini ot barokko prişel k rokoko...

Nədənsə bu cümlə Zaura xususi ləzzət verdi, pıqqıldayıb gülməkdən özünü güclə saxladı... Eynəkli qız axır ki, niyyətinə çatdı, telefonda istədiyi adamın səsini eşidib:

– İr, eto ya Yulka, – dedi – Bitıy ças torçu zdes ne moqu do tebya dozvonitsya.

Təhminə foyenin o başından gəlirdi, uzun paltar geymişdi, yanında da iki kişi və uzun, sarışın bir qadın vardı.

Zaura tanış gəlirdi bu qadın və az sonra yadına düşdü ki, onu ekrandan tanıyır – Moskva televizorunun diktoru idi. Kişilərdən biri də, görünür, moskvalı idi, o biri isə... Zaur, heç vaxt görməmişdi bu adamı, amma dərhal tanıdı, kim olduğunu təyin elədi. Şübhəsiz, həmin televiziya rejissoru, adı Təhminənin dilindən düşməyən Muxtar Məhərrəmov bu idi. Muxtar çox da yaşlı adam deyildi, amma başı ağarmışdı, birçəkləri tamam ağ idi, başında da ağ tüklər qaradan çox idi. Dolu bə-

dəni bir az lırt təsir bağışlayırdı, bu təəssüratı qırış zamş pencəyi, əzik köynəyi və səliqəsiz bağlanmış qalstuku da artırırdı, bu adam, deyəsən, üst-başına heç fikir verən deyildi. Ağıllı və kədərli gözləri vardı. Muxtarın sifəti yorğun idi. Həm də bu yorğunluq bir gərgin günün, bir yuxusuz gecənin əzginliyi deyildi, illərin yorğunluğu idi. Bu yorğunluqda həyatdan bezarlıq da olmasa, hər halda, dünyanın hər üzünə bələdçilikdən doğmuş bir pərişanlıq vardı, bu adam elə bil yaşının illərindən qat-qat artıq yaşamışdı dünyada və hər şeyi də bilirdi insanlar haqqında.

Görünür, Muxtar Məhərrəmov elə sayaq adam idi ki, dünyada heç bir şeylə təəccübləndirmək olmazdı onu. Belə adamlar bədbəxtlikdən heç nəyə ürəkdən sevinə bilmirsə, xoşbəxtlikdən heç nəyə də dərindən kədərlənmirlər... Qəribədir, adamların başları da müxtəlif cür ağarır: bəzilərinin başı ağappaq qar kimi ağarır, bəzilərininki elə bil kif-atır... Muxtarın çallığı kül rəngində idi, amma elə bil yalnız saçları yox, sifəti də kül rəngində idi, alnında və dodaqlarının ətrafında dərin qırışlar, gözlərinin altında qara həlqələr vardı və Muxtar içində boğulmuş adam təsiri bağışlayırdı. Bircə dişləri ağappaq idi və Muxtar güləndə nazik qara bığlarının altından ağaran dişləri sifətinə xoş bir ifadə verirdi...

Təhminə Zauru görüb əl elədi, amma gəlmədi ona tərəf, dayanıb dostlarıyla danışırdı... Söhbətləri nə isə uzanırdı, amma Zaur səbirlə gözləyirdi, bilirdi ki, indicə Təhminə onlarla görüşüb ayrılacaq, Zaurun yanına gələcək və onlar yenə də dünənki kimi Moskva küçələrini elədən-belə ölçəcəklər... Yenə də cürbəcür adamlar foyeyə girib-çıxır, vəsiqələrini göstərirdilər, yenə də ayrı-ayrı cümlə qırıqları, ayrı-ayrı sözlər dəyirdi Zaurun qulaqlarına: "trakt, monitor, Xutsiev, Xesin, Fellini..."

Nəhayət, Təhminə dostlarıyla vidalaşmağa başladı, əvvəlcə əlini kişiyə uzatdı, kişi Təhminənin əlindən öpdü, sonra qadın diktorla qucaqlaşıb öpüşdülər, sonra isə hər ikisinə bir daha əl eləyib, çıxışa tərəf addımladı. Muxtar da moskvalılarla görüşüb Təhminənin yanınca gəlirdi. Zaur heç bu variantı ağlına gətirməmişdi...

Təhminə:

– Tanış olun, – dedi. – Zaur – Muxtar... Hər ikinizə bir-biriniz haqqında o qədər danışmışam ki, elə tanış kimisiniz.

Muxtar:

– Çox şadam, – dedi və əlini uzatdı.

Zaur da əlini uzadıb nəzakətlə:
– Mən də şadam, – dedi.
Təhminə:
– Gedək, – dedi və onlar küçəyə çıxdıqda hər ikisinin qoluna girdi.
– Yolumuz hayanadır, hara gedirik indi? – Təhminə heç birinə müraciət eləmirdi, amma birinci Muxtar cavab verdi:
– Sənin kefin hara istəsə...
Təhminə:
– Bilirsən nə var, Zaur, – dedi. Zaur öz-özünə qeyd elədi ki, Muxtarın yanında ona "Zaurik" yox, Zaur deyir. – Muxtarın başına gözəl bir fikir gəlib, bizi yeməyə dəvət eləmək istəyir. Məncə dahiyanə fikirdir bu, sən necə bilirsən?
Zaur tutulmuşdu, axı ona elə gəlirdi ki, bu axşam da ikisi olacaqlar, dünənkitək... Amma budur bax bu Muxtardır nədir, hardansa çıxdı ortalığa və Təhminə də indi onun adından dəvət eləyir Zauru şam yeməyinə. Belə görünür ki, Muxtarın hesabına... Özü niyə dinmir bəs?
Muxtar:
– Zaur, – dedi, – əgər, axşam elə vacib işiniz yoxdursa, gedib bir yerdə oturmaq pis olmazdı məncə, hə?
"Gör bir məsələni necə qoyur? Vacib işiniz yoxsa... Burada mənim Təhminədən başqa nə vacib işim ola bilər?.. Yəni məgər bilmir bizim Təhminəylə münasibətlərimizi?.. Təhminə qandırmayıb onu?.." Pis bir fikir gəldi Zaurun başına: "Bəlkə elə mən özüm də Təhminəylə həmin bu Muxtarın əsil münasibətlərindən bixəbərəm... Bu nə söhbətdir belə: "vacib işiniz yoxsa...". Tutalım ki, mənim vacib işim olsaydı, mən Təhminəni bununla qoyub gedəcəydim bəyəm...". Amma qəribədir ki, Zaur Muxtara yox, Təhminəyə əsəbiləşirdi... bu ikibaşlı münasibətlər üçün əsəbiləşirdi... Bir istədi acıqcan desin ki, hə, vacib işim var; amma qorxdu ki, onu saxlayan olmasın, elə Təhminə də o cümlədən, madam ki, vacib işin var, xoş gəldin...
– Yox, bir elə işim yoxdur, – dedi.
Muxtar:
– Lap yaxşı, – dedi. – Onda kino evinə gedək.
Taksi saxladılar – Muxtar qabaqda oturdu, Zaurla Təhminə dalda. Muxtar ünvanı dedi.
Gəlib çatdılar, Muxtar sürücünün haqqın verəndə də Zaur özünü birtəhər hiss elədi, indi burada qabağa düşmək, "yox, mən verərəm" demək gülünc olardı, axı, yeməklərinin daha böyük xərcini Muxtar

çəkəcəkdi. Eyni zamanda Muxtarın hesabına taksiylə gəlmək, yemək də heç açmırdı Zauru: Şam yeməyinin hesabını verməyə isə heç bir imkanı yoxdu, cibində cəmi-cümlətanı onca manat pulu qalmışdı.

Taksidə gələrkən Zaur susmuşdu. Muxtarla Təhminə danışırdılar, verilişləri haqqında, Moskva televiziyasının imkanları haqqında, onları bir neçə müddətdə sıx bağlamış olan ümumi işləri barədə söhbət edirdilər. Burada imkanlar, doğrudan da tamam başqadır. Bakıda iki trakt məşq olanda Allahımıza şükür eləyirik, burada isə rejissor yeddi-səkkiz trakt ala bilir... Aparaturaları da necə kamildir, heç olmasa o sinxron videoyazı aparatının bircəciyi bizim studiyada olaydı. Amma bütün bu söhbətlərin dibində bir qürur hissi də vardı: bunlara baxmayaraq yaxşı bir veriliş hazırlaya, apara bilmişdilər. Hətta, Təhminəyə yarızarafat-yarıciddi burda qalıb işləməyi də təklif eləmişdilər. Muxtarı isə lap çoxdan bura dəvət edirlər. Kino evinin qapısında Muxtar üzvlük biletini göstərdi: – Bunlar da mənim qonaqlarımdır, – dedi və onlar içəri keçdilər. Elə pilləkəndəcə Muxtar hansı tanışlarınasa rast gəldi, mehriban görüşdülər, şirin söhbətə başladılar... Təhminə iri güzgünün qarşısına keçdi, saçlarını düzəldir, dodaqlarını boyayırdı.

Zaur isə neyləyəcəyini bilmirdi, siqaret çəkmək istəyirdi, amma bilmirdi: məhz burda siqaret çəkmək olar, ya yox... Elə bil onu tamam unutmuşdular. Muxtarın təzə-təzə tanışları yanaşırdı ona, Təhminə isə güzgünün qabağında bərk məşğul idi.

Foyedəki adamları Zaur ömründə birinci dəfə görürdü, amma çoxunun sifəti yaman tanış gəlirdi. Ekrandan tanıyırdı onların sifətlərini. Məşhur, adı dillər əzbəri olan aktyorlar deyildi bunlar əlbəttə, amma hər halda çox filmlərdə çəkilmişdilər və odur ki, sifətləri də yaddaşlarda həkk olunmuşdu. Zaur yadına sala bilmirdi ki, bax bu müasir dəblə geyinmiş qadını hansı filmdə görüb, özü də sadə rus kəndlisi geyimində... Bax bu dama-dama pencəkli oğlan isə hansı filmdəsə alman zabitini oynayırdı...

– Nədir, Zaurik, darıxmırsan ki? – Təhminə ona yanaşdı və Zaur yenə də öz-özüyçün qeyd elədi ki, Muxtar olmayanda Təhminə həmişəki kimi "Zaurik" deyir. – Ya kino ulduzlarına tamaşa eləyirsən?

Zaur:

– Bəli, – dedi, – canlı Larionovanı gördüm indicə.

Təhminə də eyni zarafatcıl ədayla:

– Mən də canlı Tixonovu gördüm, – dedi.

– Dostlar, siz allah bağışlayın, – Muxtar onlara tərəf gəldi, amma yenə də hansı tanışınısa gördü, salamlaşdılar, qucaqlaşıb öpüşdülər.

Təhminə:

– Qəribə adamdır, – dedi. – Bax televiziyada da belədir. Hamı tanıyır onu, özü də hamının ürəyi gedir onunçün, görən kimi bağırlarına basıb öpürlər... Niyə belə qaşqabaqlısan, Zaurik?!

Zaur:

– Yox, – dedi, – kefim lap kökdür. – Və birdən-birə lap səfehcəsinə soruşdu: – Məni daha sevmirsən?

Təhminə güldü:

– Dəli, əlbəttə sevirəm... Elə darıxırdım səninçün bütün günü ki... Bəs, sən neyləmisən bütün günü?

Zaur cavab verməyə macal tapmadı. Muxtar qayıdıb gəldi və Təhminə indi də Muxtara müraciət elədi:

– Muxtar, o yelpicli qadın kimdir?

Muxtar qadının adını dedi.

– Bəs o cavan oğlan, yanındakı, əridir?

– Keçmiş əridir... Bax, onlara kofe gətirən oğlan da indiki əridir... Yaxşı, gedək restorana?

Restoran, demək olar ki, tamamilə boş idi. Böyük salonda cəmicümlətanı üç-dörd stolun ətrafında adamlar oturmuşdu. Stolların üstündə kiçik çıraqlar yanırdı. Ayrı işıq yox idi restoranda, odur ki, salon alaqaranlıq idi. Küncdə, pəncərənin yanında oturdular – sağda Təhminə, ortada Zaur, solda Muxtar. Ofisiant məzəli şəkillər çəkilmiş menyünü gətirib qabaqlarına qoydu. Təhminə oxumağa başladı, elə bil yeməklərin adından belə dadlı iy gəlirdi, Zaur hiss elədi ki, möhkəm acıb – axı bütün günü dilinə bir şey vurmamışdı.

Təhminə:

– Heç özüm də bilmirəm nə istəyirəm, – deyə menyünü Muxtara ötürdü, – sən seç...

Muxtar:

– Duru xörək yeyəcəyikmi? – deyə soruşdu.

Təhminə:

– Əlbəttə, yox, – dedi, – axşam– axşam nə duru xörəkbazlıqdır?.. Mən toyuq istəyirəm.

– Tabaka?

– Hə.

– Zaur, bəs siz?

Zaur çiynini çəkdi.

Muxtar:

– Şəxsən mən yaxşı bir tikə ət parçası yeyərdim, – dedi, ofisianta baxdı. – Podjarku u vas takje vkusno qotovyat, kak prejde?

Ofisiant başıyla təsdiq elədi.

– Toqda davayte nam dve podjarki, da, Zaur?

– Aha.

Bir xeyli məzə də sifariş verdi Muxtar.

– Yaxşı, içməyə nə içəcəyik?

Təhminə:

– Nə bilim, siz nə içəcəksiniz ki?

Muxtar koynak sifariş verdi.

Ofisiant hər şeyi yazıb getdi... Sükut çökdü, sonra Muxtar:

– Fikir verdiniz, nə qəmli gözləri var? – dedi. – Ofisiantı deyirəm...

Zaur bu sözlərə təəccüb elədi, çünki o özü Muxtarın gözləri haqqında bayaq bu cür düşünmüşdü.

Muxtar:

– Mən fikir vermişəm ki, ofisiantlardan, xüsusilə də yaşlı ofisiantlardan çoxunun gözləri qəmli olur... Qəmli və ağıllı... Görünür, peşələriylə bağlıdır bu cəhət... Ofisiant da Allah kimi qəmli və müdrik olur. – O gülümsündü.

Təhminə:

– Bəyəm sən Allahı görmüsən? – dedi. – Nə bilirsən ki, Allah müdrik və qəmlidir?.. Yaxşı, tutalım müdrikdir, bununla razılaşmaq olar birtəhər, bəs qəmli niyə olsun ki, Allah?

– Bircə səbəbdən... Elə ofisiantlar da o səbəbdən qəmlidirlər: Allah da, ofisiantlar da insanlara yaxşı bələddirlər, onların bütün zəif, naqis cəhətlərini görürlər, buna görə də qəmlidirlər...

Zaur da bu sayaq, maraqlı bir şey demək istəyirdi. Muxtara etiraz eləmək istəyirdi, həm də elə bir tərzdə eləmək istəyirdi ki, həm ağıllı olsun, həm də məzəli, amma elə bil bütün zehni qıc olub qalmışdı. Heç bir şey düşünməyə, tapıb deməyə iqtidarı yox idi, sanki çuqun ağırlığı çökmüşdü bütün içinə, dili də elə bil zəncirlə kilidlənib hərəkətsiz qalmışdı. Özünü çox naqolay hiss edirdi, qorxurdu ki, birdən kobud bir səhv eləyər, çəngəlləri-bıçaqları qarışıq salar, ya yöndəmsiz davranıb nəyisə salıb sındırar. Salfeti hara qoymağı da bilmirdi, əllərinə də yer tapa bilmirdi elə bil. Ona elə gəlirdi ki, bu narahatlığını Təhminə də, Muxtar da duyurlar, xususilə də Muxtar. Zaur görurdü ki, Muxtar

hərdənbir altdan-altdan ona göz qoyur, hərəkətlərini izləyir və Zaurun bütün varlığını, içini, rentgen cihazındaymış kimi görür. Zauru bu cür gördüyüyçün də ona bir qədər yüngül istehzayla baxır – yaşlı adam uşağa baxan kimi...

Ofisiant məzələri gətirdi, konyakı badələrə süzdü. Muxtar yeməkdən bircə tikə də ağzına götürməmiş konyakı daddı, sağlıqsız-filansız bir qurtum içdi, sonra isə uzun müddət badəni ovucları arasında sürtdü, elə bil isidirdi, sonra yenə də kiçik bir qurtum aldı... Zaur da içmək istəyirdi, amma bilmirdi necə eləsin. Muxtar kimi sağlıqsız-filan, kiçik-kiçik qurtumlarlamı?..

Təhminə:

– Bir az salat ver, mənə, – dedi.

Zaur pis bir hisslə Muxtarın qonaq elədiyi məzələri Təhminənin boşqabına qoyurdu. Sonra badəsini qaldırdı:

– Sənin sağlığına, Təhminə, – dedi.

Təhminə:

– Çox sağ ol, əzizim, – dedi və bir qurtum aldı. Muxtar Təhminəyə baxıb gülümsündü və o da bir qurtum içdi. Sonra:

– Amma öz aramızdır, konyak doğrudan da əla konyakdır ha, – dedi.

Zaur da təsdiq elədi.

Muxtar qəfildən Zaurdan soruşdu:

– Bəs siz nəylə məşğulsuz?

Zaur:

– Geoloqam, – dedi və bir qədər sükutdan sonra əlavə elədi. – Amma nəşriyyatda işləyirəm... Təhminəylə bir yerdə işləyirdik.

– Elədir, hə, Təhminə deyirdi axı... Geoloq... Romantik sənətdir... həmişə, dağda daşda...

Zaur tutuldu – onun söyər yerinə toxunmuşdu Muxtar. Zaur həmişə xəcalət çəkirdi ki, bütün kurslarından bircə o əsil peşəsiylə – geoloq peşəsiylə məşğul olmur, nəşriyyatda geologiyaya aid kitabları redaktə edir. Nəşriyyata anasının təkidiylə işə düzəlmişdi, aspiranturaya daxil olmaq üçün staj lazım idi. Doğrudur, heç aspiranturaya da girmədi, yenə də anasının təkidiylə sərbəst mövzu götürdü, amma hər halda ikinci ildi ki, bu nəşriyyatda ilişib qalmışdı. "Dağlar, meşələr..." Bilmirdi Muxtar qəsdənmi onun yaralı yerinə toxunmuşdu, ya təsadüfən demişdi bu sözləri. Romantik sənət... Təhminə ki, hər halda Zaurun bu zəif damarından agah idi, amma o da Muxtarın sözlərinin fərqinə varmırdı elə bil. Eybi yox, Zaur da borclu qalan deyil.

– Bəs siz nə sənət sahibisiniz? – deyə Muxtara müraciət elədi. Əlbəttə, onun nə sənət sahibi olduğunu çox gözəl bilirdi, necə də bilməyə bilərdi ki, söhbətləri bayaqdan məhz elə Muxtarın işi-peşəsiylə əlaqədar idi.

Muxtar qımışdı və zeytunu ağzına atıb:

– Mən televiziya rejissoruyam, – dedi, – amma mənim də əsil peşəm deyil bu... Təhsilimə görə mən kino rejissoruyam. Vaxtilə Moskvada kino institutunu qurtarmışam. Bu, uzun əhvalatdır...

Muxtar bunu elə tərzdə dedi ki, Zaur düşündü: "Deyəsən, mən də yaralı yerinə toxunmuşam", – məmnun oldu bundan, amma bu səfər Təhminə əlüstü söhbətə qarışdı:

– İnstitutu qurtarandan sonra Muxtarı burada, "Mosfilm"də saxlayırlarmış... Elə nahaq qalmamısan o vaxt... Qalsaydın, indi neçə böyük film çəkmişdin.

Muxtar:

– Ay Təhminə, məgər iş filmin böyüklüyündə, kiçikliyindədir? – dedi. – Hər şey daha qəlizdir həyatda. Həm də daha sadə... Həm daha qəliz, həm daha sadə, – deyə bir daha təkrar elədi. – İnsan ömründə bir sərhəd var, görünməz yaş sərhədi, – əlbəttə, sən də, Zaur da bu sərhəddən hələ çox uzaqsınız, amma mən daha keçmişəm bu sərhədi, odur ki, danışa bilərəm bu barədə... Bu sərhədə çatanacan hər şey qabaqdadır, ümidlərlə, arzularla, xəyallarla yaşayırsan – filan şeyi filan filan eləyəcəyəm, filan iş filan cür olacaq. Elə ki, bu sərhədi keçdin – istəyirsən lap bizim o Şirəli baba kimi yüz əlli il yaşa – hər şey arxada qalmış olacaq, ancaq xatirələr, həyata keçməmiş arzular barəsində, baş tutmamış niyyətlər haqqında xatirələr, vəssalam.

Konyakdan bir qurtum aldı və Zaura baxdı:

– Bilirsiz, Zaur, lent, plyonka – böyük məsələdir. Lent qalır – böyük film olsun, kiçik olsun, fərqi yoxdur – plyonkaya, lentə çəkmisən – kinofilm, ya telefilm – qalacaq. Amma mənim peşəm kədərli peşədir. Televiziya verilişləri, filmləri yox a, verilişləri rejissoru... Verilişi hazırladın, efirə verdin, vəssalam, şüttamam, daha yoxdur o veriliş, heç bu qədər zəhmətin, əzab-əziyyətin elə bil yerli-dibli olmayıb... Başa düşürsüz?

Zaurun yerinə Təhminə cavab verdi:

– Lap mənim kimi. Elan elədim, ekrandan getdim, vəssalam, izim-sorağım qalmır.

Muxtar:

– Bəli, – dedi, – doğrudan, kədərli işdir. Nə qədər əmək sərf eləyirsən, gecə-gündüz bilmirsən, ağlında, qəlbində nə varsa hamısını tökürsən ortalığa, əsəblərinin, sağlamlığının hesabına veriliş hazırlayırsan, bəzən həftələrlə, aylarla ancaq bu barədə düşünürsən, bütün istedadını, – yaxşı, deyək ki, istedad böyük sözdür, – qabiliyyətini deyək, bacarığını-təcrübəni deyək – bir söz, varın-yoxun nəyin varsa, qabında, necə deyərlər, nə varsa atırsan ortalığa, veriliş hazırlayırsan, yarım saat, qırx dəqiqə, çoxu bir saat efirdə səslənir, sonra... – siqaretindən bir qullab alıb dodaqlarını araladı, tüstü burula-burula yuxarı qalxdı, – bax bu tüstü kimi uçub gedir hamısı, heç nə qalmır... Yox, doğrudan, çox kədərli peşədir...

– Ofisiantların peşəsi kimi? – deyə Zaur yadına saldı. Təhminə dərhal:

– Tək ofisiantların yox, həm də Allahın, – dedi.

Muxtar gülümsündü:

– Bəli kədərimiz Allahınkı qədərdir, amma müdrikliyimiz yoxdur.

Təhminə:

– Muxtar, gəl bir yerdə bir film eləyək. Sən çək, mən də oynayım. Bilirsən necə oynayaram... Sənin bütün məşhur aktrisalarından yaxşı. Hə, nə olar, gəl bir təşəbbüs eləyək də... Ümumiyyətlə, gəl səninlə birgə bir iş görək də axır ki. – Zaura Təhminənin bu cümləsi bir az ikibaşlı göründü.

– Mən ki sənə çoxdan bunu təklif edirəm. – Muxtar da beləcə ikibaşlı cavab verdi.

Təhminə:

– Ciddi deyirəm, – dedi. – Yəni təkid eləsən, sənə film verməzlər çəkməyə?.. Niyə baş qoşmursan bu işə axı? Heç olmasa mənimçün, mənim xətrimə... Baş rolda çəkərsən məni?..

Muxtar:

– Gecdir daha, – dedi. – Bu yaşda mən həyatımı dəyişməyəcəyəm ki?.. Elə sənin də daha vaxtın keçib.

Təhminə:

...– Utanmazın biri utanmaz, – dedi, – dilin necə gəlir mənə belə söz deməyə. Ölürəm, kinoda çəkilmək istəyirəm. Heç olmasa nə isə qalsın bu dünyada məndən bir gün yıxılıb öləndə. Özü də indi istəyirəm, çünki sonra, sən demiş, doğrudan da, gec olacaq, vaxtı keçəcək. İstəyirəm ki, kino ulduzu olum, şəkillərimi jurnallarda çap eləsinlər. Sevdiyim rəng? Mavi... Bəyəndiyim filmlər – rejissor Muxtar Məhərrəmovun əsərləri... Xobbim? Nədir, doğrudan da mənim xobbim?

Muxtar:

– Bəzənib-düzənmək, – dedi.

Təhminə:

– Əh, siz kişilər heç nə başa düşmürsüz bu dünyada, – dedi – Başa düşmürsüz ki, gözəl qadın da milli dəyərdir, nadir ağaclar kimi, faydalı qazıntılar kimi, tarixi abidələr kimi...

Muxtar:

– Təvazökarlığına söz ola bilməz, – dedi.

Təhminə:

– Nədir, deyəcəksən, gözəl deyiləm? Gözəlliyimi də danacaqsız yoxsa?

Muxtar:

– Yox, danmıram, – dedi. – Amma dəqiqləşdirmək istəyirəm. Sən doğrudan da çox gözəl idin. Təkrar edirəm: idin...

Təhminə:

– Naxal, – dedi və barmağıyla zarafatyana hədələdi Muxtarı, sonra Zaura tərəf döndü. – Zaur, bəs sən nə ağzına su alıb durmusan, necə centlmensən, müdafiə eləsənə məni bu köntöy ədəbsizdən.

Amma Zaur ağzını açmamış Muxtar:

– Sənin cavabını verirdim, – dedi, – Muxtar Məhərrəmovun əsərləri haqqında istehzana görə...

– Ay Muxtar, yəni zarafat-zad başa düşmürsən?

– Bəs sən? Sən zarafat başa düşmürsən? Heç mən sənin gözəlliyin haqda keçmiş zamanda danışa bilərəm?

Zaur hiss eləyirdi ki, Muxtarla Təhminənin arasında gedən bu yarızarafat, yarıciddi atışmanın dalında uzun illərin sıx münasibətləri, tanışlığı, dostluğu durur, – bunlar hamısı bütöv bir aləmdir və Zaur bu aləmdən tamam bixəbərdir...

Ofisiant isti yeməkləri gətirdi, onlar yeməyə başladılar, arabir sağlıqsız-zadsız, qurtum-qurtum konyakdan da içirdilər, içkinin xumarı yavaş-yavaş Zaurun fikirlərini dumanlandırırdı və o sıxılır, özünü son dərəcə naqolay və artıq hiss eləyirdi bu məclisdə. İstər-istəməz özünü Muxtarla müqayisə eləyirdi və Muxtarın hazırcavablığı, ülfətə-ünsiyyətə yatımlığı, hətta yumşaq kədəri müqabilində Zaur özünü son dərəcə ağır, qılıqsız, hətta, küt və bəsit adam kimi qavrayırdı... Yadına salırdı Təhminənin dünənki sözlərini, gecə nəvazişlərini, düşünürdü ki, bütün bunlar yalan deyilsə, onda Təhminə nəyə görə, axı, nəyə görə, Zauru sevir? Təhminə kimi bir qadın hansı cəhətləri-

nə, hansı məziyyətlərinə görə Zaur kimi bir adamı sevə bilər axı? Ancaq Zaurun zahiri görünüşünə, boy-buxununa, sir-sifətinə, cavanlığına, gücünə görəmi? Əgər belədirsə, deməli, onları yalnız və yalnız şəhvət bağlayır? Bəs onda Domodedovo meşəsində cəh-cəh vuran quşlar, Moskva küçələrindəki dünənki şıltaqlıqları, əlaqələrindəki bütün poeziya – bunlar necə olsun bəs, bütün bunlar da yalnız şəhvət oyunlarıyçün bir hazırlıq imiş yoxsa?

Muxtar danışır, danışırdı. Zauru fikirlər aləminə, qəm dəryasına qərq eləmiş içki Muxtarı əksinə nəşələndirmişdi, dil-boğaza qoymurdu. İndi o öz peşəsini yamanlamırdı, əksinə tərifləyirdi, deyirdi ki, dünyada heç bir başqa sənətə dəyişməz onu, doğrudan da, deyirdi, məgər möcüzə deyilmi bu? Gecənin tənhalığında tək bir adamın başına gələn fikirlər, sözlər əvvəlcə kağız üzərində maddiləşir, sonra isə səhərisi gün onlarla, yüzlərlə adamın iştirakıyla sifətlərə, rənglərə, səslərə, lövhələrə çevrilir, canlı həyatın bir parçası olur və bütün bu həyatın nəbzi rejissorun ovcunun içindədir. Bu həyat ekran işığıyla minlərə, milyonlara göstərilir, onların yaddaşına, zehninə həkk olunur. Nə olsun ki, ekran sonra solub sönəcək, bütün sözlər, bütün sifətlər əriyib yoxa çıxacaq – bu dünyada daimi nə var ki? Xoş bir yuxudan aldığımız təəssürat kimidir bu – yaddaşımızda, qəlbimizdə qalır. Və xoş bir yuxudan, ya yaxşı bir verilişdən yaddaşımızda qalan iz məgər həyatın başqa maddi ləzzətlərindən daha azmı zövq verir insana? Muxtar niyyətlərindən, həyata keçməmiş arzularından danışırdı – ayrı-ayrı səhnələr, parçalar, obraz – dağıntıları...

– İçərişəhər haqqında film çəkmək istərdim, – deyirdi. – İçərişəhərin evləri yadınızdadır da... Bax, bütün hadisələr bu evlərdə, həyətlərdə, o dar küçələrdə gedərdi, finalda isə – finalını elə aydın görürəm ki, filmin, tez-tez yuxuma girirlər bu kadrlar – finalda İçərişəhər evlərinin damlarını göstərərdim və damlardan birinin üstünə zil qara paltarlı gənc, gözəl bir qız paltar sərərdi... İpin üstündə ağlar, mələfələr, balış üzləri asılıb. Hamısı da ağappaq, meh onları yellədir və qara paltarlı qız da bu ağ parçaların arasında görünüb itir, göy üzü açıqdır, uzaqda da gömgöy dəniz... bu bir növ rəqsdir – ağ parçaların, qara paltarlı qızın, küləyin rəqsi... Amma eyni zamanda kəndirdəki ağlar elə bil yelkəndir və bu evlər də yelkənli qayıqlardır, uzaqdakı mavi dənizin içində üzürlər... Başa düşürsüz, kameranı elə nöqtədə qoyardım ki, evlərin damı gəmi göyərtəsinə oxşardı və ağlar da yelkən kimi dənizin fonunda görünərdi – həm plastik obrazdır bu, həm də rəmzi... Biz

çox vaxt yelkənləri döşəküzünə çeviririk, lakin mən döşəküzülərini yelkənə çevirmək istəyirəm. Amma bu rəmzin başqa mənası da var. Damların üstündə yellənən ağlar həm də təslim bayraqlarıdır... İçərişəhərin köhnə evləri müasir buldozerlərə müqavimət göstərə bilmirlər, onlar dağılmağa, sökülməyə məhkumdurlar və təslim bayrağı kimi damların üstündə mələfələri, döşəküzlərini qaldırırlar... Kiminsə şeiri vardı bu məzmunda... "Ağ döşəküzüləri nə görürlər yuxuda? Görürlər ki, uzaq cənub dənizlərində yelkənlərdir...", ya "uzaq cənub dənizlərinə kölgə düşür bu yelkənlərdən..." – xatirimdə deyil.

Təhminə birdən Muxtarın uzun monoloqunu kəsdi:

– Gəl sənin sağlığına içək, Muxtar, – dedi. – Zaura çox danışmışam sənin barəndə. Zaur da mənimçün əziz adamdır.

Zaur: "Zaur da" – deyə ürəyində təkrar elədi.

– Odur ki, deyirəm, Zaurik, – "Zaurik"– Muxtarın sağlığına qaldıraq bu qədəhi. Muxtar əsil dostdur, elə dostdur ki, ən çətin dəqiqədə, ən pis vəziyyətində ondan kömək uma bilərsən və o da əlindən gələni əsirgəməz. Heç vaxt da boynuna minnət-zad qoymaz ki, bəs filan-peşməkan... ya görürsən bir təmənnası olsun... bir söz...

– Bir söz, boşla bu söhbətləri, – deyə Muxtar onun sözünü kəsdi. – Lap bal-bəhməz oldu... Nə bilirsən təmənnasızam, ya yox, bəlkə ürəyimdə mənim də təmənnam var. Uzun sözün qısası – gəlin, elə-belə içək, vəssalam, sağ olun.

Təhminə sərxoş inadıyla:

– Yox, – dedi, – mən bir neçə kəlmə də demək istəyirəm, xahiş edirəm sözümü kəsməyəsən... Mən demək istəyirəm ki, dostlar da cürbəcür olur. Elə dostlar var ki, yaxşı günün dostudur, ancaq yaxşı günündə sənin böyründə hərlənir, – üç qara qəpikdir qiyməti belə dostun. Elə dost var ki, yaman günün dostudur, bax belə dostu adam gərək çox yüksək qiymətləndirsin. Amma əgər həmin bu yaman günün dostu, ancaq yaman gündə sənin imdadına çatırsa, amma yaxşı günündə səndən gen gəzirsə, bu da məncə birtərəfli dostluqdur e. Adamın ürəyi darıxar bu cür dostluqdan, sən otur gözlə ki, mənim pis günüm haçan gələcək, onda öz dostluğunu sübut elə... Yox, bu da yarımçıq dostluqdur bir növ. Amma bir başqa cür dostluq da var, məncə əsil dostluq da elə budur... Yaman günündə səni tək qoymaz belə dost, amma yaxşı günündə də yaxasın qırağa çəkməz. Sənin dərdivə də şərikdir, sevincinə də sevinir. Sənin sevincin onun sevincidir, onun sevinci sənin sevincindir, dayan görüm, tamam çaşdım,ki... deyəsən, çox içmişəm... Nə isə... sənin sağlığına, Muxtar!

İçdilər, sonra Muxtar durub harasa getdi və Təhminə:

– Bilirsən necə insan adamdır, – dedi. – Sənətkarlığına da söz ola bilməz, – Allah vergisidir də...

Zaur düşündü ki, bu Allah zalım mənə niyə bir şey verməyib görəsən.

– Zaurik, nədirsə, elə bil pərişan dəyirsən bu gün gözümə? Nə olub?

Zaur:

– Qəribədir, – dedi, – mən fikir vermişəm ki, Muxtarın yanında sən mənə "Zaur" deyirsən. Muxtar olmayanda "Zaurik".

Təhminə şaqqanaq çəkdi:

– Ay Allah, əcəb ağılsızsan, – dedi.

– Biz hardan ağıllı olaq? Ağıllı Allahdır, ofisiantlardır, bir də rejissorlar.

– Lap zəhər tuluğusanmış ki sən, Zaur... Nədi, yəni məni qısqanırsan, kimə, Muxtara? Ay-hay! İstəyirsən, lap bax Muxtarın yanında səni qucaqlayıb öpüm, Zaurik, yox, lap elə "Zaurcığaz" deyim sənə, istəyirsən?

Zaur:

– İstəyirəm, – dedi. – Gəl bircə burdan çıxaq gedək.

Muxtar:

– Znakomtes, – dedi, onunla bir kişi və bir qadın da yanaşmışdı stola. Muxtar Zaur və Təhminəni rusca onlara təqdim elədi, sonra dedi ki, gələnlərin adı Saşa və Lenadır. Onu da əlavə elədi ki, əlbəttə, Lenanı və Saşanı təqdim eləməyə ehtiyac yoxdur, onları kim tanımır ki, – bu ər-arvad çox məşhur kino aktyorları idi.

Muxtar Saşayla Lenanı da stollarının başına dəvət elədi.

Ər-arvad ikisi də artıq möhkəm dəm idilər və Saşa oturarkən az qaldı stuldan yıxılsın.

– Pardon, – dedi, – oçen rad... Sonra – madam, – deyə Təhminəyə müraciət elədi, – vı ne vozrajayete esli ya syadu ryadom s vami?

Təhminə etiraz eləmədi və Saşa ondan soruşdu ki, siz də aktrisasınızmı? Təhminə dedi ki, xeyr, mən televiziya diktoruyam.

Lena:

– Ax da, ya je videla vas po televizoru, – dedi, – pozavçera eto bılo.

Saşa Təhminədən xəbər aldı ki, bəs nə əcəb siz aktrisa deyilsiz, Təhminə də cavab verdi ki, bu barədə rejissorlardan soruşmaq lazımdır, məsələn, elə Muxtardan.

Muxtar da dedi ki, icazə verin əvvəl mən özüm soruşum ki, nə içəcəksiz. Saşa:

– Da teper vse odin xren, – dedi. – Nu davay vodki...

– A vı Lena?

– Mne toje vse ravno, vodka, tak vodka... Sonra Lena Zaurdan soruşdu ki, adı nədir:

– Zaur.

– Zaur! Krasivoe stepnoe imya! A kak zovut menya?

Zaur cavab verdi ki, özünüz daha yaxşı bilərsiz.

– O, ne budte qrubım, çelovek so stepnım imenem, – dedi Lena, – vı je doljnı znat toçno: Lena...

Araq gətirdilər, Muxtar qonaqların qədəhlərinə süzdü.

Saşa:

– Vı pyete konyak, a mı vodku, – dedi. – Kakaya-ta anarxiya poluçaetsya u nas za stolom.

Muxtar:

– Net, u nas za stolom ne anarxiya, a monarxiya, – dedi, – poskolko est koroleva. İ daje dve korolevı.

Lena:

– Vot çto ya panimayu – vostoçnaya qalantnost, – dedi.

Saşa dedi ki, gəlin onda içək gözəl şərq qadınlarının sağlığına. İçək onların sağlığına ki, parancanı çıxarıb atıblar və konyak içirlər, sonra Təhminədən soruşdu ki, Təhminə paranca taxıbmı?

Təhminə cavab verdi ki, bizlərdə, ümumiyyətlə, heç vaxt, heç kəs parancanın nə olduğunu bilməyib.

Muxtar dedi ki, bizdə çadra olub, bu isə başqa şeydir.

Lena dedi ki, mən bilirəm, paranca Özbəkistanda olub. Sonra əlavə elədi ki, bildir Daşkənd festivalının iştirakçısıydım. Daşkənddə əntiqə plov bişirirlər.

Zaur dedi ki, bizim plovumuz daha ləzzətlidir. Zaur söhbətə ona görə qarışdı ki, susması diqqəti cəlb eləməsin, amma Saşa dərhal bunu tutdu və bərkdən:

– Bravo, bravo, sfinks zaqovoril, – dedi. – Vı molçali dolqo i zaqadoçno i nakones reşili raskrıt usta, çtobı zaşitit çest nasionalnoy kuxni.

Lena onun sözünü kəsib:

– Nu, xoroşo, – dedi, – ne... – və qəliz bir söyüş əlavə elədi.

Təhminə özünü o yerə qoydu ki, guya eşitmədi. Zaur qıpqırmızı qızardı, Muxtar isə mülayimliklə Lenadan xahiş elədi ki, söyüş söyməsin, bizlərdə adət belədir ki, qadının yanında söyüş söyməzlər.

Saşa dedi ki, onda yaşasın günəşli Azərbaycan respublikası və arvadına müraciətlə əlavə etdi:

– U nix nasçet etoqo znaeş kak stroqo, çut çto, esli çest zadeta, srazu pırnut nojom v serdse ili pulyu v lob.

Sonra Zauru göstərib əlavə elədi ki, görürsənmi, bu xanımın, yəni Təhminənin yanında necə mühafizəçi var.

Muxtar dedi ki, Saşa, məncə, sən Bakıda olmusan və sağ-salamat qayıtmısan ordan, nə bıçaqlayan olub səni, nə gülləylə yaralayan.

Saşa:

– Da, potomu çto ya bıl tam nije travı, tişe vodı, – dedi.

Muxtar:

– Nu, nasçet vodı tı izlişne skromniçaeş, – dedi, – pomoemu tı tam pil vse, çto uqodno, tolko ne vodu.

– Starik, ə deystvitelno probıl tam tri dnya ne prosıxaya, – dedi. Bakıda olmasından danışdı, dedi ki, təyyarədən düşəndə məni sizin kinonun rəhbər işçiləri qarşıladılar, sonra harasa getdik, haradasa görüş idi, nəydi, daha dalısı yadıma gəlmir, bir onu bilirəm ki, üç gündən sonra kimsə gətirib məni basdı Moskva təyyarəsinə... Ayrı heç nə yadına gəlmirdi Saşanın. Qədəhini qaldırıb:

– Nu, xoroşo, vzdroqnuli, – dedi, sonra yenə Təhminəyə baxıb dedi ki, bilmirəm bu Azərbaycan rejissorlarının gözləri hardadır, belə bir dünya gözəlini məgər kinoya çəkməmək olar heç?

Təhminə dedi ki, onlar çəkmir, siz çəkin. Saşa da dedi ki, məmnuniyyətlə və Təhminənin ünvanını, telefonunu istədi. Təhminə ünvanını və telefonunu vermədi, amma dedi ki, istəsəz, məni Muxtarın vasitəsilə tapmaq olar.

Saşa:

– On çto, vaş lyubovnik etot çertov, persyuk? – dedi.

Təhminə quru tərzdə:

– Net, – dedi.

– A kto vaş lyubovnik?

Təhminə:

– A u menya net lyubovnika, – dedi. – U menya est muj.

– A kto vaş muj?

Ani bir tərəddüddən sonra Təhminə Zauru göstərdi...

Sonralar Zaurla Təhminə mübahisə edirdilər: Təhminə belə deyəndə kim daha artıq quruyub qaldı – Zaur özü, ya Muxtar... Sonralar Təhminə Zauru başa salırdı: elə dedim ki, Saşa birdəfəlik əl çəksin məndən.

Doğrudan da, Saşa elə bil ayıldı, dərhal ahəngini dəyişdi. Zaura baxıb dedi ki, ancaq xahiş edirəm mənim qol-qabırğamı sındırmayasız, yüz faiz inanıram ki, bunu əla bacararsız, amma mən, ümumiyyətlə, arvadbaz deyiləm, mən alkoqolikəm, lazım gəlsə, arvadım da bunu təsdiq eləyə bilər.

– A poşel tı... – Lena ərini müəyyən ünvana göndərmək istəyirdi ki, birdən Muxtarın sözləri yadına düşdü, əlləriylə ağzını tutub, üzr istədi.

Saşa Muxtara müraciətlə:

– Starikan, a davnenko mı s toboy ne pili, – dedi, vaxtilə kursunda bir oxuduqları institutun dekanı Pal Palıçı yada saldı, soruşdu ki, Muxtarın yadındadırmı Pal Palıç?

Muxtar cavab verdi ki, əlbəttə, yadındadır. Saşa da dedi, bəs Muxtar bilirmi ki, ölüb yazıq Pal Palıç, Muxtar cavab verdi ki, şübhəsiz bilir və hətta, başsağlığı teleqramı da göndərib.

Saşa dedi ki, mən isə heç teleqram da vura bilmədim. Kannda idim, filmimizin premyerasında, qayıdanda bildim.

Təhminə soruşdu ki, Kann xoşuna gəlibmi Saşanın.

Saşa cavab verdi ki, üçüncü dəfədir Kann festivalında iştirak edir və lap zəhləsini töküb ora – qəbullar, nə bilim, press-konferensiyalar, kokteyllər, amma ağıllı-başlı içmək mümkün deyil... Amma bu səfər bəxti onda gətirdi ki, Fellininin təzə filminə baxdı orda, hələ bizdə yoxdur bu film, Muxtara müraciətlə:

– Nu, starik, – dedi – eto obaldet mojno, skaju tebe.

Zaur qəfilcən:

– A po-moemu, – dedi, – Fellini ot barokko prişol k rokoko...

Zaurun bu bəyanatı o qədər gözlənilməz oldu ki, hamının gözü kəlləsinə çıxdı, hamı bir müddət matdım-matdım bir-birinin sifətinə baxdı, nəhayət, Saşa:

– Nu, tı vıdayeş, starik, – dedi.

Təhminə də qəhqəhə çəkib Zaura "afərin" dedi.

Zaur isə kiçik qədəhini bir qırağa qoyub iri bir fujer götürdü, ləbələb konyak tökdü və göz qırpımında başına çəkdi. İçəndən sonra dedi ki, onun fikrincə dünyada ən yaxşı film "Tarzan"dır.

İstəyirdi ki, onun geriliyinə, primitiv zövqünə gülsünlər; amma əksinə, Lena Zaurun fikrinə qəhmər çıxdı, dedi ki, tamamilə razıdır bu sözlə, Tarzan heç olmasa sağlam kişidir. Sonra əlini Zaurun saçlarına çəkib:

– A vı sami poxoji na Tarzana, – dedi, – takoye je dikoye pervobıtnoye suşestvo s lesnım imenem...

Təhminə:

– So stepnım – qovorili vı, – dedi.

Lena da cavab verdi ki, meşə, düz, dağ – hamısı bir... və dərhal da üzr istədi, daha söyüş söyməyəcəyinə and içdi... Sonra Lena da Bakıya gəlməsindən danışdı, kinostudiyada balaca bir rolda çəkilibmiş, orada maraqlı bir adamla da tanış olub, rejissordur, bəlkə tanıyırsız. Adını xüsusi bir səylə tələffüz elədi: Ağamehdi...

Muxtar dedi ki, tanıyır belə bir adamı.

Lena dedi ki, çox maraqlı məxluqdur. Lenaya nələr vəd eləmirmiş ki, həmişəlik Bakıda qalsın.

Saşa Zaurdan xəbər aldı ki, siz də rejissorsunuz?

Zaur cavab verdi ki, xeyr rejissor deyiləm, tüfeyliyəm, çıxıb ata-anamın boynunda oturmuşam.

Saşa sakit-sakit cavab verdi ki, bu da pis peşə deyil, həm də gör necə gərək məharətin olsun ki, özün də valideynlərinin boynunda oturasan, hələ arvadını da orada əyləşdirəsən.

Təhminə, məzəmmətlə başını buladı, yəni ki, niyə, axı belə, Zaur.

Zaur cavab verdi:

– Ona görə belə deyirəm ki, sizin bütün bu söhbətləriniz lap məni boğaza yığdı daha, – Kann festivalı, Fellini, ağ yelkənlər, nə bilim, daha nə cəfəngiyat. Sonra əlavə elədi: – Ya samıy obıknovennıy, prostoy çelovek...

Lena:

– Nu, eto uje skuçno, – dedi, – kakaya-to demaqoqiya poşla. Davayte luçşe vıpyem.

Saşa:

– İskustvo prinadlejit narodu, – dedi və Zaura müraciət elədi: – A mejdu proçim, predstavitel prostoqo naroda, qde eto vı dostali takie şikarnıe tufli, ya ix daje v Parije ne moq kupit? Posmotri ka, Len...

Hamı Zaurun çəkmələrinə baxdı. Zaur nə isə fikirləşib, dedi ki, satıram, özü də qət təzədir... Saşa soruşdu ki, neçəyə, Zaur dedi ki, qırx manata, özüm almışam. Məlum oldu ki, Saşayla ayaqlarının ölçüləri də eynidir, 42. Zaur gördü Saşanın, deyəsən, doğrudan da meyli var, dedi, amma bircə şərtim var, sövdamız bax indicə, elə buradaca baş tutmalıdır. Mən öz ayaqqabımı sizə satıram, sizin ayaqqabılarınızı özüm geyirəm, üstəlik də mənə qırx manat pul verirsiz... Saşa fikirləşdi və dedi ki, razıyam.

Muxtar da, Təhminə də, hətta Lena da bilmirdilər, onlar zarafat edir, ya ciddi danışırlar, amma Zaurla Saşa artıq çəkmələrini dəyişdüyüş eləmişdilər. Saşa:

– Len, day yemu sorok rubley, – dedi.

– Da ne çudi tı...

– Day qovoryu. Tufli je blesk, eto on po pyanke otdayot, protrezveyet peredumayet.

Lena, doğrudan da, sumkasından qırx manat çıxardıb Zaura verdi və Muxtar dedi ki, onda gəlin içək Saşanın təzə çəkmələrinin şərəfinə... Təhminə dedi ki, həm də Zaurun təzə çəkmələrinin şərəfinə.

Zaur üzr istəyib, stolun arxasından durdu, ehmallıca ofisiantı kənara çağırdı, hesabı bilib pulunu verdi. Sonra qayıdıb öz yerində oturdu.

Saşa dedi ki, yaxşı, vaxtdır, hər şeyi yedilər, içdilər, qurtardılar, əntiqə çəkmə də qazandı aralıqda, indi isə evə getmək lazımdır, işıqları da söndürərlər daha.

Hamı yerindən durdu.

Muxtar:

– Siz gedin, – dedi, – mən gəlib çataram sizə. – Zaur gedə-gedə yavaşca çevrilir, Muxtarın ofisiantı çağırmasına ləzzətlə göz qoyurdu... Küçəyə çıxdılar. Binanın qapısındakı bir neçə maşını sahibləri işə salır, qızdırırdılar. Bir maşından Lenayla Saşanı çağırdılar.

Saşa və Lena Təhminə və Zaurla görüşdülər, dedilər ki, qonşularıdır çağıran. Aeroport metrosuna tərəf gedirlər, onsuz da yolları ayrılır. Muxtara da salam desinlər, heyf ki, sabah Kiyevə getməlidirlər, yoxsa görüşərdilər, bir də Moskvaya gələndə mütləq zəng vursunlar, hökmən görüşmək lazımdır. Keçib maşına mindilər, pəncərədən əl elədilər, maşın yola düşüb uzaqlaşdı... Muxtar elə bu vaxt çıxdı binadan.

– Ayıb deyilmi, Zaur, – dedi. – Axı, mən dəvət eləmişdim, siz niyə vermisiz hesabı?

Zaur:

– Təzə çəkmələrimin şirnisini verdim, – dedi.

Təhminə:

– Nə? Deməli sən... – deyə sözə başladı və birdən hər şeyi başa düşdü, – ağılsız...

Sonra sözünü yarımçıq kəsib, Zaurun boynuna atıldı, ayaqlarını da yerdən üzüb havadan sallandı. Zaur da onu bağrına basıb o yan-bu yana hərləyirdi və elə bil hər ikisi Muxtarın burada olduğunu unudaraq uşaq kimi şən gülüşürdü.

Muxtar:

– Metroya getmirsiniz? – dedi. “Siz” – yəni Təhminəylə Zaur.

Zaur:

– Yox – dedi. – Piyada getmək istəyirik.

Muxtar tələsik vidalaşıb getdi. Becid addımlarla metro stansiyasına tərəf gedirdi. Zaur arxadan onun azacıq bükülmüş yorğun kürəyinə baxır və Muxtar haqqında onun özünün tapdığı obrazlarla düşünürdü: qırışıb-əzilmiş yelkən, heç bir zaman daha yelkən ola bilməyəcək ağ parça... qayıqları, uzaq cənub dənizlərini isə ancaq yuxularında görə bilər... Özgə şəhərdə, qərib oteldə, tənha nömrədə yatıb gördüyü yuxularda...

## Səkkizinci fəsil

*Bu nə sirdir, sirri-eşqin demədən bir kimsəyə,*
*Şəhrə düşmüş mən səni sevdim deyən avazələr.*

Telefonun dəstəyini Təhminə özü götürdü. Zaur:

– Xoş gördük. Xoş gəlmisən, – dedi.

Təhminə:

– Sağ ol, – dedi, səsində nə sevinc vardı, nə intizar. Elə bil Zaurla on dəqiqə bundan qabaq ayrılmışdılar. Halbuki son görüşlərindən bir həftə keçmişdi, bu bir həftə ərzində Zaur Moskvadan uçub Bakıya gəlmişdi, Təhminə üç gün də Moskvada qalmışdı, sonra isə qatarla o da Bakıya yollanmışdı. Dünən gəlib çıxmışdı Bakıya, bu gün isə Zaur ona avtomatdan zəng eləyirdi.

– Bəs dedin gələn kimi zəng vuracam? Dünəndən gəlmisən, zəng eləmirsən.

Təhminə:

– Nə bilim, vallah, – dedi, səsi soyuq idi. Küləkli boz bir payız günü idi, elə bil Təhminənin səsinə də çökmüşdü bu günün soyuqluğu, tutqunluğu.

– Sevirsən məni?

Təhminə:

– Aha, – dedi, amma elə biganəliklə dedi ki, deməsəydi yaxşıydı.

– Haçan görüşək?

Bir az sükutdan sonra Təhminə:

– Mən özüm sənə zəng vuraram, – dedi. – İdarəyə...

– Haçan?

– Bilmirəm baxarıq...

– Bu gün?

– Yox, bu gün yox, sabah, birisi gün də yox... bir neçə gündən sonra...

– Axı niyə axı?.. Nə olub ki, bəlkə bir hadisə baş verib, hə?

– Yox, Zaur heç bir şey olmayıb. Amma işim var, bir məsələni həll eləməliyəm. Səndən də xahiş edirəm, bu günlər zəng vurma mənə. Bir neçə gündən sonra, bir həftədən sonra təxminən, özüm səni tapa-ram, yaxşı?

Zaur həvəssiz:

– Yaxşı, – dedi. – Özün bil...

Zaur birdən-birə yenə də:

– Sevirsən məni? – deyə soruşdu.

Təhminə tələsik:

– Hə, hə, sevirəm, – dedi və Zaura elə gəldi ki, bu sözləri Zauru tez başından eləmək üçün deyir. Bir də təkrar elədi. – Özüm sənə zəng vuraram. Hələlik.

Zaur da:

– Hələlik, – dedi və Təhminə dərhal dəstəyi asdı. Telefondan kəsik siqnallar eşidilməyə başladı, du, du, du...

***

Günlər keçirdi, Zaur evdə də, işdə də, hər telefon zəngindən diksinir, dəstəyə tərəf atılırdı, amma Təhminə zəng vurmurdu ki vurmurdu.

Zaurun əsəbi vəziyyətini anası da duyurdu... və buna ayrı rəng verirdi... Zaurun Moskva səfəriylə bağlı inadını, tərsliyini, höcətliyini görüb, Zivər xanım dərk eləmişdi ki, hərbə-zorbayla oğluna təsir göstərə bilməyəcək, başqa yol seçmək lazımdır – hər şeyi “pişim-pişim"lə həll eləmək gərəkdir. Zivər xanım indi Təhminəni açıq yamanlamırdı, dolayı yollarla söhbət salıb, Zauru ona qarşı doldurmaq istəyirdi. Onu da bilirdi ki, sözü hərləyib-fırlayıb Təhminənin üstünə gətirən kimi Zaur çəmkirib otaqdan çıxacaq, söhbəti uzatmağa qoymayacaq, odur ki, Zivər xanım az sözlə çox şey demək məharətinə yiyələnirdi: oğlu sözünü kəsib otaqdan çıxanacan bir cümləylə, bir məlumatla onun qəlbinə şübhə toxumları səpməyə çalışırdı...

– Eşitmişəm, Moskvada sənin rəqibin də olub ki, – deyirdi. – Nədi o televizor rejissoru, Muxtar Məhərrəmovdu nədi. Bəs davanız düşmədi? Məşədibad demişkən, qızın iki adaxlısı varmış ki...

– Bəsdir, qurtar, – deyə Zaur başını götürüb qaçırdı, amma gələn səfər anası qəsdən televiziya verilişlərindən söz salırdı, guya ki, təsadüfən Muxtarın adın çəkirdi, sonra isə: “sənin rəqibin” – deyə yenə işarə vururdu...

Başqa bir səfər anası:

– Hərənin öz yeri var da, – deyirdi, – ər ad üçün, adı olsun ki, ərdədir, ərli arvaddır. Spartak geyindirib-gecindirmək üçün, Muxtar işdə qabağa çəkmək üçün, sən... sən isə səfehqulu, elə-belə – gün keçirməkçün lazımsan ona. Ən pisi səninkidir, bu gün səninlə gününü keçirdər, sabah başqasıyla...

Bəzən isə tamam qəribə mülahizələr yürüdürdü: “Bilirəm səndən niyə belə bərk yapışıb, – deyirdi, – elə bilir ki, biz öləcəyik, bütün bu ev-eşik, bu var-dövlət ona qalacaq... Ay hay... asta ye, boğazında qalmasın...”

Bu, lap gülməli fikir idi və Zaur əsəbiləşməkdənsə maraq göstərirdi:

– Başa düşə bilmirəm, sizin ev-eşiyiniz hardan ona düşə bilər axı?

– Bunu başa düşməyə nə var ki?.. Onun fikri budur ki, biz ölək, sənə ərə getsin, bu ev-eşiyə sahib dursun... Asta ye, boğazında qalar...

Zaur bu sayaqlamanı müəyyən bir məntiqə bağlamaq istəyirdi:

– Axı, öz ərinə nə gəlib...

– Külü qoyum elə ərin təpəsinə... Ondan boşanmağa nə var ki, bir stəkan su içmək kimi asan işdir o cür arvadın əlində.

– Deməli, sənin məntiqindən belə çıxır: Təhminənin indi evi də var, əri də. Ərindən boşanır, evindən əl çəkir ki, allah eləməmiş siz öləndən sonra bizim evə köçsün? Yəni buna səndən başqa bir inanan olar?

– Sən ələ sal, qoca anavı, atovu lağa qoy... Əlbəttə, Təhminə xanım sənə bundan yaxşı şey öyrətməyəcək ki. Əlbəttə, könlündən keçir də... O qotur evlərini bizim bu cah-cəlallı mənzilə kim dəyişməz, aralığa salıb ərini də dəyişər, nə çətin imiş onunçün bu... O ev-eşiyi ki, atanla mən iynəylə gör qaza-qaza illərlə düzəltmişik, hazırına-nazir Təhminə xanım gəlib bütün bu var-dövlətə sahib durar. Ölmüşdü deynən Zivər ki, sən onun nəslinin başında turp əkəsən... Vallah öləm məni basdıralar ha, onda da qəbrimin içindən, yerin yeddi qatından durub gəlib, öz əllərimlə boğaram onu.

Anasının fantastik fərziyyələri gülməli gəlirdi Zaura, həm gülməli, həm də ağlamalı, amma bir yandan ona sevinirdi ki, əgər anasının fərziyyələri bu dərəcədə həqiqətdən uzaq, boş-bekara gümanlardısa, onda deməli, verdiyi bütün başqa xəbərlər, topladığı bütün başqa məlumatlar – o xəbərlər, o məlumatlar ki, onları qaşıq-qaşıq zəhər kimi hər gün Zaurun içinə tökürdü – onlar hamısı da mənasız və puç şayiələr imiş... Zivər xanım Moskvada Təhminəylə Muxtarın məhəbbət macəralarından danışırdı və Zaur bilirdi ki, bütün bu söhbətlər boş uydurmalardır, amma sonra fikirləşirdi ki, məgər Təhminənin Moskva səfərinin bütün təfərrüatına, hər saatına, hər gününəmi bələddir? Əlbəttə, yox... – Bakıya qatarla həmin o Muxtarla bir kupedə gəlib ki – deyirdi anası və Zaur bilirdi ki, bu, həqiqətdir, amma əlavə eləyəndə ki, "ikiadamlı kupedə gəliblər", Zaur bunun yalan olduğunu da dəqiq bilirdi. Təhminə, Muxtar və televiziyada işləyən iki qız – dördü bir yerdə – bir kupeyə bilet almışdılar, Zaurun yanında.

Amma bəlkə... Niyə, axı nəyə görə Təhminəylə olanda onun vəfasına, sözlərinin həqiqiliyinə Zaurun şəkk– şübhəsi qalmır, amma elə ki, üç gün-beş gün görüşmədilər – "bütün şəhərin danışdığı" və anasının ona müfəssəl çatdırdığı şayiələr Zaurun içini didib-tökür, beynini gəmirirdi... Domodedovo meşəsində Təhminə: "bax indi, bu saat, bu dəqiqə biz xoşbəxtik və ən böyük həqiqət də budur" – demişdi və

Zaur da o zaman bunu həqiqət kimi qavramışdı, amma “bu saat, bu dəqiqədən” başqa da vaxt axarı vardı axı. Bəs bu vaxtın, Təhminəylə görüşmədiyi anların həqiqəti, Təhminənin onsuz, Zaursuz olduğu və kim bilir, kimlə olduğu dəqiqələrin həqiqəti nədə idi? Bəlkə də bu dəqiqələr kiminçünsə başqa birisiyçün ən böyük həqiqət idi, Təhminəylə başqa birisiyçün... Zauru dəhşətə gətirən də elə bu fikir idi...

– Mən ölü, sən diri, – dedi Zivər xanım, – görəcəksiz, ərindən boşanacaq o. Öz planları var onun. Alya da deyir ki, televiziyaya keçib ki, o Muxtarı tovlayıb yoldan çıxartsın, ərə getsin ona... Özü bilər e, öz işidir, kimə gedir getsin, bircə səndən qəmişini çəksin.

Zaur “bəlkə, doğrudan da belədir”, – deyə düşünürdü. Bəlkə, Təhminə seçirmiş: “Zaur, ya Muxtar və axırı Muxtarı seçib... Vacib işi də elə budur. Buna görə də “sən mənə zəng vurma, özüm zəng eləyəcəyəm” deyir və zəng eləmir...”.

On gün də keçdi və Zaur bu müddət ərzində Təhminəni ancaq bircə dəfə gördü – televiziya ekranında...

***

Təhminə axır ki, qərara gəldi, dəstəyi götürdü və nömrəni yığdı

Qadın səsi gəldi:

– Bəli... – Təhminə susmuşdu, qadın səsi bir də təkrar etdi:

– Eşidirəm...

Təhminə əlini uzatdı ki, dəstəyi assın, amma dayandı, nəfəsini dərdi və bilərək ki, bu sözlərlə hər şey həmişəlik həll olunur, dedi:

– Manafı çağırın...

İndi də xəttin o biri ucunda sükut çökdü və bu zaman Təhminə səhərdən bəri öz-özünə təkrar elədiyi cümləni dedi:

– Madam ki, mən bu nömrəylə zəng eləyirəm, deməli, Manafın sizdə olduğunu bilirəm. Xahiş edirəm onu telefona çağırın.

Görünür, orada uzun zaman məşvərət apardılar, sonra addımlar eşidildi, sonra isə Manafın səsi gəldi. Özünü tamamilə itirmiş, öz adından belə imtina etməyə hazır olan yazıq bir insanın səsi.

– Bəli...

– Mənəm, Manaf, Təhminədir, – bir an qorxdu ki, hətta Manafın ürəyi gedə bilər. Amma daha geriyə yol yox idi, – Manaf, indi başa düşdün ki, mənim hər şeydən xəbərim var? Bilirəm ki, Tiflisdə deyilsən, Bakıdasan, harda olduğunu da bilirəm, görürsən zəng elədim. – O, Zoyanın adını, familiyasını, dəqiq ünvanını da demək istədi, amma fikirləşdi ki, bu artıqdır. – Özü də çoxdan bilirəm, – yalnız bir bunu əlavə elədi.

Manaf udqundu...

Təhminə:

– Heç bir vaxt dava-dalaşa çıxmamışıq səninlə, indi də belə fikrim yoxdur. Amma xahiş edirəm ki, yarım saatlığa evə gələsən, vacib bir məsələni həll eləyək. Biz ayrılmalıyıq.

Bir kəlmə də dinib-danışmırdı Manaf və yalnız Təhminə: – Yarım saatlığa gələ bilərsənmi? – deyə təkrarən soruşanda Manaf batmış bir səslə:

– Yaxşı, – dedi.

Təhminənin zənn elədiyi kimi iyirmi dəqiqədən sonra gəldi Manaf, sir-sifəti meyit rəngində...

Əgər Manaf Təhminənin gözlərində bu qədər miskin və iyrənc olmasaydı, hətta, yazığı da gələrdi ona.

– Biz ayrılmalıyıq, Manaf, – dedi, – daha bu cür yaşamaq olmaz... Mənim bir hakim tanışım var, tez ayırarlar bizi, əngəlsiz-filan...

Manaf yenə də susmuşdu, başını almış bu gözlənilməz bəlanın dəhşəti ona qara bir yuxu kimi gəlirdi. Axı ömrünün dəqiq düşünülmüş və onun gümanıyla yaxşı ört-basdır edilmiş bütün düzümü, sahman-səliqəsi alt-üst olurdu.

– Sənin Zoyayla, ya başqa qadınlarla əlaqən... mən onların da adını bilirəm, inan buna, bir söz, bütün bu xəyanətlərinin heç bir dəxli yoxdur... Sən çoxdandır, neçə ildir ki, məni aldadırsan, amma görürsən ki, indiyəcən vecimə olmayıb bu. Çünki səni sevmirəm, Manaf. Demirəm ki, haçansa sevmişəm, indi sevmirəm, yox, heç vaxt sevməmişəm... Bilirəm, bəlkə də bunu eşitmək səninçün ağırdır, amma, doğrudan da, belədir. Bizim evlənməyimiz böyük səhv idi. Hər halda mənim həyatımın ən böyük səhvi adi...

Manaf onun dediklərini sanki heç dərk etmirdi, bayaqdan bəri. Təhminənin zəngindən bəri fikirlərində dolaşan sual yalnız bu idi ki, görəsən Təhminə haradan öyrənib hər şeyi, kim deyib ona, necə təyin edə bilib hər şeyi belə dürüst, telefon nömrəsinə qədər, bundan başqa daha nə bilir və ən əsas məsələ – görəsən hələ bir şey eləmək mümkündürmü, ailələrini, nikahlarını saxlamaq mümkündürmü? Bəlkə yalvarıb-yaxarsın, ya əksinə, çığır-bağır salsın, Təhminəni borclu çıxarsın? Yox, bunlardan heç biri bir nəticə görməyəcəksə, onlar hökmən ayrılacaqlarsa, onda Manafın gələcək həyatı necə qurulacaq, elə Zoyanın özüylə ya başqalarıyla necə olacaq münasibətləri? İndi azad və sərbəst olandan sonra daha gizlənməyə bilərmi, ya əksinə, daha artıq gizlənməlidir və asudəlik onun qarşısına yüz cür təzə problem çıxaracaq?..

Mənzil Təhminənin atasından qalmışdı və Təhminənin adına idi, Təhminə:

– Səndən yeganə xahişim budur ki, – dedi, – hələlik bu evi təkotaqlı mənzilə dəyişənə qədər sən Zoyagildə, ya kefin harda istəyir orda qal... Bu xahişimi yerinə yetirərsən?

Və ancaq bu zaman Manaf hər şeyi sonunacan, son nöqtəsinəcən başa düşdü, başa düşdü ki, qətidir ayrılmaqları, heç bir şeylə qarşısıalınmazdır bu iş və birgə ailə həyatıyla bağlı nə vardısa, məsələn, bax elə bu mənzilləri – bir də heç vaxt, heç vaxt olmayacaq...

Təhminə tamam yad bir adam olacaq Manafçün, daha bir də heç vaxt, heç vaxt onlar bir divanın üstündə yan-yanaşı oturub televizora baxmayacaqlar, mətbəxdə bir yerdə çay içməyəcəklər, bir-birinə qapı açmayacaqlar və bir-birinı telefona çağırmayacaqlar... Ağır, ləng bir qorxu yavaş-yavaş Manafın bütün içini doldurdu: yavaş-yavaş tam bitkinliyi ilə dərk edirdi ki, bir də heç vaxt Təhminəni mavi, tiftikli xalatda hamamdan çıxıb nəm saçlarını darayan görməyəcək.

Dəhşətli bir peşmançılıq hissiylə onu da duyurdu, hər hansı bir vaxt – keçmişdə ya indi – əlaqə saxladığı qadınların hamısından daha artıq, dünyadakı butün qadınlardan daha artıq Təhminəni xoşlayırdı. Təhminəyə məftun idi və neçə ilin ər-arvadı olsalar da, əslində heç bir gün, heç bir gecə, heç bir saat da Təhminəyə malik olmayıb. Bəlkə elə Təhminənin soyuqluğu, biganəliyiydi Manafı başqa qadınların ağuşuna atan?.. Başqa qadınların nəvazişi onda özünə inam hissi oyadırdı, o hissi ki, Təhminəylə olanda itirirdi, daha doğrusu, heç bir vaxt duya bilmirdi Təhminəylə olanda. İndi, bu an dəli bir ehtiras oyanmışdı Manafda, Təhminəni bağrına basmaq, paltarlarını dartıb cırmaq, çabalayan çılpaq bədənini qolları arasında sıxmaq, öpüşlərə, nəvazişlərə qərq eləmək! Amma onu da bilirdi ki, bu saat yer üzündə bundan mümkünsüz şey yoxdur, dünyada heç bir qadın indi onunçün keçmiş arvadı Təhminə qədər uzaq və əlçatmaz deyil. Bunu dərk edə-edə hər halda yenə də inanmaq istəmirdi – yaxın bir adamın ölümünə inanmamaq istəyi kimi bir şeydi bu istək... İllər boyu birgə yaşadıqları bu otağın ora-burasına göz gəzdirirdi: divarlarda Təhminənin iri fotoşəkilləri, atasından qalma iri divar saatı, əlvan üfürmə şar – Bolqarıstandan gətirmişdi onu Təhminə və balaca, lap balaca əncir ağacı – təbiətin qəribə şıltağı, dağlarda bitmişdi bu mikroağac və onların ümumi dostları – alpinistlər hədiyyə gətirmişdi Manafgilə toylarından bir neçə ay sonra. O vaxtlar, evlənmələrinin ilk illərində, aralarında nə isə ümumi bir şey vardı məsələn, ümumi dostları. Sonralar hərəsi öz

həyatına qapıldı... Təhminənin səbir kasasını dolduran son damla nə olmuşdu görəsən. – Manaf bu barədə düşünür və Təhminənin paltarlarının düymələrini sayırdı, bu düymələr indi onunçün ən açılmaz möhürlər idi...

Divar saatı on bir dəfə vurdu...

***

– Bəs mən nə deyirdim. – Zivər xaımın həyəcandan gözü-başı qaynayırdı – bu dünyada bircə öldüyüm günü bilmirəm mən... Deyirdim sənə ərindən boşanacaq, deyirdim, demirdim hə?

– Kim?

– Kim, kim? Sənin aşnan... Belə de, sənin heç xəbərin də yoxmuş ki... Alya gəlmişdi... Onun da dərdi mənimkindəndir yazığın, deyir bilmirəm haraya müraciət eləyim, SK-ya? "Pravda"ya yazım bəlkə?

– Bir ağıllı-başlı de görüm nə olub axı.

– Nə olacaq, bu həyasızın qızı bütün təmiz ailələri pozacaq vallah... Alya deyir ki, yenə dadanıb zəng eləməyə Spartaka, yazığa aman vermir. Neçə aydır deyir, mağıl qulağımız dinc idi, bilmirəm kimə uymuşdu. Spartakın yaxasından əl çəkmişdi... Alya bunu mənə eşitdirir, e... Sənin fırıldaqlarından xəbərdardır. Moskvaya bir yerdə getməyivizi də bilir. İndi də, deyir, qayıdıb Moskvadan, yapışıb yenə Spartakın boğazından. Nə göz verir, nə işıq... hə, o yandan da deyir, məsələ qaldırıb, ərindən boşanır. Yəqin mənim oğlumun xirtdəyinə keçmək fikrindədir, deyir Alya yazıq... Spartakın pullarına tamah salıb, yaxşı təmiz ailəyə dürtülmək istəyir... Ay onun mürdəşir yusun üzünü, deyir Alya... Amma mən bir yandan sevinirəm ki, vallah, o Spartak – o da o. İtin dişi, donuzun dərisi... təki səndən əl çəksin, amma bir yandan Alya da yazıqdır da... Vallah, ana olmaq da bir bədbəxtçilikmiş bu dünyada.

Zaur daha onu eşitmirdi, telefona yanaşdı, elə evdəncə zəng elədi... Birinci dəfəydi ki, Təhminəyə evlərinin içindən zəng eləyirdi. Telefon cavab vermədi.

Zivər xanım altdan-altdan qımışaraq:

– Hardan cavab verəcək? – dedi. – Səhər gördüm Spartak "Volqa"sını qarajdan çıxarırdı. İndi də onun maşınında gəzir də... Spartakın "Volqa"sını sənin "Moskviç"indən üstün tutur də... – amma birdən Zivər xanım susdu, diqqətlə Zaurun üzünə baxdı və tamamilə başqa, yumşaq həlim bir tərzdə:

– Ay oğul, – dedi, – qanını qaraltma, anan qurban. Sənin tayın deyildi o... Qurban olum, o kimdir ki, sən bir belə ürəyivə salırsan, özüvə

dərd eləyirsən bu şeyləri... Çıxart başından, sənə qurban olum... Gəl sənə dolma bişirmişəm, səhərdən acsan, işdən gəlmisən, bir tikə çörək ye, gözlərinin qadasını alım...

Zaur geyinib küçəyə çıxdı ki, anasının səsini eşitməsin. Nə kinayəli, nə mehriban, nə acı, nə şirin sözlərini eşitmək istəyirdi...

Küçəylə gedir və düşünürdü: bu nə təzə söhbətdir belə... Doğrudanmı Təhminə yenə Spartaka zəng eləyib, indi nə işi düşüb görəsən?.. Bəs Zaura niyə zəng eləmir və bu nə boşanmaq məsələsidir belə, bu söhbət hardan çıxıb? Spartakın nə dəxli var buna?.. Bu boşanmanın – əgər doğrudan da boşanırsa – Spartakla nə əlaqəsi ola bilər? Bəs Muxtarla? Muxtar bilirmi bu barədə bir şey?.. Bəs özü hardadır. Təhminə, axşam doqquzdur axı... Yenə zəng elədi. Sonra bir də, bir də... Telefon susmuşdu... Gecə on birin yarısı olmuşdu artıq. Telefon susduqca Zaurun nigarançılığı da artırdı və bilirdi ki, əgər bu axşam Təhminəylə danışıb bütün bu məsələləri aydınlaşdırmasa, rahat ola bilməyəcək. Küçələri gəzə-gəzə gəlib Təhminəgilin evlərinin qabağına çıxdı.

Evlərini də tanıyırdı Təhminəgilin, pəncərələrini də və bu pəncərələr indi işıqlı idi. Pəncərələri işıqlı görən kimi Zaur cəld telefon budkasına girdi – yəqin axır ki, Təhminə gəlib çıxıb evə, amma nömrə yenə də cavab vermədi. Zaur budkadan çıxdı və birdən par-par parıldayan çəhrayı “Volqa”nı – Spartakın “Volqa”sını gördü. Maşın düz Təhminəgilin qapılarının qabağında dayanmışdı, iki təkəri – bir tərəfi səkinin üstündəydi.

Elə bil hər şey birdən-birə Zaurun beynində işıqlandı, “deməli belə” – deyə düşündü. İndi lap qəti əmin idi ki, Spartak Təhminəgildədir, Təhminə də evdədir, hər ikisi o işıqlı pəncərələrin dalında oturub, telefon zənglərinə qəsdən cavab vermirlər və anasının, Alyanın, “bütün şəhərin” danışdığı söhbətlərdə, şübhəsiz, həqiqət var... Ərindən də yəqin ki, boşanır Təhminə, Spartaka da şübhəsiz ki, zəng eləyir. Muxtara da... Birdəfəlik bütün bunlara son qoymaq lazımdır, – deyə düşündü Zaur, özü də məhz indi, bu saat. İndicə qalxacam onların mənzillərinə, qapılarını döyəcəyəm, telefonu götürmədikləri kimi qapını da açmayacaqlar. – Zaur cəm halında düşünürdü evdəkilər haqqında, amma Təhminəylə Manaf kimi yox, Təhminəylə Spartak kimi – qapını açmayacaqlar, eybi yox, təpiklə vurub sındıraram, qoy səs-küyə qonşular çıxsın, onsuz da bütün şəhərdə rüsvay olmuşuq, qoy lap biabır olaq, amma həqiqət axır ki, biryolluq üzə çıxsın. Zaur elə bil qızdırma içində sayıqlayırdı öz-özünə; Çöl qapısından, yüyürə-yüyürə üçüncü mərtəbəyə dırmaşdı, zəngi basdı... Qapının dalından səs-səmir

gəlmirdi. Zaur barmağını zəngin üstünə qoydu və çəkmədi – aramsız çalırdı zəngi. Bir azdan qapı ardından tələsik addım səsləri eşidildi və Təhminənin təəccüb dolu səsi eşidildi:

– Kimdir?

– Mənəm, Zaurdur, – dedi.

Qapı açıldı və mat-məəttəl qalmış Təhminə:

– Sənsən? – dedi...

### Doqquzuncu fəsil

*Vəsl qədrin bilmədim hicran bəlası çəkmədən,*
*Zülmət hicr etdi çox mübhəm işi rövşən mana.*

Zaur boğuq səslə:

– Bəli, mənəm, – dedi. – Gözləmirdin?

Təhminə çiynini çəkdi:

– Gəl içəri də, – dedi.

İçəri keçdilər. Otaqdan yavaş musiqi sədaları, mətbəxdən isə qovrulmuş şabalıd iyi gəlirdi.

– Sən hardan gəlib çıxmısan bura?

– Telefonu niyə götürmürsən?

– Xarabdır da telefonum. Dünəndən işləmir. Yəqin pulun gecikdirmişəm, kəsiblər... Yaxşı, burda niyə dayanmışıq, gəl otağa.

Zaur ömründə birinci dəfə Təhminənin otağına girirdi. Təsəvvüründə çox canlandırmışdı bu otağı.

İndi isə Təhminənin dəfələrlə, bütün təfsilatıyla təsvir elədiyi şeyləri görürdü-standart rumın mebeli, divarlarda Təhminənin iri fotoları, güncdə əlvan üfürmə şar, təbiətin qəribə şıltağı – xırdaca əncir ağaçı, ləng kəfkirli iri divar saatı – bütün bunlar vardı otaqda, amma təsvir olunmamış və təsəvvür edilməyəcək, izah olunmayacaq bir hava, nə isə xüsusi bir rövnəq, bir zövq də duyulurdu hər yerdə – Təhminənin zövqü, Təhminənin şəxsiyyəti... Torşerin alaqaranlıq şöləsində, kiçik dəyirmi masanın üstündə iki stəkan çay, konfet, mürəbbə və üç qədəh vardı: qədəhlərdən ikisi boş, üçüncüsü dolu idi.

Təhminə:

– Əyləş, – dedi.

– Qonaqların var?

– Əşi, nə qonaq... Qonşumuzdur – Mədinə...

– Bu konyakı onunla içirsiz?

– Bəli. İndi səni də qonaq edərik, – Təhminə bufeti açıb konyak şüşəsini çıxartdı. Şüşənin yarısı boş idi.

– Yarım şüşə konyakı elə ikiniz vurmusuz? – Zaur sərt və kəskin danışırdı: cinayətkarı ifşa edən müstəntiq ahəngi vardı səsində.

– Zaurik, bir az nəzakətli danış. Sənə konyak verirlər iç, nə borcuna butulkanın yarısını kim boşaldıb.

– Belə de... Çox əcəb... Görürəm, ayrı qonağın da var. Tək bir qonşu Mədinə deyil.

Təhminə təəccüblə:

– Ayrı kimdir? – deyə soruşdu.

Zaur özünü güclə saxlayaraq:

– Bax bu üçüncü qədəhin sahibi... Amma doğru buyurdun, nə borcuma kimdir o, odur ki, soruşmuram da.

Təhminə elə bil üçüncü qədəhi yalnız indi gördü, bir müddət maddım-maddım bu qədəhə baxdı, sonra birdən bərkdən güldü.

– Ceyranı lap gözündən vurdun, – dedi. – Doğrudan da bu qədəhin sahibi mənim üçüncü qonağımdır.

Zaur dözmədi:

– Soruşmaq ayıb olmasın, bəs o kimdir belə? – deyə xəbər aldı.

– Kimdir? Necə kimdir? Sən.

– Mən? – "nədi yəni Zauru açıq-açığına dolayır?".

– Salaməleyküm. – Mədinə otağa daxil oldu, əlində iri bir boşqab vardı, boşqabın içində də qovrulmuş şabalıd. Zaur Mədinəylə görüşdü.

Təhminə:

– Doğrudan a, lap yadımdan çıxmışdı, – dedi. – Siz axı tanışsınız. – Zaura "Ronson" alışqanını Mədinə gətirmişdi işə.

Təhminə:

– Görürsən, Mədinə, – dedi. – Bilmirəm Zauru qayınanası çox istəyir, ya kim çox istəyir, amma hər halda lap məqamında gəlib çıxıb. Axı o da qovrulmuş şabalıdın dəlisidir.

Zaur düşündü ki, hər şey, hər şey Təhminənin yadındadır, bir dəfə, hələ əlaqələrinin başlamasından çox qabaq Zaur nəşriyyata qovrulmuş şabalıd alıb gətirmişdi. Təhminəni də qonaq eləmişdi və elə onda demişdi ki, çox xoşlayır qovrulmuş şabalıdı...

– Yaxşı, əyləş görək, Mədinə.

Təhminə iki boş qədəhə konyak süzdü, üçüncü dolu qədəhi isə Zaurun qabağına qoydu.

– Bilirsən nə münasibətlə içirik? – deyə Zaurdan soruşdu.

Zaur:

– Yox, – dedi.
Təhminə:
– Bir iş vardı onu qeyd eləyirik.
Zaur hiss edirdi ki, Təhminə bu axşam nə isə həyəcanlı, bir qədər çılğın va əsəbidir, amma nə idi bunun səbəbi, bilmirdi. – Zaurun qəfilcən gəlməsimi, ya başqa bir hadisəmi? Ya bəlkə bir az artıq içmişdi Təhminə.
Təhminə əsəbi gülüşlə:
– Adətən adamlar xoş hadisələri qeyd edirlər, – dedi,– amma biz Mədinəylə mənim boşanmağımı qeyd edirik.
Mədinə:
– Sən də keçdin bizim dəstəyə, – dedi.
Zaur bilirdi ki, Mədinə neçə il bundan qabaq ərindən ayrılıb, balaca, məzəli bir oğlu da var; Təhminə həmişə bu uşaq haqqında danışardı...
Sükut çökdü... Sonra Təhminə:
– Bu gün məhkəmə oldu, Zaur – dedi. – Rəsmən ayrıldıq.
Zaur bilmirdi nə desin: “Niyə? Nə səbəbə?” sualları da, təəssüf, ya təəccüb hissləri izhar etmək də, sevinmək də, kədərlənmək də eyni dərəcədə yersiz idi.
Mədinə bu sıxıntılı vəziyyəti aradan qaldırmaq üçün içi şabalıdlı boşqabı Zaura tərəf uzatdı. Təhminə başını aşağı dikib gözlərini qədəhinə zilləmişdi. İki damla yaş gözlərindən yanaqlarına süzüldü. Zaur ilk dəfə idi ki, onu ağlayan görürdü.
Mədinə:
– Əşi, yaxşı görək, – dedi, ayağa durdu. Təhminənin çiyinlərini qucaqladı. Təhminə bir dəfə, cəmisi bircə dəfə hıçqırdı və dərhal da özünü ələ aldı, hıçqırığını boğub, yanaqlarındakı, gözündəki yaşı sildi və gülümsündü:
– Əşi, fikir verməyin, – qədəhini qaldırdı. – Gəlin içək, – dedi, – hamımızın sağlığına.
İçdilər və Zaur xəbər aldı:
– Bəs niyə zəng eləmirdin?
– Nə bilim... elə istəyirdim... bəlkə sabah zəng vuraydım... – yenə elə bil çənəsi oynadı, ağlamsınan kimi oldu, səsi titrədi, amma yenə də dərhal öz zəifliyindən utanırmış kimi gülümsündü. – Əsəblərim lap pozulub, – dedi – Bütün bu günlər elə bil qızdırma içində yaşayırdım... Nə yaxşı ki, sən gəldin, Zaurik.
Mədinə çaydan bir qurtum içib:
– Yaxşı, mən gedim, – dedi. – Gecdir...

Təhminə:

– Hara tələsirsən, əşi? – dedi. – Bu qədər zəhmət çəkib, şabalıd qovurmusan... Əntiqə qovrulubdur, hə, Zaur?

– Aha...

– Heç olmasa özün də bir dadına bax da, Mədinə. Elə bil öz malındır, – sonra Zaura müraciətlə əlavə elədi: – Şabalıdları elə Mədinə alıb gətirib mənimçün. Təsəllidir də hər halda...

Zaur:

– Mən də yaman nigaran qalmışdım, – dedi. – Bu gün eşitdim sənin ayrılmağını... Zəng vururam, telefonun cavab vermir. – Zaur artıq üçüncü qonaq haqqında düşünmürdü, indi mənzildə onlardan başqa heç kəs yox idi, – şkafın içində gizlətməyiblər ki onu. Bəlkə də Zaur gələnəcən çıxıb gedib bu naməlum şəxs.

Təhminə Zaura deyil, Mədinəyə müraciətlə:

– Bilirdim ki, Spartak ağzında söz saxlayan deyil. Daha doğrusu, heç Spartak özü də yox e, anası...

Mədinə başıyla təsdiq elədi.

– Məsələ ondadır ki, – indi Təhminə Zaura müraciət edirdi, – bizim rayonun hakimi Spartakın canbir qəlb dostudur. Spartaka zəng elədim ki, dostuna desin, day çox uzatmasınlar məsələni. Bilirsən də adamın lap ürəyini çəkirlər: "Bəlkə bir də fikirləşəsiz, ailəvizi dağıtmayın, gedin, filan vaxtdan sonra gəlin" və sairə. Görürsən uzandı məsələ neçə ay... Bizimki də belə idi ki, fikirləş, fikirləşmə onsuz da hər şey həll olunmuşdu, daha bunu çək-çevirə salmağın nə mənası var axı... Spartak, Allah ondan razı olsun, doğrudan da, kömək elədi. Amma heç bu sözü ürəyində saxlaya bilərdi Spartak? İndi yəqin aləmə car çəkib.

Val qurtardı. Təhminə durub cihazı keçirdi.

Mədinə:

– Yaxşı, gecdir, daha mən gedim, – dedi və bu dəfə Təhminə onu saxlamadı.

Qapıyacan ötürdü Mədinəni, dəhlizdə uzun müddət nə barədəsə pıç-pıç etdilər. Zaur indi nə duyduğunu, nə düşündüyünü özü də dəqiq təyin edə bilməzdi, döyükə-döyükə qalmışdı, – otağın divarlarına baxırdı, oboylar çox zərif idi – mavi fonda ağ narın çiçəklər...

Təhminə qayıtdı:

– Nə belə diqqətlə baxırsan divarlara?

– Qəşəng oboylardır. Çiçəklər çox zərifdir.

Təhminə birdən:

– Zaurik, – dedi, – sən gəlmisən, ona görə də bütün bu çiçəklər açıblar. Birinci dəfədir sən mənim evimə gəlmisən, oboylar da çiçəkləyib, görürsən.

... və Zaur yenə də axıracan anlaya bilmirdi – doğrudanmı Təhminə səmimi deyir bu sözləri, onu sevdiyindən deyir, ya dolayır, ələ salır...

– Nə yaxşı ki, gəldin, Zaurik, Allah yetirdi səni bu axşam. Elə pis idi ürəyim, dünya gözümdə deyildi. Ağlıma gəlirdi ki, bax indi Mədinə çıxıb gedəcək, mən də yəqin öləcəm.

– Bəs niyə axı mənə zəng eləmirdin? Niyə mənim bütün bu əhvalatlardan xəbərim olmasın? İndi nə olsun ki, tanış hakim dostum yoxdur, amma hər halda bəlkə mənim də köməyim dəyərdi sənə.

– Çox sağ ol, Zaurik. Amma dünyada elə işlər var ki, onu gərək adam tək-tənha, təkbaşına həll eləsin. Ayrı heç kəsi qarışdırmasın gərək belə işlərə... Sənə zəng eləmirdim; çünki əlimi-ayağımı bağlamışdı bu boşanma məsələsi, istəyirdim birdəfəlik qurtarsın bütün bu dəhşət... Bilsən bütün bu illər nə qədər əzab, narahatlıq içində yaşamışam, özüm-özümə nifrət edirdim bəzən... Nə qədər yalan, riya olarmış... İlahi, çox şükür ki, qurtardı bütün hər şey, birdəfəlik bitdi. Bilsən necə azad-asudə hiss eləyirəm özümü. Amma hər halda asan da deyil bu azadlığa birdən-birə alışmaq... Həm də bütün bu günlərin gərginliyi... Səhər durdum, məhkəmədən qabaq, gördüm bütün içim elə bil qırılıb tökülüb. İstədim içəm gedəm məhkəməyə, sonra fikirləşdim, bunu da söz eləyərlər, ya bəhanə edib ayırmazlar bizi, təxirə salarlar iclası. Bir söz, içmədim getdim, ayırdılar bizi, gəldim evə, yıxıldım çarpayının üstünə, düz dörd saat üzüqoylu qaldım beləsinə... Sonra durdum, başladım içməyə, əvvəlcə təkbaşına, sonra Mədinə də işdən gəldi... Mədinə içən deyil, – o mənəm pyanıska... Amma hər halda o da mənimlə qədəh-qədəhə vururdu, necə deyərlər “qaraltı” verirdi mənə. Yarım şüşəni boşaltdıq. Vurduq bədənə, sən demiş...

Zaur öz qədəhini göstərdi:

– Bəs bu qonaq kim idi? Spartak?

– Başına at təpib, Zaur? Spartak ömründə mənim evimin kandarına ayaq basmayıb. Dedim ki, sənə, sənin qədəhindir bu.

– Necə yəni mənim? Axı mən gələndə masanın üstündə idi, həm də dolu idi. Sən hardan bilirdin ki, mən gələcəm?

– Zaurik, axı sən niyə mənə inanmırsan?.. Lap təkbaşına içəndə də mən həmişə bir qədəhi artıq qoyuram, ürəyimdə tuturam ki, bu da Zaurun qədəhidir... Köhnə bir anekdot var e, eşitmisən? Bir pyanıska həmişə iki qədəhdən içirmiş – biri özününkü, biri də guya dostunun-

ku... Arvadı danlayır, başlayır bir qədəhdən içməyə, – mən içkini atdım deyir, dostumdur içən... Mən də bax belə. Axı bir az dəliyəm mən, Zaur, indiyəcən başa düşməmisən hələ? Səninlə ilk dəfə plyaja getdik ha, bax o gündən haçan içməli olsam, bir qədəhi də doldurub deyirəm: bu da Zaurun payı... Mədinə də bilir mənim bu dəliliyimi...

Zaur gülümsündü, nəvazişlə, qayğıyla, həm də bu gün ərzində ilk dəfə olaraq dərin daxili bir arxayınçılıqla gülümsündü. Və bu təbəssüm bir müddət – bəlkə də çox qısa bir müddət – hər ikisinə qayğılarını, nigaranlıqlarını, irili-xırdalı bütün qəm-qüssələrini unutdurdu, ürəklərini səadətlə olmasa da, xoş, ılıq mehribanlıqla, sakitliklə doldurdu.

– Zaurik, axı niyə sən həmişə mənim yalanımı çıxarmağa cəhd edirsən... Guya mən bir cinayətkar-zadam, hansı qəbahətimisə səndən gizlətmək, ört-basdır etmək istəyirəm, sən də min fənd qurub, min sorğu-suala tutub ifşa etmək istəyirsən məni? – Təhminə başını Zaurun sinəsinə qoydu, sonra üzünü Zaurun sifətinə tərəf çevirib əlavə etdi. – Başa düş, Zaur, əzizim, birdəfəlik başa düş axır, sevirəm səni, sevirəm. Yalnız tək bir səni sevirəm... Bilirəm mənim deyilsən. Sənə heç bir hüququm çatmır, sənin cavan həyatını dağıtmağa da heç bir haqqım yoxdur... bilirəm bütün bunları... Amma sənsiz dura da bilmirəm. Bütün bu günlər dəli-divanə idim səninçün. Min dəfə sizin idarənin qabağından keçirdim və özüm özümə deyirdim: salam, Zaurik. Bilmirəm, Zaurik, nə olacaq, necə olacaq, heç bir şey bilmirəm. Nə istəyirəm, onu da bilmirəm. Lap azmışam, Zaurik, özüm öz içimdə azmışam.

Zaur bunu demək istəmirdi, amma qeyri-ixtiyari ağzından çıxdı bu söz:

– Mən elə bildim Spartak sizdədir. Maşını aşağıda dayanıb.

– Maşını aşağıdadır? Görürsən bu fırıldaqçını... Bir yandan mənə, doğrudan, çox köməyi dəydi, amma o biri yandan belə murdar xasiyyətləri var da. Bilir ki, ərimdən ayrılmağım camaata yayılacaq, qəsdən gətirib maşınını evimin altında saxlayır... Dedim axı ona... O səfər telefonla danışanda söz düşdü, dedim Spartak, niyə belə eləyirsən? Deyir, heç dəxli var? Bəlkə sizin evdə mənim başqa tanışlarım da olur. Deyirəm, kimdir axı tanışın? Hər şeyi deməzlər ki, deyir... Bilirəm axı yalan deyir, gözünün içinəcən, tanışı-zadı yoxdur bu evdə... – Susdu, sonra əlavə elədi, – amma nə deyim, vallah, bəlkə doğrudan da bir dostu-tanışı bu tərəfdə olur, axı o qədər tanışı var ki, bu adamın... Nə belə diqqətlə baxırsan mənə, Zaurik? – Təhminə də gözlərini düz Zaurun gözlərinin içinə zillədi, sonra, – Zaurik, belə baxma, sən allah, – dedi, – söndür gözlərini, Zaurik... Bayaq gələndə də gözlərin od tu-

tub yanırdı, dedim, məni də alışdırıb yandırarsan... Söndür gözlərini, Zaurik, – deyə sərxoş inadıyla təkrar elədi.

Zaur Təhminədən aralanıb ayağa durdu, qapıya tərəf addımladı.

Təhminə təlaşla:

– Zaurik, hara belə? – deyə soruşdu.

– Bu saat gəlirəm, – Təhminənin narahatlığını görüb – zəng eləməliyəm, – dedi, – avtomatdan zəng vurub qayıdıram.

Qapıdan çıxdı, pilləkənləri beş-beş atılaraq aşağı düşdü. Spartakın çəhrayı “Volqa”sı əvvəlki yerində idi – bir tərəfi səkidə, o biri tərəfi küçədə, elə bil iki təkəriylə küçəyə yiyəlik iddiasındaydı, iki təkəriylə də səkiyə.

Zaur cib bıçağını çıxartdı və “Volqa”nın dal təkərlərini deşdi, sonra tələsmədən çevrilib pilləkənlərlə yuxarı qalxdı.

Təhminə pəncərənin qabağında dayanmışdı, uğunub gedirdi:

– Gördüm, – dedi, – Zaurik, səndən də işlər çıxır ha.

Zaur:

– Hələ sabah da bir onun dərsini verəm gərək, – dedi.

– Yox, işin olmasın, qurban olum sənə... Sən mənim igid cəngavərimsən... hansı əsrdən gəlmisən, ey mənim igid cəngavərim? Hə, cavab ver?

Zaur:

– On altıncı əsrdən, – dedi.

– Düzdür, elə mən özüm də ya on beşinci əsrdən, ya da on dördüncü əsrdənəm. Amma görürsən iyirminci əsrdə görüşmüşük... Elə bütün işlər bundadır da...

Aşağıdan maşın səsi eşidiləndə gecə yarıdan keçmişdi. Spartak maşını işə saldı, maşın yerindən tərpəndi, amma dərhal da dayandı, qapısı açıldı.

Zaurla Təhminə bərkdən güldülər.

***

Spartakla səhər həyətdə görüşdülər, Zaur öz “Moskviç”inə tərəf gedirdi, meşin pencək və göy idman şalvarı geymiş Spartak isə öz “Volqa”sını yuyurdu. Zaura həmişə elə gəlirdi ki, Spartakın özündən müştəbehliyi “Volqa”sına da sirayət edib. Elə bil maşının da xasiyyəti varmış və məhz bu “Volqa” çox təkəbbürlü xasiyyətliymiş. Bəlkə də bu təəssürat ondan doğurdu ki, Spartak hər yerdə, həmişə “Volqa”sını burnu dik yuxarı saxlayırdı...

Zaur:

– Bura bax, Spartak, – dedi, – dünən axşam necə gəlib çıxdın evinizə?

– Necə bəyəm?
– Təkərin deşilmişdi axı.
Spartak təəccüblə:
– Sən hardan bilirsən? – deyə soruşdu.
– Hardan biləcəm, özüm deşmişəm də.
– Sən?
– Bəli, mən.
Spartak səmimi təəccüblə:
– Niyə? – deyə soruşdu.
– Ona görə ki, bir də maşınıvı harda saxlamağın yerini biləsən.
Spartak dərhal hər şeyi başa düşdü və etinasızlıqla:
– Maşın mənimdir, kefim harda istədi, orda da saxlayacam, – dedi.
Zaur sakitcə:
– Özün bilərsən, – dedi. – Məndən deməkdir... Hələlik bircə təkərini deşmişəm. Amma gələn səfər yenə bu maşını o yerdə görsəm, dörd təkərinin dördünü da deşəcəm, üstəlik dal şüşəylə qabaq şüşəni də sındıracam. Bilirəm, pulun çoxdur, təmir elətdirərsən, amma sonra sənin sir-sifətivi də elə günə qoyacam ki, day heç kəs təmir edə bilməsin.
– Bilirsən nə var, çox qozqurablıq eləmə. Səndən qorxan-zad yoxdur burda. Xox, qorxdum. Səndən qorxan-zad yoxdur burda...
Belə desə də, Zaur gözlərindən gördü ki, bir balaca qorxub Spartak, hələ uşaqlıq oyunlarından Zaurun dəlisov xasiyyətinə, tərs damarına bələd idi axı.
Amma Zaur maşınına minib həyətdən çıxanda birdən başına ayrı bir fikir də gəldi. Düşündü ki, Spartakın ona cavab qaytarmamasının, həsdəməsinin səbəbi yalnız qorxu deyil. Spartak, yəqin ki, ailələrinin planlarından agah idi, ucundan-qulağından eşitmişdi ki, bacısını Zaura vermək istəyirlər. Spartak yəqin güman edirdi, kim bilir, bəlkə də baş tutacaqdı bu sevda. Belə olan surətdə gələcək yeznəylə pərdəni aradan götürməyin nə mənası vardı?

***

Zivər xanım:
– Mən day səninlə danışmayacam, – dedi. – Səninlə qoy dədən özü danışsın. Heç utanıb eləmirsən, ə, heç qızarıb eləmirsən? Bir tikə abır-həya yox imiş sənin sifətində, səhər üzü gəlmisən evə, utanıb yerə girmirsən heç... Ərindən ona görə boşanıb ki, səni sabahacan yanında saxlasın... Tfu... Eyib eləməz, day atan da hər şeydən agah oldu, səninlə nə tövr rəftar eləməyi özü bilər atan.

Axşam atası çağırdı Zauru otağına. Atası aramla, təmkinlə, yeknəsəq bir tonla danışırdı, həm də çox uzun idi söhbəti və hər ikisi – atası da, Zaur da – bu söhbətdən üzülürdülər. Zaur bir daha yəqin elədi ki, insana ən ağır yaraları məhz ən yaxın adamlar vura bilirlər. Əlbəttə, atasının danışığı anasının haray-qışqırığından çox fərqli idi, sözlər, ifadələr də bambaşqa idi, ton da, amma mənası, məğzi eyni idi. Zaur bir də ona fikir verdi ki, atasının nitqində durğu işarələri yoxdur – nə nöqtə, na vergül, nə nida – elə-belə, ardı-arası kəsilməyən, fasiləsiz, uzun, yeknəsəq bir monoloq... Nə səsini qaldırırdı, nə həyəcanlanırdı, nə də nəfəsini dərmək üçün dayanırdı – nöqtəsiz, vergülsüz, axırsız bir cümlə – lal axan çayın ağır ləngəri: "Əgər o qadın belə düşünürsə ki, bizim çoxlu var-dövlətimiz, pulumuz var və bütün bunlara da o sahib duracaq, çox yanılır".

Atasının dediklərinin sadə və aydın məğzi bu idi ki, Zaur özü özlüyündə heç nədir, heç kəsi cəlb etməyə qadir deyil və əgər kimsə onu çənginə keçiribsə, burda mütləq başqa bir mətləb var, daha doğrusu, yalnız bircə mətləb-maddi təmənna var, vəssalam. Bu fikri dönə-dönə müxtəlif şəkillərdə təkrar edəndən sonra atası başqa bir mətləbə keçdi:

– Sən yekə kişisən, özün bilərsən həyatını necə qurmağı, istəsən, hətta, ala bilərsən o qadını, çünki mən eşitdim ki, o, ərindən də ayrılıb, amma bu halda sən bizim oğlumuz deyilsən artıq, yeganə balamız olsan da, anan da, mən də belə hesab edərik ki, heç yerli-dibli övladımız olmayıb, yaxud da olub və ölüb. Nə qədər çətin olsa da bu cür düşünmək, hər halda bu namussuzluqdan, biqeyrətlikdən min pay yaxşıdır. Amma bir məsələ də var axı... Tutalım elə sən də vaz keçdin bizdən, yəni biz səni oğulluqdan çıxartdığımız kimi, sən də bizi ata-analıqdan çıxartdın, saymadın bizi, elə hesab elədin ki, atan-anan yoxdur, ölüb. Çox əcəb. Tutalım ki, aldın o qadını – yaxşı bəs necə dolanacaqsınız, harda, nə pulla?.. Həm də axı anan mənə danışıb, o qadın geyinib-gecinməyi də sevir, o şəhəri – bu şəhəri gəzib-dolanmağı da sevir, vərdiş edib bu sayaq həyata, sən hansı qazancınla bu ehtiyaclarını ödəyəcəksən onun? Ödəyə bilməyəcəksən, eləmi, o da vərdiş etdiyi həyat tərzindən əl çəkmək istəməyəcək və onda deməli, atası üz-gözünü turşutdu, – bu barədə danışanda belə ürəyim qalxır. Deməli, belə olan surətdə sənin arvadın onun-bunun hesabına geyinib-gecinəcək, dolanacaq, özgə kişilərin – başa düşursən? Sənin qeyrətin bunu necə qəbul edər və sən adamların gözünün içinə necə baxa bilərsən, – bu Zivər xanımın nitqləri idi, amma indi cümlələr durğu işarələrsiz və kişi səsiylə tələffüz olunurdu. – Sən deyə bilərsən ki, xeyr

mənim heç evlənmək-zad fikrim yoxdur, elə-belə müvəqqəti, keçəri bir əlaqədir bu. Çox əcəb, belə olan surətdə yenə nakişi hərəkətidir sənin hərəkətin. Axı, bəlkə onun da həyatı sənə görə qırılır, dağılır, onu da bir düşünməlisən axı. Əlaqəniz müvəqqətidirsə, hər bir müvəqqəti şey gec-tez qurtarır və bir gün bu əlaqə də qırılanda, onun halı necə olacaq, axı o da insandır, onu da nəzərə al, onu da düşün.

Atasının fikrindəki bu çalar Zaurçün də gözlənilməz idi və indi ona elə gəlirdi ki, atası, hətta, müəyyən bir mülayimliklə, nəvazişlə danışır və hətta, cümlələrinin arasında pauzalar da verir, durğu işarələri də qoyur.

– Sözumə qulaq as, oğul, o qadın haqqında çox söz gəzir, mən bilmirəm hansı düzdür, hansı yalan, mənim işim deyil bu. Amma mən bir şeyi bilirəm, o bizim tayımız deyil. O tamam başqa yuvanın quşudur. Sənin rastına belə qadın çıxmamalıydı... Ananla mən səni belə böyütməmişik... Biz – anan da, mən də – ancaq sənin gələcəyini düşünürük, səni xoşbəxt görmək istəyirik və bundan böyük məqsədimiz də yoxdur həyatda... Xoşbəxt olmağın isə bircə yolu var: insan gərək həyatda qarşısına müəyyən dəqiq məqsədlər qoysun və onlara nail olmağa can atsın... Bu məqsədlər nədir – iş, faydalı əmək, bir də təmiz, möhkəm ailə... Ailə gərək səni işdən, fəaliyyətdən yayındırmasın, əksinə işinin, əməyinin səmərəli olması üçün hər cür şərait yaratsın... Mən başa düşürəm – cavanlıqdı filan, amma məncə, sən cavanlığın kefini kifayətcən çəkmisən daha. Mən nə sənin yaşında, nə də bütün ömrüm boyu sən görənləri görməmişəm... Amma hər şeyin vaxtı, məqamı var... Sən indi gərək daha bütün bu keflərlə, əyləncələrlə birdəfəlik vidalaşasan, gələcəyin haqqında ciddi düşünəsən. Birinci növbədə namizədlik dissertasiyası haqqında... İndi bir il, il yarım nədir ki, amma bu gecikmədən başlanır hər şey, namizədliyi gecikdirirsən, doktorluq da filan qədər yubanır, gələcək elmi karyeran da filan qədər geri atılır... Elə ailə də belədir... Hər şey gərək öz vaxtında olsun. Bir aya mənzilin də hazırdır. Ananla mənim arzum budur ki, bu mənzilə sən yeni ailənlə birlikdə köçəsən, təmiz, namuslu, ismətli bir qızla həyat qurasan.

Bəlkə də atasının bütün bu sözlərini bir vaxt unuda bilərdi, xatirələrin acısı da yaddan çıxıb gedərdi, yaraların yeri də yavaş-yavaş qaysaqlanıb sağalardı, amma atası bir cümlə də əlavə etdi və həmin bu cümlə hər şeyi həll elədi – gərək deməyəydi, deməyəydi gərək atası bu cümləni:

– Mənə "Volqa" boyun olublar, – dedi atası, – maşını sənə toy hədiyyəsi kimi alacam. Güman edirəm ki, toyunu da çox gözləməli olmayacayıq.

Gərək deməyəydi, deməyəydi gərək atası bu sözləri. Axı bilirdi ki, Zaur necə də “Volqa” tamarzısıdır, hətta, gecələr Zaurun yuxusuna da girirdi bu maşın. Gərək atası deməyəydi bu cümləni. Təhminədən əl çəkməyin bahasına verilən rüşvəti təklif etməyəydi gərək Zaura.

Zaur:

– Yenə bir sözün var, ata? – dedi.

– Nə sözüm?

– Deyirəm, daha ayrı bir sözün yoxdur ki, mənə.

Məcid şübhəylə:

– Yox, – dedi.

– Çox əcəb. – Atasının sevimli ifadəsini təkrar etdi. – Mən diqqətlə qulaq asdım sən deyənlərə. Mən sizin oğlunuzam və hər ikinizi – anamı da, səni də – çox istəyirəm. Amma nə etməli, görünür, qismət beləymiş. Kim nə deyir desin, mənimçün heç bir dəxli yoxdur. “Volqa” təklif etdiyinçün mənə çox sağ ol. Amma mən sənin “Moskviç”ini də qaytarıram, bu da açarları... Əynimdəki bir bu kostyumdan başqa heç bir şey götürmürəm... Salamat qalın...

Məcidin rəngi ağappaq ağardı, dili-dodağı təpə-təpə:

– Rədd ol, – dedi, – itil gözlərimdən, rədd ol o fahişənin yanına!

Zaur anasıyla görüşmədən qapıdan çıxdı...

## Onuncu fəsil

*Ey, məh, mənimlə dustlarım düşmən eylədin,*
*Düşmən həm eyləməz bu işi kim, sən eylədin.*

Torpağın altından, yerin dərinliyindən işığa can atan ot kimi, bitki kimi Zaur da yuxunun qaranlıq və qatı zəminindən səhərə doğru boylanırdı...

Tül pərdəli pəncərələrdən çəpəki günəş şüası dolub otağın döşəməsinə düşmüşdü səhər... Mətbəxdən ləzzətli iylər dolub otağa süzülürdü səhər... Haradasa yarıpıçıltılı, gülüşlü, sevincli səslər qatmaqarışığıyla radionun ertə konsertiylə mənzilə dolurdu səhər. Təhminə idi yarıpıçıltıyla danışan, gülən... Qonşu Mədinəydi yarımpıçıltıyla danışan, gülən. Səhər açılmışdı, Təhminə mətbəxdə qayğanaq bişirir, çay dəmləyir, Mədinəylə laqqırtı vururdu və Zaurdan danışırdılar. Səsinin hər xalında sevinc vardı Təhminənin, gülüşünün hər çalarına bəxtiyarlıq hopmuşdu Təhminənin və bütün bu səhər sevincləri Zaurla bağlıydı...

– Tənbəlin böyüyüymüş Zaur, – deyirdi, – heç cür oyanmaq istəmir, – otağa gəldi. – Tənbəl, tənbəl, a tənbəl, yatsan olar iş əngəl, dur Zaurik, gün çıxıbdı günortanın yerinə.

Hələ də gözləri qapalıydı Zaurun, tamam ayılmamışdı, amma yuxulu da deyildi, qəribə bir orta vəziyyətdə idi – məkanı, harda olduğunu, ayın tarixini, öz vəziyyətini dəqiq təyin edə bilməzdi indi, amma eyni zamanda, xoş bir səhər hissi, qayğısız bir erkənlik, təzəlik, saflıq ovqatı duyurdu, bir yüngüllük, işıq vardı içində, elə bil içində xoş bir mahnı oxunurdu. Təhminənin səsi yenə uzaqlaşdı, yenə mətbəxdən gəldi:

– Müsibətlə durur yuxudan, elə birtəhər əl-üzünü yuyub küçəyə cumur ki, işə gecikməsin. Uşaq kimidir lap. Gərək uşaq kimi qaydına qalasan, özbaşına qoysan, səhər heç çay-çörək də yeməz... – səsi yenə yaxınlaşdı və otaqdan gəldi. – Xan həzrətləri buyurub dursunlar, yemək-içmək hazırdır.

Zaur gözlərini açdı, gülümsündü, gərnəşdi.

– Yox, çox pis öyrədiblər, ərköyün böyüdüblər, – yenə də mətbəxdə Zaurdan Mədinəyə şikayət edirdi.

Məhəbbətlərinin ilk çağlarında – adamın bütün içini çapıb-talayan görüşlərin xoş qarətindən sonra Zaurda qəribə bir istək oyanırdı – Təhminədən ayrılandan sonra dostlarıyla, sırf kişi məclisində oturmaq, yeyib-içmək, deyib-gülmək istəyi. Bəzi kişilərin öz eşq macəralarından açıq-saçıq söhbət eləmələrindən zəhləsi gedirdi Zaurun. Heç bir vaxt özü belə söhbətlər eləməzdi, illah da ki, Təhminəyə aid heç bir şeyi heç kəslə bölüşməz, qürrələnməzdi. Amma məhəbbət görüşlərindən sonra sırf kişi məclislərinin asudəliyi Zauru cəlb edirdi, çünki bura – öz zarafatları, ümumi məzəli söhbətləri, müştərək xatirələri olan dostların məclisinə – Zaur içini limhəlim dolduran bir sirlə, sehirlə, heç kəslə bölüşülməyəcək duyğularla gəlirdi. O da söhbətlərdə, mübahisələrdə, zarafatlarda iştirak edirdi, amma fikri-xəyalı buralardan uzaqlarda – Təhminənin yanındaydı və fərəhlə düşünürdü ki, yəqin Təhminə də, harada olursa-olsun, Zauru yada salır, keçmiş görüşlərinin xoş anlarını bir də fikrində canlandırır, yaşadır. İndi Zaur başa düşmüşdü ki, Təhminə də təqribən belə bir hiss keçirirmiş və Zaurla görüşlərindən sonra mütləq Mədinəylə ünsiyyət, təmas ehtiyacı duyurmuş. Aşiq olan insan eqoistləşir, ona elə gəlir ki, keçirdiyi xoşbəxtlik, səadət dəmləri başqalarına da yoluxa bilər. Halbuki başqasının sevinci insanı çox nadir hallarda eyni dərəcədə sevindirə bilər, əksərən, hər bir insan başqasının sevincinə biganə qalır, bəzən hətta, qısqanır, ya həsəd çəkir bu özgə sevincinə. Məhəbbət – iki nəfərin şəxsi

işidir, deyirlər ki, üçüncü artıqdır, amma bəzən məhz bu üçüncü gərək olur iki sevişənə – səadətlərinin şahidi kimi. Bu şahid güzgü kimi lazımdır onlara – güzgüyə baxıb öz xoşbəxtliklərini görmək üçün. İndi Zaurla Təhminənin xoşbəxt günlərinin belə bir güzgüsü, belə bir şahidi peyda olmuşdu və adı Mədinə idi... Mədinə gündə neçə dəfə keçirdi Təhminəgilə – lap səhər erkən də, gecənin bir yarısında da. Çox vaxt gəzməyə də bir yerdə çıxırdılar – Təhminə, Zaur, Mədinə...

Küçədə təsadüfən rastlarına çıxan bir adam – ümumi xatirələrin qəhrəmanı olurdu: "Yadında, "Azərbaycan" kinosunun yanında o axsaq vəkilə rast gəldik: öz-özüylə danışırdı, yəqin məhkəmədəki nitqini məşq edirdi...". "O qoca arvad yadında, Parapetin yanında itlə gəzməyə çıxmışdı, iti nə yaman özünə oxşayırdı, ay Allah?"

Bir dəfə gecəyarısı kinodan qayıdırdılar. Cavan bir oğlana rast gəldilər, oğlan evlərin tinində elektrik qutularının qapaqlarını açır və işıq reklamlarını keçirirdi. Əmanət kassaları, sığorta, yeni filmlər haqqında iri şəhər reklamlarının hərfləri bir-bir sönürdü. Belə qəribə bir peşə varmış – gecələr şəhərin reklam işıqlarını söndürmək peşəsi... Mötəbər ailə başçısı ailə üzvləri yatandan sonra mənzilin bütün işıqlarını yoxladığı, söndürülməmişini söndürdüyü kimi bu oğlan da şəhərin çıraqlarını keçirirdi. Təhminə, Zaur və Mədinə uzun zaman bu romantik peşədən danışdılar və Təhminə dedi ki, bir başqa romantik peşə sahibini də tanıyır – o da bulvardakı fontanları səhərlər işə salır və gecələr yatırdır. Bir gün xəstələnib işə çıxmasa bulvardakı fontanlar o gün fəvvarə vurmayacaqlar.

– Amma ən maraqlı peşə bilirsiniz hansıdır? – Təhminə əvvəl Zaura, sonra Mədinəyə baxdı. – Hava məlumat idarəsində işləmək. Mən özüm bir vaxt yaman metereoloq olmaq istəyirdim. Təsəvvür edirsiz, yağışdan, küləkdən xəbərdar olacaqsan, buludlar hardan gəlir, qasırğa harada qopacaq, ildırım haçan çaxacaq...

Bəzən bu gəzintilər zamanı tanışlarına rast gəlirdilər və tanışlar hər üçünü – Təhminəni, Zauru, Mədinəni diqqətlə süzürdülər. Və həmin o şəxslər ki, Təhminənin hər hərəkətini Zaurun anasına yetirərdi, indi Zaurla Təhminənin və Mədinənin gecə gəzintiləri haqqında arvada yerli-yataqlı xəbərlər çatdırır, yarasına duz basırdılar. Cin vururdu Zivər xanımın təpəsinə və o telefonu qapıb, Təhminəyə zəng edir, dişinin dibindən çıxanı deyirdi... Zaur bu barədə ancaq üçüncü, ya dördüncü zəngdən sonra bildi...

Bir dəfə gördü ki, Təhminə telefona yanaşdı, dəstəyi qaldırdı: "Bəli, mənəm", – dedi, amma birdən-birə ağappaq ağardı, dili-dodağı əsdi və bir müddət lal-dinməz dəstəyi qulağında saxlayıb asdı.

Zaur:

– Kim idi? – deyə xəbər aldı.

Təhminə:

– Düz düşməyiblər, – dedi. Zaur başa düşdü ki, yalan deyir, amma nə illah elədisə də, Təhminə bir şey demədi. Zaurun heç ağlına da gəlməzdi ki, anasıymış zəng vuran. Onun ağlına tamam başqa şeylər gəlirdi: yenə də qısqanırdı Təhminəni, yenə də elə bilirdi ki, Təhminə ondan nə isə gizlədir. Axı, doğrudan da, Təhminəyə çox tez-tez zəng vururdular, özü də dəstəkdən gələn səslərin çoxu kişi səsi idi... Təhminə telefonla çox mehriban danışırdı, sonra isə mısmırığını sallayan Zaura:

– Sən də qəribə adamsan e, Zaurik, – deyirdi, – dərzimdir də. Demişdim ki sənə, paltomu vermişəm qısaltsın. Axşam primerkaya getməliyəm.

– Nə danışırsan, Zaur, diş həkimidir də, görmürsən dişlərimi müalicə elətdirirəm, zəng eləmişdi ki, bu gün gəlməyim, işi var, gələn həftə gəlim.

Amma ikinci, ya üçüncü dəfə idi iki, bax beləcə telefonu götürür, nə isə eşidib susur və dinməzcə dəstəyi yerinə qoyurdu və bundan sonra da bir müddət halı özündə olmurdu.

– Yenə ayrı yerə düşüblər? – deyə soruşdu Zaur.

Təhminə:

– Hə, – dedi və tələsik vanna otağına keçdi... Zaura elə gəldi ki, oradan hıçqırıq səsləri eşidilir, amma yarım saatdan sonra Təhminə vannadan çıxdı, sifəti tərtəmiz və açıq idi, üzü də qayğısız gülümsünürdü.

Səhərisi gün yenə zəng olundu və Təhminə dəstəyi qaldırıb pərişan bir halda susduqda Zaur bildi ki, zəng vuran həmin adamdır, ehmallıca arxadan Təhminəyə yanaşdı, birdən kəskin hərəkətlə dəstəyi qapıb öz qulağına tutdu. Dəstəkdən hiddətli qadın səsi və elə bil zəhərlə yoğrulmuş bir nəfəs gəlirdi:

– Ay qəhbə, ay üç manatlıq şortu, sən elə bilirsən uşağımızı əlimizdən ala biləcəksən? Ay sənin ölmüşünü görüm, ay mürdəşir yusun sənin o həyasız sifətini! – Zaur dərhal dəstəyi qoydu, bu səsi dünyada heç bir başqa səslə dəyişik sala bilməzdi – anasının səsiydi bu.

Təhminə qolu-qanadı sanki qırılıb yanına düşmüş Zaura baxdı, qəmli-qəmli gülümsündü:

– Di sakit oldun? – dedi.

Zaur xəcalətindən nə edəcəyini bilmirdi, bilmirdi nə desin, nə etsin və güc-bəlayla yalnız:

– Dünən də o idi? – deyə soruşdu.

Təhminə ağır-ağır başını yellədi, sonra yavaş səslə əlavə elədi:

– Hər gün zəng eləyir. Sən bura köçəndən bəri hər gün.

Bir ay idi Təhminəgildə yaşadığı. O soyuq noyabr günü atasıyla danışdıqları, evlərindən çıxıb getdiyi axşam yadında idi. Atasıyla o ağır söhbətdən sonra, anasıyla görüşmədən qapını çırpıb evlərindən çıxmış, bura gəlmiş və hər şeyi Təhminəyə danışmışdı... Təhminə:

– Zaurik, – dedi, – yəqin ki, mən yaxşı adam, nəcib qadın olsaydım, gərək sənə deyəydim: yox, yox, əzizim, cavan həyatını mənə qurban vermə, qayıt evinizə, ata-ananı bədbəxt eləmə. Amma mən yalan danışmaq istəmirəm. İstəyirəm qalasan mənimlə, hətta, belə ağır şeylərin bahasına olsa da qalasan... Yəqin mən çox pis adamam və çox amansız qadınam... Neyləyəsən?..

***

Yalnız Təhminənin yanında qalandan sonra Zaur uzun gecələrin Təhminəyçün nə qədər əzablı olduğunu başa düşdü. Təhminə yata bilmirdi, yuxusuzluq bəlasına düçar idi və səhəri açmaq onunçün həyatın ən ağır işgəncələrindən idi. Təhminə bu dəhşətli tənhalıq gecələri haqda çox danışırdı Zaura və deyirdi ki, ən dəhşətli tənhalıq – gecə tənhalığıdır və əriylə yaşadığı vaxtlar o bu dəhşətli gecə tənhalığını bəlkə daha da ağır hiss edirdi, "indi isə sən – canlı, isti bir varlıq – buradasan, yanımdasan və mən özümü tənha hiss eləmirəm" – deyirdi...

– Xan, barı bir gözünüzü açın, yeməyinizi yatağa gətiriblər.

Padnosda qayğanaq, kofe və xırda-xırda doğranmış kəllə qənd gətirmişdi... Dünən axşam kəllə qəndləri yox idi. Zaur axşam çay içəndə dedi ki, bu biri qəndi xoşlamır və Təhminə səhər tezdən durub dükana düşmüş, Zaur yuxudan oyananacan kəllə qənd alıb gətirib, xırda-xırda doğramışdı. İndi Zaur bütün bunları yadına salıb, sonsuz bir məmnunluqla kəllə qəndi ağzına qoyur, gülümsünürdü. Təhminə onun bu məmnun gülüşünə baxıb qəhqəhə çəkdi:

– Aman Allah, kişilər lap uşaq kimidirlər e... Xırda bir arzunuzu yerinə yetirən kimi ağzınız gedir qulağınızın dibinə. Madam ki, hər xırda istəyinizə əməl edirik, elə bilirsiz ki, day sizin yolunuzda sino gedirik. Odur ki, tez tora düşürsüz də.

Zaur qəndi uddu, kofedən bir qurtum aldı, udqundu və:

– Bəs əslində belə deyil, sino getmirsən mənimçün? – dedi.

Təhminə cavab vermədi, dilini göstərdi ona və otaqdan çıxdı.

Zaur addımlarını dinləyirdi Təhminənin. Təhminə mətbəxə gedirdi, otağa qayıdırdı, əynindəki paltar təkin sadə və yüngül bir melodiya

zümzümə edirdi, hardan düşmüşdü bu melodiya dilinə? Bu melodiyada işıqlı bir səhər erkənliyi vardı, divara düşmüş çəpəki günəş şüaları, sabundan üfürülən şarlar vardı, apaydın, apaçıq mavi səmada uçan rəngbərəng çərpələnglər vardı – qayğısız uşaqlığın bütün işığı, buludsuzluğu vardı və ılıq dekabr gününün gözlənilməz bol günəşi pəncərələrdən otağa dolub oboyların çiçəklərini də elə bil doğrudan çırtdatmışdı... Kofe də isti idi, çörək də isti və təzəydi, qayğanaq da ləzzətliydi, Təhminə də sadə melodiyanı hey zümzümə edirdi və bütün bunlar elə cavab idi də...

***

Səhərlər Təhminənin səliqəli mətbəxində yemək yeyərkən bəzən öz evlərini yada salardı. Təhminənin mətbəxi həmişə tərtəmiz olardı, döşəməsi qara-yaşıl kvadratla döşənmişdi, masanın üstündə də dördkünc Vyetnam salfetləri düzülmüşdü, elə bil pəncərələrdən düşən işıq da dəqiq kvadratlara bölünmüşdü. Bu mətbəxin səliqə-sahmanı nədənsə Zaurun xəyalında anasının mətbəxini canlandırırdı. Evlərində mətbəx masasının üstü həmişə qalaq-qalaq çirkli qabla dolu olardı və Zaur səhər yeməyini yemək istəyəndə bu çirkli-yağlı boşqabları aralayıb masanın üstündə kiçicik bir yer açardı, çayını-çörəyini orda yerləşdirib, birtəhər yeyərdi. Tələsik yeyərdi, çünki ətrafdakı yağloçalara, illah da hardansa gəlib bu boşqabların arasına düşmüş anasının iri darağına baxanda ödü ağzına gələrdi. Darağın üstündə də həmişə bir çəngə tük olardı...

Mətbəxin, evin, üst-başının təmizliyinə, səliqəsinə Təhminə o qədər vaxt sərf edərdi ki, Zaur, hətta, təəccüblənirdi də. Təhminə: "Bəs necə, – deyərdi, – evdə təmizlik ən vacib şərtdir, adamın kefi-əhvalı da, özünü necə hiss eləməsi də hamısı bundan başlanır. Evin təmizliyini gərək uşaqdan-böyüyə hamı gözləsin. Özü də lap körpəlikdən tərbiyə etmək lazımdır bu hissi".

Uşaqların tərbiyəsi haqqında saatlarla danışa bilərdi... oğlu olsaydı onu necə tərbiyə etməsindən (idmanla məşğul olardı mütləq, ən kiçik yaşından üzmək öyrənərdi), qızı olsa onu necə böyütməsindən (gəlin kimi geyindirib bəzəndirərdim onu, üç yaşından balet məktəbinə verərdim ki, bədəni mütənasib olsun) elə hey söz açardı və deyərdi ki, onun uşaqları dünyada ən səliqəli və ən gözəl uşaqlar olardı yəqin.

Amma bəzən tamam başqa şeylər deyirdi... İstərdim ki, deyirdi, çoxlu uşağım olsun, hamısı da səliqəsiz, murdarçı, bütün bu mənzili çirkləndirib batırsınlar və həm də bu uşaqlar Zaurun uşaqları olsun. Hər

ikisi – Zaur da, Təhminə də – bütün günü onların çirklərini, zibillərini təmizləsinlər, his-paslarını yusunlar, dallarıycan zibillərini təmizləsinlər, yorulub əldən düşsunlər, amma bütün bunlara baxmayaraq yenə də bir-birini sevsinlər. Bütün günü uşaqlarla əlləşib axır ki, onları yatırsınlar və onları yatırandan sonra yenə də bir-birlərinə qovuşsunlar – bax əsil məhəbbət bu olardı – məişətin, gündəlik həyatın hər cür xırda-para qayğılarından, əzab-əziyyətlərindən, çirkindən, hisindən-pasından keçib, əvvəlki çılğınlıqda qalan məhəbbət doğruçu məhəbbətdir, yoxsa ki, elə-belə "quru-quru qurbanın olumun" nə qiyməti var?

– Sən heç bilirdin, Zaur, demə uşaqlar ana bətnində yuxu görürlərmiş... Bircə biləydim nə görürlər yuxularında, axı hələ dünyadan xəbərsizdirlər, nə xəyalları, nə təsəvvürləri ola bilər ki, onu da görsünlər yuxuda. Amma elmi, tibbi surətdə təsdiq olunub ki, ana bətnində yatıb dururlar, yuxu görürlər, özləri də bilirsən nə cür yuxuya gedirlər – ana ürəyinin döyüntüsü altında... yəqin orada... bu səs təbil səsi kimi gəlir. Belə bir eksperiment eləyiblər: ana ürəyinin döyüntüsünü maqnitofona yazıblar və yenicə dünyaya gəlmiş uşağın qulağının dibində səsləndiriblər, o saat yuxuya gedib uşaq... Eh, Zaurik, heyif ki, mən ana ola bilməyəcəyəm heç vaxt.

– Nə əcəb bəs uşaq götürmürsən? – dedi Zaur. "Götürmürük" yox, məhz "götürmürsən". Bu barədə hər ikisi – Zaur da, Təhminə də eyni anda fikirləşdi...

Təhminə bir qədər susduqdan sonra:

– Bilirsən, – dedi, – mənim də ağlıma gəlib. Amma qərara gəldim ki, heç bir vaxt eləməyim bu işi. Axı, Zaurik, mən dəliyəm, xasiyyətimi bilirsən necədir, üç günə, bir həftəyə, bir aya o uşağa elə bağlanardım ki, doğma balamdan da artıq istərdim. Amma hər an, hər dəqiqə onu da düşünərdim ki, mənimki deyil. Qorxudan ürək-göbəyimi yeyərdim, birdən uşağın əsil ata-anası çıxdı və nə cürsə tanıdılar uşağı – nağıllardakı kimi, məsələn, kürəyindəki bir xala görə. Yaxud lap elə ata-anası olmasın, hər halda kimsə bir mərdimazar bir gün həqiqəti açıb deyəcək uşağa. Tutalım oğlan olsun, bir vaxt evlənəcək, o zaman arvadı mütləq açacaq bu sirri ona – sənin anan doğma deyil ki, deyəcək... Ya arvadı olmasın, başqa adam olsun, nə çoxdur belə "xeyirxahlar", mənim o qədər istəməyənlərim, düşmənlərim var ki, biri elə tutalım sənin anan – Zaur qızardı, – başqası, məni yandırmaqçün, məndən intiqam almaqçün mütləq açacaqlar həqiqəti uşağa. Təsəvvür eləyirsən, deməli, mən bütün ömrümü gərək iynə üstündə oturam, hər dəqiqə, hər gün qorxam ki, bu gün, ya sabah uşaq həqiqəti biləcək...

Deməli, o tam mənimki olmayacaq. Mən isə istəyirəm ki, kim isə tam mənasında mənim olsun, ancaq mənim... – Yenə bir müddət susdu, sonra qətiyyətlə əlavə etdi:

– Yox, özgə uşağı elə özgə uşağıdır. Mənimki deyil... Sənin kimi Zaurik... axı sən də mənimki deyilsən... Gec-tez itirəcəm səni... bilirəm axı...

Bu söhbət Zaurun Təhminənin yanına köçdüyü lap ilk günlərdə olmuşdu. Zaurun haradasa ürəyinin lap dərinliklərində gizlətdiyi bir hissin, ürəyinə dammış bir duyğunun Təhminə tərəfindən belə dəqiq ifadə olunması qəribə idi. Mat-məəttəl qalasıydı... Onlar ikilikdə içki içəndə belə Təhminə həmişə stolun üstünə üçüncü bir qədəh də qoyurdu: bu sənin, bu mənim, bu da bizim ayrılığımızın... Görüşlərinin ilk günündən gələcək ayrılıqları da onlarla birgə yaşayırdı, gündən-günə böyüyərək gündən-günə onlara yaxınlaşırdı.

***

Söhbət tamam kənar məsələdən düşmüşdü – həqiqi və yalançı kübarlıqdan. Həqiqi kübarlıq – nə bilim, babanın babasının kim olmasından, əsil-nəcabətdən, qandan-filandan asılı deyil... – deyirdi Təhminə. Həqiqi kübarlıq insanın gözü toxluğunda, özünü tutmasında, daxili ləyaqətindədir. Həqiqətən kübar və ziyalı adamı mən addımlarından tanıya bilərəm, insanın necə yeriməsi onun varlığı, mənliyi, insanlığı haqqında çox şey deyir. Məsələn, götürək Muxtarı.

Muxtar haqqında söhbətlər birgə yaşadıqları günlərdə Zaurun ən çox qanını qaraldan şey idi. Muxtar haqqında söhbətlər, bir də telefon zəngləri. Elə hamıdan çox zəng eləyən də Muxtar idi.

Zaur təəccüblə:

– Bütün günü idarədə bir yerdəsiniz, söhbətinizi eləyib qurtarmırsınız ki, evə gələn kimi yenə bir saat Muxtarla telefonla laqqırtı edirsən?

Təhminə gülə-gülə:

– Zaurik, niyə başa düşmürsən, – deyirdi, – idarədə hamı ancaq işlə məşğuldur, söhbətə, qeybətə macal qalmır. Amma telefonla qeybət qırırıq. Axı Muxtarın da qeybətlə arası kökdür. Nə deyirsən de, öz aramızdır, arvadların adı çıxıb, kişilər qeybəti arvadlardan çox xoşlayırlar. Mənim dostlarımın çoxusu...

Zaur onun sözünü yarımçıq kəsib:

"– Mənim dostlarım, mənim dostlarım", – deyə Təhminənin ağzını əydi, – yaman çoxdur sənin dostların... Yadında saxla, adam istəyəndə ki, dostu çox olsun, axırda bir nəfər də həqiqi dostu qalmır.

Təhminə soyuq bir tərzlə:

– Nədi, yəni özünü nəzərdə tutursan?.. Hədələyirsən məni? Ya xəbərdarlıq edirsən?

Zaur:

– Necə istəyirsən o cürə başa düş, – dedi. İlk dəfə onda toqquşdular.

Təhminə dinmədi. Kirimişcə geyindi, heç nə demədən çıxıb getdi... Zaur onun hara getdiyini bilirdi, axşam verilişi vardı, yarım saatdan sonra Zaur televizoru qurdu və ekranda Təhminəni gördü. O axşam bütün verilişlərə baxdı və verilişlərin arasında elan edən Təhminəni gördü... Axırıncı verilişin qurtarmasına iyirmi dəqiqə qalmış Zaur geyinib küçəyə düşdü, maşın tutdu, televiziyanın qabağına gəldi. Birinci mərtəbədəki mənzillərin pəncərələrindən televiziya ekranının mavi şüası görünür və Təhminənin səsi gəlirdi... Təhminə verilişin qurtardığını elan etdi, hamıya "gecəniz xeyrə qalsın" dedi... Beş-on dəqiqə də keçdi və Zaur Təhminənin tələsik addımlarla trolleybus dayanacağına tərəf qaçdığını gördü. Zaur çağırdı, Təhminə onu gördü, gülümsündü. Onlar qucaqlaşdılar, adamsız gecə avtobusuna mindilər və avtobus onları Təhminənin evinə – onların evinə tərəf apardı...

***

– Sən gərək məni qısqanmayasan, Zaurik, – qaranlıqda onun pıçıltıları sanki sözlərə xüsusi bir siqlət verir, həqiqət aşılayırdı; bu sözlərə inanmamaq olmurdu – qısqanmaq bilirsənmi nə deməkdir, deməli, sən özün öz zəifliyini etiraf edirsən. Amma heç kəsə qısqanmamaq hamıdan güclü olmaq deməkdir. Mən istəyirəm sən güclü olasan, Zaurik, hamıdan güclü... Özünə inanasan... Bir də mənə inanasan, Zaurik... İnan mənə... Mən sənə xəyanət etmərəm... Nə qədər ki, biz bir yerdəyik...

***

Axşamlar tez-tez musiqiyə qulaq asardılar. Təhminənin çoxlu lent yazıları vardı, amma bu yazıların toplanmasında heç bir dəqiq prinsip, ya sistem yox idi. Müxtəlif musiqi parçalarını yazdırmışdı – yalnız özünün sevdiyi musiqiləri. Çox vaxt yalnız klassik musiqini və "Leyli və Məcnun" operasını dinləmək istəyirdi... Hər axşam bir qədər rəqs etmək də xoşlayırdı, ağır ritmli caz musiqisi-blüzləri çaldırırdı və otağın dar sahəsində Zaurla qol-boyun olub, uzun zaman rəqs edirdilər. Gözlərini yumar, uzun saçlarını Zaurun çiynindən onun kürəklərinə sallayar, qollarıyla Zaurun boynunu qucaqlardı.

Çox vaxt xalq mahnıları çaldırardı: xatirəsində hər mahnı nə ilə isə bağlı idi... Musiqiyə xüsusi bir münasibət bəsləyirdi və deyirdi ki, Za-

ur onu atıb gedəndən sonra musiqi sonuncu və yeganə pənahı olacaq. "Onda musiqi qurtaracaq məni, – deyirdi, – yoxsa ölərəm, ya da içkiyə qurşanaram". Saatlarla "Küçələrə su səpmişəm", "Səndən mənə yar olmaz", "Aman ovçu", "Pəncərədən daş gəlir", "Girdim yarın bağçasına", "Papirosum yana-yana", "Qaragilə" mahnılarına, ən çox da "Laçın" mahnısına qulaq asardı... Qəlbinin ən dərin, ən gizli hisslərini, söz tapıb ifadə eləyə bilmədiyi duyğularını elə bil bu mahnıların melodiyalarında, sözlərində tapırdı. Bu sözlər – məhəbbət, ayrılıq, nisgil, ümid haqqında mahnı sözləri – dünya qədər qədim və əbədi sözlər – elə bil Təhminənin ürəyinin, varlığının dibindən, ən dərin, ən gizli guşələrindən qopub gəlirdi.

– Zaurik, gör bir nə qədər sadədir və gözəldir: "Küçələrə su səpmişəm, yar gələndə toz olmasın" gör necə sevərlərmiş bir vaxtlar, Zaurik, indi gör necə sevirlər. Məsələn, sən mən keçən küçələrə heç su səpərsənmi, toz olmasın deyə?

Zaur:

– Bakıda mümkün deyil bu, – deyirdi, – küçənin bir başına su səpənəcən xəzri o biri başını yenə toza qərq eləyəcək.

– Eh, ruhun yoxdur sənin.

Ayrı mahnı səslənirdi və Təhminə də indi başqa sual verirdi: "Qoy məni öldürsünlər bir alagöz qız üstə". – Zaurik, sən heç razı olarsanmı ki, səni bir alagöz qız üstündə öldürsünlər? Öldürmək yox, e, Allah iraq eləsin, öldürmək-zad nədir, amma bax, məsələn, sevdiyin alagöz qızın üstündə razı olarsanmı ki, bir qədər çətinliyə, əzab-əziyyətə dözəsən?

– Məlumun olsun ki, mən çox çətinliklərə, əzab-əziyyətə dözürəm, bir qaragöz qız üstdə...

– Eh, Zaurik, heç nə başa düşmürsən sən. Ürəyin genişliyinə bax e: "Qoy məni öldürsünlər, bir alagöz qız üstə". Bəs bu sözləri bilirsən, qulaq as, fikir ver: "Bir evdə ki, sən tək gözəl olmadı, o ev viran olub, talanmaq gərək". Zaurik, bu sözlər xalqın təfəkkürünü yüz dənə qalın elmi kitabdan daha gözəl ifadə edir.

Maqnitofondan mahnı səslənirdi: "Səndən mənə yar olmaz" – və Təhminə Zaurun düz gözlərinin içinə baxa-baxa bu sözləri təkrar edirdi: "Səndən mənə yar olmaz". Zaur, doğrudan da, təəccüblənirdi. Təəccüblənirdi ki, sevdiyi, amma indiyə qədər belə diqqət vermədiyi xalq mahnıları onun və Təhminənin münasibətlərindəki ən dərin, ən mübhəm duyğuları bu qədər səlis və aydın, bu qədər təsirli və yanıqlı, belə sərrast və dəqiq ifadə edə bilirlər. "Pəncərədən daş gəlir, ay bəri bax, bəri bax, xumar gözdən yaş gəlir, ay bəri bax, bəri bax. Səni mə-

nə versələr, ay bəri bax, bəri bax, Allaha da xoş gələr, ay bəri bax, bəri bax...”.

Təhminə bu sözləri də təkrar edir:

– Doğrudan da, Zaurik, səni mənə versəydilər, Allaha da xoş gələrdi, – deyirdi, amma nə olsun ki, verməyəcəklər səni mənə, dünyasında verməzlər, bilirəm axı...

*Papirosum yana-yana,*
*Od düşüb şirin cana.*
*Vallah, qoyub gedərəm, ay gülüm,*
*Qalarsan yana-yana...*

Bu mahnıdakı hədə zarafatyana bir hədə idi, amma bu zarafatın dibində acı və qaçılmaz bir həqiqət də var idi.

Axı necə olurdu, necə olurdu ki, haçansa, çox-çox qabaqlar yaşamış insanlar, onların – Zaurla Təhminənin – bu gün duyduqlarını eynilə onlar duyduqları kimi duymuş, belə gözəl və sadə sözlərlə, yanıqlı və əbədi melodiyalarla ifadə edə bilmişlər?.. Hisslərin yaşı, tarixi yoxdur, insanlar həmişə, hər yerdə eyni cür duyublar, eyni duyğular keçiriblər – məhəbbət, qısqanclıq, ağrı, sevinc, güman, nisgil, ümid, həsrət duyğuları – və eyni cür nəticələrə də gəliblər: ağrıyla-acıyla “səndən mənə yar olmaz” qərarını veriblər və bu qərarın özündə şıltaq bir yalan, tərs bir işvə var, necə yəni səndən mənə yar olmaz, səndən başqa da mənim, ya məndən başqa da sənin yarın ola bilərmi, mümkündürmü bu, əlbəttə, yox, əlbəttə, biz bir-birimiz üçün yaranmışıq, kim bizi ayıra bilər, əlbəttə, əlbəttə, biz bir-birimizinik, əlbəttə “səndən mənə yar olmaz...”

“Laçın” mahnısı səslənəndə isə Təhminə həmişə ağlayırdı, bu mahnı qəlbinin hansısa, Zaura belə məlum olmayan tellərini tərpədirdi, gözləri dolurdu, yaş gilə-gilə yanaqlarına süzülürdü. Niyə, nədən bu sözlər Təhminəyə belə dərin təsir göstərirdi: “Elçiləri qırılmış. Özü elçi düşən yar...”.

***

Təhminəgilə köçəndən bəri ilk dəfə maaşını alan kimi Zaur bazara getdi... Maaşının tən yarısını xərclədi – meyvə, qoz-fındıq, kişmiş, qərənfil və hətta, ət aldı. Nə isə indiyəcən yaşamadığı bir hiss – evdarlıq hissi duyurdu və pilləkənləri fərəhlə, sevinclə, tələsə-tələsə qal-

xırdı. Təhminə kefinə soğan doğramadı? İki kilo əti o yan-bu yana çevirdi, üz-gözünü turşudub:

– Adam belə ət alar, – dedi, – başdan-ayağa sür-sümükdür, bir də şəntir. Hardan ağlına gəldi bazarlıq eləmək? Heç olmasa mənə deyəydin, göndərərdim səni Fazilin yanına, mənim tanışımdır, həmişə ətin yaxşı yerindən saxlayır mənimçün... Evdə səni pis öyrədiblər, yəqin ömründə bazarlıq eləməmisən, hə?

Zaur hirslə:

– Bəli, – dedi – bazarda tanış ətçim də yoxdur.

– Elə görünur ki, yoxdur, yoxsa belə uşaq kimi başını aldadıb zir-zibili verməzdilər qoltuğuna.

Zaur dinmədi, qaşqabağını salladı və ta axşama kimi Təhminəylə kəlmə kəsmədi.

Axşam televizorla filmə baxırdılar, yenə də dinib-danışmırdılar. Filmdə toy səhnələri vardı... Təhminə birdən gözlənilməz bir tərzdə Zaura müraciət elədi:

– Zaurik, bilirsən necə istərdim ki, mənim də toyum olsun. Özü də lap elə bizim bütün dədə-baba qaydalarıyla: əvvəl elçilər gəlsin, həri alsınlar, sonra nişan, sonra toy... Uzun ağ paltar, çalğıçılar, gəlin havası, güzgü, şamlar...

Düz Zaurun gözlərinin içinə baxıb susdu, yenidən danışmağa başlayanda Zaur mat qaldı ki, Təhminə necə də məharətlə onun ürəyindən keçən ən ani fikirləri, düşüncələri açıq kitab kimi oxuya bilir – elə düşüncələri, elə fikirləri ki, Zaur özü belə onları dəqiq müəyyənləşdirə bilmirdi.

– Zaurik, sənin başına gələcək bütün bunlar, bilirəm. Elçi də göndərəcəksən, nişanın da, toyun da olacaq. Amma, vallah, heç çür sənin Spartakla yeznə-qayın olacağını təsəvvürümə gətirə bilmirəm.

Zaur başını buladı. Təhminə ciddi tərzlə:

– Bilirsən nə var? – dedi. – Başını-zadı yelləmə. Nə olub, deyirlər, doğrudan da, gül kimi qızdır. Minnətin olsun sənin. Ümumiyyətlə, başa düşmürəm nə adətdir siz kişilərdə, dartıb özünüzü dağ başına qoyursunuz “evlənəcəm, evlənməyəcəm, bəyənirəm, bəyənmirəm...”. Guya ki, evlənməyinizlə qadınları xoşbəxt eləyirsiz.

Zaur siqaret çıxartdı, kibrit çəkdi, kibritin qığılcımından bir qor kənara sıçradı, divarın güncündə dayanmış iri, əlvan hava şarının üstünə düşdü. Təhminə:

– Vay, neylədin, – deyə yerindən sıçradı: şar partlamışdı...

***

Sonralar Zaur heç cür müəyyənləşdirə bilmirdi – haçan, axı haçan başladı bütün bu şeylər. Bəlkə növbəti bir zəngdən sonra – Təhminə tanışlarından kimləsə uzun-uzadı danışırdı. Zaur isə mətbəxdə papiros çəkir, hirsini içində boğur və Təhminənin şən zarafatlar etməsinə, deyib-gülməsinə diqqət edirdi... Ondamı? Ya başqa bir vaxtda – Təhminə özünü pis hiss eləyirdi, xəstələnmişdi, bazara Zaur getməli oldu, hər şeyi alıb gətirəndən sonra isə Təhminə onun bazarlığını lağa qoymağa başladı, "əlindən heç bir iş gəlmir, – dedi: – bu nədi belə alıb gətirmisən, deyirdim sənə axı, Fazilə yanaş, mənim adımdan xahiş elə, ətin yaxşı yerindən versin...".

Zaur ölsəydi də Fazilə yanaşmazdı. Təhminə onu nişan verəndən sonra göz qoymuşdu bu yoğun peysərli, qırmızısifət, qarabığlı ətsatana, az-çox gözəgəlimli qadınlara, qızlara-ət verəndə Fazilin ağzının suyu axırdı...

Bəzən Zaura elə gəlirdi ki, Təhminə qəsdən onun yaralı yerlərini qurdalayır, zəif damarını tutur... Küçədə Zaur hər hansı bir maşına bir az artıq baxdımı, Təhminə dərhal masqaraya başlayırdı. "Hə, nədi, "Moskviç"in yadıva düşüb? Valideynləri dəcəl oğlancığazlarını cəzalandırıblar – oyuncağını əlindən alıblar yazıq uşağın". Bu cümlələrin deyiliş tərzi, "oğlancığaz, uşaq" sözləri Zauru cin atına mindirirdi. Hiss edirdi ki, hiddət onu get-gedə daha artıq boğur, bütün içini çulğalayır və belə dəqiqələrdə o, hətta Təhminəyə nifrət edirdi. Bəlkə də bu hiss başqa bir gün başlamışdı. O gün ki, Təhminə Mədinənin yanında Zaurun anası barədə danışmağa başladı, dedi ki, indi tək evdə yox, idarədə də Təhminəni rahat buraxmır, ora da zəng vurur. Mədinə dedi ki, kaş bircə dəfə Zivər xanım zəng vuranda dəstəyi mən götürəydim, dərsini verərdim onun. Zaur özünü güclə saxladı, hiddət butün içini çulğamışdı, o tək Mədinəyə yox, Təhminəyə də ağzından çıxanı demək istəyirdi, – axı hər halda söhbət anasından gedirdi... Doğrudur, anasının hərəkətləri də nalayiq hərəkət idi, amma hər halda Mədinənin – tamamilə yad adamın borcu deyil onların sırf ailə məsələlərinə qarışsın. Yaxşı. ki, Mədinə artıq-əskik söz demədi və heç bir vaxt bu söhbətə qayıtmadılar, amma o gün Mədinə bircə kəlmə də desəydi anası barədə, – Zaur aləmi dağıdacaqdı.

Bütün bunlardan xırda-xırda müəyyən bir fikir, bir hiss oyanırdı, necə deyərlər, dama-dama göl olurdu və bir gün Zaur nədənsə, yaman darıxdı, qəribsədi anasıyçün, Təhminənin səliqəli, təmiz mətbəxində şam yeyərkən anasının çirkli, səliqəsiz mətbəxi gəldi durdu gözlərinin

qabağında – fikri yayındı, gözləri yol çəkdi. Təhminə də dərhal bunu gördü, amma Zaurun imdadına yetməkdən, təsəlli verib, ovudub, yenidən onu yanına qaytarmaqdansa, əksinə, elə bil tərs damarı tutdu, rişxəndlə istehzaya keçdi:

– Hə, nə olub, uşağın gözləri yenə yol çəkir? – dedi. – Olmaya "Moskviç"i düşüb yadına?

Qəsdən belə deyirdi, qəsdən Zaurun intizarını, ata-ana həsrətini "Moskviç"lə, Zaurun məhrum olduğu məişət rahatlıqlarıyla, bayağı vərdişlərlə bağlamaq istəyirdi.

Zaura elə gəlirdi ki, Təhminə onu yalnız "Moskviç"ə qısqanır. Ona qəribə görünürdü ki, özü Təhminəni belə ağrıyla, əziyyətlə hamıya qısqandığı halda, Təhminə Zauru heç kəsə qısqanmır. Zaur onu da bilirdi ki, Təhminə onun keçmiş məhəbbət əlaqələrindən, hətta, idmançı Tanyadan belə xəbərdardır, amma heç vaxt Zauru nə keçmişdə, nə indi, ya da gələcəkdə mümkün ola biləcək əlaqələrinə görə zərrə qədər qısqanmırdı. Nə idi bunun səbəbi? Bəzən Zaura elə gəlirdi ki, Təhminə əslində onu sevmir, ona görə də biganədir. Bəzənsə duşünürdü ki, yox Təhminənin xasiyyəti belədir, ümumiyyətlə, qısqanmağa qadir deyil.

Bu barədə söhbətləri düşəndə Təhminə zarafata saldı:

– Bilirsən, Zaur, – dedi, – mən o qadınlardanam ki, heç kəsə qısqana bilmərəm, əksinə hamı mənə qısqanmalıdır kimisə... Lap tutalım sən başqasıyla oldun, məni unudamı biləcəksən?

Zaur fikirləşirdi ki, yəqin doğrudan da belədir: deyirlər, kişini bir qadının dərdindən yalnız başqa bir qadın qurtara bilər. Təhminənin dərdindən qurtara bilən qadınmı vardı bu dünyada?

Bəzən onların ayrılacaqları barədə Təhminə soyuq və sərt bir dəqiqliklə danışırdı. Bir axşam Təhminənin uzun-uzadı telefon söhbətindən sonra Zaur yenə onu sorğu-suala tutdu: kimnən danışırdın, niyə belə uzun danışırdız, nə barədə belə gülüşürdüz.

Təhminə lap özündən çıxdı:

– Bura bax, Zaur, – dedi, – lap təngə gətirdin məni. Bəsdir də... Canımı boğazıma yığmısan bütün bu şübhələrinlə... Nə istəyirsən məndən, canım? Yaşayırıq səninlə, mənim evimdə qalırsan, həmişə yanındayam, daha nə lazımdir sənə, başa düşmürəm... Bəlkəm məni qıfılla bağlayasan, evdən bayıra buraxmayasan, hə? Telefonu da kəsdirəsən biryolluq? Nə vermisən mənə ala bilmirsən? Ailə qurmusan mənimlə bəlkə, ya uşağım var səndən?! Nə böyük qurbanlar vermisən mənim yolumda ki, bu qədər çox şey tələb edirsən? Evinizdən çıxıb getməyinlə çox qürrələnmə, bilirsən? Böyük fədakarlıqdır – maşının-

dan keçib! Darıxma, qayıdacaqsan evinizə, maşınını da qaytaracaqlar sənə, evləndirəcəklər də səni halal südəmmiş qızla.

Zaur ömründə Təhminəni belə acıqlı, zəhər dilli görməmişdi, elə bil gözü-başı od püskürürdü. Amma birdən-birə susdu, elə bil sakitləşdi, süstləşdi və yorğun bir ədayla, yavaş səslə sözünü tamamladı: – Çıxıb gedəndən sonra nə qalacaq səndən mənə? – Gözü Zaurun kibritinin oduyla partlamış, atılıb bir qıraqda qalmış boş şara sataşdı: – bircə bu şar – deyə gülümsündü, – onu da yandırdın...

Zaurun matı-qutu qurumuşdu, nə edəcəyini bilmirdi. Bilmirdi ki, indi, bu saat necə hərəkət etsə daha düzgün olar: durub Təhminəni söysünmü, yaxud ondan üzr istəsinmi, yaxud heç bir söz demədən çıxıb getsinmi bu evdən...

Təhminə siqaret yandırdı, dərin bir qullab vurub tüstünü havaya buraxdı və Zaura tərəf çevrilib:

– Bax bu tüstü kimidir bizim münasibətlərimiz, – dedi, əlini yelləyib tüstünü qovdu, – görürsən, heç bir şey yoxdur...

## On birinci fəsil

*Könüldə min qəmim vardır ki, pünhan eyləmək olmaz.*
*Bu həm bir qəm ki, el tənindən əfqan eyləmək olmaz.*
*Nə müşkül dərd olursa, bulunur aləmdə dərmanı.*
*Nə müşkül dərd imiş eşqin ki, dərman eyləmək olmaz.*

– Neçə yaşındasız?

– Bunun nə dəxli var?

– Dəxli çoxdur. Uşaq deyilsiz, öz hərəkətlərinizə nəzarət eləməlisiniz, cəmiyyət qarşısında məsuliyyət duymalısız.

– Cəmiyyətin bura nə dəxli var axı?

– Necə nə dəxli var? Biz cürbəcür siqnallar alırıq. Gərək bu siqnallardan müəyyən nəticələr çıxaraq. Bizim komsomol təşkilatı, hətta, sizin məsələnizi büroya çıxarmaq istəyirdi... Siz özünüz də deyəsən, axı büronun üzvüsünüz?

– Bəli.

– Görürsünüz. Siz komsomol bürosunun üzvüsüz, özgələrə nümunə olmaq yerinə özünüzü bu cür nalayiq aparırsız. Yalnız komsomolçular deyil, idarəmizin başqa mötəbər işçiləri də sizin hərəkətlərinizdən çox narazıdırlar.

Zaur dərhal "Dadaş" deyə düşündü.

– Yoldaşlar belə hesab edir ki, sizin özünüzü belə aparmağınız kollektivimizin üstünə kölgə salır, gənclərin əxlaq tərbiyəsinə mənfi təsir göstərir, ümumən bizim əxlaq kodeksimizə ziddir.

– Mən ərizə verib çıxa bilərəm işdən.

– Yaxşı– yaxşı, özünüzdən çıxmayın. Mən kollektivin fikrinə biganə qala bilmərəm... Siz də hələ cavansınız. Bütün ömrünüz qabaqdadır, parlaq gələcəyiniz ola bilər, əgər indidən ağlınızı başınıza yığsaz, lazımsız hərəkətlərə yol verməsəz, əgər siz...

Zaur onun sözünü ağzında yarımçıq qoyub otaqdan çıxdı.

***

Zaur qapını öz açarıyla açıb içəri girdi, indicə yazıb verdiyi ərizənin – işdən çıxmaq haqqında ərizənin – hər sözünü bir də beynində götür-qoy edirdi... Yaxşı, bəs hara işə düzələcək? İşə düzəlmək üçün ona kömək edə biləcək tanış-bilişini yadına salmaq istəyirdi... Geoloji ekspedisiyanın birinə qoşulmaq olardı, bu barədə fikirləşən kimi Azər Mərdanovu xatırladı. Universitetdə bir yerdə oxumuşdular, o vaxtdan bəri dost idilər. Azər indi, deyəsən, haradasa Filizçay tərəfdədir. Əgər bu iş düzəlsə, Zaurun taleyi tamam dəyişə bilər və Təhminəylə münasibətlərində də müəyyən bir dəyişiklik əmələ gələr: axır günlər Təhminənin evində – nə deyirsən de – hər halda bir vaxt Manafın mənzili olan evdə – yaşamaq onunçun ağır idi... Manaf, əlbəttə, Zaurun orada yaşamasından xəbərdar idi, amma bir dəfə də olsun Təhminəni evi dəyişmək haqqında qərarı icra etmək üçün tələsdirməmişdi. Təhminə də bunu qiymətləndirirdi və özü tələsirdi, tezliklə mənzilini iki ayrı-ayrı otağa dəyişmək istəyirdi, amma olunan təkliflərdən heç birini bəyənmirdi. Bu məqsədlə də çox zaman uzun-uzadı telefonla danışar, cürbəcür mənzilləri gəzirdi və hətta, hansı mənziləsə – Zaur bunu biləndə lap dəli olmuşdu – Spartakla birlikdə getmişdi. Özü demişdi bu barədə Zaura...

Zəng oldu, Zaur telefonu götürdü:

– Zaur? Salam, Muxtardır.

Zaur:

– Tanıdım, – dedi, – Təhminə evdə yoxdur.

– Haçan gələcək?

– Bilmirəm.

– Bağışlayın.

Zaur divanın üstündə uzanıb papiros çəkirdi, tavana baxırdı. Harda ola bilər Təhminə? Hər halda işdə deyil, yoxsa Muxtar evə zəng eləməzdi.

Bəs hardadır? Bu barədə fikirləşmək mənasızdır. Soruşsan deyəcək ki, dərzidəydim, ya çəkməçidə, ya diş həkiminin yanında, ya rəfiqəmgildə, ya mənzilə baxmağa getmişdim – yüz cür variantı vardı və bu variantların heç birinin düz olub-olmamasını yoxlaya bilməzdi, yoxlamaq istəməzdi Zaur, amma heç birinin yüz faiz doğru olduğuna inana da bilmirdi.

Telefon zəng çaldı. Zaur dəstəyi qaldırdı:

– Bəli:

Dəstəyi dərhal asdılar: du, du, du...

Zaur fikirləşdi ki, yəqin yenə zəng vuracaqlar, hər dəfə divandan qalxıb telefona yanaşmağa ərinirdi, odur ki, dolabçanı divana tərəf çəkdi, indi uzandığı yerdən əlini uzadıb dəstəyi qaldıra bilərdi...

Yarım saat da keçdi və yenə telefon səsləndi. Zaur dəstəyi qaldırdı, elə bildi yenə asacaqlar, amma Muxtarın səsini eşitdi:

– Siz allah bağışlayın, Zaur, Təhminə hələ gəlməyib?

– Yox

– Bəs hardadır görəsən?

– Bilmirəm.

– Xahiş edirəm gələn kimi mənə zəng vursun. Vacib işim var. Özüm də arabir zəng vuracam.

Zaur heç nə demədi...

Balaca əncir ağacına baxırdı. Təhminə hey bu ağacdan danışardı, daha doğrusu, bu ağacı onlara hədiyyə gətirmiş alpinist dostlarının söhbətlərini təkrar edərdi; haradasa Naxçıvanda, dağlarda tapmışdılar bu ağacı, Gəmiqayanın yanında. Gəmiqaya adlı yerdə, rəvayətə görə, Nuhun gəmisi lövbər salıbmış və oralarda alpinistlərin dediklərinə görə qayaların üzərində maraqlı şəkillər var. Qobustan qaya rəsmləri kimi...

Telefon zəng vurdu:

– Bəli.

Yenə asdılar: du, du, du...

Zaur səhərdən dilinə bir şey vurmamışdı, amma yerindən durub mətbəxə keçmək, naharı qızdırmaq istəmirdi. Heç bir şey istəmirdi. Ümumiyyətlə, yalnız bax beləcə uzanmaq, papiros çəkmək və heç bir şey haqqında düşünməmək istəyirdi. Hətta, geoloji ekspedisiya barəsində, Filizçay partiyası, Mərdanov Azər barədə belə düşünmək istəmirdi. Ona elə gəlirdi ki, əslində heç yoxdur da belə geoloji partiya və varsa da, hər halda, Zaurun ora düşməsi qeyri-mümkün bir xülyadır... Ümumiyyətlə, ona elə gəlirdi ki, həyatında heç bir çıxış yolu yoxdur, indiki həyatını dəyişə biləcək və eyni zamanda onu keçmiş həyatına qaytarmayacaq üçüncü bir yol, üçüncü bir variant yoxdur və hər şey

bitib-tükənib onunçün, bütün yollar bağlanıb, bütün qapılar örtülüb, bütün pəncərələr qapanıb...

Yenə də zəng oldu, Zaur gülümsündü ki, bu cavabsız zənglər dəqiq və müəyyən bir ardıcıllıqla səslənir, düz yarım saatdan bir...

– Allo.

Asdılar.

Saat doqquzdan sonra Zaur nigaran olmağa başladı. Axı bilirdi: Təhminə bu gün işləmir və işləməyən günlərdə heç vaxt belə gec gəlmir evə. Bəlkə cədvəli dəyişiblər. Təhminə kimisə əvəz eləyib. Bunu öyrənmək çox asan idi, durub televizoru qura bilərdi, amma ayağa qalxıb otağın o biri küncünə keçməyə, televizoru yandırmağa həvəsi yox idi. Həm də ki, işdə olsaydı, Muxtar onu evdə axtarmazdı... Pəncərədən Mədinəgilə tərəf boylandı, onun da işıqları yanmırdı...

Saat onu keçəndə ciddi nigaran oldu, qorxurdu ki, birdən Təhminənin başında bir qəza olar. Düz saat 11-də bir də zəng elədilər, asdılar. Muxtar daha zəng eləmirdi. Əlbəttə, dəstəyi asan Muxtar deyildisə... Yəqin ki, o deyildi, belə xasiyyətli adam deyildi Muxtar. Əgər o deyildisə, "vacib bir iş üçün" daha zəng vurmurdusa Muxtar, deməli, Təhminəni tapmışdı və Zaur da daha nigaran olmamalıydı. Təhminənin başında qəza-filan yox idi.

On ikinin yarısında gəlib çıxdı Təhminə və dəhlizdə paltosunu çıxaran vaxt yenə telefon səsləndi.

Zaur:

– Telefonu götür, – dedi.

Təhminə:

– Sən götür, – dedi.

– Mən götürəndə asırlar, – dedi.

Təhminə yorğun– yorğun:

– Bilirəm. – dedi. Çox əzgin görünürdü Təhminə.

Telefon isə hey səslənirdi.

Zaur:

– Muxtar zəng eləmişdi, – dedi, – dedi ki, vacib işi var.

Bu sözlərdən sonra Təhminə aramla telefona yanaşdı, dəstəyi qaldırdı, nə isə eşidib dərhal asdı və ağır-ağır kürsüyə çökdü.

Zaur diqqətlə ona baxırdı.

– Hardaydın? – dedi.

Təhminə:

– Canımı götürüb sənin ananın əlindən qaçmışdım, – dedi və birdən hönkürüb ağladı.

Zaur yerindən durdu, Təhminəyə yanaşdı, əllərini onun çiyinlərinə qoydu:

– Nə olub sənə? – dedi.

– Bacarmıram day, Zaur, bacarmıram... Təngə gəlmişəm. Hər gün mənə zəng vurub küçə söyüşləriylə söyür, çirkab qalmayıb başıma tökməsin... Mənim nə günahım var ki, sən işdən çıxmaq barəsində ərizə yazmısan, hə? Mənim heç xəbərim də yox idi bundan. Amma anan məni hədələyirdi ki, məhkəməyə verəcək, milisə xəbər eləyəcək, daha nə bilim nə... Mənim nə təqsirim var, ilahi? Sən allah, sən ölülərinin, dirilərinin canı, qayıt evinizə, Zaur, mənim də canım qurtarsın. Rahat buraxın məni, sən allah, sən də, sənin anan da. Daha səbrim çatmır, çatmır səbrim, vallah...

Qaçıb vannaya girdi...

Zaur divarın oboylarına baxırdı... Həmin oboylara ki, Təhminənin dediyinə görə, Zaur gələn gün çiçək açmışdılar, indi torşerin alaqaranlıq işığında bu oboylar tamam başqa cür görünürdü... Zaur siqaret çəkirdi, cürbəcür fikirlər gəlirdi başına – özü barədə, Təhminə barədə, anası barədə düşünürdü.

Təhminə vannadan çıxdı, əynində mavi xalat vardı və həmişəki kimi hamamdan sonra sifəti sakit, arxayın, tərtəmiz idi; elə bil bütün qayğılarını, dərd-qəmini, əzab-iztirablarını yuyub atmışdı.

Telefon səsləndi, Zaur telefona tərəf atıldı, dəstəyi qaldırdı və indi asılacağını bildiyi üçün tələsik özü:

– Ay ana, axı sən niyə belə edirsən? – deyə bircə cümlə dedi. Xəttin o biri başında susmuşdular, bir müddət bu sükut davam etdi. Zaur yenidən sözə başlamaq istəyirdi ki, qəflətən dəstəkdə bərkdən güldülər – kişi səsiylə bərkdən qəhqəhə çəkdilər...

Zaur dəstəyi asdı və Təhminəyə heç nə demədi. Nə mənası vardı bir şey deməyin. “Mən nə bilim kim idi bu, – deyəcəkdi Təhminə, – mən bütün telefon xuliqanlarını tanıyıram bəyəm?”

Bir də ki, son günlərin bütün iynələrindən, tikanlarından, küsüşmə-dalaşmalarından, tənəli sözlərindən, zəhərli atmacalarından, şübhələrindən, əsəbiliyindən sonra ilk dəfə idi ki, Zaur Təhminəni belə sakit, arxayın halda görürdü. Hamamdan sonra həmişəkindən onqat gözəl idi. Şampunla yumuşdu saçlarını, hansı meşə bitkilərininsə, hansı ağac yarpaqlarınınsa ətri vardı bu şampunda və qoxu Təhminənin saçlarına, bütün bədəninə hopmuşdu.

Zaur onu öpüşlərə qərq edirdi, elə bilirdi ki, ılıq bir bahar günü meşədədirlər, ətraf yaşıllığa, sərinliyə, sıx yarpaqlar arasından düşən

günəş şüalarına qərq olub, onlar məhəbbətlərinin uzaq ilk günləri qədər bəxtiyar və hər şeydən asudədirlər... Təhminəni sığallayırdı, oxşayırdı – bu nəvazişlər, tumarlar, öpüşlər qurtarmaq bilmir, uzandıqca-uzanırdı və elə bil hər ikisinin ürəyinə danmışdı ki, bütün bu çılğınlığın axırına az, lap az qalıb...

***

– Səkinə, ərizəni direktora verdin?

– Yox, Dadaş aldı məndən.

– Dadaş? Dadaşın bura nə dəxli var?

– Dedi ki, direktorla özüm danışacam. Bir də xahiş elədi ki, onun yanına gələsən. Dadaşın...

Dadaş:

– Əşi, sən bir toxta görək, – dedi və küncdəki masanın arxasında oturmuş Qurban tərəfə əyri-əyri baxdı. – Ərizən burdadır, budu ey, məndədir.

– Mən axı sizə yazmamışam bu ərizəni.

– Bilirəm, bilirəm, ancaq səninlə bir balaca söhbətim var mənim. – Bir də tərs-tərs Qurban tərəfə baxdı. Qurban başını aşağı salıb, guya ki, öz işiylə məşğul idi, amma qulağı darı dənləyirdi. Dadaş ərizəni Zaura uzatdı. – Ala bax, budur ərizən, haçan istəsən, müdirə apara bilərsən. Amma səndən kiçik bir xahişim var, səninlə balaca bir söhbət edək, sonra haçan istəsən gir direktorun yanına, direktor qaçıb eləmir ki, işin axırınacan burda olacaq – Dadaş birbaşa Qurbana müraciət elədi. – Qurban, – dedi, – bir neçə dəqiqəliyə zəhmət çək çıx otaqdan, mənim Zaurla xudmani söhbətim var.

Qurban qaşqabağıyla yer süpürə-süpürə otaqdan çıxdı, amma çıxmamışdan qabaq bir xeyli masasının siyirtmələriylə əlləşdi – açdı, bağladı, kağızları səliqəyə saldı, götürdü, qoydu, bir söz, xeyli onların, illah da Zaurun əsəbləriylə oynadı. Nəhayət, çıxdı otaqdan, qapını da örtdü arxasınca.

Dadaş:

– Bilirəm, Zaur, – dedi, – mənimlə o qədər də aran yoxdur. Səbəbini də bilirəm. Amma inan ki, mən ancaq sənin yaxşılığını istəyirəm, gec-tez özün də bunu görəcəksən. Mən ərizəvi anavın xahişiylə götürmüşəm. O, təsadüfən haradansa bilib və mənə zəng eləmişdi. Məsələ ondadır ki, atan xəstələnib. – Zaur həyəcanla yerində qurcuxdu.

– Yox, yox nigaran olma, elə ciddi bir şey yoxdur. Bir az təzyiqi qalxıb, amma mən özüm həkimlə danışdım, deyir, qorxulu bir şey de-

yil. Əsəbdəndir, vəssalam, bir-iki gün dincələr, hər şey öz qaydasına düşər. İndi səndən də xahişim budur ki, bir-iki gün səbir eləyəsən, atan eşitməyib bu məsələni, amma eşitsə, bir az da əsəbiləşəcək, indiki vəziyyətində isə, özün başa düşürsən, əsəbiləşmək olmaz ona... Anan da elə bu barədə xahiş eləmişdi məndən. Qoy atan sağalsın, sonra ərizəni apar, çıxırsan işdən çıx, özün bilərsən.

– Atam yatır?

– Yox, anan deyirdi ki, evdə gəzir, amma işə çıxmağa həkimlər icazə vermirlər. Sabah gedib dəyəcəm ona... İstəyirsən, qoy bu ərizə də məndə qalsın, heç olmasa bazar ertəsinəcən gözlə. Mən danışdım direktorla, o müavin də bir az zırı adamdır, səninlə kobud danışıb bir az, bilirəm, direktora da çatdırdım bu məsələni, dedim, axı olmaz belə, bu tərzdə danışmaq olmaz belə incə mətləblər barəsində, özü də yeniyetmə gənclə. Axı yaşı-filanı da gərək nəzərə alasan.

Zaur:

– Yaşın bura heç dəxli yoxdur, – dedi.

– Yox, dediyim odur ki, özgənin işinə belə kobud şəkildə müdaxilə etmək ədəbsizlikdir, qanacaqsızlıqdır. Bəyəm belə məsələni kobud, qaba inzibatçılıq yoluyla həll etmək olar? Neyləyəsən, belə peziqırıq adamlar da var da...

Köynəyinin tərli, kirli boyunluğu, ora-bura dığırlanan göz bəbəkləri – bu adamın bütün görkəmi Zaurun ürəyini bulandırırdı. Əlləri necə də gödəkdir, barmaqları necə də qısadır, ilahi, elə bil ilk dəfə idi görürdü onun gödək barmaqlarını.

Zaur ayağa qalxdı:

– Yaxşı, – dedi, – bazar ertəsinəcən gözləyərəm.

Dadaş:

– Otur, – dedi, – sənə bir neçə kəlmə sözüm də var. Amma xahiş eləyirəm axıracan dinləyəsən... Dünən Təhminəylə danışmışıq. – Bu cümləni birnəfəsə dedi, elə bil qorxurdu ki, Zaur ağzından vurar, durub çıxıb gedər, söhbətləri yarımçıq qalar. – Dünən bütün axşamı Təhminəylə söhbət eləmişik. Amma ürəyinə ayrı bir şey gəlməsin, ha...

Zaur, nədənsə, ancaq Dadaşın gödək barmaqları haqqında, gödək əlləri haqqında düşünürdü, belə gödək əllərlə Təhminəni necə qucaqlamaq olardı, ilahi?

– Sən bilirsən ki, mənim ona münasibətimi. Nə olursa-olsun, mənim ona müəyyən rəğbətim var və bir çox yaxşı cəhətlər görürəm onda.

"Gödəkdi əlləri də, barmaqları da, yaman gödəkdir". Zaur bir kəlmə dinib danışmırdı.

– Hə, sözüm odur ki, dünən Təhminəyə zəng elədim, görüşdük və hər şey barəsində ətraflı danışdıq... Zaur, inan mənə, sizin aranızda nə olubsa, olub keçib, hər şey bitib, hər şey qurtarıb. Təhminə artıq başa düşüb bunu, sən də bir azdan başa düşəcəksən, amma bir az gec başa düşəcəksən və o vaxta qədər də həm özün əzab çəkəcəksən, həm də başqalarına, o cümlədən atanla anana əziyyət verəcəksən... Xahiş edirəm sözümü kəsmə, axıracan dinlə məni. Mən hər şeyi başa düşürəm, – rast gəlmisiniz bir-birinizə, bəyənmisiz bir-birinizi, bağlanmısız bir-birinizə, məhəbbət deyirsən buna, sevgi deyirsən, nə deyirsən de, sözüm yoxdur. İkiniz də cavansınız, sağlamsınız, gözəl-göyçəksiniz, bir-birinizi cəlb etmisiniz, nə günah var ki, bunda?.. Bilirəm, hamısın bilirəm. Moskvada da olmusuz bir yerdə, indi Bakıda da bir mənzildə yaşayırsınız. Amma oğul, inan mənə, bir gün hər şey sona yetir, ən çılğın ehtiras belə bitib tükənir və əgər kişiylə qadını ehtirasdan başqa heç nə bağlamırsa – yəni ailəylə, uşaqlarla, nikahla bağlı deyillərsə – onda bu cür əlaqə elə bir dəhşətli işgəncəyə çevrilir ki, gəl görəsən.

Zaur Dadaşın nitqindəki hər çaları yaxşıca duyurdu; eşqdən, məhəbbətdən danışanda – rişxəndini, gənclikdən, gözəllikdən danışanda – həsədini, aralarında hər şeyin bitib-tükənməsindən danışanda – duyduğu ləzzəti – hər şeyi, hər şeyi qavrayırdı. Zaur onu da bilirdi ki, bu ağsaqqal təmkini, bu həlim danışıq, bu öyüd-nəsihət – hamısı eyni bir məqsədə yönəlmişdi: Zauru sındırmaq, qırmaq, ram etmək – hədələrlə, tənələrlə, inzibati tədbirlərlə nail ola bilmədiklərinə Dadaşın xəbis müdrikliyilə, mötəbər məsləhətləriylə, mülayim rəftarıyla çatmaq istəyirdilər. Ən dəhşətlisi bu da deyildi. Ən dəhşətlisi o idi ki, qəlbinin dərinliklərində Zaur, Dadaşın sözlərindəki həqiqəti duyurdu, bilirdi onun dedikləri düzdür, doğrudur, amansız, çılpaq və yeganə həqiqətdir. Bircə şeyi bilmirdi – bütün bunları, ehtirasın bitib-tükəndiyini, birgə həyatlarının işgəncəyə çevrildiyini Dadaşa Təhminə özümü danışmışdı, yaxud Dadaşın öz gümanları, çin çıxmış fərziyyələri idi? – Hər halda dünən Təhminənin Dadaşla görüşməsinə şəkk-şübhə ola bilməzdi.

– Hər şey sənə belə dəhşətli faciə kimi görünməsin e, – dedi. – Dünyanın axırı bilmə hər şeyi. Sənin ömrünün sonu deyil ki bu, olsa-olsa ancaq bir epizodudur. Həyat bilirsən nə uzundur. Zaur, yalan deyirlər, qısa deyil ömür, biz çox yaşayırıq, lap çox, o qədər, o qədər şey görüb bilirik, o qədər şeydən keçirik ki, həyatımız boyu hər cürə bərkəboşa düşürük, dünyanı, necə deyərlər, əməlli-başlı dişimizə vururuq. İndi ayrılsanız, ömrünüzün bu günlərini həmişə xoş bir təəssüflə, yüngül bir qüssəylə yad edəcəksiniz, şirin bir yuxu kimi, amma əlaqə-

niz davam etsə, bu, əməlli-başlı əzab-əziyyətə çevriləcək... Tıx deyincə yeyib toxluq eləməkdənsə, hər şeydən bir balaca doymamağın özgə ləzzəti var, inan mənə. – Bu sözlərdən sonra Dadaş gülümsündü və bu sözlərdən sonra Zaurun gözləri qarşısında haçansa gördüyü bir səhnə canlandı: Dadaş toppuş, gödək barmaqlarıyla soyutma toyuğu paralayır, ağzının içinə basır, hava da istidir, tər və yağ bir-birinə qarışıb axır çənəsindən boğazına, çirkli boyunluğunun ardına, boğazına, döşünə, sinəsinə...

Zaur ayağa durdu, yenə də kəlmə kəsmədən qapıya tərəf addımladi. Dadaş onun arxasınca:

– Bugündə, sabahda bir atana baş çək, – dedi. – O saat bütün azar-bezarı keçib gedəcək...

## On ikinci fəsil

*Fəthi-meyxanə üçün oxuyalım fatihələr*
*Ola kim, üzümüzə açıla bir bağlı qapu.*

Nəşriyyatdan çıxıb yavaş-yavaş küçələrlə addımlamağa başladı. Evlərinə getmək istəmirdi. Öz-özünə acı-acı güldü: "evimizə..." Məgər onun evi vardı? Onun "evim" dediyi yer – Manafın sabiq mənziliydi.

Çalışdı ki, bu barədə fikirləşməsin. Ayrı şeylər barədə düşünməyə cəhd etdi və birdən duydu ki, yamanca acıb, Təhminənin mətbəxini xatırladı, düşündü ki, evə getsə Təhminə nahar qızdırıb qabağına qoyacaq. Zaur da dinməz-söyləməz yeyəcək, heç birisi bir kəlmə də danışmayacaq, çünki ikisi də biləcək ki, danışacaqları hər bir söhbət gec-tez dava-dalaşla nəticələnəcək və həm də ki, bu dava-dalaş, yəqin ki, axırıncı savaşları olacaq... Yaxud dalaşmasalar, elə-belə danışsalar, bir-birini anlamağa, başa düşməyə çalışsalar, vəziyyətlərini, hallarını, hisslərini, fikirlərini bir-birilərinə sakit və təmkinlə izah etsələr belə, bunun da yeganə nəticəsi ayrılıq olacaq, hər ikisi mütləq bu qərara gələcəkdi – ayrılmalıyıq...

Trolleybusa minmədi, yolunu bulvardan saldı. Bulvar adamsız idi. Havalar pis keçmirdi, ağaclar tamam çılpaq olmasaydı, adama elə gələrdi ki, payız təzəcə girib. Amma payızın son ayı, qışın əvvəli olması yalnız ağacların yalın budaqlarından deyil, həm də havanın çox tez qaralmasından məlum olurdu. Adamlar idarələrindən çıxanda hələ işıq idi, amma evlərinə yollanarkən haradasa – trolleybusun, avtobusun içində – qaranlıq onları haqlayırdı. Bu keçid, xüsusilə metro sərnişin-

ləri üçün kəskin idi. İşıq keçiddən yerin altına enir, öz dayanacaqlarında yer üzünə qalxanda isə qatı qaranlığa qərq olmuş şəhərə çıxırdılar...

Zaur bulvarla addımlayırdı. Sahil xiyabanına səpələnmiş şüşə kababxanaların, çayxanaların, qutabxanaların mehrəm və mülayim çıraqları ətrafa işıq çiləyirdi. Bu şüşə yeməkxanalarda – akvarium içindəymişlər kimi – təkdənbir adamlar oturmuşdu, elə bil işığın, istinin başına yığışmışdılar, yavaş-yavaş söhbət edirdilər. Heç buradan çıxmaqları gəlmirdi. Ocaq başı kimi cəlbedici idi bu məclislər. Bəzən insan yad şəhərin otellərində belə isti nəfəsə, ünsiyyətə, təmasa ehtiyac duyur – həm insanların içindəsən, həm də aralısan onlardan – heç kəsi tanımırsan, səni də heç kəs tanımır, amma hər halda, haradasa lap yaxında həyanların var – başqa insanlar – söhbət etmək, sorğu-suala tutulmaq, cavab vermək məcburiyəti də yoxdur, eyni zamanda ılıq hənirtiləri çatır sənə...

Kababxananın borusundan tüstü çıxırdı, ləzzətli iylər gəlirdi, Zaur da yolundan burulub kababxanaya tərəf addımladı.

Adam az idi. Dörd nəfər dəm kişi bir-biriylə qızğın mübahisəyə girişmişdi, bir-birinə isbat eləmək istəyirdilər ki, doğrudur, Əhmədov əclafın biriydi, amma Ağayev ondan da betərdir.

Başqa bir masanın dalında iki nəfər gənc oğlan, küncdəki dördüncü stolun ardında isə cavan oğlanla qız əyləşmişdilər.

Zaur arxası qapıya oturdu. Piştaxtanın arxasındakı bufetçi radiocihazı qurdalayırdı, nəhayət, konsert verən İran stansiyasını tapdı... İki başqa xidmətçi mətbəx qapısının ağzında mırt vururdu. Zaur xeyli oturdu, nəhayət, xidmətçilərdən biri tələsmədən yanaşdı. Zaur kabab və iki yüz qram araq sifariş verdi. Bir azdan sonra xidmətçi göyərti, pendir, bir şüşə "Badamlı", üstünə xaş-xaş səpilmiş çörək və kiçik armudu qrafində araq gətirdi.

Zaur arağı qalın çapma stəkana süzdü, bir qurtuma başına çəkdi... Ac qarnına içdiyi araq dərhal təsirini göstərdi. Zaurun beyni yüngülcə dumanlandı və kiçik kababxananın, gur işıqlı elektrik qızdırıcısıyla yaxşıca isidilmiş bu şüşə otağın məhrəmliyi, şüşələrin arxasındakı gecəyə, qaranlığa qərq olmuş bulvarın, ağır, qatı, zülmət dənizin yaxınlığı – hamısı birlikdə Zaurun ürəyini riqqətə gətirdi: elə bil ki, burda əyləşən adamlar da, xidmətçilər də, kök bufetçi də ona əziz və doğma oldular. Piştaxtanın ardındakı divara zillədi gözlərini – divara "Oqonyok"dan kəsilmiş rəngli reproduksiyalar, Zeynəb Xanlarovanın və Müslüm Maqomayevin portretləri, Stalinin generalissimus formasında, habelə anası və oğluyla birlikdə şəkilləri, "Neftçi" futbolçuları-

nın fotoları vurulmuşdu... Bir neçə kinoaktrisanın şəkilləri də vardı divarda, adlarını bilməsə də sifətləri tanış gəlirdi Zaura. Zaur cəhd eləyib onları hansı filmlərdə gördüyünü də yada sala bilərdi. Lenanı, Moskvada kino evində tanış olduğu Lenanı tanıdı, dərhal da Moskva sərgüzəştləri yadına düşdü. Muxtarı xatırladı və elə bu vaxt qulağının dibində tanış bir səsdən diksindi:

– Ay sizi xoş görmüşük.

Başını qaldırdı və masasının yanında dayanmış gülümsünən adamı gördü – Muxtar Məhərrəmov idi... Qəribə təsadüf idi. Sanki Muxtar Zaurun fikirlərindən canlanıb çıxmış, hansı cinin əmriyləsə peyda olmuşdu elə bil... Zaur ayağa qalxdı, əl verib görüşdülər.

– Buyurun, əyləşin, – dedi. Muxtar dərhal stul çəkib oturdu.

– Elə indicə sizə zəng vurmaq istəyirdim, – dedi.

– Bizə, yəni Təhminəyə, – deyə dəqiqləşdirdi Zaur.

Muxtar yüngülcə gülümsündü.

– Yox, məhz sizə, – dedi, – Təhminəylə telefonla danışdım, dedi ki, hələ işdən qayıtmamısınız, indilərdə gələrsiniz...

Zaur "Necə də arxayındır Təhminə, – deyə düşündü, – necə də arxayındır ki, mütləq indilərdə gələcəm".

– Siz də demə, burada – kababxanada kefdəsiniz – Muxtar araq qrafininə işarə elədi.

Zaur gülümsündü, araqdan öz stəkanına və ikinci təmiz çapma stəkana Muxtar üçün süzdü.

Muxtar:

– Zəhmət çəkməyin, – dedi. – Mən bu saat deyərəm gətirərlər. Arif! – deyə xidmətçini çağırdı.

Xidmətçi dərhal gəldi. Kök bufetçi də Muxtarın səsini eşidib piştaxtanın arxasından başını yellədi, hal-əhval tutdu.

Arif:

– Muxtar müəllim xoş gəlib, – dedi. – Çoxdandı görünmürsüz?

Muxtar:

– İş çoxdur, – dedi. – Bəs Nadir hanı?

– Nadir indi gələr. Biz burdayıq da, nə qulluğunuz var, buyurun.

– Yaxşı, bir iç-qovurma düzəlt bizimçün, iki şiş də qabırğayla ağ ətdən kabab çək.

– Baş üstə!.. Nə içəcəksiz?

– Yox, verilişim var, içməyəcəyəm mən... Yaxşı, day keçib, iki yüz araq gətir. Zaur müəllimlə birtəhər həzmi-rabedən keçirərik...

Xidmətçi getdi. Muxtar:

– Nadir buranın böyüyüdür, – dedi. – Qəribə oğlandır.

Zaur:

– Məni niyə axtarırdınız ki? – deyə soruşdu.

Muxtar cavab verə bilmədi, Zaurun başının üstündən indicə açılmış qapı tərəfə baxırdı. Sonra ayağa durdu.

– Hə, – dedi, – adını çək, qulağını bur, Nadir müəllim özü də təşrif buyurdu.

Zaur da çevrildi və qapıdakı potaboy, yekəqarın, qırmızıyanaq kişini gördü.

Nadir Muxtarı görüb dişlərini ağardırdı, daha doğrusu, dişlərini ağarda bilməzdi, çünki bütün dişləri qızıldan idi... Tələsik onlara tərəf gəldi.

– Ay Muxtar müəllim xoş gəlib bizim tərəflərə... Çoxdandı görünmürsən, a kişi?

Muxtar:

– Tanış ol, – dedi. – Zaur mənim dostumdur.

Nadir razılıqla başını tərpətdi, Muxtarın dostu olması Zauru onun gözlərində elə bil bir neçə mərtəbə ucaltmışdı.

– Nə var, nə yox, ay Muxtar müəllim?.. Baxırıq, izləyirik işivizi... Həm sevinirik, həm həsəd aparırıq.

Muxtar:

– Nəyə sevinirsən və nəyə həsəd çəkirsən ki? – deyə xəbər aldı.

– Hə, bunları bu saatca bircə-bircə sənə deyəcəyəm. – Nadir yoğun boynunu çevirmədən barmaqlarıyla çiyninin üstündən çırtma çaldı və xidmətçi Arif dərhal onlara yanaşdı. Muxtarın sifariş verdiyi iç-qovurmanı, arağı da gətirmişdi... Nadir gözucu tavaya baxıb Arifdən soruşdu:

– O ətdəndir?

Arif:

– Eyib sözdür ki, Nadir qədəş, – dedi. – Biz bəyəm adamımızı tanımırıq? Muxtar müəllimə hamımızın hörməti var, – Nadirin məmnun-məmnun dodağı qaçdı, amma sonra qrafindəki arağı görüb qaşlarını çatdı.

– Bu nədir bəs? – dedi.

Muxtar üzrxahlıq edirmiş kimi:

– İşim var, Nadir, getməliyəm, – dedi.

Nadir:

– Yox, canımçün, ürəyimə toxunarsan, – dedi və sonra Arifə müraciətlə, – uberite etu menzurku, – deyə əlavə etdi. – O dünənki ekstralardan hələlik bir şüşə gətir, birin də qoy xolodelnikə... Orda xo-

lodelnikdə pivə var e, bilirsən hansından deyirəm də, ondan da hələlik üç-dörd şüşə gətir bura, dalısına baxarıq.

Arif tapşırığı yerinə yetirməyə getdi və Nadir təmkinlə kababxanadakı adamlara göz gəzdirdi.

– Belə-belə işlər, Muxtar müəllim, – dedi.

Arif beş şüşə çex pivəsi gətirəndə Muxtar:

– Bax bu olmadı da, – dedi. – Köhnə dostları yaddan çıxardırsan.

Nadir:

– Canımçün, Nadirin ölmüşünə dünən axşam almışıq on yeşik, elə bu gün sənə zəng vurmaq istəyirdim, özün öz ayağına gəlib çıxdın. Bir qutusunu məxsusi sənünçün ayırmışam, bilirəm axı çex pivəsinin bazısan mənim kimi, istəyirsən bax elə indi götür apar.

– Yox, indi işə gedirəm, amma sabah səhər gəlib aparacam.

– Əşi, nə zəhmət çəkirsən, özüm göndərərəm evinə.

Arif qırmızı "Ekstra" etiketli araq şüşəsini açdı, təzə gətirdiyi üç nazik qədəhə süzdü və getdi.

Nadir:

– Hə, Muxtar müəllim, soruşursan ki, niyə sevinirəm, niyə həsəd çəkirəm, hə? – dedi.

Muxtar artıq unutmuşdu bu söhbəti, amma Nadir təmkinlə öz fikrini şərh eləməyə başladı:

– Ona görə sevinirik ki, Muxtar müəllim, siz bizim fəxrimizsiz, başımızın ucalığısınız... Siz – sənət adamları – bizim yolumuzda çalışırsız, bizim zövqümüzə qida verirsiz, odur ki, bizim də borcumuzdur ki, sizə hər cür hörmət eləyək neçin ki, siz bizim fəxrimizsiniz... O ki, qaldı həsəd çəkmək məsələsinə, hə, burda məsələ bir az başqa cürdür. Məsələ ondadır ki, axı biz də baxırıq bu televizora da. Evdə üç dənəsi varımdır mənim – uşaqlarım köpək uşaqları elə ancaq Moskvaya baxmaq istəyirlər, məni bəyənmirlər, rusca, deyirlər səhv danışırsan, papa, ələ salıb dolayırlar məni, it uşağı, hə, sözüm onda deyil, bir söz, almışam onlarçün televizor ki, baxın nə qədər kefinizdir Moskvaya: caza-maza qulaq asın, amma mənimki Bakıdır – bizim o komediya artistlərimiz var e, vallah, onları dünyanın heç bir Raykininə-zada dəyişmərəm... Arvad da ki, bədbəxtin qızı bütün günü mətbəxdə əlləşir, odur ki, yazıqdır da, televizorun bir dənəsin də alıb qoymuşam onunçün mətbəxə, qoy soğan soya-soya baxsın özüyçün, kef çəksin, mən ölüm, necə sözdür, hə? Ha, ha, ha! Burda işdə də televizorum var, mətbəxin dalında, orda bir balaca xudmani otağım var, – nədənsə, Muxtara göz vurdu, – ay səni, Muxtar müəllim, yaman arif adamsan,

tükü-tükdən seçirsən, hə televizorun birin də qoymuşam ora, hərdən baxıram özümçün bala-bala... Hə, sözümün canı odur ki, hərdən baxıram televizora, görürəm adə, bu nə işdir belə, elə ki, yazdılar verilişin rejissoru Muxtar Məhərrəmov – mütləq bir təzə mamlımatan canan çıxasıdır ekrana. Deyirəm, dinmə, Muxtar müəllimin təzə şikarıdır bu... indi diktordur, artiskadır, oxuyandır – hər halda həmişə bir təzəsini, svejisini, belə necə deyərlər, tavada təzə qızardılmışın çıxarır Muxtar müəllim... İndi özün de, həsəd çəkməyəsən, neyləyəsən, biz deyir, dəridən-qabıqdan çıxırıq ki, bir belə canalan afətlə tanış olaq, amma Muxtar müəllim elə gününü bu cür dilbərlərin içində keçirir. Mən ölüm, necə sözdür? Əşi, vur bura görək, ay Muxtar müəllim, halal xoşun olsun, dünya deyir, beş gündür, bacarana can qurban... vur bura...

Muxtar Nadirin əlinə bir balaca toxundu. Nadir:

– Odur ki, deyirəm, qaldıraq bu badələri sənin sağlığına, Muxtar müəllim. Ömrüvün axırınacan elə-belə kefdə-damaqda yaşayasan. Biz də sənin kölgəndə dolanaq... Amma yoldaşlıqda bu yaxşı şey deyil ha, hərdən-birdən dostlarızun da könlünü şad elə də. Nə olardı o gözəllərdən biriylə bizləri də tanış eləyəydin.

Muxtar zarafatyana bir ərklə, amma eyni zamanda kifayət dərəcədə sərt tərzdə:

– Çiy söz danışırsan, Nadir, – dedi. – Məni görünür kimnənsə dəyişik salmısan.

Nadir dərhal sözün dəyişdi:

– Yaxşı, yaxşı, incimə, zarafatım var səninlə, ərkim çatır, nə olar? Dediyim odur ki, bax mən çex pivəsi alan kimi o saatca səni salıram yada. İndi dünya dağılmaz ki, sən də bir dəfə o iş yoldaşlarını – elə içində o gözəl qızlar qarışıq – götürüb gələsən bu Nadir qərdeşivə qonaq, səninçün bir süfrə açım, bir məclis düzəldim ki, dadı damağınızdan getməsin. Dalıynan sənin nə işin var?.. Yaxşı, yaxşı, day bu barədə bir kəlmə kəsməyəcəyəm, vurduq bunu sənin sağlığına.

İçəndən sonra Nadir fikirləşdi ki, Zaur bu söhbətləri ayrı cür başa düşər, odur ki, izahat verməyə başladı:

– Siz yəqin bilmirsiz, – dedi, – biz Muxtar müəllimlə çoxdanın curuyuq. Sonra ürəyinizə ayrı şey-zad gələr e... Guya ki, mən özümçün canan-zad tapa bilmirəm, kasadlıq çəkirəm bu cəhətdən? Ay-hay, canımçün, bilmirəm arvadların əlindən hara qaçım gizlənim. Qarğa-quzğun kimi tökülürlər üstümə hər tərəfdən. – Nadir bu sözləri deyəndə Zaura baxırdı, birdən Allah eləməmiş, bu qaraqabaq oğlan elə düşünər ki, Nadir – hərifdir, qadın tamarzısıdır, kiminsə köməyinə möhtacdır.

Muxtar:

– Nadir, bilirsən nə var, – dedi, – səninlə mənim sinnimiz elədir ki, gərək imkan tapdıqca qadınlardan gen gəzək.

Nadir Muxtarın sözlərini eşitməyibmiş kimi söhbətini davam elədi:

– Bu günlərdə bura iki oğlanla bir qız gəlmişdi. Gördüm ki, bizimkilər deyil, özgə şəhərdəndirlər. Oğlanlar da lap elə maygülüdürlər – biri belə başı daz, eynəkli, o biri də balaca, cürübbəz – üfürsən yıxılar. Amma qız, Allaha and olsun, bir dünya gözəlidir ki, iki göz istəyir tamaşasına. Ucaboy, fiqurası əmiri, üzü ağappaq, elə uzun qıçları vardı, Allaha and olsun elə bil çiynindan başlayır lap. Nə isə, göz qoydum bunlara... Arif bunlara qulluq eləyir, mən də görürəm ki, yox, aşnam, qızın gözləri elə o yan-bu yandadır, belə dağınıqdır gözləri, mən day belə-belə şeylərdə saç ağartmışam axı... Görürəm ki, bu gədələrin heç biri tay deyil ona, yəqin ikisinin də ürəyi gedir bu qız üçün, amma qız bunlara heç məhəl də qoymur. Görürəm, puldan da belə xeyli kasaddılar. Üç pors kabab sifariş veriblər, bircə şüşə də çaxır. Arif apelsin təklif eləyib bunlara, uzun-uzadı haqq-hesab eləyiblər, axırda da deyiblər, yox, lazım deyil. Barmağımı dişlədim, əsil məqamdır, dedim... Noyabr ayıdır, bəli, göndərdim bunların stoluna əntiqə parnik xiyarları, pomidorları, təsəvvür eləyirsən, noyabrın axırında təzə pomidor, xiyar... Yanında da bir şüşə əntiqə konyak... Əvvəl istədim iki şüşə göndərəm ki, gədələr vurub bədənə lap dəm olsunlar, sonra fikirləşdim ki, belə nərmənaziklərçün elə bir şüşə də bəs eləyər xosumvay olmaqçün... Bəli, axırda da iri bir dəstə qırmızı qərənfil göndərdim, dedim de ki, kababxananın böyüyüdür sizi belə qonaq eləyən – bizim elin adətidir bu. Gördüm bəli, gözləri par-par parıldadı üçünün də, əsas da ki, qızın... Birdən ağlıma gəldi ki, köpəyin qızı özü içib dəm olar, əməlli-başlı qanmaz ki, məsələ nə yerdədir. Mənim də xüsusi fransız likörüm var. Muxtar, müəllim, sən ki, bilirsən də nədir o, qadın bir qədəh dilinə vuran kimi özü kişinin üstünə atılır, ha, ha, ha, ay xətakar... Bəli, bu likördən göndərdim, dedim deyin ki, bəs qadın yalnız bu likördən içsin, çünki bu da bizim el adətimizdir... Bəli, Arif gəlir ki, bəs, Nadir qardaş, qız səni görmək istəyir, soruşur ki, hardadır bəs bu səxavətli, gözəl insan. Mənəm ha gözəl! Ay səni, evinəcən... Yox, deyirəm, keçəl suya gedən deyil, hələ tezdir, aşna, mənim sir-sifətimi görərsən, yediyin-içdiyin burnundan tökülər, mənim də mayam batar. Hələlik gərək sən bir az da bu likördən içib dəmlənəsən, onda bütün dünya gözündə huri-qılman görünəcək. Köpək oğlunun fransızları bu işlərin allahıdırlar da... Bir söz, oturmuşam bir qıraq-

da kirimişcə, elə göz qoyuram bunlara, gördüm oğlanlar day lap lülüş oldular. Arifə deyirəm, öyrən gör, harda qalırlar, de ki, müdirimiz sizə qonaq gəlmək istəyir, şəhərimizin suvenirlərini gətirmək istəyir... Bəli, Arif öyrənib bilir ki, Pribaltikadan gəliblər, "Bakı" qostinisasında qalırlar. Təbii ki, oğlanlar ayrı nömrədə, qız da başqa qadınla bir nömrədə. Bunu mən hər ehtimala qarşı öyrənmişdim, amma hər şey daha asan başa gəldi... Oğlanlar lülüşqə olub qaldılar. Otuzdurdum onları maşınıma – bilirsən də "Volqa"mı burda, mətbəxin dalında saxlayıram həmişə – gətirdim qostinisaya, qıznan bir yerdə belə ədəblə, nəzakətlə apardım oğlanları nömrələrinə, uzandırdım çarpayılarına. Hamısı da belə kulturnu ha... İndi deyirəm qıza, qız da tamam ayıqdır, amma likördən əməlli-başlı hallanıb, bəli, nəzakətlə, ədəb-ərkanla deyirəm qıza: heyif, deyirəm, sizin oğlanlarınız belə zəif çıxdılar, amma siz maşallah tamam ayıqsınız... İndi axşam şəhərə çıxmağınız yaxşı olmaz. Nömrədə qalıb darıxacaqsınız, bəlkəm mən maşınla gəzdirim sizi, şəhərimizi göstərim. Qız sevincək: çox sağ olun, əlbəttə, çox razı olaram sizdən, deyir. Day burda mənim sir-sifətimin bir əhəmiyyəti yoxdur. Əsas iş ondadır ki, mənim maşınım var, özüm də çox belə nəzakətlə, kulturnu rəftar eləyirəm. Özgə bir arvadla nömrədə qalıb neyləyəcək yazıq, bağrı çatlayar ki. Bəli, hər şey yağ kimi getdi. Əvvəl apardım Kirov parkına, şəhəri seyr elədi, sonra belə ehmallıca maşını şəhərin kənarına sürdüm, arada başını söhbətə qarışdırdım, "bir az o yanda mənim bağımdır, Buzovnada" dedim.

Zaur: "Murtuzovgilinki kimi – deyə düşündü. – Axı onların da bağı Buzovnadadır".

– Bəli, gəldik çıxdıq bağa... Day nə deyim...

Zaur fikir verdi ki, bundan qabaqkı bütün təfsilatları yerli-yataqlı danışan Nadir sonluğu nə isə tələsik tamamladı. Səbəb nə idi? Nadirin utancaqlığı, abır-həyasımı, yaxud başqa bir şey? Bəlkə də bütün bu tədbirlə qurulmuş tələlərə, konyaklara, noyabrda stolun üstünə düzülmüş parnik pomidorlarına, xiyarlarına, qərənfillərə va fransız likörünə baxmayaraq, əhvalat heç də Nadir arzu etdiyi nəticəylə bitməmişdi? Çox güman ki, Nadirin söhbətinin axırının itməsi də elə bu səbəbdən idi.

Nadir qədəhlərə araq süzdü, içdilər, Muxtar saatına baxdı. Nadir isə başqa bir qadına aid yeni bir əhvalat danışmağa başladı. Danışırdı ki, bir qadından yaman kəsirdim, onunla tanış olmaq üçün dəridən-qabıqdan çıxırdım. Nəhayət, ümumi tanışımız tapıldı və ilk tanışlıq xətrinə qadına hədiyyə olaraq kremplin parça göndərmək istədim. Bir dostum

məni sklada aparıb üç cür kremplin göstərdi – boz, yaşıl və göy rəngli... Əvvəl istədim üçünü də alıb göndərim, hansını bəyənsə, seçsin, sonra qorxdum birdən zalımın qızı üçünü də bəyənər, yox, dedim, baha düşər, xarab eləyər səni, əvvəlcədən belə öyrətsəm, sonra necə çıxaram bunun altından? Özüm göy rəngini seçdim, göndərdim, ismarış elətdirdim ki, bəli, axşam ona qonaq gəlmək istəyirəm. Tək yaşayır, "Monolit"dən bir tin yuxarı... Adresini çoxdan bilirdim, axşam bir yaxşı bağlama düzəltdirdim: – dörd-beş sveji tabaka, içkisi-filan yanında, apelsin, bir dəstə gül – hər şey öz qaydasında... Hə, bir də təzə pomidorla xiyar... Özü də noyabr ayı idi...

Zaur diqqət elədi ki, Nadirin bütün məhəbbət sərgüzəştləri noyabr ayında cərəyan edir və ilin bu vaxtlarında ortaya pomidor, xiyar çıxartmasıyla Nadir xüsusi fəxr edir... Kiməsə yamanca oxşayırdı Nadir, amma kimə, Zaur nə qədər etsə də yadına sala bilmirdi.

Nadirin danışdığı bu əhvalat da əvvəlki əhvalat kimi birdən-birə, gözlənilməz-tələsikliklə qurtardı və Nadir artıq təzə bir əhvalata başladı. Xüsusi kayut götürərək bir aşnasıyla gəmidə Krasnovodska getməsindən danışırdı indi də... Həmin bu aşnası üç dəfə eyni bir üzüyü aldırmışdı Nadirə. Bir dəfə bahalı üzüyü Nadirə göstərib, "bu üzüyü gətiriblər mənimçün, bilmirəm götürüm-götürməyim – demişdi. Nadir: "xoşun gəlirsə, əlbəttə, götür" – demişdi, pulunu çıxarıb vermişdi və ilk dəfə ayrıca kayutda Krasnovodska getmişdilər... Yarım ildən sonra (qadın elə bilib ki, Nadirin yadından çıxıb) aşnası ikinci dəfə həmin üzüyü Nadirə göstərib, eyni sözləri təkrar etmişdi: "bilmirəm götürüm-götürməyim". Nadir dəm imiş, ya da doğrudan da unudubmuş, odur ki, bu səfər də fərqinə varmadan "əlbəttə, götür" – deyib, pul çıxarıb verib və onlar ikinci dəfə Krasnovodska gediblər... Ancaq üç ay sonra yenə də Nadirin dəm vaxtında arvad üçüncü dəfə həmin üzüyü göstərib həmin sözləri deyəndə qan vurub Nadirin təpəsinə: "Yaxşı, ay ləçər, – deyib, – istəyirsən sənin on barmağının onuna da bu cür üzük alıb taxım, amma day mənə paçka basmaq niyə?.. Mən bəyəm hərifzadam səninçün ki, üçüncü dəfədir həmin üzüyü aldırırsan mənə?"

– Əşi, qadınların işi uzundur, – deyə Nadir sözünü yekunlaşdırdı, – danışmaqla qurtarar bəyəm?

Zaur nə qədər cəhd edirdisə də, bu adamın kimə bənzədiyini təyin edə bilmirdi. Danışıq tərziylə bənzəmirdi, amma nəyiləsə, nəyiyləsə kimisə yaman xatırladırdı... Dayan, dayan... Elə bil nə isə Zaurun beynində durulub aydınlaşmağa başladı, amma Nadir dərhal onu fikirlərindən ayırdı. Zaura müraciətlə:

– Gəlin bunu da içək sizin sağlığınıza, – dedi. – Bağışlayın, siz nə sənət sahibisiniz?

Zaur:

– Nəşriyyatda işləyirəm, – dedi.

Nadir:

– Yaşa, – dedi, – nəşriyyat işçiləri bizim hamımızın fəxrimizdir, başımızın ucalığıdır... Siz bizə mənəvi qida verirsiniz, bizim də borcumuzdu ki, sizə nə cür ki, lazımdır, o cürnə hörmət göstərək... Nəşriyyatda kitab buraxırsız da, ya bəlkə səhvim var? Ay sağ ol... Kitab biliyin anasıdır. Kitabsız indi bir addım atmaq olmaz... Mənim atam rəhmətlik, – allah ölənlərivizə rəhmət eləsin, – yaman istəyirdi ki, mən də oxuyub alim olum, nə bilim, kitab yazan olum. Elə əmim də məni görən kimi başlayır, danlamağa ki, bircə sənsən bizim ailənin adını batıran. Axı, doğrudan da, bizim nəsildə hamı oxumuşdur, bircə mənəm belə fərsiz çıxan. Neyləyim, vaxtında ağlım olmayıb, oxuyub başımı bir yana çıxarda bilməmişəm, indi də birtəhər çaq-çuruq eləyirəm də. Bütün qohum-əqrəbam hamısı oxumuşdular, amma bilmirəm, nə məsələdir ki, bu oxumuşlar həftə səkkiz mən doqquz gəlirlər yanıma ki, bəs gərək borc verəsən bizə, puldan korluq çəkirik. – Nadir qəhqəhə çəkib güldü. – Ay Muxtar müəllim, zarafatdır da, dilxoşluqdur da, bala-bala edirik özümüzçün. Amma əmim, doğrudan da, böyük adamdır. Kişi əməlli-başlı alimdir e... Hə, yeri gəlmişkən, elə o da nəşriyyatda işləyir, bəlkəm siz tanımamış olmazsız? Dadaş.

Zaur: “Əlbəttə, Dadaş, – deyə düşündü, – nə cür olub ki, indiyə qədər tapa bilməmişəm bu adamın kimə bənzədiyini? Bu gödək əllər, bu toppuş qısa barmaqlar – bunlar ki, Dadaşınkıyla eynidir”.

Zaur sual, yox, təsdiqlə:

– Cabbarov Dadaş, – dedi.

– Tanıyırsız?

Zaur:

– Bir yerdə işləyirik, – dedi və düşündü ki, vəssalam, hər şey gəlib nöqtəsində dayandı. Bütün iplər bir-biriylə bağlanıb düyünləndi. İndi Nadir bir neçə əhvalat da danışacaq və məlum olacaq ki, Təhminəylə də yaxından tanışdır.

Nadir:

– Təsadüfə bax e, – dedi. – Yox, bu məsələnin üstündən belə yüngülvarı keçmək olmaz. Bu məsələni gərək biz əməlli-başlı qeyd edək. Adə, Arif! – deyə çağırdı, – o arağı bəri gətir görüm.

Amma Muxtar:

– Yox, yox, – dedi, – mən daha içən deyiləm, getməliyəm. Tələsirəm. Qalsın başqa səfərə. Amma özünüz bilin, bəlkə Zaurla ikiniz içmək istəyirsiniz. Hər halda, mən gedirəm.

Zaur:

– Yox, – dedi, – mən də tələsirəm.

Nadir:

– Yox, siz mənim ürəyimi qırırsız, qoy bir boşqabları təzələsin, bir-iki şiş isti kabab gətirsin, bir balaca araq, dünya dağılmaz, iş qaçmır ki... – amma Muxtar onu dinləmədən yavaşca durdu, “bağışlayın, bir dəqiqə” – deyə harasa çıxdı və bir qədərdən sonra qayıtdı.

– Zaur, gedirsiz? – dedi.

Zaur:

– Bəli, gedirəm, – dedi, ayağa durdu. Nadirə müraciətlə: – Neçə verəcəyik? – deyə xəbər aldı.

Muxtar:

– Çatıb, – dedi.

– Necə? – Nadir yerindən sıçradı. – Adə, Arif, adə, qırışmal, utanmırsan Muxtar müəllimdən pul alırsan?

Arif boynunu büküb:

– Neyləyim, ay Nadir qədəş, – dedi. – Muxtar müəllim dedi ki, almasan, bir də bura ayaq basan deyiləm.

Nadir:

– Muxtar müəllim, yaman sataşırsan a, – dedi, – mən sifariş verirəm, xərci sən niyə çəkirsən? Mən sizi qonaq eləmək istəyirdim.

Muxtar:

– Biz xanım deyilik ki, bizi qonaq edəsən, – deyə gülümsündü. – Həm də, – Zaura göz vurdu, – mən Zaurun üsuluyla hərəkət elədim. Bir dəfə Moskvada bax bu sayaq o məni qonaq elədi, mən də borclu qalmaq istəmədim. Nadir, sağ ol, deməli, pivəni gözləyirəm.

Nadir:

– Mütləq, – dedi, amma hiss olunurdu ki, möhkəm pərtdir. Axı nə Muxtara, nə də əmisi Dadaşın iş yoldaşı Zaura səxavətini, əliaçıqlığını lazımınca nümayiş etdirə bilməmişdi.

...Zaurla Muxtar bulvarın adamsız xiyabanlarında addımlayırdılar. Sükutu Muxtar pozdu:

– Siz yəqin təəccüblənərsiz... Mənim bu sayaq – Nadiri deyirəm – bu sayaq adamlarla tanışlığıma təəccüblənirsiniz. Məsələ ondadır ki, məni hər cür, hər növ insanlar maraqlandırır – yaxşısı da, pisi də, ax-

mağı da, ağıllısı da, təmizi də, əyyaşı da... Azarımdır cürbəcür adamlarla görüşmək, təmasda olmaq, sözlərini eşitmək, anlamağa çalışmaq onların düşüncə və həyat tərzini.

Zaur:

– Nə üçün axı? – deyə soruşdu.

Muxtar:

– Nə bilim, – dedi və təkrar etdi, – nə bilim... Amma illər keçdikcə mən özümü də, başqalarını da daha pis anlayıram. Heç başa düşə bilmirəm insanları da, özümü də. Bircə onu bilirəm ki, bu dünyada sual çoxdur, cavab az.

Bulvardan çıxdılar...

Muxtar:

– Taksini hardan tapaq indi? – dedi. – Burada bütün taksilər Bayıl tərəfə gedir.

Zaur:

– Yaxşı, axı demədiz, mənə niyə zəng vurmuşduz.

Muxtar:

– Hə, deyirəm axı, nə isə sözüm qaldı sizə... Məsələ ondadır ki... Aaa, taksi! – deyə çağırdı. – Taksi! Saxla görüm!

Maşın düz onların qabağında dayandı.

Muxtar:

– Bağışlayın, sən allah, – dedi və maşına əyləşdi, – yaman tələsirəm, gecikmişəm daha doğrusu, sabah axşam sizə zəng vuraram, danışarıq. Yaxşı?

Maşın hərəkətə gəldi. Zaur hiss edirdi ki, içkinin ağır dumanı beynini get-gedə daha çox bürüyür. Ağır-ağır evə tərəf addımladı. Təhminənin evinə tərəf...

## On üçüncü fəsil

*Ah idi həmnəfəsim ah ki, ol həm axır,*
*Çıxdı ikrah qılıb gülbeyi-ehzanımdan.*

Heç vaxt bu pilləkənləri belə ağır bir hisslə belə ağır-ağır qalxmamışdı. Qapının ağzında da xeyli yubandı, cibindən çıxardığı açar heç cür yuvasına düşmürdü.

Axır ki, qapını açdı, mənzilə girdi. Təhminə evdəydi. Zaur keçib əllərini yudu, bir xeyli də orda yubandı. Sonra otağa keçib kürsüdə əyləşdi. Təhminə də qarşıdakı kürsüdə oturmuşdu, siqaret çəkirdi.

– Nahar eləmirsən? – deyə soruşdu.

Zaur:

– Yox, yemişəm, – dedi, o da siqaret çıxarıb odladı... Hər ikisi dinib danışmadan siqaret çəkirdi, heç biri söhbəti açmaq istəmirdi və hər ikisi bilirdi ki, gec-tez mütləq söz açılmalıdır.

Nəhayət, Zaur qərara gəldi:

– Dünən Dadaşlaydın? – deyə xəbər aldı.

Təhminə başıyla təsdiq elədi:

– Elçi göndərmişdilər yanıma Dadaşı, – dedi. – Sənin valideynlərin... Sövdalaşmaqçün. Deməli, mən səni onlara qaytarıram, əvəzində onlar məni rahat buraxırlar, daha qulağımı dəng eləmirlər.

Zaur:

– Əcəbdir, – dedi. – Mən demək elə-belə cansız bir əşyayam, dəyiş-düyüş edirsiz.

– Bu sənin özündən asılıdır. – Zaura elə gəldi ki, bu sözlərlə Təhminə yenə də onun zəif damarını tutmaq istəyir. Axı çox gözəl bilirdi ki, Zaurun söyər yeri məhz budur – onun müstəqilliyinin, sərbəstliyinin şübhə altına alınması: indi beyni içki dumanı içində olarkən Təhminənin niyyəti ona daha dəqiq və aydın görünürdü.

Təhminə:

– Hər halda, – dedi, – mən səni zorla tutub saxlamaq fikrində deyiləm. Mənim evimə özün öz ayağınla gəlmisən, haçan kefin istəsə, özün öz ayağınla çıxıb getməyə də ixtiyarın var.

– Ehtiras bitib-tükəndi? – Zaur kinayəylə Dadaşın sözlərini təkrar elədi.

Təhminə əsəbi bir tərzdə:

– Ehtirasın bura nə dəxli var? – dedi. – Dünya tək bir ehtiras üzərində qurulmayıb ki.

“Dadaşın fikirləridir büsbütün”.

– Bircə şey mənə aydın deyil, – dedi Zaur. – Niyə sən bizim ikimizə aid olan məsələləri Dadaşla müzakirə eləməlisən? Dadaş sənin nəyindir – əmindir, atandır, nəyindir, hə?

Təhminə kədərlə:

– Mənim nə atam var, – dedi, – nə də anam. O sənsən, maşallah, atan da var, anan da.

Zaur əllərilə saçlarını qarışdırdı, sonra üzünü, gözlərini ovuşdurmağa başladı.

– Axı niyə məhz Dadaşla danışırsan bizim işlərimiz haqqında?

– Dedim də sənə, bu anavın təşəbbüsüdür. Tək Dadaş olsaydı, dərd yarıydı. Haradansa Muxtara da tanış tapıblar. O da dünən axşam bu məsələyçün axtarırmış məni.

Bu xəbər gözlənilməz olmadı Zaurçün. Bayaq Muxtar deyəndə ki, səninlə sözüm var, Zaurun ürəyinə dammışdı. Axı ayrı nə sözü ola bilərdi ki, Muxtarın Zaurla?

– Hətta, Mədinəyə də zəng vurubmuş.

– Mədinəyə?

Təhminə:

– Bəli, – dedi, sonra rişxəndlə əlavə etdi, – amma Mədinəyə zəng eləməyi yaxşı olub. Mədinə onun cavabını yaxşı verib. Büküb abrını ətəyinə... Mədinəni tanımır hələ anan... dilinə bələd deyil, Mədinə doqquz qoyar ona söyüş söyməkdə.

– Mədinənin nə həddi var ki, mənim anama söyüş söysün? – Zaur hiss edirdi ki, bütün əsəbləri gərilib, hirsindən əsirdi və hiss edirdi ki, bu gərginlik Təhminəyə də yoluxur. Ya bəlkə əksinə, Təhminənin hirsi, hiddəti, əsəb gərginliyi Zaura təsir edirdi.

Təhminə:

– Bəs sənin ananın nə həddi var ki, Mədinəni aradüzəldən yengə adlandırır? Həyasızlığa bax sən allah... Nə var, nə var Mədinənin əri yoxdu. Əri yoxdursa, ona ağzından gələni demək olar? Nə olub, Mədinənin nəyi əskikdir ondan, öz əlinin zəhmətiylə dolanır, balasını saxlayır... Heç mən bilmirdim, demə sənin anan da cavanlıqda elə Mədinə kimi makinaçı işləyirmiş, intəhası ananın bəxti gətirdi, mötəbər adama ərə getdi, amma Mədinəninki gətirməyib də.

– Sus, kəs səsini, – dedi Zaur, – anam barəsində artıq-əskik danışma, – o az qala qışqırırdı.

– Bəs nə haqla anan Mədinəni təhqir edir, kim verib bu haqqı ona? – Təhminə də qışqırırdı. Əsəbdən əsim-əsim əsirdi... – aradüzəldən yengə.

Zaur:

– Düz deyib anam, sənin Mədinən elə aradüzəldən yengədir ki, var.

Heç bir vaxt Təhminəni bu sifətdə görməmişdi; elə bil üzü əyildi Təhminənin.

– Deməli, belə. Aradüzəldən... mən də, deməli, onun kadrıyam da.

– Mən belə söz demədim.

– Nə olsun demədin? Fikrində ki, tutmusan. Həmişə fikrində bunu tutmusan. Əlaqəmizin ilk günündən mənim haqqımda belə düşünmüsən. Fahişə hesab eləmisən məni. Elə ona görə də mənə yaxınlaşmaq fikrinə düşmüsən də. Fikirləşmisən ki, nə var, yüngül, ayağısürüşkənin birisidir də... Sonralar ən xoşbəxt günlərimizdə də bu fikir içini gəmirib, həmişə-həmişə şübhələnmisən məndən. Xəyanət, etibarsızlıq gözləmisən məndən. Ürəyinin dibində məni əxlaqsız qadın hesab eləmisən həmişə. Elə indi də bu fikir səni rahat qoymur. Ona görə ki, sən südəmər uşaqsan, kişi deyilsən hələ.

Zaur içindəki bütün zəhəri dilindən tökərək:

– Əlbəttə, kişi Dadaşdır, Spartakdır, qəssab Fazildir, – dedi, – sənin aləmində...

– Kişi mələkəni fahişə edən deyil, fahişəni mələkə edəndir.

Zaur:

– Düz deyirsən, mən bunu bacarmadım – dedi.

Təhminə ağappaq ağardı və:

– Dur, çıx get burdan, – dedi. – Yüyür get anavın yanına, "Moskviç"ivin yanına. Alçaq.

Zaur özü də bilmədi ki, necə oldu, birdən-birə şillə çəkdi Təhminəyə. Təhminə əlləriylə üzünü örtüb yerindən sıçradı, qaçıb otaqdan çıxdı. Zaur da ayağa durdu, dəhlizə çıxdı. Yavaş-yavaş çöl qapısına tərəf addımladı, sonra otağa qayıtdı, cibindən qapının açarını çıxardıb, dolabçanın üstünə qoydu. Yenidən dəhlizə çıxanda qeyri-ixtiyari mətbəxə tərəf baxdı: Təhminə mətbəx masasının arxasında hərəkətsiz oturmuşdu, əlləriylə sifətini örtmüşdü.

Zaur qapını çırpıb çıxdı...

***

Unutmaq olmaz axı, unutmaq olmaz axı, unutmaq olmaz axı ki, bu ancaq oyundur... Yeniyetməlik çağlarında, qadınlar dünyasına qədəm qoyduğu ilk aylardan, illərdən bunu dərk eləmişdi, bilmişdi, öz-özünə tövsiyə vermişdi axı. Ciddi, ya qeyri-ciddi, qısa, ya uzun müddətli, təsadüfi, keçəri, yaxud əsaslı, davamlı əlaqələrinin heç birində Zaur bu dərsi, bu qanunu unutmurdu... bəs necə oldu ki, o, kişi çağında bu vacib həyat təcrübəsini unutdu birdən-birə? Niyə imkan verdi ki, cilovsuz bir duyğu varlığına hakim kəsilsin, iradəsini buxovlasın, ona bu qədər ağrı və acı gətirsin. Unutmamalıydı, bütün bunların yalnız oyun,

əyləncə, ötəri xoş münasibətlər olduğunu unutmamalıydı bir an da. Unutdu və indi budur – cəzasını çəkir... necə oldu ki, bu cür aldandı, necə oldu ki, oyunun qanunlarını pozdu və bu oyunu məhəbbət bildi? Məhəbbət bilən kimi də oyun amansızlaşdı, əyləncə yox, işgəncəyə çevrildi... Elə bilirdin ki, möcüzə baş verib? Sevgi filan... ancaq kitablarda və kinolarda olur bu, ya da həyatda olursa, yalnız 17–18, ən uzağı 19 yaşında, vəssalam. Sən isə 24 yaşında bu cür aldandın... Öz yaşının acı, amma vacib dərslərini necə unutdun ki, belə tələyə düşdün, ay biçarə?

Beynində qaynayıb pırtlaşan fikirlərlə şəhərin küçələrini dolaşa-dolaşa adamsız qaranlıq dalanlara gəlib çıxdı. Burada şəhər evləri qurtarırdı, çöllük başlanırdı...

## On dördüncü fəsil

*Məhrəm qoyub önərmə sinəmdə qanlı dağı,*
*Söndürmə öz əlinlə yandırdığın çırağı.*

Əvvəl elə bildi ki, öz "Moskviç"ini sürür, sonra birdən başa düşdü ki, yox öz maşını, həm də "Moskviç" deyil bu maşın, çəhrayı "Volqa"dır. "Volqa"nın sükanı arxasında idi Zaur, özü də lüt idi, – bircə mayka vardı əynində, amma maşını geniş və izdihamlı küçəylə sürürdü. Əvvəl ona elə gəldi ki, bu küçə Moskvadakı Leninqrad prospektidir, sonra gördü ki, yox, Bakıdakı Nərimanov prospektiylə sürür... Tindən milislər çıxdılar, işarə elədilər ki, Zaur saxlasın maşını. Zaur saxlamadı, saxlaya da bilməzdi, axı özgənin maşınını qaçırtmışdı – bu bir, maşın sürmək vəsiqəsini götürməmişdi – bu iki, lüt idi, heç trusiki də yox idi əynində, bircə mayka vardı və maykayla birtəhər örtünmək istəyirdi – bu üç, həm də dəm idi, – bu da dörd – kababxanada "Ekstra" arağı və çex pivəsi içmişdi, bütün bunlarla bərabər küçənin tərs istiqamətində sürürdü, bu da beş, bu da altı, yeddi, səkkiz, kimsə elə bil onun başının üstündə sayırdı və Zaur başa düşürdü ki, yuxudadır, amma ona elə gəlirdi ki, bunu başa düşəndən sonra ayılıb yuxudan və yuxuda yox, doğrudan doğruya, real gerçəklikdə maşın sürür, sükan arxasındadır, əynində də tək bircə maykası var və dəhşətlə onu da duyurdu ki, tək deyil, maşının içində kimsə başqa bir nəfər də var – haçan mindirmişdi bu adamı, yadına gəlmir, yox, heç kəsi mindirmə-

mişdi, amma maşının arxa kürsüsündə kimsə vardı və Zaur çevrilib o sərnişinə baxmasa da, onu görməsə də, nəfəsindən kim olduğunu bilirdi – Təhminə oturmuşdu arxada. Milislər iki motosikldə Zaurun maşınını qovurdular, amma dünya dağılsa da Zaur onların təqibindən qaçıb qurtarmalıydı, çünki ələ keçsəydi biabırçılıq olardı, professor oğlu özgənin maşınını qaçırdıb, həm də kimin maşınını – öz qonşusu Spartakın maşınını?.. Özü də təsəvvür edirsiz, şəhərin içində, günün günorta çağı sükan dalında lüt ətcəbala oturub, bu da kifayət deyilmiş, maşınına yad bir arvadı da mindirib, başqa bir kişinin arvadını – axı Təhminə Dadaşın arvadı idi. Bir az qabaq da məhkəmədə keçmiş əri Muxtardan boşanmış, Dadaşa ərə getmişdi, amma Dadaş da ikiləşirdi, kimsə başqa bir adam da vardı, eynilə Dadaşa oxşayan, onun kimi potaboy, yekəqarın, burnu ziyilli və əlləri də eynilə Dadaşın əlləri kimi gödək, barmaqları da beləcə qısa və toppuş; amma bu adam Dadaş deyildi, onun ikiləşmiş surəti idi. Kim idi bu adam, kim idisə noyabrda pomidor və xiyar yeyirdi, indi də həmin adam tüfəngini Zaurun peysərinə tuşlamışdı, gözləyirdi ki, maşın sürətini bir azca yavaşıtsın və o zaman tətiyi çəkəcəkdi bu adam – bu ikinci Dadaş. Zaur bunu duyduğu üçün sürəti daha da artırırdı, nəhayət, qazı axıracan basdı. Ayağı möhkəm metal səddə dirəndi – sonuncu sürətə çatmışdı, bundan tez gedə bilməzdi maşın... və əksinə sürət get-gedə azalmağa başladı və bu zaman arxadan tüfəng atmağa başladılar. Atan milis paltarı geymiş iki Dadaş idi, amma qəribədir, tüfənglərinin patronları qırmayla deyil, toxumla doldurulmuşdu və Təhminə dedi ki, bu gül toxumlarıdır. Bu zaman qarşı tərəfdən də onlara sarı motosikletlər gəlməyə başladı – hamı burdaydı – Spartak da, atası Murtuz da, Mədinə də, Muxtar da...

Birdən Təhminə arxadan Zaurun boynunu qucaqladı, daha doğrusu qollarını uzun şərf kimi Zaurun boğazına doladı, Zauru boğmağa başladı. Zaur xilas olmaq üçün əllərini sükandan ayırdı. Təhminənin qollarını boğazından qoparmağa çalışdı. Təhminə isə həmin andaca sükandan yapışdı və kəskin hərəkətlə sükanı sola burdu, maşın sola döndü və hər ikisi gördülər ki, yolun sol kənarında dibi görünməyən bir uçurum var və maşın da düz bu uçuruma tərəf gedir...

– Nə olub, a kişi, nə qışqırırsan. – Zaur bu səsə və birdən otağı bürümüş işığa ayıldı. Qapıda Azər Mərdanov dayanmışdı. Azərin əynində zolaq-zolaq pijama vardı. Azər təbəssümlə:

– Nə yaman qışqırırsan. Qara basırdı səni? – dedi.

Zaur:

– Qışqırırdım? – deyə xəbər aldı.

– Bilirsən necə? O biri otaqda eşidib durdum.

Zaurun çarpayısının baş tərəfində pəncərə vardı və pəncərəyə damcı-damcı yağış yağırdı...

Zaur:

– Bağışla, səni də yuxudan elədim, – dedi və əlini uzadıb siqaret götürdü.

Azər işığı keçirib öz otağına keçdi. Zaur siqaretini odladı...

Dünən küçələri dolaşa-dolaşa gəlib bura – köhnə universitet yoldaşı Azər Mərdanovun mənzilinə çıxmışdı. Xoş bir təsadüfdən Azər bu axşam ekspedisiyada deyildi, Bakıdaydı. Zaurun macəralarından bixəbər idi Azər, Zaur da heç nə danışmadı ona. Bircə onu dedi ki, müəyyən səbəblərə görə bir neçə gün Azərgildə qalmaq istəyir, əlbəttə, əgər mümkündürsə, Azəri narahat eləməzsə...

Azər:

– Nə narahatçılıq, canım, nə danışırsan, istəyirsən lap bir il qal, – dedi. – Onsuz da üç gündən sonra ekspedisiyaya gedirəm.

Bəlkə də Zaur bura təsadüfən gəlib çıxmamışdı. Azərin subay həyatından da xəbərdar idi, qonaqpərvərliyindən də, amma bəlkə bura gəlməyinin əsas səbəbi Azərin köməyilə ekspedisiyaya düzəlmək arzusuydu. Axşam bu barədə xeyli danışdılar. Azər: “Mən bir İdrislə məsləhətləşərəm, – dedi, – görüm nə deyir. – İdris universitetdə onların müəllimi olmuşdu, tanınmış geoloq idi. Azərin işlədiyi ekspedisiyaya hamilik edirdi. Azər: “Yəqin ki, İdris səni yaddan çıxartmayıb, – dedi, – mənə elə gəlir ki, düzəltmək olar bu işi. Hər halda mən imkan düşən kimi danışaram”.

“Sadıllı” çaxırı içir, Azərin bişirdiyi qayğanağı yeyir və dünyada hər şeydən danışırdılar. – Azərin çalışdığı ekspedisiyadan, ümumən geologiyadan, universitet illərindən, köhnə yoldaşlarından, dünya futbol çempionatından, qadınlardan, ailə qurmağın vacibliyindən, oğul-uşaq atası olmağın ləzzətindən, daha nə bilim nədən və Zaur bircə kəlmə də həyatının son aylarındakı hadisələrdən söz açmadı. Guya olmamışdı da heç bütün bu bəlalar...

***

Zaur Dadaşdan ərizəsini götürərək:

– Mən sizin xahişinizə əməl elədim, – dedi. – Üç gün keçdi, bu gün bazar ertəsidir, bu gün ərizəmi direktora vermək istəyirəm:

Dadaş:

– Demək, hər halda, çıxmaq istəyirsən burdan? – dedi. – Bəs harda işləyəcəyini necə, fikirləşmisən?

– Fikirləşmişəm, narahat olmayın. Geoloji ekspedisiyaya götürürlər məni.

Dadaş uzun zaman dinmədi, zənlə Zaura baxdı:

– Yaxşı, atangilə necə izah eləyim mən bu xəbəri?

Zaur:

– İzah eləmək lazım deyil, – dedi. – Bu axşam özüm atama deyəcəm, hər şeyi özüm deyərəm ona.

***

Hətta futbol oynayan uşaqlar da onu görüb dayandılar və ən balacası oyundan ayrılıb yuxarı, evlərinə qaçdı ki, bu təzə xəbəri çatdırsın... Zaur tamam sakit idi. Həyətlərindən, futbol oynayan uşaqların arasından keçdi, pilləkənlərlə yavaş-yavaş qalxmağa başladı. Artıq xəbər yayılmışdı və qonşular müxtəlif pəncərələrdən oğrun-oğrun baxırdılar. Zaura elə gəldi ki, hətta Murtuzovların pəncərəsində Murtuz Balayeviçin şəxsən öz daz başı da göründü.

Mis lövhə üstündə “Professor M. Zeynallı” yazılmış qapıya yanaşdı. Zəngi basanda tamam sakit idi, amma qapının ardından tələsik addımları – anasının addımlarını eşidəndə öz ürəyinin döyüntülərini də eşitməyə başladı.

Qapı açıldı, anasını gördü, dərhal da başa düşdü ki, bu gəlişi qəfil deyil anası üçün: “Dadaş agah edib” – deyə ağlından keçirdi:

– Xoş gördük, ana! – dedi.

Anası da sakitcə:

– Xoş gördük, – dedi və əlavə etdi, – gəlsənə içəri, – və bircə bu cümlədən məlum oldu ki, didərgin oğul neçə müddətdən sonra doğma ocağının başına qayıdıb. Çünki axı daimi yaşayan adamı içəri xüsusi dəvət eləməyə nə hacət? Dəhlizə girdi. Paltosunu çıxara– çıxara anasının davranışına təəccüblənirdi – nə “ah-of” eləmişdi anası, nə qışqırmış, nə ağlamış, nə onu tənbeh etmiş, nə də bağrına basıb sevinmişdi. Çox adi və sadə görüş idi bu, elə bil heç nə olmamışdı.

Zaur:

– Atam necədir? – dedi. Anası:

– İndi babatdır, – dedi. Sonra əlavə etdi. – Yaman qorxuzmuşdu bizi, təzyiqi qalxmışdı, ürəyi də incidirdi.

Zaur atasının otağına daxil oldu. Məcid stolunun arxasında oturub işləyirdi. Zauru görüb ayağa qalxdı, əl uzatdı.

Sonra hər ikisi oturdu və Zivər xanım getdi çay dəmləməyə.

Sükutu Zaur pozdu:

– Necəsən?

Məcid uzun-uzadı, durğu işarələri işlətmədən, xəstəliyindən, həkimlərin konsiliumundan, təyin etdiyi dərmanlardan danışırdı və hər ikisi başa düşürdü ki, bu müfəssəl söhbətin əsas məqsədi aralarındakı yabançılığı dəf etmək, keçmiş məhrəmliyi yenidən bərpa etmək üçündür – bütün bunlar üçün isə vaxt, müəyyən muddət lazım idi – hər hansı danışıqlarla, kənar, əsil mətləbə dəxli olmayan söhbətlərlə doldurulmalıydı aralarındakı bu vaxt uçurumu, zaman yarğanı.

Zivər xanım otağa qayıtdı, gözləri qıpqırmızı idi, amma üzü gülürdü. Zivər xanımın armudu stəkanlarda gətirdiyi çaydan qurtum-qurtum içir və üçü bir yerdə Məcidin xəstəliyindən danışırdılar. Zivər xanım arabir ötəri replikalarla Zaura ailələrindəki son xəbərlərdən məlumat verirdi, gəlib-gedəndən danışırdı, kim zəng eləyib, kim soruşub, kimdən məktub gəlib, sözarası Zaurun kooperativ mənzilinin hazır olduğunu da eşitdirdi oğluna və dedi ki, bu günlərdə ev təhvil veriləcək. Orderlər hazırdır, bir nəfər öz gözüylə görüb.

Atası görünür yorulmuşdu bu söhbətdən, gərginlikdən və tez-tez masası tərəfə, açıq qalmış kitablara, kağızlara tərəf baxırdı. Zaur ayağa qalxdı, atasıyla görüşmədən o biri otağa keçdi. Zivər xanım onun dalınca gəldi və bu an Zaur anasının gözlərində qorxu, təlaş oxudu. Bu təlaş vəziyyətin qeyri-müəyyənliyiylə, Zaurun gəlişinin aydın olmayan məqsədiylə bağlı idi. Atası da, Zivər xanım da bilmirdi ki, Zaur necə gəlib – birsaatlığa, ikisaatlığa xəstə atasına baş çəkməyə, ya həmişəlik... Təhminəylə biryolluq əlaqəni kəsib evlərinə qayıdıb, ya qısa bir müddətə rüsxət alıb, bədbəxt ata-anasını yoluxmağa gəlib? Və odur ki, Zivər xanım diqqətlə oğlunun hərəkətlərini izləyirdi – hara, hayana gedəcək, çöl qapısına tərəfmi, öz otağına tərəfmi, ya da bəlkə elə bu otaqda oturacaq, yeməyə bir şey istəyəcək... Zaur divarlara göz gəzdirdi, elə bil ilk dəfəydi görürdü bu oboyları.

Sükut üzücü, dözülməz idi. Zivər xanımın hövsələsi çatmadı:

– Yerini dəyişmişəm, – dedi. – Çiməcəksən?

Zaur da yalnız bu suala deyil, verilməmiş, amma nəzərdə tutulmuş başqa suala cavab olaraq:

– Hə, – dedi.

***

Çiləyin isti iynələrindən sonra, dabandaşının təmasından sonra, köpüklü şampunların mülayim tumarlarından sonra tərtəmiz, ağappaq yatağa uzanmaq, tanış otağın doğma divarlarına – hər qarışı, hər çapığı, hər məftili, xətti, ləkəsi tanış olan divarlara baxmaq nə qədər xoş idi. Divarlara haçansa Zaurun özünün çəkdiyi fotoşəkillər vurulmuşdu, çarpayısının yanında, gecə dolabçasının üstünə siqaret qutusu, alışqan, külqabı, yapon tranzistoru və maqnitofon qoyulmuşdu, yerindən durmadan ancaq əlini uzadaraq musiqi dinləyə bilər, siqaret çəkər, fikir-xəyallara dala bilərdi. Cürbəcür cihazların dəlisiydi, səsyazan aparatlarla saatlarla əlləşməyi, fotoqrafiyayla məşğul olmağı sevərdi. Sonra – maşın sürməyə başlayandan sonra – bu həvəsləri kölgədə qaldı, çoxundan vaz keçdi. Əsas marağı, həvəsi maşın motoruyla əlləşmək oldu. Bu həvəsin sayəsində idmanı da unutmuşdu tamam, qantellər, espanderlər otağın bir küncündə atılıb qalmışdı. Amma nahaq yerə – idmanı boşlamaq olmaz – yaşı da elə yaşdır ki, idmanla ardıcıl məşğul olmasa, bir də görürsən, Dadaş kimi göbək bağladı.

Dadaşın adı beyindən keçən kimi, dərhal telefon səsləndi və Zaur diksindi bu zəngdən. Amma o saatca da düşündü ki, daha hər telefon zəngindən diksinməyə, təlaş keçirməyə səbəb yoxdur: nə Təhminəni çağıran kişi səsləri eşidəcəkdi dəstəkdən, nə anasının Təhminəyə aid olan hədələrini, söyüşlərini heç kəs onun "allo"suna cavab olaraq dəstəyi şırpadan asmayacaqdı daha.

Dəstəyi götürdü:

– Bəli.

– Zaur?!

– Bəli. – Mədinənin səsini tanımışdı.

– Danışa bilərsiz, ya bəlkə çıxıb avtomatdan zəng vurasız mənə.

– Yox niyə ki, lap rahat danışa bilərəm, buyurun, – soyuq bir nəzakətlə deyirdi bu sözləri.

– Üç gündür sizi axtarıram, tapa bilmirəm, nə işdə, nə evinizdə.

– Nədir ki, nə olub?

– Bilmirəm, Zaur, – o həyəcanlı idi, – bilmirəm telefonla bu barədə danışmaq olarmı. Telefonunuz paralel deyil ki?

– Yox.

– Bilirsiz... Təhminənin halı yaman xarabdır.

– Niyə, nə olub ki?

– Necə nə olub? Tamam halı özündə deyil yazığın... Əlbəttə, bilmir ki, mən sizə zəng vurmuşam, yoxsa qoymazdı, amma siz gedəndən bəri dəli-divanə kimidir. Qorxuram ki, lap özünə bir şey eləyər.

– Siz nə danışırsız? – Zaurun tonunda istehza var idi, halbuki qəsdən deyildi bu istehza, öz-özündən rişxənd, kinayə kimi alındı.

– Dünən gecənin bir aləmində oyandım – bilmərəm üç idi, dörd idi, neçəydi – gördüm işığı yanır. Həm də musiqi eşidilir. Təəccüb qaldım. Durub keçdim yanına, gördüm oturub divanın üstündə, əlləriylə dizlərini qucaqlayıb, musiqiyə qulaq asır və içir... Bir şüşə konyakı təkbaşına içib.

– Daha niyə nigaran qalırsız ki, – dedi Zaur, – bundan da yaxşı kef olar?

Mədinə səbirsizliklə:

– Eh, ay Zaur, – dedi, – Niyə özünüzü bilməməzliyə qoyursuz? Başa düşmürsüz ki, halı çox pisdir Təhminənin, mənə deyirdi ki, özümü öldürmək istəyirəm.

Zaur susmuşdu.

– Niyə başa düşmürsüz axı? Sevir e sizi. Hamıdan çox sizi sevir...

Zaur:

– Bəli, "hamıdan çox" – deyə təkrar elədi, – elə iş də bundadı ki, "hamıdan"... "hamıdadır" elə iş...

Mədinə bu sözləri qulaqardına vurdu.

– Bilmirsiz ki, əriylə da sizdən ötrü ayrıldı?

Zaur:

– Əşi, boşlayın görək, – dedi. Təzədən bütün bunlara qayıtmaq istəmirdi, amma tam arxayınlaşmaq üçün Təhminənin başında heç bir fəlakət olmadığını da bilməliydi. Əlbəttə ki, Mədinə hər şeyi şişirdir. Ayrılıqlarının ilk günləri Zaurun da az qala bağrı çatlayacaqdı, amma bax bir neçə gün keçdi, yavaş-yavaş sakitləşib, toxtayıb.

Mədinə:

– Sabah axşam bizə gəlin, – dedi. – Təhminəgilə yox e, bizə, mənim mənzilimə. Bir oturaq, ağıllı-başlı danışaq. Burda nə isə bir anlaşılmazlıq olub, vallah, kimsə girib aranıza... Yaman yazığım gəlir qıza...

Zaur:

– Yaxşı, – dedi. – Gecəniz xeyrə qalsın.

– Gecəniz xeyrə qalsın. Amma məbadə deyəsiz mənim zəng elədiyimi.

Bəli, buyurun görək... Evə qayıtdığı ilk axşam, rahat keçirmək istədiyi ilk axşamı da burnundan tökdülər. Axı qəti söz vermişdi özünə

– bütün olan-keçənləri biryolluq kəsib atsın, yenə təzədənmi başlanmalıdır hər şey? Əlbəttə, sabah Mədinəgilə gedib-eləyən deyil... Zaur siqaret yandırdı, ayrı şeylər barəsində düşünmək istədi, amma nə qədər cəhd etsə də bacarmadı. Təhminə gəlib dururdu gözlərinin qarşısında. Otağı, divanı. Təhminə də əlləriylə dizlərindən tutub oturub divanın üstündə, musiqi dinləyir, konyak içir və xısın-xısın ağlayır. Bəlkə götürüm zəng eləyim ona? Telefon budur bax, əlimin altındadır, dəstəyi götürüb altıca rəqəmi yığmaq, vəssalam. Zəng vurub danışım. Ya heç danışmayım, zəng vurum səsini eşidim, asım. Bəs birdən telefonu cavab vermədi?.. Birdən yoxdur evdə?.. Bu gün bazar ertəsidir, işləmir, evdə olmalıdır. Bəs birdən olmadı evdə?.. Evdə deyilsə, hardadır bu vaxt? Deməli, yenə bu barədə – Təhminənin harada olması barədə düşünəcək, deməli, yenə də biganə deyil buna, yenə də həyəcanlanacaq. Yaxşısı budur heç zəng vurmayım. Sabah zəng vuraram... Doğrudan da sabah zəng vurmaq olar... Elə bil bu fikirdən yüngülləşdi Zaurun ürəyi, ürəyindən asılmış daş qırılıb düşdü sanki. Sabah hökmən zəng vurar – bu fikirdən elə sevindi ki, sanasan itirdiyi, bir də görüşəcəyinə heç bir ümid bəsləmədiyi bir adama təsadüfən yenidən rast gəlib... Sabah zəng eləyər – yarıciddi, yarızarafat üzrxahlıq eləyər – hər halda o şilləni nahaq vurdu – bəli, zarafata salıb üzrxahlıq eləyər, sonra görüşməyi təklif edər. Əgər Təhminə ayrılmaqlarını, doğrudan da, ürəyinə salıbsa, doğrudan da iztirab çəkirsə bu ayrılıqdan, onda mütləq razılaşacaq, görüşəcəklər... Ümumiyyətlə, gələcəkdə də tez-tez görüşə bilərlər – amma indi daha tamam başqa cür – Zaur daha ayıq olar, bir də tələyə düşməz. Yazıq valideynlərini də incitməsin daha gərək... Sinləri də o sinn deyil, səhhətləri də... Zaur bundan sonra gərək tam ayıq başla davransın. Ayrılmağımızı istəmirsən, görüşmək istəyirsən, çox yaxşı, mən də razı, amma daha gərək hər görüşümüz gizli olsun, aləmə car çəkməyək. Həm də hər ikimiz dəqiq bilək ki, bu görüşlərin məhəbbətə-filana dəxli yoxdur, qadınla kişinin, erkəklə dişinin cinsi görüşləridir bu, vəssalam, şüttəmam... Və belə olan surətdə Zaurun nə borcuna Təhminəyə kim zəng vurur, kim vurmur, işdə olmayanda hardadır, harda deyil? Bir sözlə, onların münasibətləri ilk vaxtlarda, ilk görüşlərində necəydisə elə davam eləməlidir – nə məhəbbət gərəkdir Zaura, nə sədaqət. Yalnız elə-belə xoş görüşlər. Təhminə də buna razıdırsa, çox əcəb, görüşərlər, razı deyilsə... Nə deyib razı olmayacaq. Mədinə demirdi ki, ölüb əldən gedir?.. Səhər işdədir,

axşam tərəfi zəng vuraram. Deməli, sabah zəng vuracam... Bu xoş fikirlə Zaur yuxuya getdi.

Səhər ertədən oyandı, əl-üzünü yudu, mətbəxə keçdi. Zivər xanım oğluna çay tökəndə.

– Bilirsən ki, atan sənə hədiyyə alıb? – dedi. – Əhd eləmişdi ki, sən evə qayıdan gün versin, amma deyəsən, utanır. Mənə deyir ki, sən de.

Zivər xanım balaca açarı Zaura uzadaraq:

– Get, bax, – dedi. – Qarajdadır.

Yüyürə-yüyürə qaraja tərəf gedərkən Zaurun ürəyi nanə yarpağı kimi əsirdi, yox, yanılmamışdı, qarajda köhnə "Moskviç"in yerində par-par parıldayan təzə "Volqa" dayanmışdı.

***

Nahar vaxtı atasıyla bir azca çaxır içdilər. Məcid bircə qurtum aldı, sağlıqsız-filansız qədəhini Zaurun qədəhinə toxundurdu və Zaur başa düşdü ki, atası onun evə qayıtmasının şərəfinə qaldırır bu badəni. Sonra atasının tezliklə sağalması şərəfinə içdilər. Zivər xanımın sağlığına içdilər ki, belə dadlı-ləzzətli plov bişirib. Hətta kooperativ mənzilin şərəfinə də badə qaldırdılar.

Sonra atası öz otağına keçdi. Zaur da dedi ki, istəyirəm bir maşını havaya çıxardım.

Anası təlaşla:

– Axı içmisən? – dedi.

– Əh, nə içmişəm ki, iki-üç rumka yüngül çaxır da içməkdir? Tez qayıdacam.

## On beşinci fəsil

*Qeyr ilə hər dəm nədir seyri-gülüstan etdiyin?*<br>
*Bəzm urub, xəlvət qılıb, yüz lütfü ehsan etdiyin?*<br>
*Əhd bünyadin mürüvvətdirmi viran etdiyin,*<br>
*Hanı, ey zalım, bizimlə əhdü-peyman etdiyin?*

*Cürümümüz noldu ki, bizdən eylədin bizarlıq?*<br>
*Biz qəmin çəkdik, sən etdin özgəyə qəmxarlıq.*<br>
*Sizdə adət bumudur? Böylə olurmu yarlıq?*<br>
*Hanı, ey zalım, bizimlə əhdü-peyman etdiyin?!*

Birdən-birə arıqlamış adam köhnə pencəyinin genliyini duyan təkin Zaur da sürdüyü maşının dəyişmiş ölçülərini hiss edirdi. Qarajdan həmişəki kimi "Moskviç"i deyil, təzə "Volqa"nı çıxararkən, maşının böyürləriylə qarajın qapısı arasındakı məsafəni elə ölçüb-biçməliydi ki, par-par parıldayan maşınını cızmasın. Odur ki, sol tərəfdən – sükan tərəfdən az, o biri tərəfdən isə çox məsafə saxlayırdı. Qarajın qapısı, doğrudan da, "Volqa" üçün bir az darısqal idi, metal çərçivəyə sürtülüb cızıla bilərdi maşın, amma bir yandan baxanda "Volqa" qarajın içinə elə bu qapıdan girmişdi də, özü də cızılıb-eləməmişdi. Görəsən kim salıb onu qaraja? Birdən ağlına gəldi: Spartak. Əlbəttə, Spartak. Axı anası deyirdi ki, Spartak köhnə "Moskviç"i satmağa (təbii ki, öz qiymətinə, mağaza vasitəsilə) kömək eləmişdi atasına. "Volqa"nı da gedib Spartakla birlikdə seçmişdi atası. Maşını həyətlərinə Spartak sürüb gətirmişdi, qaraja salmışdı, nömrə almaqda da fəal iştirak etmişdi.

Zaur şəhər küçələrini bir-bir keçdikcə böyük və güclü maşına get-gedə daha çox alışır, hətta, isnişirdi. Doğrudur, hələ tam ram etməmişdi bu maşını, "Moskviç"in vərdişi hələ hakim idi əllərinə, ayaqlarına. "Moskviç"dəki pedallara, sükanlara bənzəyən pedalları, sükanları "Moskviç"ə vərdişli ayaqları, əlləriylə idarə edirdi, amma eyni hərəkətlərdən daha sürətli, daha güclü nəticələr alınırdı. Zaur onu da bilirdi ki, qısa müddətdən sonra bu maşınına da tamamilə məhrəm olacaq, onun hər sirrinə, xususiyyətlərinə, hər cür cəhətinə bələd olacaq və gələcək həyatının ən böyük sevincləri də məhz bu "Volqa"yla bağlı olacaqdı.

"Moskviç"i sürərkən ona bu qədər tanış görünən küçələr indi elə bil birdən-birə darısqal və qısa olmuşdu və Zaur bilmirdi: bu tinə çəpəki, kəsə yolla burulsa "Volqa"nın quyruğu səkidəki qəzet köşkünə ilişməz ki görəsən? Şəhər küçələrinin, döngələrinin, dalanlarının torundan qurtulmağa can atırmış kimi, bivec piyadaların, xam sürücülərin, qırmızı işıqforların, qadağan işarələrinin hökmündən xilas olmağa çalışaraq maşını şəhər civarına tərəf yönəltdi. Get-gedə maşını daha çox öz iradəsinə tabe etdiyini böyük şövqlə duyur və açıqlığa, gediş-gəliş az olan geniş yollara çıxdıqca sürəti hey artırır, başqa maşınları bir-birinin ardınca ötüb keçirdi. Geniş, rahat aerodrom yoluyla sürdükcə fərəh və asudəlik hissi onu daha artıq çulğalayırdı və özü də hiss etmədən şəhərdən uzaqlaşdıqca uzaqlaşır, Abşeronun şimal sahillərinə tərəf üz tuturdu. Ağlına gəldi ki, çoxdandır – daha doğrusu, yay

aylarında Təhminəylə birgə çimərliklərə getdiyi vaxtdan bəridir – bu yolla getməyib. Son həftə ərzində ilk dəfə idi ki, Təhminə haqqında sakit, həyəcansız, ağrısız düşünürdü. Dünənki müdrik qərarını bir də götür-qoy edir və bir də əmin olurdu ki, doğrudan da, çox ağıllı fikrə gəlib – Təhminəylə əlaqəni, münasibətləri tamam kəsmək lazım deyil, amma məbadə əvvəlki dəli-divanəliyə, məcnunluğa qayıdasan ha. Hər şey əndazəsində, dəqiq ölçülüb-biçilmiş olmalıdır; hərdən-birdən zəng eləyər Təhminəyə, arabir görüşərlər, hər ikisiyçün yaxşı olar belə bir əlaqə. Yəni əslində elə münasibətləri də bu cür başlanmışdı da – hər şey necə də xoş idi, sakit idi, ta o vaxtacan ki, Zaur özü öz axmaqlığı və əbləhliyi ucundan xam xəyallara düşdü, başını cürbəcür səfeh fikirlərlə doldurdu: nə bilim, əsil məhəbbətdir bu, həqiqətən sevirəm. Qısqandı, ağrıdı, başı daşdan-daşa dəydi, hardan axı beyninə batdı ki, səadətə çatıb? Və sonra da qorxmağa, əsməyə başladı ki, birdən bu səadət deyil, aldanmışam, ya aldadılmışam. Axı səadət yalnız tək bir xoş anlar deyil ki... Səadət həm də dəhşətli qorxu anlarıdır – həmin bu səadəti itirmək qorxusundan müc olub qaldığın dəqiqələr...

Bir neçə xoşbəxt dəqiqələrin qorxusunu, nigarançılığını saatlarla, günlərlə, həftələrlə, aylarla çəkməkdənsə tamam səadətsiz-filansız yaşamaq yaxşıdır. Əvvəllər elə-belə görüşəndə və bu görüşlərdən sonra ayrılanda, bir-biriləriyçün mövcud olmurdular artıq. Amma sonralar – bütün bu dolaşıq duyğular onun qəlbinə hakim kəsiləndə Təhminəni görmədiyi hər saat, Təhminənin harada olduğunu bilmədiyi hər dəqiqə min bir qara-qura şübhələrlə, bəd-bəd gümanlarla dolu olurdu.

Sahil qəsəbələrinin içiylə sürürdü maşını. Dəvə belinin donqarlığını xatırladan cütbacalı yastı damlar, yel dəyirmanları, kələ-kötür daşlardan hörülmüş hasarlar, tikan kollarından qurulmuş çəpərlər, talvarlara dırmaşdırılmış meynələr, küləyin süpürüb divar dibinə yığdığı qum təpəcikləri – bütün bu qərib, həzin payız mənzərələri keçib getmiş günləri xatırladırdı – onların ilk görüş çağlarını – közərmiş ehtiraslarsız, itkilərsiz, uçqunlarsız xoş günləri...

Uzaqda Murtuzovgilin bağları, evlərinin əyri eyvanı görünürdü. Bir dəfə Təhminəylə bura gəldikləri, içəri girdikləri yadına düşdü, hasarın yanından buruldu və dərhal əyləci basdı: az qala alaqapının ağzında dayanmış başqa bir maşınla – çəhrayı “Volqa”yla toqquşacaqdı. Bir an sonra Zaur dərk elədi ki, Murtuzovgilin qapıları qabağında dayanmış bu çəhrayı “Volqa” Spartakın maşınıdır... Zaur ehmallıca öz maşınını dar küçədə Spartakın “Volqa”sının yanından keçirtdi.

Dar dalandan burulub gen yola çıxandan sonra fikirləşdi ki, ilin bu vaxtında Spartakın bağda nə işi var, görəsən. Sonra ağlına gəldi ki, bəlkə Spartak tək gəlməyib bağa, saysız-hesabsız cananlarından biriylə gəlib... Zaur dəniz sahilinə çıxdı... Hava tutqun deyildi, amma dekabr dənizi, adamsız sahil payızın son nəfəsindən, qışın əvvəlindən xəbər verirdi. Haradasa sahilin bir tərəfində balıqçı komaları vardı və Zaur düşündü ki, indi bu komaların içində olmaq ayrı ləzzətdir – sahil soyuq olsa da, komalarda yəqin isti soba qalayıblar, pəncərələrdən baxırlar dənizə... Zaur maşınını sahil boyu sürəndən sonra yenidən şoseyə çıxdı. Qumlu sahilin təhlükəli yumşaqlığından sonra beton avtostradanın möhkəmliyi arxayınlıq hissi aşılayırdı, sürəti artdıqca artırmaq istəyi oyanırdı. Yol, demək olar ki, boş idi, təkdənbir maşınlar keçirdi. Yolun hər iki tərəfində plakatlar, çağırışlar, şəkilli diaqramalar vurulmuşdu. Şəkillərdən birinin üstündə eyni boylu, eyni biçimli, eyni cür ağaclar çəkilmiş, "Qəsəbəmiz nümunəvi olsun" sözləri yazılmışdı... Zaur qarşısında uzanmış geniş yolu seyr edir və get-gedə sürəti artırırdı – uzaqdan ona tərəf gələn maşına diqqət verdi, maşın get-gedə yaxınlaşırdı və bu andan etibarən elə bil hər şey Zaura yuxu kimi, ləng sürətli nümayiş etdirilən film kimi gəldi – elə bil vaxt başqa ölçülərlə, başqa sürətlə axmağa başladı, gerçəklik ayrı cür, ayrı rənglə, ayrı işıqda qavranıldı – qarşıdan gələn maşın Spartakın çəhrayı "Volqa"sı idi. Sükanın arxasında Spartak oturmuşdu, onun yanında qadın oturmuşdu və çəhrayı "Volqa" Zaurun maşınının yanından ötüb keçəndə Zaur bu qadının kim olduğunu da təyin etdi... Zaur bir müddət də getdiyi istiqamətdə getdi, ürəyi çırpınıb yerindən çıxacaqdı elə bil, hələ hər şeyi sanki axıracan dərk eləməmişdi və nə edəcəyini, nə etmək lazım olduğunu da bilmirdi hələ. Yalnız iki yüz-üç yüz metr keçəndən sonra kəskin saxladı maşını, döndərdi və geriyə sürdü – əks istiqamətə.

Çəhrayı "Volqa" xeyli uzaqlaşmışdı, dəmir yol keçidi həndəvərində idi. Zaur başa düşdü ki, Spartak da əlbəttə ki, onu tanıyıb və sürəti artırıb. Hər halda yarım dəqiqə ərzində Zaur onları haqlayardı, amma Spartak dəmir yol keçidini ötən kimi şlaqbaum bağlandı və Zaur uzun çoxvaqonlu qatarın keçib-getməsini gözləməli oldu. Artıq hər şey Zaur üçün aydın idi. Çəhrayı "Volqa"nın nə səbəbdən ilin bu vaxtında bağ qapısında dayanmasının səbəbini də bilirdi. Zauru görən kimi sürəti artırıb ondan qaçmasının səbəbini də bilirdi. Şlaqbaum düşhadüşdə altından keçib uzaqlaşmışdılar, niyyətləri, məqsədləri bir idi – qaçmaq,

vaxtı udmaq, məsafəni udmaq, bir sözlə, hər şeyi udmaq. Həyat adlanan bu oyunda Zauru udmaq, ona qalib gəlmək. Qalib gəlmək və gülmək Zaura – sadəlövh, hər şeyə inanan axmaq Zauru doyunca lağa qoyub gülmək – onun sadədilliyinə gülmək – "ay nə bilim, Zaurik, sən bizə gələn gün oboylar çiçək açdı, ay Zaurik, səni belə sevirəm, sənə sadiqəm, mən nə bilim nə". Hər şey, hər şey, hamısı, bütün sözləri, nəvazişləri, göz yaşları-hamısı yalan imiş, pozğun, əxlaqsız qadının mahir işvələri, fəndləri, tələləri və hiylələriymiş, vəssalam...

"Çərşənbə axşamı məşqdəyəm. Çərşənbə axşamıdır bu gün, bu imiş demə bunun məşqləri – Spartakla bağa getmək. Hər çərşənbə axşamı məşq adıyla bu bağa gəlirmiş yəqin, axmaq Zaur da divanın üstündə uzanıb onu gözləyirmiş, ay-hay... Əcəb olur sənin kimi axmağa. Sən orda divanda uzanıb siqaret çəkirdin, onlar isə burda, bu bağda həmin otaqda – ikisi... Təhminəylə Spartak... bu fikirlərdən, xəyalında canlanan bu səhnələrdən dəli olurdu Zaur və bu an maşınını qarşısından taqqataraqla ötən qatarın üstünə sürmək, toqquşmaq, əzilmək, parçalanmaq, həlak olmaq istəyirdi, amma eyni zamanda o iki nəfərdən hayıfını çıxmamış bu dünyadan köçmək də istəmirdi heç cür. Qatarın vaqonları qurtarmaq bilmirdi. Zaur bu vaqonlara baxıb, yenə də həmin o bağ otağını, Spartakın qolları arasında çırpınan Təhminəni görürdü və bilmirdi ki, bu qatar haçan keçib qurtaracaq, Zaur haçan bu keçidi adlayacaq, onları haqlayacaq. Hər şeyin, bütün yaralarının, təhqirlərin, ona elədikləri bütün yamanlıqlarının hayfını çıxacaq. Hiddəti, əsasən, Təhminəyə aid idi. Qəribədir ki, Spartak haqqında, hətta kinsiz düşünürdü. Spartak Zaurdan daha dünyagörmüş adam imiş, daha bic, daha fərasətli, daha təcrübəli imiş, vəssalam. Spartak kimisini hər cürə yağlı dillərlə aldatmaq olmaz. Zaur təki axmaq deyil ki, hər sözə inansın, hər saxta mehribançılığı həqiqət bilsin, hər hiyləni doğru saysın. Təhminənin bütün fəndlərinə, pişik tumarlarına, nəvazişli pıçıltılarına Spartak ancaq gülərdi, "mənə yox, mənə gəlmə" deyərdi və əcəb də edərdi, afərin Spartak. Spartak kimi olmaq lazımdır belə Təhminələrlə... İndi Zaur Təhminənin hər bir hərəkətini, hər sözünü, evdə olmadığı hər saatı – yalanla, fırıldaqla, saxtakarlıqla və riyakarlıqla bağlayırdı və yaddaşı qəsdən ona müxtəlif sübutlar, faktlar, xatirələr təqdim edirdi.

Bu lənətə gəlmiş qatar, nəhayət ki, keçib getdi...

Qalın sırıqlı pencək geymiş dolu bədənli qadın yoğun kəndirli çarxı hərləməyə başladı, şlaqbaum yavaş-yavaş qalxdı. Zaur maşını hə-

rəkətə gətirib, qalxmaqda olan şlaqbaumun altından keçdi. Sürət göstərici saatda 130-la 140 kilometr arasında gedib-gəlirdi. Bir azdan çəhrayı "Volqa"nı qabaqda, aeroporta dönən yolun ayrıcında gördü. İndi əmin idi ki, çatacaq onlara, ancaq, görünür, onlar da Zaurun maşınını görmüş və sürətini artırmışdılar, elə bil məsafə azalmırdı iki maşının arasında, elə bil bir ölçüdə donub qalmışdı aralarındakı məsafə... Zaur qazı tam dibinəcən basdı və artıq onların maşınları bir-birinə toxunacaq dərəcədə yaxınlaşmışdı. Zaur düşündü ki, indicə sükanı bir balaca sağa əysə, belə dəhşətli sürətlə çəhrayı "Volqa"ya ilişdirsə maşınını, hər iki maşın kəllə-mayallaq aşacaq və hər üçü lap yəqin həlak olacaq. Bu üçlük də ölüm tragikomediyanın məntiqi sonluğuydu.

...Ancaq baş vermədi bu sonluq... Spartakın əsəbləri tab gətirmədi, sürəti aşağı saldı. Zaur onların maşınını keçdi, təqribən iki yüz metr qabağa çıxıb sürəti kəskin azaltdı, sonra tamam saxladı maşınını və yanböyrü qoyaraq yolu kəsdi.

Spartak da kəskin saxladı və çəhrayı "Volqa" lazlarla sürüşüb Zaurun maşınının lap yanında dayandı.

Zaur maşından çıxıb, onlara tərəf getdi. Spartak da maşından düşdü, amma yerindən tərpənmədi, "Volqa"sının qanadına dirsəklənib dayandı. Paltosuz idi, əynində mixəyi kostyum vardı, köynəyinin yaxası açıq idi. Günün qürub çağında Zaur Spartakın bütün qızıllarını aydın görürdü – qızıl saat, qızıl üzük, boynundan tüklü sinəsinə sallanmış qızıl zəncir... İki qabaq dişi də qızıl idi... Spartakın rəngi qaçmışdısa da, üzündə təbəssüm vardı, cibindən qızıl portsiqar çıxardı, siqaret qoydu damağına, alışqanla yandırdı. Zaur alışqana da fikir verdi; "Ronson" idi – bəlkə bu da Təhminənin hədiyyəsidir. Zaur özü də təəccüblənirdi ki, indi, bu anlarda ən xırda təfərrüat da yayınmırdı diqqətindən... Təhminə tərəfə baxmırdı. Amma gözünün qırağıyla onu görürdü. Təhminə maşının içində hərəkətsiz oturmuşdu, donub qalmışdı sanki.

Spartak siqareti diliylə yuxarı dişlərinin arasında tutmuşdu, ağzı da açıq idi. Bir az təlaşlı, amma həmişəki kimi sitizə təbəssümlə:

– Nə oldu? – dedi. – Sınadın təzə maşınının sürətini? Əntiqə maşındı, doğrudan... Çox mübarək, sağlığına qismət olsun.

Zaur bu sözlərdə murdar bir istehza duydu və yanaşıb Spartakın çənəsinə bir yumruq ilişdirdi: Spartak səndirlədi, amma yıxılmadı, dişləri bir-birinə dəyib siqareti qırdı, siqaretin közərən başı Spartakın köynəyinin açıq yaxalığından sinəsinə düşdü, köz sinəsini, qarnını,

yandırdı. Spartak əlini tələsik yaxasından içəri salıb siqareti axtarmağa başladı: çox məzəli idi onun bu hərəkətləri. Spartakdan odekolon iyi gəlirdi. Nəhayət, siqareti tapdı, çıxartdı ordan, kənara atdı. Daha təbəssümdən əsər-əlamət qalmamışdı sifətində, tez maşının qapısını açdı, əlini paltosunun cibinə saldı. Həmin andaca maşının o biri qapısı açıldı və Təhminə bayıra sıçrayıb, tələsik addımlarla Zaura tərəf qaçdı. Zaur Təhminəyə tərəf baxmırdı, paltosunun cibindən bıçaq çıxarıb gələn Spartaka baxırdı. Bıçaq fin bıçağı idi, tiyəsi uzun və itiydi. Zaur fikirləşirdi ki, Spartak zərbə vurmağa cəhd etməmişdən bir an qabaq təpiklə onun qarnından ilişdirmək lazımdır və elə bu an özüylə Spartakın arasında Təhminənin mavi paltarını gördü. Moskvada Kino evinin restoranında həmin bu paltarda idi və bu paltarı Təhminənin bütün başqa paltarlarından daha çox sevirdi Zaur.

Təhminə Spartakı bərk-bərk qucaqladı, onun bıçaq tutmuş əlindən yapışdı və kəsik-kəsik:

– Qurban olum, Spartak, qurban olum sənə, – deyə-deyə maşının qapısına tərəf itələməyə başladı.

Zaur düşündü ki, əlbəttə, Spartak çox istəsəydi Təhminənin əllərindən qurtula bilərdi, itələyə bilərdi bir qırağa Təhminəni, amma, görünür, özü də buna cəhd eləmirdi: düzdür özünü elə göstərirdi ki, guya Zaurun üstünə cummağa çalışır... Sağ əliylə Spartakın bıçaq tutan əlindən bərk-bərk yapışmışdı Təhminə, sol əliylə isə maşının qapısını açırdı. Qapını açan kimi yenə də sol əliylə Spartakı oxşaya-oxşaya, sığallaya-sığallaya və tələsik-tələsik ona nə isə deyə-deyə maşına dürtmək istəyirdi. Sözləriylə, əlləriylə, Zauru qoruyan tarım bədəninin bütün qüvvətiylə Spartakı birtəhər maşına saldı və dərhal qapını çırpdı. Başını qaldırmadan, bir kəlmə dinib-danışmadan Zaurun qabağından keçdi, sağ qapıdan maşına mindi, oturdu. Maşının içində də nə isə danışırdılar hələ. Zaur isə durduğu yerdəcə dayanmışdı, gözləyirdi, onlardan qabaq çıxıb getmək istəmirdi. Nəhayət, Spartak motoru işə saldı, maşını çevirib əks istiqamətdə sürdü – dənizə tərəf, sahilə tərəf – bəlkə də əyri eyvanlı bağ evinə sarı...

***

“Əcəb axmağammış, ilahi, adam da belə axmaq olarmış!”. Şəhərə yaxınlaşdıqca fikirlər, sözlər Zaurun beyni içində qaynam-qaynam qaynayırdı. “Belə bir fahişənin üstündə mən iztirab çəkirdim, ürəyimə salırdım hər şeyi... Nəyimə lazım idi mənim o? Hardan beynimə sal-

mışdım ki, bu cür qadını sevmək olar? Bütün o şirin dilləri, o yağlı sözləri, vədləri – hamısı başdan-ayağa fırıldaq imiş... Gör özü də kimnən – Spartakla!!! Aman Allah, Spartakla ha... Gör bir fırıldaqçılığa bax, sən allah, necə də yalanlar tapıb deyirdi e... "maşınını qəsdən mənim evimin qabağında saxlayır... Ay səni... heç eybi yoxdur. Atamın oğlu deyiləm, bu hayfı onda qoysam... Necə eləyəm, onu elə yandıram, elə yandıram ki, cızdağı çıxsın... Spartakı qucaqlamışdı, guya məni onun bıçağından qoruyur, tüpürüm onun özünə də, bıçağına da. Ammaənginə əntiqə qoydum Spartakın, siqareti də qarnına düşdü, ləzzət elədi mənə... O gün elə Təhminəyə də yaxşı çəkmişəmmiş, yerində lap... İtin qızı it... heç eybi yoxdur... İndi mənə gülürlər, yəqin gediblər bağa, mənə gülürlər, daha da cuşa gəlirlər... Kef çəkirlər... Gülün, heç eybi yoxdur, görək axırda kim güləcək... Məni, demək, aldatdınız da öz aləminizdə?.. İndi görək axırda kim-kimi aldadacaq...

Zaur xəyal elədi, uzaq gələcəyi gətirdi fikrinə, bir gün haçansa, çox-çox illər sonra Təhminəyə rast gələcək, Təhminə lap qoca və eybəcər olacaq, amma qəmli-qəmli Zaura baxıb: – Zaurik, sən bizim hamımızdan bic çıxdın, – deyəcək – hamımızı aldadıb hamımıza doqquz qoydun, – deyəcək... Zaur da belə yuxarıdan aşağı baxacaq ona, etinasız gülümsünəcək, yəni ki, bəs sən nə bilmişdin Zauru? Amma bu çox-çox illər sonranın işiydi hələ, indi, bax indi neyləsin ki, Təhminəni yandırıb-yaxsın, kabab eləsin, hə?

Şəhərin küçələriylə sürürdü artıq. Şəhərə gecə düşmüşdü.

***

Təəccübdən Zivər xanımın ağzı açıla qalmışdı.

– Ciddi deyirsən?

Zaur:

– Əlbəttə, ciddi deyirəm, – dedi. – Heç bu boyda da zarafat olar? Axır vaxtlar çox fikirləşmişəm bu barədə, çox götür-qoy eləmişəm... Mənzil də hazırdır... Odur ki, başlayın görək fəaliyyətə.

Zivər xanım:

– Çox gözəl, – dedi. – Elə günü sabah elçi göndərərik. Amma sonra fikrini dəyişməzsən ki? – Zivər xanım bir qədər ehtiyat edirdi: axı Zaurun qərarı çox gözlənilməz idi.

Zaur:

– Uşaq-zad deyiləm ki, fikrimi dəyişəm, – dedi. – Belə şeylərnən zarafat eləmək olmaz.

Anası tələsik mətbəxə keçdi, geri qayıtdı... Nə isə axtarırdı, amma heç özü də bilmirdi ki, nə axtarır – sadəcə olaraq karıxmışdı arvad, başını itirmişdi elə bil, nə edəcəyini bilmirdi... Nəhayət, Zaura yanaşdı, diqqətlə, uzun-uzadı oğlunun gözlərinə baxdı və onu öpdü:

– Sən mənim ağıllı balamsan, – dedi. – Mən elə bilirdim ki, Allah insafsızlıq eləməz bizə qarşı, hər şey yaxşılıqla qurtaracaq... Sənin boyuna qurban olum mən... Atan da, bilirsən, necə sevinəcək... Day qızgili demirəm, əməlli-başlı bayram olacaq onlarçün. Alyanın ən böyük arzusuydu da bu.

Zaur televizorun qabağında əyləşdi, xokkey oyununu gözləyirdi... "Amma bunu doğrudan əntiqə fikirləşdim ha, – deyə öz-özünə düşünürdü, – bomba kimi partlayacaq bu xəbər, bəzi-bəzi adamların yandırıb cızdaqların çıxaracaq... Doğrudan da, "ey həyat, sən nə qəribəsən...". Nə gözəlsən, ey həyat, cavan, güclü, sağlam olmaq nə gözəl şeymiş... Həm də sərbəst, azad olmaq, istədiyin kimi hərəkət eləmək, heç kəsdən asılı olmayasan, əksinə, səndən asılı olsunlar. Həm də bütün ömrün irəlidə olsun... Əla..."

Doğrudan da, məgər onun həyatı əla, əladan da əla deyilmi – əntiqə təzə maşını var, əntiqə təzə mənzili olacaq, istədiyi kimi bəzəyəcək bu təzə mənzilini – ekspedisiyalardan qəribə, əcaib daşlar gətirəcək, meşələrdən əcaib budaqlar toplayacaq, maqnitofona quşların, meşənin, çayların, küləyin, dənizin səsini yazacaq, mənzillərini təbiətin gözəl bir guşəsinə çevirəcək. Uzaq ölkələrə səyahətlər edəcək, oradan da maraqlı şeylər gətirəcək – Afrika maskaları, yapon kuklaları, hind taxta fiqurları... Bütün dünyanı, bütün ölkəni gəzəcək, evdə də sağlam, xoşbəxt ailəsi olacaq – gül kimi təmiz arvadı, səliqəli, tərbiyəli, sağlam, xoşbəxt uşaqları, qoy gözü götürməyənlərin gözləri kor olsun; yansınlar, cızdaqları çıxsın paxıllıqdan, həsəddən.

***

Yeddidə yığışmağa başladılar... Məcidin əmisi oğlu professor Bəhram Zeynallı gəldi. Şahin gəldi. Zivər xanımın dayısı gəldi... Dadaşın gəlməsi Zauru təəccübləndirdi, amma Zivər xanım oğlunu mətbəxə dartdı:

– Sən allah, hirslənmə, – dedi. – Dadaşa bilirsənmi niyə görə demişik, çünki onlar tərəfdən Murtuzun bacanağı olacaq – Nemət, o da sizin nəşriyyatda işləyir, özü də Dadaşın əlinin altında: qoy onlar tərəfdən işçi olsun, bizim tərəfdən bu işçinin böyüyü – həm də Dadaş

dilli-dilavərdir, sənin dədən kimi hər sözü kəlbətinlə çıxartmaq lazım deyil ağzından, qoy bir az meydan sulasın, səni tərifləsin orda.

– Məni tərifləmək nəyə gərəkdir axı... Məni tanımırlar bəyəm?

– Tanımağına, əlbəttə, tanıyırlar səni. Amma onlar da tək özləri olmayacaq ha. Onların tərəfindən də yəqin yad adamlar olacaq, gərək onların yanında səni də, elə bütün ailəmizi də bir əməlli-başlı təqdim eləyən olsun da. Odur ki, Dadaşa qaşqabaq eləmə, boyuna anan qurban.

Zaur yorğun tərzdə:

– Qaşqabaq niyə eləyirəm ki?.. Dadaş deyirsiz Dadaş olsun, mənimçün nə təfavütü var.

Səkkizçün elçilər Murtuzovgilə yollandılar. Zaur isə krossvord doldurmağa başladı... Afrikada "K" hərfiylə başlanan on hərfli şəhəri heç cür yadına sala bilmirdi... Elçiliyə, təbii ki, ancaq kişilər getmişdi, qadın qohumlar isə Zivər xanımla mətbəxdə laqqırtı vururdular. Zaur sözləri aydın eşitməsə də qadınların nə barədə, nədən danışdıqlarını çox gözəl təsəvvür edirdi – qadınlar gah bərkdən məmnun-məmnun gülüşür, gah xısın-xısın pıçıldaşırdılar.

***

– Yəni ki, Zauru xüsusi təqdim eləməyə ehtiyac da yoxdur. – Dadaş danışa-danışa çaydan qurtum-qurtum içir, qəndi dişləri arasında xırçıldadırdı – hamımızın gözü qabağında böyüyüb... Ailəsini də, maşallah, yaxşıca tanıyırsız, deyir, qonşu qohumdan yaxın olur adama, amma qonşu həm də qohum ola, görün bu da nə aləmdir də... Ha, ha, ha, zarafat bir yana. Məcid müəllim görkəmli alimlərimizdəndir, gözəl ailə başçısıdır, ailəsi də – demək artıqdır – ən təmiz, ən gözəl, mərifətli, qanacaqlı, sağlam ailələrdəndir. Ot da ki, bilirsiz, öz kökü üstündə bitər. Belə bir ailədə boya-başa çatmış oğul da, necə deyərlər, layiqli cavandı, hansı tərəfdən götürürsüz götürün – savadı, biliyi, tərbiyəsi, böyüknən böyükdür, kiçiknən kiçik. İki ildir bir idarədə çalışırıq – kollektiv arasında da əməlli-başlı nüfuz qazanıb, cavan olmasına baxmayaraq. Xasiyyəti ipək kimidir, ürəyi təmizdir, şəxsən mən bunu nöqsan saymıram, amma hər halda bunu Zaura nöqsan bilən varsa, nə olar, yaşa dolduqca, necə deyərlər, bərkə-boşa düşdükcə, şübhəsiz, təcrübəsi də artacaq. Hər halda böyük gələcəyi var Zaurun. Bilirsiz ki, pis adamçün sizin kimi hörmətli adamların qapısına elçi düşməzdik... Burda görürəm mənim dostum, Nemət müəllim də əyləşib, o da necə deyərlər, qız evinin adamıdır, amma eyni zamanda biz

hamımız iş yoldaşlarıyıq, elə Nemət də Zauru yaxşı tanıyır və mənim sözlərimi təsdiq edə bilər.

Nemət nə isə dodaqaltı mızıldandı, yəqin ki, Dadaşın sözlərinə şərik çıxdığını ifadə etməliydi.

Murtuz pörtmüşdü, fısıltıyla ağır-ağır nəfəs alırdı. Bir az doluxmuşdu elə bil, axı hər halda ilk dəfəydi elçi qəbul edirdi. Amma o biri bacanağı Cabbar özünü çox fəal aparır, Dadaş danışdıqca: “bəli, bəli, qəşəng, qəşəng”, – deyə replikalar verirdi. Nəhayət, Dadaş nitqinə balaca bir ara verdi və Cabbar gözlərini Murtuzun üzünə zillədi. Murtuz yüngülcə başını tərpədən kimi Cabbar tələsik üyüdüb tökməyə başladı:

– Bizimçün də böyük şərəfdir ki, sizin kimi mötəbər adamlar elçi gəlibsiz qapımıza. Zauru hamımız tanıyırıq, mərifətli, qanacaqlı cavandır. Siz də, şübhəsiz ki, Murtuzovlar ailəsini yaxşı tanıyırsınız. Yəni Balayeviçi respukablikamızda kim tanımır axı? Görkəmli sərkərdədir, hərbi xadimdir, Firəngiz qızımız gözlərimiz qabağında böyüyüb. Doğrudur, indiyəcən onun səsini eşitməmişik, indiki At Balaxanım qızların tayı deyil, dindirirsən qıpqırmızı qızarır, başıaşağı, utancaq bir baladır, mən deyərdim qönçədir, fidandır, hələ gül kimi açılmayıb... Hamımız belə düşünürük ki, bu gözəl, göyçək-cavanlar xoşbəxt, qəşəng ailə quracaqlar: Allah xeyir versin...

Hamı gülümsündü, “Allah xeyir versin” dedi və bir dəqiqə sonra Alya, Tahirə və Süreyya armudu stəkanlarda çay gətirirdilər, bu səfər bütün çaylar şirin idi.

Dadaş, başqa elçilər, ev adamları adət üzrə qaşıqları stəkanların içində şaqqıldada-şaqqıldada hərləməyə başladılar, hamı bir-bir Məcidi, Murtuzu, Alyanı təbrik etdi. Dadaşla Nemət isə nəşriyyatın işlərindən söhbətə qurşandılar...

Saat doqquzda, elçilər gülə-gülə, bərkdən danışa-danışa qayıtdılar. Hamıdan qabaq içəri Dadaş girdi, Zauru da hamıdan qabaq o təbrik elədi... Deyəsən, Zauru marçıldadıb öpmək fikri də vardı Dadaşın, amma Zaur birtəhər üzünü kənar elədi və bu an Afrikadakı “K” hərfiylə başlanan şəhər birdən-birə yadına düşdü: Kasablanka. On hərf. Əlbəttə, Kasablanka...

***

Səhəri gün də qadınlar görüşdülər. Zivər xanım Alyagilə getdi və hər şey barədə ətraflı danışdılar. Zaur geoloji ekspedisiyaya düzəlmiş-

di, bir aydan sonra getməli idi. Məsələni çox da uzatmağın mənası yoxdur. Həm də ki, doğrusu, hər ikisinin – elə Alya xanımın da, Zivər xanımın da ürəkləri bir az səksəkəli idi, iraq-iraq birdən bir şey çıxdı, birdən, nə bilmək olur, Zaurun başına başqa fikir düşdü. Odur ki, on günün içində həm nişan, həm də toy eləmək qərarına gəldilər. Hər iki tərəf tədarükünü çoxdan görmüş, lazım olan hər şeyi çoxdan hazır edib saxlamışdı. Alya lap qızı dünyaya gələn gündən xırda-xırda ona cehiz toplamağa başlamışdı – parçalar, yorğan-döşək, bahalı örtüklər, qab-qacaq, duz qabına qədər – hər şey səliqə-sahmanla hazır durub, məqamını gözləyirdi. Doğrudur, bəzi iri şeyləri hələ alasıydılar – soyuducu, mebel, amma Spartak boyun oldu ki, üç günün içində nə lazımdırsa tapar, tapdı da – 12 əşyadan ibarət ərəb mebeli, fin mətbəxi, ZİL soyuducusu – bütün bunların xərcini də Spartak özü çəkdi, Cabbarla Tahirə televizor, Nemətlə Sürəyya büllur çılçıraq aldılar...

Zeynallıgil də qıza və qızın qohumlarına bahalı hədiyyələr alıb hazır qoymuşdular (o cümlədən Spartak üçün kostyumluq parça). Böyük bir restoranda dəm-dəsgahlı toy üçün məbləğ də əmanət kassasında hazır idi, yetmiş adamlıq toy etmək fikrindəydilər. Alya xanım "azından əlli yeri gərək bizim olsun, – demişdi, – o qədər dost-tanış var ki..." Adət üzrə nişanı qız evi, toyu oğlan evi eləməliydi.

Alya xanımla Zivər xanımın diplomatik danışıqları sülh və əmin-amanlıq şəraitində keçdi, söhbətin axırında Alya xanım Zaurgilin ailəsini sabah günortaya nahara dəvət elədi. Ayaq açdıya.

***

Zaur işdən qayıdırdı. Soyuqdu, adamın iliyinəcən işləyən xəzri əsirdi. Yağış da çiləməyə başladı. Zaur maşınını saxlayıb düşdü, şüşə süpürücülərini taxdı və avtobus dayanacağında büzüşüb durmuş Mədinəni gördü.

Zaur:

– Mədinə, – deyə çağırdı. – Gəlin oturun, aparım sizi.

Mədinənin əlində iri və görünür, çox ağır zənbil vardı, işdən sonra adəti üzrə bazara dəymiş, ayın-oyun almışdı, Mədinə tələsik maşına yaxınlaşdı, keçib oturdu və:

– Zaur, – dedi, – sizi Allah yetirdi mənimçün. Əlim-qolum qırılmışdı lap. Avtobus da gəlib çıxmaq bilmir. Bir yandan da bu yağış, külək...

Zaur təbəssümlə:

– Evə? – deyə xəbər aldı.
– Əlbəttə... Day heç ümidim yox idi ki, bu zənbillə gedib evə çıxacağam.
Zaur:
– Necəsiniz? – deyə soruşdu.
– Sağ olun. Pis deyiləm. Uşaq bir az nasaz kimidir.
– Nə olub ki?
– Qripdir də yəqin, həm də öskürür.
– İndi bütün şəhər qripdir.
Mədinə:
– Hə, kimi dindirirsən, xəstədir, – dedi. – Maşınıvız təzədir, hə? Çox mübarək, sağlığıvıza qismət olsun.
– Sağ olun.
Mədinə susdu, tərəddüd keçirirdi; desin, deməsin, nəhayət, Zaura çəpəki baxaraq demək qərarına gəldi:
– Hə, sizi təbrik edirəm, eşitdim evlənirsiz.
Zaur:
– Çox sağ olun, – dedi və siqaret yandırdı.
İndi Zaur da soruşa bilərdi:
– Qonşunuz necədir?
– Təhminə? – Guya Zauru Mədinənin başqa bir qonşusu da maraqlandıra bilərdi. – O da xəstələnib yazıq.
– Nədir ki? O da qrip olub?
– Qara ciyəri xəstədir onun... İndi də xəstəlik şiddətlənib, deyirdim axı bədbəxt qızına – sənə içmək olmaz, qulaq asmır. – Mədinə susdu, sonra əlavə etdi. – Bəs görmürsünüz, day heç televizora da çıxmır ki.
Zaur:
– Mən televizora baxmıram, – dedi.
Mədinə həvəslə:
– Lap yaxşı eləyirsiz, – dedi. – Baxmalı nə var ki. Elə boş şeylər göstərirlər ki...
Mədinə televiziya verilişlərindən danışırdı, onları pisləyirdi, amma Zaur istəyirdi, yaman istəyirdi ki, Təhminə haqqında desin yenə bir şey. Görəsən, Təhminə danışıbmı Mədinəyə o gün, o bağ yolundakı görüşlərini, Spartakın bağlarından qayıdarkən Zaura rast gəlməsini?.. Mədinə indi də dünənki verilişi söyürdü.
– O nə film idi elə?.. Heç həyatda belə şeylər olur bəyəm?
Zaur:
– Təhminə yatır yəni? – deyə soruşdu.

– Yox, bu gün bir az babatdır, bəlkəm hələ işə də çıxdı,– birdən bic-bic gülümsünüb, – istəsəz axşam televizorda görə bilərsiz onu, – deyə əlavə etdi.

Zaur:

– Bəli, bununçün televizora baxmağa dəyər, – dedi.

Mədinə:

– Qara ciyəri xəstədir, o isə hər axşam içir, – deyə təkrar elədi. – İçir, musiqiyə qulaq asır. Gecəyarısı ayılıram, baxıram, görürəm işıq gəlir, özü də musiqi çaldırır.

Zaur gülümsündü. Gəlib Təhminəgilin küçəsinə çıxdılar. Həmin o bağın yanından keçirdilər. O bağın ki, haçansa – yox, Zaur dəqiq tarixi də deyə bilərdi – iyunun 5-də, ilk dəfə burada bir saatdan artıq gözləmişdi Təhminəni. Axır ki, Təhminə gəlib çıxmışdı, ağ düyməli qırmızı paltarda idi Təhminə o gün, dəniz sahilinə getmişdilər və münasibətləri də bundan başlamışdı... Zaur çöl qapısının ağzında saxladı maşını. Həmin bu yerdə bir gecə Spartak saxlamışdı maşınını və Zaur da onun təkərini deşmişdi... Mədinə birdən dedi:

– Zaurik, inanın mənə, bircə sizinlə xoşbəxt idi o yazıq, – Zaur bu sözlərə təəccüb qaldı. Sözlərdən daha artıq Mədinənin ona lap Təhminə təkin “Zaurik” deməsinə təəccüb qaldı. Çiyinlərini çəkdi Zaur.

Mədinə maşından çıxaraq:

– Çox sağ olun, – dedi. – Lap qanımın arasına girdiz. Allah sizi xoşbəxt eləsin.

Zaur:

– Dəyməz, canım, nə böyük iş imiş, – dedi və maşını ağır-ağır sürdü.

***

Zivər xanım:

– Sabah işdən bir az tez gəl, – dedi. – Alya xanım qonaq çağırıb bizi.

Zaur başını tərpətdi.

– Bu gün getmişdim Alyagilə. Hər şey barədə danışdıq. Məsələni uzatmağın nə mənası var? Şahin restoranla iyirmisinə danışsın. İyirmisi şənbədir...

Zaur başını tərpətdi...

– Firəngizlə görüşmüsən heç?

Zaur təəccüblə:

– Yox, niyə ki? – dedi.

– Necə niyə? Day sənin adaxlındır da. Bir görüşəydin, kinoya, teatra, konsertə aparaydın bir onu.

Zaur:

– Axı hələ rəsmən nişanlı deyilik, – dedi. – Görən-bilən nə deyər... Yaxşı düşməz...

Anası onun istehzasını ya başa düşmədi, ya da başa düşüb üzə vurmadı.

– Orası elədir, – dedi. – Sabah gedərik evlərinə, ayaqaçdı olar, sonra da tez-tez sən onlara gedərsən, o bizə gələr, yəni elə nişana, toya nə qalıb ki, – anasının gözlərində sevinc, fərəh, qürur vardı və Zaurun ona yazığı da gəldi hətta. Zivər xanım özünü saxlaya bilməyib, "Ay Allah, bunun boyuna qurban olum mən, – deyirdi, – pərvərdigara, çox görmə bizə bu xoşbəxtliyi".

Sonra anası:

– Gecən xeyrə qalsın, – deyə yatmağa getdi. Zaur isə televizoru qurdu... Filmin son kadrları bitdi, ekranda Təhminə göründü... Yoldakı o görüşdən sonra Zaur görməmişdi Təhminəni və mat qaldı: solub-soluxmuşdu Təhminə, arıqlamışdı, tamaşaçılara xeyirli gecələr arzularkən sifəti gülsə də, gözləri qəmlidən qəmli, kədərlidən kədərliydi.

"Gecəniz xeyrə qalsın..." Zaurun yadına düşdü ki, Təhminə həmişə uzanıb-uzanıb qurtarmaq bilməyən gecələrin dəhşətindən danışırdı. "Səhərə necə çıxasan, necə dözəsən səhərəcən, ilahi", – deyərdi... Füzulinin bir beytini tez-tez təkrar edərdi:

"*Ey Füzuli, şam-ğəm əncamına yoxdur ümid.*
*Bir təsəllidir sənə ol söz ki, derlər var sübh".*

Bəlkə bu sözlər də Təhminənin bütün başqa sözləri kimi saxtakarlıq, riya, yalan idi... Kim bilir... Zaur ekranda Təhminənin gözlərinin lap dibinə, dərinliyinə baxmaq istəyirdi, bəlkə həqiqət orada, ən gizli, ən uzaq bir dərinlikdə gizlənib, amma bu dəm yox oldu Təhminə. Ekran boşaldı və Təhminədən yalnız ağ-mavi bir boşluq qaldı, sonra o da qaraldı, tündləşdi, işıldayan bir nöqtəyə çevrildi, sonra o nöqtə də qeyb oldu.

Hardansa Zaurun başına qəribə bir fikir gəldi: durub düşsün, maşınına minsin, getsin telestudiyanın qabağına, qarşılasın Təhminəni. Necə də sevinərdi Təhminə, bəlkə də o yalançı sevinc idi, amma hər halda, yalanmı, doğrumu bu sevinc, bu gözlənilməz, qəfil sevinc Təhminənin bütün varlığını çıraq kimi işıqlandırardı və bu çırağın şöləsin-

də, istisində Zaur özü də qızınardı, yalan da olsa, doğru da – bu işıq, bu isti, bu sevinc... Bax bu saatca maşına minib getmək, telestudiyanın qabağına çatmaq və:

– Xoş gördük, Təhminə – demək.

Bundan asan nə var dünyada? Amma Zaur bilirdi ki, bundan mümkünsüz bir iş də yoxdur dünyada onunçün. Bu asan iş dünyada ən müşkül iş idi. Durub televizoru keçirdi...

## On altıncı fəsil

*Əgər tutsam qəmim eldən nihan, səbrü-qərarın yox,*
*Və gər şərhi-qəmi-pünhanım etsəm qəmküsarın yox.*
*Əsiri-bəndi-zindanəm, əlimdə ixtiyarım yox,*
*Bu yetməzmi ki, bir dərd artırırsan dərdimə sən həm?*

Zivər xanım:

– Gözlərinin qadasını alım Zaur, – dedi. – Olan-olub, keçən-keçib, barış Spartakla... Day qohum olmusuz da – Murtuzovgilin qapılarının ağzına çatmışdılar. Zaurun qucağında iri bir tort vardı! Zivər xanım gecə hazırlamışdı onu. Professorun əlində də iri gül dəstəsi vardı.

Zaur anasına cavab vermədi və Zivər xanım sözünə davam etdi:

– Mənə Alya danışıb, deyir, guya haradasa dalaşmısız Spartakla.

Zaur:

– Niyə dalaşmışıq, – dedi. – Vur-tut bircə dəfə yumruq ilişdirmişəm çənəsindən, vəssalam.

– Yaxşı, indi keçmiş olsun bütün bunlar, gərək...

Qapını açdılar. Alya xanım:

– Xoş gəlmisiz, xoş gəlmisiz, – dedi.

Dəhlizə keçdilər. Zaur tortu asılqanın yanındakı kətilin üstünə qoydu, atasıyla bir yerdə otağa keçdilər. Zivər xanım isə qadınların yanına, mətbəxə keçdi. Otaqda, üstü bəzənmiş masanın yanında, ağ köynək geymiş Murtuz Balayeviç Cabbarla nərd oynayırdı. Stolun başına Murtuzun polkovnik pencəyi asılmışdı, pencəyin yaxası orden-medallarla dolu idi. Nemət nərd oyununu müşahidə edirdi... Hər üçü qonaqları görən kimi qalxdılar, əl verdilər. Murtuz Zaurun kürəyindən vurub:

– Hə, qoçaq, – dedi.
Cabbar:
– Buyurun, əyləşin, professor, – dedi.
Murtuz Cabbara baxıb:
– Bu saat bunun dərsin verim, – dedi. Nemət isə Zaurdan təzə işi barəsində soruşdu.
Masanın üstündə quş südündən başqa hər şey vardı. Lap o kababxana müdiri Nadirin sözü olmasın, ilin bu vaxtında təzə xiyar, pomidor. Qədim alman servizlərinin içində növbə növ salatlar vardı, rəngbərəng içkilər zəhmli ağır büllur qrafinlərə süzülmüşdü;
– Buyurun görək. – Alya xanım hamını masanın başına dəvət elədi... Stolun başında Murtuzla Məcid əyləşdilər, onlardan sol əldə Zivər xanım, Cabbar və Nemət... Sağdan Zaur oturdu və onun yanındakı stulu boş saxladılar. Bir azdan Alya Firəngizi otağa gətirdi. Firəngiz qıpqırmızı qızarmışdı və dümağ paltarı yanağının çəhrayı, saçlarının, göz-qaşının zil qara rənglərini daha da parlaq göstərirdi. Saçları yoğun hörüklər şəklində hörülmüşdü. Gözlərini qaldırmadan hamıyla salamlaşdı... Zaur ayağa durdu, Firəngizi yanındakı boş stula otuzdurdu... Sürəyya, Tahirə və Alya stolun aşağı başında əyləşdilər. Onların yanında üç qız, bir nəfər oğlan uşağı da var idi – Sürəyyanın qızları və Tahirənin oğlu. Alyanın, Sürəyyanın və Tahirənin anaları Bikə xala gəldi otağa. Zaurla Firəngizi öpdü, dedi ki, ömründə ən şad günüdür bu gün, sonra üzr istəyib mətbəxə getdi, plovu o bişirirdi.
Murtuz:
– Bəs Spartak hanı? – deyə soruşdu və Alya cavab verdi ki, indi gələr... – Zaurla Firəngizin sağlığına, valideynlərin sağlığına, qohumlarının sağlığına içdilər. Zaur Spartakın otağa daxil olduğuna diqqət verdi. Spartakın baxışlarında bir nigarançılıq sezdi... Amma Zaur Spartaka baxıb gülümsündü və Spartakın gözlərindəki nigarançılıq həmişəki sırtıq ifadəylə əvəz olundu, gəlib saymazyana Zaura əl uzatdı, görüşdülər...
Murtuz artıq bir balaca dəm idi, növbəti sağlığı demək üçün ayağa qalxmışdı. Murtuzovlar ailəsinin sağlığına Məcidin qaldırdığı badə istisna olunsa, bütün sağlıqları Murtuz özü deyirdi.
– Bu gün, bu gözəl nemətlər düzülmüş stolun başında ən yaxın qohumlarımız yığışıb və çox xoş, gözəl bir münasibətə görə yığışmışıq, – dedi Murtuz Balayeviç. – Adə, Spartak bokalıva içki tök görək. Amma bax, içib keflənməyəsən ha, sən haramzadanı yaxşı tanıyıram mən. Vurmağa başlayanda açarıvı itirirsən.

Spartak:

– Ay papa, – dedi, – bu sözləri özüvə de də.

Hamı gülüşdü və Alya xanım məzəmmətlə Murtuza baxdı:

– Düz deyir də, – dedi, – sən də özünü saxla bir balaca, ürəyin yadından çıxıb?

Murtuzun kefi ala buludda idi, odur ki, arvadıyla oğlunun məzəmmətinə başqa vaxt hirsləndiyi təkin hirslənmədi, heç eyninə də almadı bu sözləri:

– Mənim hər şey yadımdadır, – dedi. Sonra kefli adamın "mənalı" inadıyla bir də təkrar etdi: – hər şey yadımdadır mənim... Qulaq asın, görün nə deyirəm... Bizim cavanların sağlığına içdik, onların gələcək təmiz, gözəl ailələrinin sağlığına içdik. Amma mən demək istəyirəm ki, üzünü Zaura tutdu, – ailə qurana qədər, evlənənə qədər nə olubsa, kişi gərək evinin qapısından eşikdə qoysun hər şeyi. Nə olub, olub, madam ki, evlənmisən, zəhmət çək, day şuluqluq eləmə, ailə gərək möhkəm, sağlam olsun.

Hamı özünü bir qədər naqolay hiss elədi, polkovnikin eyhamları lap düzünəqulu idi, amma bu sözləri təkzib etməklə, ya onlara bir şey əlavə etməklə məsələni daha da ağartmaq olmazdı... Gərgin bir sükut çökdü. Yalnız professor arabir öskürür, boğazını arıtlayırdı.

Bütün bu sözlərə, bütün bu vaqiələrə tam bir biganəlik hissi – bu hiss axır bir neçə gün idi ki, Zaurun bütün varlığına hakim kəsilmiş yeganə duyğu idi – Zauru qoruyurdu. Hər cür mənfi emosiyalardan, hər növ qanqaraltısından mühafizə edirdi. İndi Murtuzun danışdıqlarını da sifətinin ehtiram dolu ifadəsiylə və daxilində səslənən rişxəndli gülüşlərlə qavrayırdı. Murtuzun söhbətləri bu ziyafətin lap əvvəlindən, yox əslində bundan da qabaq, elçilik məsələsi başlayandan bəri polkovnikin fikirlərində dolaşırdı və indi erməni konyakının təsiriylə ürəyinin içindəkilər dilinin ucundan tökülürdü.

İçdikcə Murtuzun fikirləri bu səmtdə daha da müəyyənləşirdi və görünür düyünü indi biryolluq açmaq istəyirdi...

– Cavanlıqda hansımızın başına belə-belə şeylər gəlməyib axı hə? – O, Məcidə göz vurdu, professor lap özünü itirdi, – yox, bir söz demirəm, bu da lazımdır, cavan oğlançün bu vacibdir də, hətta... Necə deyərlər, həyatın gərək hər kef-damağını görəsən, hərif olmayasan, inkişaf üçün də lazımdır bu, lap elə sağlamlıq, səhhət cəhətincə də... Təbabət də təsdiq edir bunu... Amma... burada bir iş var... nə iş? Gərək ailə qarşısında, cəmiyyət qarşısında borcunu da heç vaxt yaddan çıxartmayasan...

Murtuz sözlərinin dalını pıçıltıyla, tək bir Məcidə danışırdı, amma Zaur hər kəlməni bircə-bircə eşidirdi:

– Yadımdadır, mənim bir Zoykam vardı (Alyanın qulaqlarından iraq), arvad deyildi, vallah, od parçasıydı köpəyin qızı... Cavan sütül uşaqdım o vaxt, az qala ilişmişdim, bu Murtuz ölsün. Yamanca tovlamışdı məni, vallah, indi heç özüm də inana bilmirəm ki, necə olmuşdu, almaq istəyirdim hətta onu... Şükür, vaxtında ayıldım... İşdir də, düşəndə düşür... Amma indiki cavanlar, maşallah, bizlərdən çox-çox ayıqdırlar... Kefini-damağını da çəkirlər, amma day bizim kimi tələyə düşsünlər, gözləri tutulsun, xeyr, əstəğfürüllah, hərif-zad deyillər... Bax elə götür bizim bu Spartakı, mənim oğlumdur, amma belə-belə işlərdə səni də, məni də, yüz nəfər yaşlı, təcrübəli kişini də cibinə qoyar. Dünyanın hər üzünə bələddir, arvad məsələsində də tükü-tükdən seçir zalım oğlu.

Sonra nədənsə Murtuzun fikri Spartakla Zaurun münasibətləri məsələsinə ilişib qaldı, uzun-uzadı sorğu-suala başladı ki, axı nə olub aranızda bir deyin görək.

Spartak da, Zaur da bir ağızdan:

– Əşi, heç nə, heç bir şey olmayıb, – deyirdilər. Murtuz da əl çəkmirdi, axırı:

– Yaxşı, indi ki, deyirsiniz heç bir şey olmayıb, onda durun öpüşün, – dedi.

Zaur başa düşdü ki, bundan da keçməlidir. Keçmişlə birdəfəlik vidalaşdığını, keçmişdə qalanları birdəfəlik ömründən qoparıb atdığını öz-özünə isbat etməkçün bu sınaqdan da keçməlidir. Salfet götürüb plovun yağına batmış dodaqlarını sildi, Spartak da ona baxıb yağlı dodaqlarını sildi, öpüşdülər. O gün yolda olduğu kimi indi də Spartakdan odekolon ətri gəlirdi.

Çay gətirdilər, cürbəcür tortlar, pirojnalar, meyvələr gəldi süfrəyə, Murtuz indi də cəbhə xatirələrini danışırdı və birdən Zaur öz sifətinə zillənmiş zənli, kədərli baxışları duydu. Nemətin baxışları idi bu həsrət dolu baxışlar... Onların gözləri toqquşdu və Zaur bildi ki, bütün burda iştirak edənlərdən yalnız tək bir Nemət hər şeyi və o cümlədən, Zaurun halını həqiqi mənasında, olduğu kimi başa düşür. Hər şeyi, hər şeyi başa düşür. Zaurun halını da, Zaurun qərarını da, bu qərara gəlməyə onu vadar edən səbəbləri də və gələcəkdə onu, Zauru gözləyən nəticələri də.

***

– Sağ olun, sağ olun...

– Sən allah, gəlin də, xüsusi dəvət gözləməyin.

– Uzaqda oluruq da, pilləkənin o biri başında, ha, ha, ha...

– Day demə...

– Bıy, yağış yağır ki...

– Zaur aparar sizi maşınla.

– Spartak da apara bilər.

– Yox, Spartak çox içib.

– Əşi nə içmişəm, boşlayın görək. Bu saat qonaqları Zaurla ikimiz evlərinə aparacayıq. Görək kimin maşını tez gedir.

– Zaur, oğlum sabah bir bizə dəy.

– Baş üstə, Alya xanım.

– Professor, nərddə sizə borcum qaldı ha.

– Yaxşı, salamat qalın da, girin içəri, yağışda islanarsız, hələlik.

– Nə yaman qaranlıqdır, bir kibrit çəksənə.

– Bu saat maşını çıxarım.

– Mən də çıxardıram, bircə dəqiqə gözləyin.

– Zaur, tez qayıt ha.

– Spartak, yubanma ha.

***

Diksinib oyandı, tez qol saatına baxdı, düz səhər saat altı idi. Mat qaldı Zaur, bəlkə yuxuda eşidib bu səsi, amma telefon ikinci dəfə zəng çaldı. Əlini uzadıb çarpayısının yanındakı dəstəyi qaldırdı, yuxulu səslə:

– Allo, – dedi.

Telefon susmuşdu. Zaur dəstəyi yerinə qoymaq istəyirdi ki, musiqi səsi eşitdi. Əvvəlcə uzaqdan gəlirdi bu səs, sonra elə bil xəttin o başındakı telefon dəstəyini səsə yaxınlaşdırdılar və Zaur "Küçələrə su səpmişəm" mahnısını eşitdi. Dinlədikcə yavaş-yavaş yuxudan ayılırdı, bu qəribə erkən konsertə təəccüblənirdi. Birdən-birə başa düşdü:

– Alo, kimdir? – dedi, amma mahnı bitdi və dəstəyi asdılar...

Və o zaman Zaur hər şeyi başa düşdü. Bildi ki, kimdir zəng eləyən, bildi ki, səhər saat altıdır, zəng vuran belə ertədən durmayıb, yox, yatmayıb bu gecəni, musiqiylə, konyakla, həsrətlə, onun – Zaurun həsrətiylə dopdolu bu gecəni yatmayıb, gözünü də qırpmayıb.

İndi Zaur özü yığdı nömrəni, gümanın tam doğruluğuna inanmaq üçün. Dəstəyi dərhal qaldırdı, amma susmuşdu Təhminə, Zaur da danışmırdı. Telefonda başqa bir mahnı səsləndi: "Ay bəri bax, bəri bax..."

*Pəncərədən daş gələr,*
*Xumar gözdən yaş gələr.*
*Səni mənə versələr,*
*Allaha da xoş gələr...*

Mahnı qurtardı və dəstəyi asdı Təhminə. Zaur siqaret yandırdı və elə dərin, elə dərin bir həsrət duydu ki, az qala ulayacaqdı. Təhminənin necə bir gecə keçirdiyini təsəvvür elədi və bu zaman telefon yenə səsləndi. Dəstəyi qaldırdı, mahnıya qulaq asmağa başladı:

*Ömrüm boyu daş daşıdım,*
*Gəmim dolmadı.*
*Gənc yaşımdan bir qız sevdim,*
*Mənim olmadı...*

"Təhminə, ay Təhminə, axı niyə sən belə etdin?" – demək istəyirdi Zaur, amma heç nə demirdi. "Özü də gör bir kimlə, Spartakla!" – demək istəyirdi Zaur, amma heç nə demirdi. "Təhminə, axı mən səni doğrudan da sevirdim və doğrudan da xöşbəxt idim səninlə" – demək istəyirdi Zaur, amma heç nə demirdi. "Hamısı yalan idi yəni? Yəni heç məni sevmirdin, sevirdinsə niyə belə yaraladın?" – demək istəyirdi Zaur, amma heç nə demirdi... "Axı mən bir də heç bir vaxt, heç bir vaxt xoşbəxt olmayacam, bilirsən ki, bunu, axı mən artıq yaşamıram, ölüyəm, canlı meyitəm" – demək istəyirdi Zaur, amma heç nə demirdi. Mahnı qurtardı. Təhminə dəstəyi asdı. Bir neçə dəqiqə keçdi və Zaur elə düşündü ki, hər şey bitib, bu zaman yenə zəng oldu, o, telefonu qaldırdı və mahnını eşitdi:

*Qırmızı gül, sarı gül,*
*Bağçaların varı gül.*
*Gec açıldın, tez soldun,*
*Açmayaydın barı gül...*

"Laçın" mahnısı idi... Təhminə bu mahnını dinləyəndə həmişə hıçqırıb ağlayırdı... Zaur özü də ağlayırdı indi, lap erkən uşaqlıq çağ-

larından bəri ilk dəfə idi ağlayırdı, səssiz-səmirsiz ağlayırdı, gözlərindən yanaqlarına süzülən damcıları silmirdi. Ağlayırdı, çünki bilirdi ki, bu son vidalarıdır və yer üzündə yalnız yeganə bir qadın bu cür vidalaşa bilərdi... “Laçın” mahnısının son bəndi səslənirdi, – Zaur bilirdi ki, Təhminənin kassetində bu, son mahnıdır və indi – Zaurla Firəngizin toyları ərəfəsində Təhminə onun həyatından əbədilik çəkilib gedirdi...

*Araz üstə, buz üstə,*
*Kabab yanar göz üstə.*
*Qoy məni öldürsünlər*
*Bir alagöz qız üstə...*

Mahnı qurtardı. Dəstək asıldı...

## On yeddinci fəsil

*Vəfa hər kimsədən kim istədim ondan cəfa gördüm.*
*Kimi kim, bivəfa dünyada gördüm, bivəfa gördüm.*
*Mənə göstərdi gərdün, tirə bəxtim kövkəbin yüz gəz,*
*Məni – bədbəxt ona hargah kim, baxdım qara gördüm.*

İstanbul duman içində... Yuxu kimi birdən-birə açıldı duman içindən İstanbulun minarələri, qülləli, qübbəli məscidləri... Səhərin bu erkən çağı duman Bosforun üstünü alıb çəhrayı üfüqəcən sərilirdi.

Bu gecəni yatmamışdı Zaur. İndi də gəminin göyərtəsində dayanıb ilk dəfə gördüyü şəhərin səhər oyanışını seyr edirdi. Dəniz elə bil ağır – tunc dalğalarıyla özü öz səthini hamarlayır, ütüləyirdi, şəhər, limandakı gəmilərin siluetləri, binaların konturları görünməz sarı-çəhrayı projektorun şüalarıyla işıqlandırılmış dekorları xatırladırdı – projektorun özü – günəş də ağır-ağır üfüq xəttinin dalından yüksəklərə dartılır, dığırlanırdı.

Günəşin şüaları onların gəmilərinin göyərtəsindəki gecə çıraqlarını da işıqlandırırdı və gecənin qaranlığında belə parlaq işıldayan bu çıraqlar, indi gün işığında sanki solub-soluxmuşdular. Gəmiləri yavaş-yavaş İstanbul limanının körpüsünə yan alırdı və biraylıq səyahətlərinin son dayanacağı idi bu şəhər...

***

Gəmidə Firəngizin ürəyi bulandı, qusdu, sonra gecə kayutda – gəmiləri artıq İstanbuldan ayrılıb Odessaya yollanırdı – Firəngiz dedi ki, deyəsən, hamilədir.

Odessaya düşən kimi Zaur təyyarəyə bilet aldı. Murtuzgilə və atasıgilə teleqram vurdu ki, qarşılasınlar. Təyyarə Simferopolda yerə enib qalxdı və Bakıya yollandı.

***

Təyyarədən düşüb qarşılayanlarla görüşən təkin Zaur başa düşdü ki, nə isə bir iş var burda. Amma məsələ nədə idi, bunu başa düşə bilmirdi... Onları qarşılayanlar – Zivər xanım, Firəngizin atası və anası, Spartak, Spartakın bir dostu – Zaur onu üzdən tanısa da adını unutmuşdu – gülümsünə-gülümsünə Zaurgilə əl edirdilər uzaqdan, Zaurla Fira da əl edirdilər, amma Zaur uzaqdan belə gördü ki, anası Murtuzovgildən aralı dayanıb. Murtuzovlarla öpüşüb, görüşüb (onlar daha yaxın dayanmışdılar) anasının yanına gələndə Zaur anasının gözlərində nə isə oxudu – inciklik, narazılıq vardı bu baxışlarda. Zivər xanım Zaurla soyuq görüşdü, gəliniylə ondan da soyuq görüşdü.

– Atan gələ bilmədi, – dedi və əlavə etdi: – Mən sənin maşınınla gəlmişəm, onda da gedəcəm. Özün sür, yaxşı? – Zaur başını tərpətdi. – Baqajı al, gəl maşına.

Zivər xanım keçib Zaurun “Volqa”sında qabaq yerdə əyləşdi.

Zaur bildi ki, onun maşınını bura Spartakın dostu sürüb gətirib və bu da təsadüfi deyil. Zivər xanım Murtuzovların maşınında, Murtuzovlarla bir yerdə gəlmək istəməyib və ümumiyyətlə, bu bir ayda iki ailənin arasında nə isə olub.

Alya xanım Firəngizi səyahətləri haqqında sorğu-suala tutmuşdu. Murtuz ətrafı şəstlə seyr edirdi. Spartakla dostu isə, nə isə, qeyri-adi bir tərzdə gah Zaura, gah Firaya, gah Zivər xanıma baxırdılar.

Alya xanımla Firəngiz qırağa çəkilib pıçıldaşmağa başladılar. Firəngizin pörtməsindən Zaur başa düşdü ki, hamilə olduğunu deyir anasına, Alya xanımın məmnun təbəssümündən bu xəbərin ona nə qədər ləzzət etdiyi də aydın olurdu...

Yüklərini gətirdilər. Spartakla dostu kömək elədilər Zaura, beş iri çemodanı maşınlarda yerbəyer elədilər.

Alya xanım:

– Fira bizim maşında gedər, – dedi və Murtuzovların hamısı Spartakın çəhrayı "Volqa"sına tərəf getdi. Spartakın dostu da onlarla mindi maşına.

Zaur öz maşınının sükanı dalına keçdi. Bir müddət motoru qızdırdı, sonra çəhrayı "Volqa"nın ardınca sürdü... Həmin o yola çıxdılar. Həmin o yola ki, bir neçə ay bundan qabaq bu yolla Zaur çəhrayı "Volqa"nı qovurdu... Amma Zaur həyatın qəribə dolanbacları haqqında düşünməyə macal tapmadı, Zivər xanım açıldı nə açıldı...

Hər şey məhz Zaurun düşündüyü kimiydi, Zivər xanım deyirdi ki, adamları tanımaq olmurmuş, neçə ilin qonşusudurlar, həmişə də Murtuzovları abırlı adam bilib, amma sən demə Alya şeytana papış tikənlərdən imiş. Özü də, əri də özlərindən elə müştəbehdirlər ki, elə bil alçaq dağları bunlar yaradıblar. Qızlarının da tayı-bərabəri yoxmuş onların gözündə, göydən qızıl zənbildə düşübmüş, bilməmişik... Hələ bütün bunlar dərdin yarısıymış, sən bir görəydin ki, o julik Spartakı necə tərifləyib göyün yeddi qatına qaldırır Alya xanım. "Spartak belə, Spartak elə", dilindən düşmür arvadın Spartak. Arvadın həyasızlığına bax ki, düz Zivər xanımın gözünün içinə şappadan deyib ki, sən nahaq Zaurla Spartakı tən tutursan. Spartak hara, Zaur hara. Spartak müstəqil kişidir, bir evin dayağıdır, Zaur isə heç öz ailəsini əməlli-başlı saxlaya bilməz öz başına qalsa... Day mən də bu yerdə partladım, nə partladım. Nə olub, dedim, bəlkəm Zaur qapıva gəlib, səndən kömək-zad istəyib, ölüb-eləyib Zaurun atası-anası ki, sizlərə möhtac olsun... Zaurun, deyirəm, maşallah dalında dağ kimi dədəsi var... İndi gör bu ləçər qızı mənə nə cavab verir, – dədəsi, deyir həmişə olmayacaq ki. – Bəs sənin ərin necə, – dedim, – qurdla qiyamətə qalacaq? Hamımızın axırı bu qara torpaqdadır da, sən nə baxırsan ki, Zaurun atası xəstədir, heç kim bilmir ki, əcəl onu haçan və harda yaxalayacaq, görürsən bığıburma cavan yıxılıb ölür birdən, amma yaşlı, xəstə adam lap qoca yaşına kimi yaşayır. Bir də deyirəm, həkimlər deyib ki, professor yüz yaşı da sapsağlam başa vuracaq. Özüm qəsdən həmişə Alyayla danışanda atana professor deyirəm, qoy o polkovnik ərini çox gözümüzə soxmasın.

Zaur bütün bu ehtiraslara tamam biganəliklə yanaşırdı. Bilirdi ki, bütün ömrü bu dedi-qoduların içində keçəsidir indən belə. Bilirdi, qabaqcadan bilirdi ki, hər şey məhz elə bu cür də olmalıdır, odur ki, indi nə təəccüblənir, nə hirslənirdi. Əlbəttə, doğma şəhərə qayıdışlarının ilk dəqiqələrindən kefinə soğan doğramaq – anasının xasiyyətinə, tə-

biətinə uyğun idi. Amma məgər bu qayıdışın, bu dönüşün özü belə sevincli, belə fərəhli idimi Zaurçün?

Maraqlandığı üçün yox, nəzakət naminə soruşdu:

– Axı, bütün bu qalmaqal nədən başlayıb?

– Əşi, heç nə... Evinizin açarını Alyaya vermişdiniz. Nə deyirəm, öz işinizdir, yəqin elə məsləhət bilmisiz – ev sizin, ixtiyar sizin. Mən axmaq da fikir elədim ki, bəlkəm bir kömək lazımdır, yır-yığış eləmək lazımdır evdə, yəqin toz basıb da... Zəng elədim belə kamal-ədəblə dedim ki, Alya xanım, bəlkə onlar gələnə gedək bir evi yığışdıraq, künc-bucağı silək-süpürək, səliqəyə salaq. Yadımdadır axı, elə siz getməmişdən də ev tör-töküntü idi... Di, partlamadı. Alya xanım... Sən demə, şəstinə dəyibmiş xanımın: nə demək istəyirsən, deyir, tör-töküntü niyə olur Firanın evi?.. Nədi, baxmır deyirsən, evə?.. Nədi, deyir, neçə il onu naz-nemət içində böyütmüşük ki, sizin qulluqçunuz olsun? – Zivər xanım Alyanın zəhərli tonunu yamsılamağa çalışır, öz replikalarını isə həlim, yumşaq tonla tələffüz edirdi – yox, bacım, deyirəm, belə sözləri niyə gətirirsən dilinə, qulluqçu, qaravaş-zad nədir, intəhası cavandır da, hər şeyi get-gedə öyrənəcək. Hələlik biz, deyirəm, onlardan böyüyük, təcrübəliyik, gərək qollarından tutaq, kömək eləyək, gedək bir yır-yığış eləyək, nə olacaq xəncərimizin qaşı düşməz ki. Bəlkəm mənim də bir köməyim dəydi. Yox, deyir, heç bir kömək-zad lazım deyil, – mən, deyir, bacılarımla gedib hər şeyi öz qaydasına salaram onlar gələnə... Bacılarını da tanıyırsan da... Biri o atmaralıdır Tahirə, əri yazığı bir qoz qabığına soxub ki, yazıq cınqırını çıxarda bilmir... O biri də Sürəyya – onu da tanıyıram nə yuvanın quşudur. Birinci ərini basdırıb, ili çıxan kimi bu Nemətə calayıb özünü – yanında da iki balası, neçə yaş cavandır özündən əri... Qızlarından da ki, olmaz.

– Yaxşı, ay ana, – deyə Zaur Zivər xanımın sözünü kəsdi, – bütün bu həngamə nədən başlayıb axı?.. Evi yır-yığış eləməkdən?

– İş yır-yığışda deyil e... İntəhası tanıdım bu adamları... Bu üç bacının xasiyyətiymiş bu – ərlərinin başında turp əkmək. Tahirəsi də elədir, Sürəyyası da... Alyanın özü elə deyil? Sən bu Murtuzun qozqurablığına, bazburutuna-filana baxma, arvadından it kimi qorxur, nə buyursa arvad, ləbbeyk deyir, bəs necə... Səni də eləcə tryapka eləmək istəyirlər ki, onların hər nazıyla oynayasan, ata-anadan keçəsən, naxələf çıxasan, onların istədiyi budur, bə nə?

– Yaxşı, ay ana, boşla görək.

– Düz demişəm?.. Alya qaçırtdı da dilindən. Sən demə, Alya xanım belə hesab eləyir ki, bizim ailəyə böyük minnət qoyub – əziz-xələf qızını sənə verib. Sən guya heç layiq də deyilsənmiş belə dünya gözəlinə ər olmağa.

– İndi nədi, danışmırsız bir-birinizlə?

– Qulaq as... Demək, bir neçə gün keçir, sizdən də bir xəbər yox, yaman nigaranam, Alyaya zəng vururam, görüm bəlkəm onlar teleqramdan-zaddan bir şey alıblar. Zəng eləyirəm, ədəblə belə hal-əhval tuturam. Özün necəsən, ərin necədir... Di, düşmədi mənim üstümə. Nə yemisən turşulu aş, day dişinin dibindən çıxanı dedi mənə.

– Niyə axı?

– Qulaq as, danışıram da – ...Sitarəni tanıyırsan da, qonşumuzu. Gəlib bir dəfə bizə, deyir, eşitmişəm Zaurun, maşallah, əntiqə evi var, özü də aləm obstavit eləmisiz. Gələndə onlar, deyir, bir mənə də papaq elə, mən də gedim baxım... Mənim də ürəyim təmiz, nə bilim ki, camaat qan çıxmayan yerdən qan çıxardır, açarlar, deyirəm, Alyadadır. Ev sahibləri ona, deyirəm, etibar ediblər açarlarını, ona denən, deyirəm, aparsın səni Zaurgilə elə indi, daha gəlməklərin neyləyirsən gözləyib?.. Day bilmirəm mənim sözümü Sitarə nə cürə çevirib deyib Alyaya, od vurub Alyanın təpəsinə. Düşmədi mənim üstümə, nə deyir bütün şəhərə car çəkirsən ki, ay açar belə gəldi, ev elə getdi. Göndərirəm, deyir, Spartaknan o andıra qalmış açarlarını, o eviniz də ki, var, deyir, nə belə mataq şey imiş... Firoçka, deyir, istəsəydi min pay bundan yaxşı evlərə köçə bilərdi. Elçilər, deyir, qapımızın dabanını çıxartmışdılar.

– Hansı elçilər?

– Əşi, yalandır deyir də, gözünün içinəcən... Kim idi ona elçi düşən? Yəni – mən bilmirəm, camaatın gözü kor, qulağı kardır bəyəm?.. Allahına şükür eləsin ki, qızının bəxti belə açılıb... Eybi yox, mən də bir iki kəlmə şirin söz dedim ona. Qiyamətəcən yadından çıxmaz. Məni o deyil, e, özümdən çıxardan, o əri heyvərədir. Guya ki, belə ağır kişidir, ağsaqqaldır öz aləmində, amma arvad işlərinə qarışmaqdan utanıb xəcalət çəkmir. Götürüb telefonu bu da, deməli, mənim üstümə xoruzlanır.

– Mənim atam da ki, Alya xanımın cavabın verib, hə?

– Xeyr, bircə o çatmırdı... Sənin atan əsil kişidir, arvadnan ağızbaağız verən qurumsaqlardan deyil. Amma Murtuzla danışdı, özü də əməlli-başlı danışdı.

– Görürəm burda vaxtınızı şən keçirmisiz.

– Elə bilirsən bu hayıfı qoyacam mən onda? Məni yaxşı tanımırsan. Bircə bax sən sarıdan...

Zaur bu söhbətin gizli mənasını yaxşı başa düşürdü, anasının gözlərindəki nigarançılığın, qorxunun, təlaşın səbəbi də aydın idi ona. Anası ondan arxayın deyildi, qorxurdu ki, birdən Alyayla qızı Zaurun saqqızını oğurlayıb, öz tərəflərina çəkərlər, bu ölüm-dirim mübarizəsində Zaur əks cəbhəni seçmiş olar... Zaur düşünürdü ki, anası gətirdiyi hədiyyələrdən xəbərdar olanda, biləndə ki, Zivər xanımla Alya xanıma eyni cür çəkmə, Məcidlə Murtuza eyni cür köynək alıblar, amma üstəlik, Spartaka iki qəşəng qalstuk da gətiriblər və bu qalstukları şəxsən Zaur özü seçib, gör onda nə mərəkə olacaq. “Bizim pulumuza səfərə çıxan öz oğlumuz qudalarımıza da elə bizə gətirdiyindən gətirir, hələ üstəlik Spartakı da yaddan çıxartmır, heç belə müsibət olar?..”

Şəhərin içinə girmişdilər və Zaur gördü ki, çəhrayı “Volqa” sağa buruldu. Deməli, Firəngizin valideynləri öz evlərinin qabağında düşəcəklər. Bəlkə Firəngiz də onlara gedir – ata evinə...

Bəlkə ümumiyyətlə, Alya xanım Firəngizi Zaurdan boşatmaq fikrinə düşüb?.. Çünki yəqin ki, o biri maşında da Alya xanım eyni hadisələri, eyni hiddətlə, amma tamam başqa şərhlə bəyan edir... Bəlkəm o biri maşında söhbət nisbətən sakit gedirdi, axı hər halda, Spartakın dostu da – tamam yad bir adam da var idi orda... Amma ehtiraslar elə qızışmışdı, elə püskürürdülər ki, yəqin orada da doğmaya, yada məhəl qoyan yox idi... Bayaq təyyarədən düşəndə uzaqdan Murtuzovlar hər ikisinə – Zaura da, Firaya da eyni cür gülümsəyirdilər, amma yaxına gələndə məlum oldu ki, bu təbəssümlər yalnız qızlarına aid imiş. Zaurla ağızucu görüşdülər. Deməli, bəlkə, doğrudan da, elə Alyanın niyyəti onların nikahlarını pozmaqdır? “Bəs uşaq necə olacaq görəsən?” – deyə düşündü Zaur və özü də başa düşdü ki, “boş fikirdir”, əlbəttə, heç kəs onları boşatmaq istəmir...

Evlərinə çatanda Zaur:

– Yaxşı axır kimdə qaldı açarlar? – deyə soruşdu.

Zivər xanım qürurla:

– Kimdə olacaq, əlbəttə, məndədir, – dedi.

Zaur çemodanları maşından çıxaran müddətdə Spartakın çəhrayı “Volqa”sı da gəlib çatdı və Fira da maşının içindəydi. Zaur, doğrudan, sevindi arvadının gəlməsinə... Spartak Zaura kömək elədi, şeyləri 8-ci mərtəbəyə qaldırdılar. Zivər xanım qapını açdı, dördü də mənzilə girdi... Zivər xanım amiranə bir tərzdə Spartaka göstəriş verdi:

– Çemodanları bax o küncə qoy. – O özünü evin sahibi hiss edirdi, istəyirdi ki, başqaları da bunu dərk etsin birdəfəlik.

Spartak:

– Yaxşı, mən gedim, – dedi. Spartak nə isə tamam başqalaşmışdı elə bil, yavaş danışırdı, həmişəki kimi səs-küylü deyildi və elə bil hətta gözlərinə də kədər çökmüşdü...

Zaur onu qapıyacan ötürdü, liftin düyməsini basdı, lift səkkizinci mərtəbəyə qalxmağa başladı. Spartak ona nə isə demək istəyirdi və Zaur yəqin bilirdi ki, nə demək istəyir, Spartak. Şübhəsiz, iki ailənin bu qarşılıqlı ədavət və nifrət toruna Spartak da düşmüşdü və bəlkə indi özü də istəmədən Zaura Alya xanımın, ya Murtuzun hansısa sözünü, hədəsini, ya təklifini, ya nə bilim, xəbərdarlığını çatdırmalıydı. Məcbur idi buna, ürəyində istəməsə də... istəməməyinə isə, açıq-aşkar görünürdü ki, istəmirdi, yoxsa bu qədər kədərli ifadə çökməzdi sifətinə, yazıq biçarə... Lift axır ki, gəlib çıxdı, qapısı açıldı. Spartak, nəhayət, iradəsini toplayıb boğuq səslə:

– Bilirsən, Zaur... – dedi. – Sənə demək istəyirdim... Təhminə... ölüb...

Liftin içinə girdi və əlavə etdi:

– Serroz... Qara ciyəri... İyirmi günün içində yandı getdi yazıq.

## On səkkizinci fəsil

*Yandı canım hicr ilə, vəsli-ruxi-yar istərəm,*
*Dərdiməndi-firqətəm, dərmani-didar istərəm.*

Heç bir vaxt təsəvvür edə bilməzdi ki, evlər, küçələr adamı bu qədər ağrıda bilər. Evlər, küçələr, maşınlar...

Bağın yanına buruldu, o bağın ki, iyun günü yaşıl "Moskviç"in içində Təhminəni gözləyirdi. Həmin o yerdə həmin rəngli "Moskviç" dayanmışdı – və elə bil parçalandı Zaurun ürəyi və hər şeyi birdən-birə xatırladı Zaur – burada, bax bu yerdə Təhminəni gözləməsini də, səbirsizliklə barmaqlarıyla sükanı döyəclədiyini də, o gün çəkdiyi siqaretin dadını da, hətta Təhminənin səsini də. Ağ düyməli qırmızı paltar geymiş Təhminə qəfilcən onu arxadan səsləmişdi. Əlində də çanta vardı, çantada da "Kamyu" konyakı, Zaurçün xüsusi gətirmişdi bu konyakı... Qapılarının qarşısındakı səki – haçansa Spartakın çəhrayı "Volqa"sı dayanmış səki – "Volqa"nın təkərini deşmişdi o gecə – səki

də eyni cür ağrıtdı Zauru. Telefon budkası da – elə həmin o gecə Təhminəyə bu budkadan zəng vurmuşdu, telefon cavab vermirdi, sonra isə bildi ki, telefon doğrudan da xarab olubmuş, çünki pulunu vaxtında verməyiblərmiş... Bu da trolleybus dayanacağı. Təhminə işə gedəndə həmişə bu dayanacaqda minərdi trolleybusa, Zaur da ötürərdi onu. Təhminə trolleybusun pəncərəsindən əl edərdi Zaura və Zaurun çox xoşladığı bir hərəkətlə saçlarını alnından atardı, gülümsünərdi.

Spartak Təhminənin ölüm xəbərini verəndən sonra bir müddət də liftin içində dayanmışdı, amma daha heç nə deməmişdi. Çünki söz qalmamışdı daha, qurtarmışdı bütün sözləri Spartakın da, Zaurun da. Nəhayət, Spartak liftin düyməsini basmışdı, liftin qapısı bağlanmışdı, lift aşağı enməyə başlamışdı. Zaur isə mənzillərinə qayıtmışdı, dəhlizdəki çemodanları, nədənsə, yataq otağına aparmışdı, yataq otağındakı çemodanları dəhlizə gətirmişdi. Bir neçə dəfə otaqdan otağa keçmişdi, nə isə götürmüş, nə isə qoymuşdu, sonra arvadına və anasına bir kəlmə demədən evlərindən bayıra çıxmışdı, liftlə deyil, pilləkənlə səkkizinci mərtəbədən aşağı düşmüşdü, küçənin tinində siqaret, dükandan kibrit almışdı və piyada Təhminəgilin evlərinə tərəf addımlamışdı... Hələ onda ağrını belə şiddətlə duymurdu, yaranın köynəyi vaxt keçdikcə artırdı və bu küçəyə, bu evə çatanda dözülməz olmuşdu. Zaur bu dözülməzliyin içindən keçib pilləkənlərlə – ona bu qədər tanış olan pilləkənlərlə, axırıncı dəfə əsəbi düşüb getdiyi pilləkənlərlə qalxmağa başladı. Və ancaq bu zaman birdən-birə qəti dərk elədi ki, Təhminə yoxdur və bir də heç vaxt olmayacaq. Bir də heç vaxt görməyəcək Təhminəni... Nədənsə, Spartak da başından çıxmırdı və bu anlar fikirləşirdi ki, bax indicə hansı yollasa bir sirr açılacaq və məlum olacaq ki, Təhminəylə Spartakın arasında heç vaxt heç bir şey olmayıb və Zaurun bütün şübhələri boş və əbəs imiş. Bu həqiqət o qədər aydın təsdiq olunacaq ki, Zaurun ağrısı, peşmançılığı birə-yüz artacaq. Özünü günahkar biləcək, Təhminənin isə heç bir günahı olmadığından Zaurun lap bağrı çatlayacaq, daha artıq iztirab çəkəcək: intihar etmək istəyəcək, hətta günahını yumaq üçün... Hardansa yadına düşdü ki, bir dəfə Təhminə onu Spartakgilin bağına aparmışdı və orada demişdi ki, bura gəlmələrinin bir səbəbi də var, Zaur bu səbəbi ya çox sonralar biləcək ya da heç bir vaxt bilməyəcəkdi. Bəlkə də bu səbəbi bax indicə, bir neçə andan sonra biləcəkdi Zaur və bu səbəb hər şeyi birdən-birə gün işığı kimi işıqlandıracaq, izah edəcəkdi və hər şey aydın olandan sonra Zaurun nəticə verməyən sonrakı peşmançılığı onun bütün həyatının sağalmaz dərdi-yarası olacaqdı...

Pilləkənin ikinci mərtəbəsində adamlar vardı, onlar tövşüyə-tövşüyə taxtaların içinə tablanmış iri şkafı qaldırırdılar, xəz yaxalıqlı qara palto geymiş kişi – yəqin ki, şkafın sahibiydi – hamballara göstəriş verirdi:

– Sola çevirin, beləsinə keçməyəcək deyirəm sizə, soldan götürün, soldan. – Sonra Zauru gördü və ona müraciət elədi. – Keçmək istəyirsiz? – hamballara: – Yol verin, yoldaş keçsin, – dedi.

Zaur adamların arasından, şkafın yanından keçdi və xəz paltolu adam yenidən göstərişlər verməyə başladı:

– İndi bir az aşağıdan götürün, aha, bu tərəfini qaldır, ay qoçaq!

Zaur üçüncü mərtəbəyə qalxdı. Təhminənin qapıları taybatay açıq idi, qapının üstündə isə yenicə vurulmuş lövhəcik görünürdü: "Əməkdar mühəndis rasionalizator Q.Kərimov.

Qapıda vız başlı, ala-bəzək xalatlı bir qadın dayanmışdı – güman ki, əməkdar rasionalizatorun arvadı idi. Şkafı da görünür, təzə ev sahiblərinin mənzillərinə qaldırırdılar. Xəz yaxalıqlı palto geyinmiş adam yəqin elə mühəndis-rasionalizator Q.Kərimov idi ki, vardı... Zaur qeyri-ixtiyari açıq qapıdan içəri baxdı – və elə bil ürəyi həmin bu qapının arasında qaldı. Təhminənin boşalmış otağında ancaq bir neçə stul və stol vardı, – Təhminənin deyil, Kərimovların stolu, stulları. Nə qədim divar saatı, nə Təhminənin fotoları, nə balaca əncir ağacı – alpinistlərin hədiyyəsi qalmışdı, bircə oboylar həmin oboylar idi... Zaur çevrildi, qarşıdakı qapının ağzında dayandı və zəngi basdı.

Uşaq səsi gəldi qapının ardından, sonra hirsli qadın qışqırığı:

– Əşi, bir dayan görək də kimdi! – Uşağa qışqırırdı Mədinə. Qapı açıldı. Mədinə:

– Zaur, – dedi, çənəsi əsdi. Bir də təkrar elədi – Zaur, – və ağladı...

Zaurun göz yaşı yox idi. Hiss edirdi ki, ağlaya bilmir, amma haradansa, içinin dərinliklərindən boğazına qəhər qalxırdı, boğazında tıxanıb qalırdı.

Qorşokda oturmuş beşyaşlı toppuş uşaq, anasının ağlamasını görüb bir müddət matdım-matdım baxdı, sonra özü də bərkdən bəyirməyə başladı...

Qarşı qapıdakı xalatlı arvad təəccüblə onlara baxdı, sonra içəri keçdi və qapısını da örtdü. Mədinənin otağının yarıaçıq qapısından balaca televizorun ekranı görünürdü və bu da Zaurun yarasına duz basırdı elə bil. Zaur fikirləşdi ki, bir aydan artıq Təhminəgildə qalıb, Mədinəylə qonşuluqda yaşayıb, amma bir dəfə də Mədinənin evində olmayıb.

Mədinə paltarının ətəyiylə gözlərini silərək:

– Gəl içəri, – dedi.

Zaur içəri girdi. Uşaq hələ də ağlayırdı. Mədinə qorşokla birlikdə onu götürüb harasa apardı və sakit elədi. Zaur kiçik və köhnə televizorun sönük ekranına, otağın kasıb avadanlığına baxırdı – hiss olunurdu ki, bu otağın sahibi sıxıntı və ehtiyac içində dolanır... Uşaq, nəhayət, sakitləşdi və Mədinə yaş əllərini silə-silə otağa gəldi. Zaurun qabağında oturdu.

Zaur siqaret yandırdı, Mədinə:

– Haçan gəlmisən? – dedi. Zaura "sən" deyirdi, elə bil dərd onları yaxınlaşdırmış, bir-birinə doğma, məhrəm etmişdi.

Zaur:

– Bu gün, – dedi, – yarım saat bundan qabaq.

Uşaq:

– Mama, bəs biz haçan gedəcəyik? – dedi.

– Gedərik, gedərik, bala, görürsən əmi bizə qonaq gəlib, – sonra Zaura müraciətlə əlavə etdi, – səhərdən day zəhləmi töküb. Yapışıb yaxamdan ki, kinoya gedək... Heç mənim kinoya getməyə həvəsim var?

Uşaq ağlamsınıb:

– Bəs haçan gedəcəyik? – dedi.

– Gedərik, gedərik, get orda topla oyna, mən də gəlirəm indi.

Oğlan könülsüz otaqdan çıxdı və Mədinə:

– Belə işlər, Zaurik, – dedi. – Təhminə getdi əlimizdən... – və yenidən ağladı...

Zaur bilmirdi nə desin, neyləsin, Mədinəni ovutmalıydımı, ya onun özünü ovudan gərəkdir indi?

Nə isə demək xatirinə:

– Mənə Spartak xəbər verdi, – dedi.

Bəlkə, indi Spartakın adını çəkən zaman Mədinə birdən bir sirr açacaq və bu sirri bütün diri qalmış insanlardan yalnız tək bir Mədinə bilir. Və o zaman hər şey aydınlaşacaq, Zaur da belə bir səhv etdiyinə görə minqat artıq peşmançılıq çəkəcəkdi. Amma onu da bilirdi Zaur ki, Mədinə heç bir sirr-filan açmayacaq, çünki heç bir elə sirr-filan bilmir və əslində də, yoxdur yerli-dibli belə bir sirr... heç bir səhv də yoxdur, heç bir şey də yoxdur, hər şey necə vardısa eləcədir, bircə Təhminə yoxdur.

– Serroz, qara ciyərində, iyirmi günün içində tələf olub getdi. – Mədinə eynilə Spartakın sözlərini təkrar etdi. Sonra isə hər şeyi danış-

dı Zaura, bütün ağır təfərrüatlarıyla, fiziki ağrılar barəsində, şişlər barəsində.

– Heç ölmək istəmirdi yazıq. Xəstəlikdən qabaq tez-tez deyirdi ki, ölmək istəyirəm, sözdü də deyirdi, amma elə ki, doğrudan xəstələndi, ağrılar, əziyyətlər başlandı, xəstəxanaya düşdü və xəstəxanada da bildi ki, doğrudan da ölür, onda qaragün elə yalvarırdı ki, qurtarın məni, ölmək istəmirəm. Amma axıracan kişi qızı kimi mərd-mərdanə apardı özünü...

Uşaq yenidən otağa gəldi:

– Ana, bəs haçan gedəcəyik axı, kinoya?

– Bu saat, bu saat, mənim göyçək balam, indicə gedəcəyik... Axır saatına qədər Muxtar gəlirdi yanına... Manaf da gəlirdi, necə yaxşı adam imiş Manaf, Zaur, heç bilməmişik vallah, bütün dəfn xərcini özü çəkdi, üç, yeddi də verdi, bu yaxında qırxıdır, amma day qırxını verə bilməyəcək, dəyişdilər də mənzili... Bir injener köçüb bura arvadıyla, bir çətən də külfəti var.

– Mama, gedək də...

– Bu saat, bu saat oğlum, qoy bir az əmiylə danışım, gedərik.

Zaur qalxdı və indi ayaq üstə danışırdılar.

– Görsən tanımazdın, Zaurik, elə arıqlamışdı ki, yazıq... Ağrılar yaman əziyyət verirdi, amma heç zarafatından da qalmırdı... Nə yaxşı oldu, deyirdi, heç kəs mənim qocalığımı, çirkinliyimi görməyəcək... Bir cavan göyçək oğlan müalicə edirdi onu. Ölümündən bir gün qabaq mənə dedi ki, heyif, belə göyçək oğlan məni ölü görəcək. Zarafat elədi ki, çılpaq görən olub məni, amma ölü görən olmayıb hələ, birinci bu cavan oğlan görəcək.

Zaur siqaretini söndürdü, yenisini yandırdı.

Mədinə:

– Zaur, otursana, – dedi, sonra dəhlizə tərəf boylanıb əlavə etdi, – deyəsən başı qarışdı orda, əl çəkdi bizdən. – Doğrudan da, uşağın daha səsi gəlmirdi.

– Dayan, bu saat sənə çay gətirim, – dedi.

– İstəmirəm çay. Yenə danış ondan. – Zaur da Mədinəyə “sən” dedi. Mədinə indi onunçün ən doğma, ən yaxın adam idi.

– Eh, ay Zaur nə danışasan... Elə bil heç yox imiş, heç nə də qalmadı bədbəxtdən. Amma bilirsən necə gözəl insan idi... Necə qızıl ki-

mi ürəyi vardı?.. Səni də yaman çox istəyirdi, Zaurik, indi istəməsin... Həqiqətdə istəyirdi... Sən gedəndən sonra bilirsən nələr çəkdi yazıq?

Zaur:

– Bilirəm, – dedi. – Bu barədə danışma.

– Başa düşürəm, sənə də ağırdır, əlbəttə. Amma sən hələ cavansan, bütün ömrün də qabaqdadır. Hər şey unudulub gedəcək ay Zaur, bu etibarsız dünyanın işi belədir.

Zaur:

– Bəli, – dedi, – elədir...

Mədinə fikrə getdi, sonra elə bil öz-özüylə danışırmış kimi:

– Amma yazığı nahaq incidirdilər, – dedi.

– Kim?

Mədinə bir az tutuldu, sonra:

– Bilmirəm, – dedi, – yəqin sizinkilərdən idi kimsə. Acığın gəlməsin. Sən arvadınla səfərə gedəndən sonra kimsə ona gündə zəng vururdu. Hə, qarnıboş, deyirdi, nə oldu, hıçqırığın içində qaldı? Kələyin baş tutmadı? Zaurun arvadı hamilədir, uşaqları olacaq.

Mədinə Zaurun sifətinə baxdı, sərmərdi və tələsik:

– Yox, anan deyildi, – dedi. – Ananın səsini tanıyırdı Təhminə, kimsə başqa adam idi.

Zaur: "Alya? – deyə düşündü. – Axı, Alya onda bilmirdi ki, bizim uşağımız olacaq. Bu yalan hardan gəlibmiş ağlına?"

– Doğrudan, yəni bir şey var? – Bu sualı Mədinə artıq sırf qadın marağıyla verirdi.

Zaur qızardı və bir an ona elə gəldi ki, Təhminəymiş onun əsil arvadı, indi Firəngizdən olacaq uşağı Təhminəyə xəyanətdir.

– Xəstəxanada da tez-tez səni yadına salırdı... Lap axır gününəcən...

– Nə deyirdi?

Mədinə gülümsündü:

– Deyirdi ki, Zaur məni satdı onlara.

– Kimə onlara?

Mədinə çiynin çəkdi:

– Nə bilim, elə beləcə deyirdi onlara...

Uşaq yenə otağa qayıtdı:

– Mama, haçan gedəcəyik bəs?

– Bu saat, bu saat, mənim göyçək balam.

Dəhlizə çıxdılar.

Mədinə:

– Spartak sağ olsun, – dedi, – o qədər köməyi dəyirdi ki, dərman lazım olurdu yerin dibindən tapırdı, hansı həkim lazım olurdu, öz maşınında gətirib aparırdı.

Zaur:

– Ayın neçəsində keçindi? – deyə soruşdu.

– 14-də...

"Hansı ölkədəydik bu gün görəsən", – deyə düşündü. Zaur, yadına sala bilmədi.

Qapıda:

– Çox sağ ol, Mədinə, – dedi.

– Niyə sağ ol deyirsən axı?

– Mama, yaxşı, daha gedək də, əmi də gedir.

– Bu saat, gedirik, – birdən Mədinənin yadına nə isə düşdü, – tamam yadımdan çıxmışdı, sənə kağız qoyub axı.

– Kağız? – Zaurun ürəyi şiddətlə döyünməyə başladı: bəlkə bu idi sirrin açarı, bu kağız hər şeyi izah edəcək, hər şeyi aydınlaşdıracaqdı bəlkə? Mədinə otağa keçdi və bir azdan iki kiçik kağız parçasıyla qayıtdı. Kağızların biri qəbz idi, Zaur görən kimi xatırladı – Moskvada küçəni səhv keçdikləri üçün serjant Trofimov onları cərimə etmiş, qəbz vermişdi. Mədinə ikinci kağızı uzadaraq:

– Ölümündən iki gün qabaq duxularının sirrini yazıb bura. Xahiş elədi ki, sənə verim: "Qoy Zaurun arvadı bu ətirləri vursun", dedi, "onda Zaur məni xatırlayacaq hər dəfə".

Zaur karandaşla yazılmış kağız parçasını cibinə qoydu. Mədinəylə görüşdü və yavaş-yavaş pilləkənlərlə düşməyə başladı. İndi də pilləkənlərlə üçüncü mərtəbəyə piano qaldırırdılar və əməkdar mühəndis yenə göstərişlər verirdi. "Ehtiyatlı olun, bu pianinodur axı, belə kobud yerə vurmayın da, ehmallıca qoyun. – Zaura baxdı: – Keçmək istəyirsiz? – dedi. – Yol verin, cavan oğlan keçsin..."

Zaur bir də çevrilib Təhminənin qapısına baxdı, qapı yarıaçıq idi. Pilləkənləri düşməyə başladı, bilirdi ki, ömründə bir daha heç vaxt bu pilləkənlərlə qalxmalı olmayacaq.

Amma bilmirdi ki...

## EPİLOQ

*Öylə sərməstəm ki, idrak etməzəm dünya nədir,*
*Mən kiməm, saqi olan kimdir, meyü-səhba nədir.*
*Gərçi canandan dili-şeydam üçün kam istərəm,*
*Sorsa canan bilməzəm kami-dili şeyda nədir.*
*Hikməti – dünyəvü mafiha bilən arif deyil,*
*Arif oldur bilməyə dünyəvü mafiha nədir.*

...bilmirdi ki, Təhminəni bir də görəcək ömründə... Bilmirdi ki, bir axşam Təhminənin səsini eşidib diksinəcək, televizorun qabağına qaçacaq və ekranda görəcək Təhminəni – həmin o Moskva verilişinin videoyazısını verirdilər. Həmin o verilişdə Təhminə Zauru ad günü münasibətilə təbrik etmişdi, təbriki kəsmişdilər, amma Təhminənin Zaura həsr etdiyi hərəkəti – əliylə alnından saçlarını atması qalmışdı. O axşam – Təhminənin ölüm xəbərini bildiyi günün axşamı – Bakıya gəldikləri ilk axşam Zaur öz-özünə söz vermişdi ki, qızı olsa adını Təhminə qoyacaq. Bilirdi ki, ailədə narazılıq, söz-söhbət olacaq bunun üstündə, vaxt keçdikcə bu niyyətinin çətinliyindən qorxurdu Zaur və bilmirdi ki, doğrudan da, qızı olsa vəziyyətdən necə çıxacaq, özözünə verdiyi sözün üstündən keçmək də istəmirdi bir yandan, artıqəskik söhbətlərdən, qeybətlərdən, dedi-qodulardan da qorxurdu. Xoşbəxtlikdən oğlu oldu və uşaq olmamışdan iki ay qabaq Firəngizin atası Murtuz rəhmətə getdiyi üçün oğlanın adını Murtuz qoydular, Murtuz Balayeviç infarktdan öldü, çünki Spartak tutulandan sonra kişinin lap beli qırılmışdı. Spartak valyuta məsələlərində ilişmişdi, beş il kəsmişdilər Spartaka və məhkəmənin bu qərarından sonra bütün Murtuzovlar ailəsinin, o cümlədən də Alya xanımın tamam tası yatmışdı və Zivər xanım da ürəyində sevinirdi ki, qudasıgilin əməlli-başlı burunları ovulub.

Zaur indi öz valideynləriylə az-az görüşürdü. Murtuzovgilə isə ildə-ayda bir baş çəkirdi, amma Alya uşaq olandan sonra qızı Firəngizə çox kömək elədi. Zaur bir müddət geoloji ekspedisiyada oldu, sonra Bakıya qayıtdı və atasının köməyiylə nazirlikdə işə düzəldi. Zaur artıq dəqiq bilirdi ki, heç bir vaxt dissertasiya-filan yazası deyil, odur ki, nazirin referenti vəzifəsini təklif edəndə ona məmnuniyyətlə razılaşdı. Bu iş Zauru yeni çevrəyə daxil elədi və ona indi qəribə gəlirdi ki, haçansa cavanlıq vaxtlarında bu sayaq vəzifələrə rişxənd edərdi. Ya-

dındadır, haçansa Zaur başqa bir nazirin köməkçisi vəzifəsində işləyən bir dostunu lağa qoyardı. Dostu deyəndə ki, "sabah kişiylə Moskvaya uçuruq", Zaur həmişə elə təsəvvür edirdi ki, dostu Moskvaya nazirin çemodanını daşımağa gedir. Ona elə gəlirdi ki, dostu nəinki nazirin çemodanını, hətta, nazir arvadının hamam boğçasını da daşıyır. Niyə belə düşünürdü – məlum deyil, axı, təbii ki, nazirin arvadının heç bir hamam boğçası-filan yox idi, çünki hamama getmirdi, özlərinin vannaları vardı, ona nə gəlmişdi ki, hamama getsin? Həm də boğçayla?.. Bəlkə bu təəssürat ondan doğmuşdu ki, Zaur bir dəfə həmin dostunu bazarda görmüşdü – nazirgilə bazarlıq edirdi. Zaur özü də təbii ki, heç bir çemodan-zad daşımırdı, bazarlıq-filan etmirdi, amma hərdən o da görürsən öz naziriylə Moskvaya gedirdi. Nazir sinli kişi idi, hərdən görürsən çox nəzakətli bir tərzdə Zaurdan xahiş edirdi ki, mehmanxanada onun yanında qalsın, lazım olanda növbətçidən çay dəmlədib gətirsin və bəzən nazir Qosplanda mühüm iclasa başı qarışanda Zaurdan onu da rica edirdi: madam boşsan, bir mağazaları gəz. Arvadının və qızının verdiyi siyahıya əsasən xırım-xırda şeylər almaq tapşırırdı. Təbii ki, pulunu da verirdi.

Nazirin arvadı da çox mədəni və nəzakətli xanım idi. Zaurla hörmətlə danışırdı həmişə, çalışırdı ki, heç bir tövrlə onun izzət-nəfsinə toxunmasın, amma əlacsız qalanda bir-iki dəfə Zaurdan xahiş eləmişdi, usta tapıb gətirsin, vannalarının xarab olmuş kolonkasını düzəltdirsin, çünki ərinin başı elə qarışıqdır ki, ev işlərinin qeydinə qalmağa heç cür macal tapa bilmir. Zaur başa düşürdü hər şeyi, amma əslində elə onun özünün də işi başından aşırdı, nazir üçün müxtəlif kağız-kuğuzlar, sənədlər, vəsiqələr düzəldirdi, qəbula yazılmışları yola verirdi, nazirə gələn məktubları seçib sahmana salırdı, nazirin imzasıyla cavablar hazırlayırdı. Tez-tez nazirlə rayonlara gedirdilər, gündüz işlərini qurtarandan sonra axşam tərəfi qonaq evində rayon rəhbərlərinin iştirakıyla keçirdikləri xudmani məclislərdə nazir azacıq içməli də olurdu və balaca dəmlənəndə Zaura "sən" deməyə başlayırdı. Həmişə rəsmi danışan bu sərt və quru kişinin elə bil çiçəyi çırtlayırdı, südü daşırdı. Zaura: "sənin işindən razıyam, – deyirdi, – bir neçə il də işlə, sonra səni pərvazlandırıb uçurdacam", – deyirdi və əlavə edirdi ki, "sənin haqqında lazımi yerlərə də məlumat vermişəm, vaxt gələr, yaxşı müstəqil işə keçərsən..."

Amma bədbəxtlikdən günlərin bir günü hörmət və ehtiramla pensiyaya göndərdilər naziri. Yeni nazir nisbətən cavan idi, iş başına ke-

çəndən bir müddət sonra yavaş-yavaş əvvəlki nazirin adamlarını təmizləməyə başladı və Zaura da qandırdı ki, onun yerinə başqa namizədi var. Zaur ərizəsini verdi və bu vaxta atası Məcid də artıq dünyadan köçdüyü səbəbdən yaxşı bir iş tapa bilmədi özünə. Ancaq Dadaşın mərhəməti sayəsində yenidən həmin o nəşriyyata – köhnə yerinə qayıtdı... Zaurun bir uşağı da oldu – bu da oğlan idi, iki ildən sonra üçüncü oğlu da oldu və üç ildən sonra axır ki, qızı gəldi dünyaya. Zivər xanım bu qız nəvəsini görə bilmədi, uşağın dünyaya gəlməsindən on gün qabaq rəhmətə getdi və qızın adını Zivər qoydular... Üç ildən sonra Alya xanım da öldü, otuz ildən sonra onların çevrəsindəki adamlardan Dadaş, Səfdər dayı, Tahirə, Cabbar artıq yox idilər dünyada. Muxtar da yox idi. Təhminə ölən il onun idarədə nə isə davası olmuşdu, köçüb bir müddət Moskvada yaşadı, orada işi pis gətirmirdi, sonra nədənsə yenidən Bakıya qayıtdı və avtomobil qəzasına düşüb həlak oldu... XX əsrin axırına onların çevrəsindəki adamlardan Nemət, Sürəyya, Zaur və Firəngiz sağ idi. Spartak da beş ilini çəkib çoxdan çıxmışdı azadlığa və türmədən çıxandan sonra tamam başqa adam olmuşdu, dəyişmişdi. Bəli, bizə tanış olan bu adamlardan sağ qalanları – Nemət, Sürəyya, Zaur, Firəngiz, Spartak bir gün yığışmışdı hamısı bir yerə nəyisə qeyd eləməyə, deyəsən, Murtuzun – Zaurun oğlu Murtuzun ad günüydü. Bəlkə də yox, heç ad günü deyildi, bəlkə də o vaxt, yəni XX əsrin axırlarında ad günlərini qeyd etmək heç dəb olmayacaq, kim bilir? Hər halda müəllif ki, bunu dəqiq bilmir və müəllif onu da bilmir ki, o vaxt kitab oxuyacaqlarmı, sevəcəklərmi, öləcəklərmi, yaxud bir üsul tapıb ölümdən yaxalarını qurtaracaqlarmı insanlar? Ölümsüzlük qazanacaq və bu ölümsüzlüyün öhdəsindən nə sayaq qurtarmağın fikrini çəkəcəklər? Nə isə əlqərəz, bir gün yığışmışdılar bütün bizim diri qalmış qəhrəmanlarımız, yaxşıca nahar edib nərd atırdılar (dadlı naharlar və nərd, şübhəsiz, o vaxt da olacaq) və söhbət arası kimsə birdən Təhminəni yada saldı. Nemət idi, deyəsən Təhminəni yada salan, dedi ki, bu gecə qəribə yuxu görmüşdüm, heç ağlıvıza gəlməz kim gəlib girmişdi yuxuma – Təhminə. Bəli, Təhminə, özü də o vaxtkı yaşında, cavan, hamımızın yadında necə qalıbsa, bax o sayaq – gözəl, yaraşıqlı, cazibədar... Bu sözün üstündən Spartak dedi ki, qəribədir, bu günlərdə küçədə bir qadına rast gəlib, elə bil Təhminəylə iki almadır tən bölünüb. Əgər Spartak qəti bilməsəydi ki, Təhminənin uşağı-zadı yoxdur, and-aman eləyərdi ki, yəqin qızıdır, adam da adama bu qədər bənzəyərmiş. Ən qəribəsi də odur ki, həmin o qadın bu-

günkü çağın dəbiylə deyil, Təhminənin cavanlıq illərindəki dəblə geyinib-gecinmişdi, yalançılar sözü, lap elə bil Təhminənin ovaxtkı paltarlarından birini keçirmişdi əyninə... Nemət dedi ki, yəqin insanlar ölərkən birdəfəlik ölmürlər, tamam yox olmurlar, nə qədər ki, onları xatırlayan, onların səslərini, sifətlərini yaddaşında saxlayan adamlar durur, bu ölənlər də hələ yaşayırlar – fikirlərdə, xəyallarda, təsəvvürlərdə yaşayırlar. Biz də yəqin Təhminəni xatırlayan axırıncı adamlarıq, sonuncu nəsilik.

Bu sözlər yaman beyninə batdı Zaurun, amma döymədə Spartaka iki tas uduzub unutdu bu fikri... Zaur bilmirdi...

***

*Xəyalilə təsəllidir, könül meyli vüsal etməz*
*Könüldən dişrə bir yar olduğun aşiq xəyal etməz.*

...bilmirdi ki, bir qədər də keçəcək və bir axşam, yağışlı bir axşam, yağışlı payız axşamlarının birində, qüssəli, yağışlı payız axşamlarının birində beli bükülmüş, sinli bir kişi avtobusdan düşəcək. Qoltuğunun altında nimdaş portfeli olacaq bu kişinin – portfelin içində kağızlar, çörək, kolbasa, pendir, bir də gündəlik qayğıları olacaq. Bəlkə kişi tindəki köşkün qabağında ayaq saxlayacaq, qəzet alacaq... Bəlkə yadına düşəcək ki, siqareti, kibriti qurtarıb, satıcıya pul verəcək (əlbəttə, əgər o vaxtlar pul hələ işlənəcəksə), siqaret alacaq, pulun qalığını hesablamadan cibinə atacaq. Sonra yavaş-yavaş evinə tərəf addımlayacaq... Televizorun (ya o zaman televizorlar olmayacaq, qoloqraflar olacaq, kim bilir) axşam proqramı haqqında, sabahkı işləri haqqında düşünəcək. Düşünəcək ki, oğluna çəkmə almalıdır, qızına palto, arvadına plaş və öz plaşını da təmizlənməyə verməlidir... Düşünəcək ki, qaz plitəsini təmir etdirmək və dama qır saldırmaq lazımdır, yayda kurorta getmək üçün pul yığmaq lazımdır (əgər o vaxtlar pul işlənəcəksə hələ). Düşünəcək ki, təzə müdirlə heç dil tapa bilmir, düşünəcək ki, hava yaman pisdir və düşünəcək ki, çox mənasız bir ömür sürüb bu dünyada.

Birdən diksinəcək: ona elə gələcək ki, küçənin o tərəfindən gənc bir qadın buruldu tini və dərhal da qeyb oldu... və bu qadının uzaq kölgəsi qəfil külək kimi onun ürəyinin içində əsəcək, unudulmuş bir qoxunu gətirəcək onun xəyalına... və qocanın qəlbində – dünyada ən basılmaz qüvvə olan bir hiss – ümid oyanacaq. Ümid bir anlığa çoxdan ötüb keçmiş gəncliyinin bütün şirin-acılarını qaytaracaq ona və sevdiyi

bütün qadınlar okeanda itmiş uzaq adalar kimi gəlib keçəcək gözlərinin önündən. Keçib gedən kölgəni haqlamaq, tutub saxlamaq istəyəcək, amma dərhal da bu fikri başından qovacaq və aramla yoluna davam edəcəkdir. Tinə çatanda dayanacaq ki, nəfəsini dərsin, çünki bu yoxuş lap adamın kələyini kəsir. Öz-özünə kənar şeylər haqqında düşünməyi qadağan edəcək, ancaq axşamkı televerilişlər (yaxud qoloverilişlər) haqqında, hava haqqında və belindəki yel xəstəliyi haqqında fikirləşməyə icazə verəcək... Lap onun böyründən vıyıltıyla keçən motosiklet yağış gölməçəsini onun üstünə çıldırladacaqdır. Motosikletdə isə cavan oğlanla cavan qız oturacaqlar, qız oğlanın boynunu bərk-bərk qucaqlayacaqdır və qoca kişiyçün həmişəlik qırmızı görünən işıqfor cavan motosikletçilər üçün yaşıl çırağını yandıracaqdır... Nə biləydi qoca.

***

*Həq bilir, yar deyil, canü-dilimdən qaib*
*Nola gər qaib isə dideyi-giryanımdan.*

...Nə bileydi Zaur ki, bir neçə gün də keçəcək, bəlkə də bir neçə ay keçəcək, il keçəcək və Zaur yenə də günlərin bir günündə – daha buna heç şəkk-şübhə ola bilməz – yenə də günlərin bir günündə Təhminəni görəcək... Onlar az qala sifət-sifətə toqquşacaqlar – Zaur və Təhminə... Təhminə Zauru görüb gülümsünəcək – həmin o ağ düyməli qırmızı paltarında olacaq Təhminə, həmin o otuz il bundan qabaqkı paltarında və belə məlum olacaq ki, vaxtın Təhminəyə heç bir dəxli yoxdur – heç dəyişməyib Təhminənin nə sifəti, nə bədəni, nə yaşı... Otuz il əvvəlki təkin gülümsünəcək Zaura və Zaur da dili-dodağı titrəyə-titrəyə Təhminənin adını çəkəcək, amma adını çəkən kimi Təhminə çevriləcək, küçədəki adamlara qarışıb itəcəkdir. Bir az sonra Zaur onu metronun qabağında görəcək, dalıyca qaçacaqdır və yenidən görəcəkdir Təhminənin qırmızı paltarını metro vaqonunun içində... Qapıları bağlanmış, hərəkətə gəlmiş qatarın pəncərəsindən Təhminə ona əl eləyəçək, gülümsünəçək və Zaur o biri qatara minib dalınca gedəcəkdi. Daha Təhminəyə çatacağına ümidi olmayacaq, amma gələn dayanacaqlarda metrodan düşəcək. Bütün perronu ələk-vələk edəcək, eskalatorla yer üzünə çıxacaq, küçədə ora-bura döyükəcək və nəhayət, bir daha görəcəkdi onu – yeni mehmanxanaya girən vaxt görəcək... Dalıyca ora qaçacaq və görəcək ki, elə bu dəm Təhminə liftin içi-

nə girdi. Zaur liftin qapısına tərəf atılacaq, amma qapılar bu vaxt bağlanacaq, Zaur divardakı işıq tablosuna baxacaq – tabloda liftin hərəkəti görünəcək – mərtəbələrin rəqəmləri bir-birini təqib edəcək – 2, 3, 4, 5, 6. Lift altıncı mərtəbəyə çatıb dayanacaqdır. Zaur düyməni basacaq və lift yenidən birinci mərtəbəyə qayıdacaq, tabut kimi ağır və əzəmətlə gələcək Zaurun qabağına; qapılar açılacaq, Zaur liftin içinə girəcək, altıncı mərtəbənin düyməsini basmaq istəyəcək və bu zaman məlum olacaq ki, altıncı mərtəbənin düyməsi yoxdur, çünki heç altıncı mərtəbənin özü də yoxdur, ev beşmərtəbəlidir. Çöldəki işıq tablosunda da yox imiş altıncı mərtəbə, Zaurun gözünə görünübmüş bu rəqəm. Zaur and içə bilərdi ki, lift məhz altıncı mərtəbəyə qalxmışdı. Hər halda beşinci mərtəbəyə qalxacaqdı Zaur, növbətçini sorğu-suala tutacaqdı, növbətçi də deyəcəkdi ki, heç bir qırmızı paltarlı qadın görüb eləməyib. Zaur bütün mərtəbəni gəzəcək, axtaracaq, sonra isə yanğın nərdivanıyla dama qalxacaqdı. Damda isə gözəl may gecəsindən, ulduzla dolu səmadan, eşqbazlıq edən pişiklərdən başqa heç nə və heç kim yox idi; təzəcə basılmış qırın iyi gəlirdi, vəssalam...

Bu qəribə və izahsız vaqiədən başqa Zaurun həyatında ömrü boyu heç bir əcaib, qəribə, anlaşılmaz hadisə olmamış və olmayacaqdı: işi, ailəsi, uşaqları, dostları, tanış və qeyri-tanış adamlar vardı Zaurun həyatında, onlar doğulurdu, ölürdü və bir də qəbiristanlıq vardı, bu qəbiristanlıqda qərib bir məzar vardı və məzarın üstündə Təhminənin adı, famili və 1941-1965 rəqəmləri yazılmışdı. Mədinənin, Manafın və Muxtarın ölümündən sonra daha bu qəbrin üstünə heç kəs gəlmirdi...

***

*Tutuşdu qəm oduna şad gördüyün könlüm,*
*Müqəyyəd oldu ol azad gördüyün könlüm.*
*Nə gördü badədə bilməm kim oldu badəpərəst.*
*Müridi-məşrəbü zöhhad gördüyün könlüm.*
*Füzuli eylədi ahəngi – eyşxaneyi Rum.*
*Əsiri-möhnəti-Bağdad gördüyün könlüm.*

Səhər saat yeddidə dəmiryol vağzalının bufetində oturmuşdular, şirin çaxır içirdilər, boyat çörəklə, qupquru qurumuş holland pendiriylə yavanlıq edirdilər. Məmməd Nəsir Zaurun söhbətinə diqqətlə qulaq asıb soruşdu:

– Neçənci mərtəbəyə qalxdı?

Zaur:

– Altıncıya, – dedi – başımı verərəm ki, səhv etmirəm, öz gözlərimlə görmüşdüm 6 rəqəmini... Amma bina da beşmərtəbəlidir axı...

Məmməd Nəsirin yaşı həştadı çoxdan keçmişdi, amma hələ də gümrah idi və allahın var günü səhər tezdən bir-iki stəkan "Ağdam" portveyni vurardı bədənə. Doğrudur, indi əvvəlkindən çox-çox az içərdi, amma əvvəlki təkin mütəmadiyən hər gün içərdi... Axır vaxtlar tez-tez Zaurla içərdilər – illər keçdikcə onların yaş fərqləri itib getmişdi və indi kənardan baxan elə güman edərdi ki, iki qoca şərab içə-içə ötən günləri, keçmiş xatirələri yada salır, nəşriyyatda birgə keçmiş uzun ömürlərindən söhbət edirlər...

Zaur bir də təkrar etdi:

– Bina axı beşmərtəbəli idi...

Məmməd Nəsir uzun müddət harasa baxdı, gözləri yol çəkdi, elə bil baxışlarıyla divarı deşib harasa çox-çox uzaqlara baxırdı, sonra qəfildən belə bir kəlam bəyan etdi:

– Əgər adamlar başa düşsəydilər ki, beşmərtəbəli binanın altıncı mərtəbəsi də ola bilər, onda nə vardı ki...

*1974-1978*
*Bakı-Moskva-Göyçay*

# BİRİNCİ NAĞIL

*O vaxt döyüşə-döyüşə iki qoç gələcək: Biri ağ, biri qara. Ağ qoç qara qoçu qovacaq, Onda atıl min ağ qoçun belinə. Ağ qoçun belinə minən kimi işıqlı dünyaya çıxacaqsan. Qara qoça minsən, qaranlıq dünyaya düşəcəksən.*

Məlikməmmədin nağılı

Məlik Məmmədli Dövlət himninin sədalarına oyandı. Daha doğrusu hələ tam oyanmamışdı: yarıyuxulu halda eşidirdi bu səsləri. Qəribədir, hər gecə yuxuya getməmişdən bilgisayarın Vaxt xidmətini sübh obaşdandan himnin səslənəcəyi saata ayarlayırdı və hər səhər də onu himnin sədaları oyadırdı, amma bu gün oyanıb durmamışdan, hələ yuxudaykən görünməmiş bir fərəh hissinə qapılmışdı. Hər gün eşitdiyi səslər nədən bu gün bu qədər xoş bir ovqat oyadırdı? Elə yuxudaykən də Məlik bunun səbəbini tapdı. Bu gün Novruz bayramı idi, redaksiyada da, şəhərdə də, ümumən bütün ölkədə də bu günü hamı kimi o da böyük ruh yüksəkliyilə, sevinc, qürur, arxayınlıq duyğularıyla yaşayacaqdı. Elə yuxudaca – naşükür olma – deyə düşündü – məgər hamı kimi o da, bütün bu son illərin hər gününü, gündüzünü – gecəsini eyni bəxtiyarlıq hissiylə yaşamırmı?

Nə isə, durmaq vaxtı idi. Məlik ani bir sıçrayışla yatağından qalxdı. Artıq vərdiş halını almış bir duruşla Himni sonacan ayaq üstə dinlədi.

Məlik bilirdi ki, bu an milli tele radio kanallarının on ikisində də səslənən bu himni Dərbənddən Həmədanacan, Qazaxdan Qəzvinəcən milyonlarla insan eyni fərəh və qürur hissəlriylə dinləyir.

Məlik, əlbəttə, bilgisayarının dalğasını çalışdığı Radio-TV kanalının dalğalarına yönəltmişdi. Üç ildən bəri şərhçi və müəllif – rejissor kimi işlədiyi Çağdaş Radio-TV kanalı fəaliyyətində ağırlığı mədəniyyət məsələlərinə verirdi. Başqa Radio-TV kanalları da nə qədər universallığa riayət etsələr də hər halda müəyyən sahələrə, müəyyən yönlərə daha artıq meyil edirdilər. Əlbəttə, yeganə rəsmi dövlət kanalı

AZRT Azərbaycan və dünya həyatını bütün dolğunluğuyla əks etdirməyə çalışırdı. Amma digər – özəl kanalların müəyyən istiqamətləri və deməli öz tamaşaçı kontingenti vardı.

Türk dünyası – "Turan"ın, Bakı şəhər və vilayətinin həyatı "Xəzər" və "Abşeron"un başlıca mövzuları idi. "Araz" əsas verilişlərini Güney Azərbaycana həsr edirdi. Gənclərin və yeniyetmələrin ən çox sevdikləri "Ulduz" musiqi, idman və əyləncə proqramları göstərirdi. "Hilal"da verilişlər əsasən dini məsələlərə həsr olunurdu – İslam tarixi, müqəddəs Quranın şərhi, peyğəmbərlərin, imamların, övliyaların ömürləri...

"Novruz"da etnoqrafik, folklor mövzuları, mədəni irsə, qədim adət-ənənələrə aid verilişlər üstünlük təşkil edirdi, "Birlik" – xarici dillərdə və ölkədəki milli azlıqların dilində proqramlar verirdi. "Savalan" R-TV Təbrizdən, "Kəpəz" R-TV Gəncədən efirə çıxırdı.

Ölkənin ən peşəkar telejurnalisti və telerejissoru kimi tanınan Məlik Məmmədlini bütün kanallar israrla dəvət edirdilər, amma Çağdaş TV-də tamaşaçılarını məmləkətinin və xarici ölkələrin mədəniyyət həyatıyla, dünyanın ədəbi, sənət sərvətləriylə tanış etməyi son illərdə ömrünün məramı seçmişdi.

Ölkədə fəaliyyət göstərən siyasi partiyalardan dəfələrlə dəvətlər alsa da, heç birinə müsbət cavab vermir, ümumiyyətlə siyasətə qoşulmurdu. Məlik qəti inanırdı ki, Azərbaycanın tarixi ərazi bütövlüyü bərpa olunandan bəri, ölkənin demək olar ki, bütün sosial, iqtisadi və ideoloji problemləri əsasən həllini tapandan sonra siyasətçilik – müəyyən dərəcədə xoş bir məşğuliyyətdir: məsələn, idmançılıq kimi, poçt markaları yaxud kəpənək kolleksiyası toplamaq kimi.

Doğrudan da bir vaxtlar sahibkarlıq fəaliyyəti məhdudlaşdırılarkən, milli dəyərlərə yetərincə diqqət verilməyərkən sağ partiyaların elektoratı çoxduysa, korrupsiya hökm sürərkən, bəzilərinin həddən artıq varlandıqları, bəzilərinin dilənçi kökündə yaşadığı vaxtlarda sol partiyaların təbliğatı güclüydüsə, indi bu problemlər birdəfəlik aradan qalxmış, seçicilərin çoxu sağ və sol partiyalara yalnız ənənəvi vərdiş kimi, valideynlərindən qalma bir rəğbət tövsiyəsi kimi səs verirdilər.

Milli Məclisdə beş partiya təmsil olunmuşdu – iki, əski təbirlə deyilərsə sağyönlü, iki solyönlü və bir mərkəzçi partiya. Milli və türkçülük dəyərlərini önə çəkən və bazar iqtisadiyyatının ardıcıl tərəfdarı olan iki sağ partiya, sosial bərabərliyin carçısı kimi çıxış edən,

əsasən işçi sinfinə arxalanan iki sol partiya və hər iki tərəfin müəyyən dəyərlərini qəbul edən, əsasən barışçı mövqedə dayanan mötədil mərkəzçi partiya. İndi iqtidarda olan da mərkəzçi partiyayla bitərəf, müstəqil millət vəkillərinin ortaq koalisiya hökuməti idi.

Məlik başını buladı – bu bol günəşli xoş gündə siyasi məsələləri xatırlamağa dəyərdimi? Yeni dəniz neft və qaz yataqları açılandan bəri, Bakı-Ceyhan xəttiylə bərabər şimaldan və cənubdan daha iki boru işə düşdüyündən və sabit gəlir gətirdiyindən əhalinin orta əmək haqqı ayda min dollar olan bir ölkənin vətəndaşlarını siyasi olaylar indi çox az maraqlandırırdı.

İndi Azərbaycan əhalisinin rifah səviyyəsinə görə ərəb əmirliklərini arxada buraxmış, iqtisadi və mədəni inkişafı etibarilə ən qabaqcıl Avropa ölkələrinə çatmışdı. Son iki ildə səhiyyə xidməti, orta və ali təhsil, çörək, kommunal xidmətlər (mənzil, elektrik, qaz, su haqqı), şəhər nəqliyyatı (taksidən başqa) pulsuz olmuşdu.

Uzaq illərin qanlı Qarabağ hadisələri, ölkənin o vaxtkı ağır iqtisadi durumu indi yalnız xatirələr aləmində qalmışdı. Qarabağ demişkən, Məliyin yadına dünən oğlunun Şuşadan telefon etməsi düşdü.

Məliyin oğlu Beyrək nəqliyyat mühəndisi, qızı Burla ədəbiyyat müəllimi, arvadı Aypəri teatr rəssamı idi. Nə yazıq, təsadüf elə gətirdi ki, bu Novruzda heç biri Bakıda deyil, Beyrək Şuşada, Aypəri Təbrizdə, Burla Kərkükdə idi.

Beyrək Şuşada Cıdır düzündən Topxana meşəsinə çəkilən funiklyorun qurulmasına rəhbərlik edirdi. Dünən Məlik tetefonla inşaatın nə yerdə olduğunu soruşduqda Beyrək Cıdır düzü tərəfdən Kirsdən Qırx pilləkana qədər, Topxana tərəfdən İbrahim xanın sığnağına qədər hazırdır – dedi, indi iki tərəfi birləşdirmək qalıb, o da bir aya bitər. Sağ olsun mingəçevirlilər, elə yaraşıqlı vaqoncuqlar istehsal ediblər ki, iki göz istəyir tamaşasına. Odur ki, yayda İsa bulağı dincərliyinə gələndə Qarqarın üstündən funikulyorla keçəcəksiniz.

Beyrək fantazyor idi, bir neçə il bundan əvvəl bu funikulyor ideyası başına gələndə heç kəs bunu ciddi qəbul eləmədi, amma budur bax, olundu ki... indi də Qırxqız yaylaqlarına – teleferiq – kanat yolu fikrinə düşüb. Niyə də olmasın. Son illər Şuşa, doğrudan da, Qafqazın ən böyük turist mərkəzlərindən birinə çevrilib. Səfalı iqlimi, şəfalı bulaqları, qışda xizək idmanı, ov, alpinizm, tarixi abidələr – dünyanın hər

yerindən bura turistləri cəlb edir. Cıdır düzündə, Ərimgəldidə, Topxanada, İsa bulağı meşəsində, Səkili bulağın yanında ucaldılmış beşulduzlu və nisbətən kiçik, xudmani otellər türist tələbatını çətinliklə ödəyir, gərək neçə ay əvvəldən yer rezervasiyası edilsin.

Hər ilin payızında keçirilən Üzeyir Hacıbəyli musiqi festivalları zamanı isə nəinki Şuşada, Laçın, Ağdam, Xocalı, Qarabulaq, Ağdərə, Xankəndi otellərində də yer tapmaq müşkül olur.

Beyrək funikulyordan daha çox dünən Şuşada keçirilən axır çərşənbədən danışdı. İlk dəfə idi ki, axır çərşənbəni Şuşada qarşılamışdı və Cıdır düzündəki Qarabağ qaçağanlarının yarışından, Çovqan oyunundan, içinə üzərrik atılan və ta gecə səhərə qədər yanan, üstündən uşaqların belədən belə atıldığı tonqallardan, Qarabağın hər tərəfindən görünən atəşfəşanlıqdan, xanəndələrin zili bütün ətraflara yayılan səsindən, səkkiz-on yaşlı uşaqların – Qarabağ bülbüllərinin Qarabag şikəstəsindən və yaşlı xanəndələrin hamısına qalib gəlib "Xarı – bülbül" mükafatı almalarından elə şövqlə danışırdı ki, Məlik özünün də iki dəfə Şuşada keçirdiyi bu bayramı sanki yenə öz gözləriylə görürdü.

Beyrək: – Bilirsən – deyirdi, – Nəvvab muğam konservatoriyasının professorları sevinclərindən yerə-göyə sığmırdılar.

Məlik əl-üzünü yuyub, üzünü qırxıb yüngülvarı idman edəndən sonra bilgisayarında əvvəlcə elektron poçtasına baxdı.

Türkiyədən, İrandan, Rusiyadan, Gürcüstandan, Avropadan tanış jurnalist işdaşlarından xeyli təbrik ismarışları gəlmişdi. Hamısına gözucu nəzər salıb Kərkükdən gələn məktubu oxumağa başladı, qızı Burladan idi. Burla iki il idi, Kərkükdə Füzuli Universitetində Azərbaycan ədəbiyyatı və dilindən dərs deyirdi:

*"Mənim əzizlərim, ata, ana, Beyrək. Hamınızın Novruz bayramını təbrik edirəm. Hamınıza bu xoş gündə möhkəm cansağlığı arzu edirəm. Söz vermişdim ki, bu il Novruzu Bakıda birlikdə keçirəcəyik, nə yazıq ki, mümkün olmadı, sabah Urumçuya uçuram, Mahmud Qaşqarlı Universitetinə dəvət ediblər. Oradan Moskvaya, Moskvadan da Bağçasaraya uçacam. Qaspralı İsmayıl Universitetində mühazirələrim var".*

Məlik: Zalımın qızı dünyanın bu başından vurub o başından çıxır: o universitet sənin, bu universitet mənim – deyə düşündü və məktubun ardını oxudu.

*Builki Novruz tətillərindən istifadə edib Bakıya gələ bilmədiyimə çox üzüldüm. Sizinçün burnumun ucu göynəyir. Axı nə qədər bir-*

*birimizi ekranda görə, bilgisayarla yazışa bilərik? Onu bilin ki, həmişə qəlbimdəsiniz. Sizi bərk-bərk öpürəm – Burla.*

Məlik təəssüflə düşündü ki, nə iyirmi yeddi yaşlı Beyrək, nə iyirmi beş yaşlı Burla hələ ailə qurmayıb, valideynlərindən babalıq – nənəlik sevincini əsirgəyiblər. Bilgisayarda bugünkü günlüklərin (qəzetlərin) mədəniyyət səhifələrinə ötəri nəzər saldı, bəlkə proqramında istifadə ediləsi xəbərlər var.

"Yeni gün" qəzeti may ayında Nabranda Xəzər – Qara dəniz uluslararası sinema festivalı haqqında məlumat verirdi. Bəli da, bu festivalları, ədəbiyyat, şeir günlərini, mədəniyyət həftələrini, musiqi konkurslarını, teatr yarışlarını işıqlandırımağı çatdıra bilmirik, biri də burdan çıxdı. Nə qədər tədbir, bayram olar: Qobustanda üç ildən bir Dədə Qorqud törənləri, Muğanda iki ildən bir Koroğlu idman oyunları, Gəncədə Nizami günləri, Naxçıvanda, Əshabi-Kəf din mərkəzində "Qafqazda İslam" mövzusunda beynəlxalq elmi məşvərət, Dərbənddə Narınqala açıq səma teatrında tarixi tamaşalar festivalı, Şamaxıda Sabir günləri, Qazaxda Molla Pənah Vaqif və Səməd Vurğun günləri, Şuşada Vaqif, Natəvan və Cabbar Qaryağdıoğlü şeir, musiqi məclisləri, Qəbələdə Yunis İmrə şöləni, Şəkidə gülüş şənlikləri, Lənkəranda Rəqs yarışı, Mərdəkanda Sergey Yesenini anma günü, Təbrizdə Şəhriyar həftəsi, Ərdəbildə Xətai simpoziumu, Marağada muğam gecələri, Tovuzda, Salyanda, Tufarqanda aşıq deyişmələri, – di gəl çatdır, hamısında iştirak edə bilməsən də, hamısını mütləq işıqlandırmalısan ki, o biri kanallar qabağa düşməsin.

"Oğuz" günlüyü Novruz ərəfəsində türk dünyasından məlumatlar verirdi: Kazanda Rudolf Nuriyev teatrında Qara Qarayevin 3-cü simfoniyası və Skripka konserti əsasında balet tamaşası hazırlanır, Parisdən ən avanqardçı xoreoqraf kimi tanınan Roce Düpon dəvət olunub. Türkmənistanda Nebit dağda türkmən neftinin kəşf olunmasında böyük xidmətləri olan Azərbaycan neftçilərinə həsr edilmiş muzey açılıb. Moskvada Avrasiya mənəvi məkanı və tarixi rus-slavyan – türk-tatar mədəni əlaqələri mövzusunda beynəlxalq elmi konfrans işə başlayıb. İstanbulda Gürcüstan filmləri həftəsi keçirilir. Günlük İstanbulda belə bir Azərbaycan filmləri festivalının keçirilməməsinə görə irad tuturdu. "İşçi çırağı" günlüyündə tələb olunurdu ki, hökumət Kəlbəcərdə Fəhlə dincərliyinin tikintisinin ləngiməsinin səbəblərini izah etsin. Bu barədə fəhlə həmkarlar Birliyinin bəyanatı da dərc olunmuşdu.

“Azad Azərbaycan” günlüyündə sağ və sol partiyalara mənsub olan gənclərin “Boz Qurd” və “Əməkçi” futbol takımlarının sabahkı oyunu haqqında elan verilmişdi.

Məlik düşündü ki, indi hansı tərəf məğlub olsa günahı hakimin üstünə yıxacaq. “Çinar” aylığı (jurnalı) iyul ayında Göygöldə Qafqaz rəssamlarının birgə sərgisinə hazırlıqdan reportaj dərc etmiş, Göygöl yolunda Əhməd Cavad abidə – bulağının şəklini vermışdi. “Türk eli” dərgisinin üz qabığında Nazım Hikmətin İstanbuldakı heykəli əks olunmuşdu, səhifələrində isə Şəkidə keçirilmiş talış mədəniyyət günlərindən rəngli şəkillər və Naxçıvanda açılmış ləzgi-avar xalq sənəti sərgisiylə bağlı illüstrasiyalar verilmişdi.

“Odlar yurdu” aylığında Qaradağ sinema şəhərciyinin dörd ən böyük studiyasında Azərfilm, Turanfilm, Xəzərfilm və Qobustanfilmdə çəkilən ssenarilər haqqında yazı vardı, “Şeytanbazar” həftəliyində isə həmişəki kimi Qaradağ sahil villalalarının sakinləri sinema ulduzları haqqında dedi-qodular dərc olunmuşdu. Məlik ərinməyib “Pəri Cadu” həftəliyinin saytına da nəzər saldı – yenə ulduz falları, tilsimlər, sehrlər, cadular, hər növ esktrasenslərin proqnozları – öncədəndemələri. Məlik XXI əsrdə də bütün bunları oxuyanlar, hətta bunlara inananlar tapılır – deyə düşündü. “Doqquz” mövsüm – yaz toplusu da çapdan çıxmışdı. Dəbdə olan modlar, geyimlər toplusuydu. Adını niyə “Doqquz” qoymuşdular?

Yadına düşdü kü, toplunun hər sayının üstündə GÖZƏLLİK ONDUR – DOQQUZU DONDUR – sözləri yazılır.

“Azərbaycan ocağı” aylığı məlumat verirdi ki, Xankəndində Şirvanzadə erməni teatrında Mirzə Cəlil Məmmədquluzadənin Kamança pyesi tamaşaya hazırlanır. Məlik düşündü ki, nə yaxşı məhz – barışa, anlaşmaya çağıran bu yüksək humanist qayəli əsəri seçiblər. Doğrudur, keçən ağır hadisələr hələ yaddaşlardan silinməyib və bəlkə uzun zaman unudulmayacaq, amma Ermənistana, doğma dədə-baba yurdlarına qayıdan azərilərin və Dağlıq Qarabağdakı ermənilərin eyni ölçüdə hüquqları təmin olunandan sonra münaqişələrə ehtiyac qalmamışdı. Eyni hüquqlara Gürcüstandakı azərilər də malik olandan bəri, Gürcüstanın da ərazi bütövlüyü qarşılıqlı anlaşma və bütün milli azlıqların mədəni-iqtisadi tələblərinin ödənməsi şərtilə bərpa olunandan bəri Cənubi Qafqazda da Şimali Qafqaz kimi tam bir sabitlik əldə olunmuşdu. Az bir zaman ərzində qarşılıqlı əməkdaşlıq nəticəsində quru-

culuq işləri bəhrəsini vermiş, işsizlik tamamilə aradan götürülmüş, ticarətin, sənayenin başqa sahələriylə yanaşı turizm industriyası da sürətlə inkişaf etmişdi. İndi doğrudan da, Qafqaz turist Məkkəsinə çevrilmişdi. Çoxlu turist şirkətlərindən ən böyük imkanlara ikisi malik idi – bir sıra ölkələrin şərikli "İpək yolu" şirkəti və "Qafqaz-tur". "İpək yolu" şirkəti "Baykaldan-Balkana" – adlı səyahət marşrutu təşkil edirdi. Marşrutun bir ucu Baykal göstərilsə də bəzi hallarda bu marşrut Yakut Saxa elindən yaxud Monqolustanda Orxan abidələrindən başlanır və Quzey Kiprıs Türk Cümhuriyyətində bitirdi. Əlbəttə uçaq marşrutları da vardı, amma çox vaxt turistlər qatarla ya avtobuslarla səyahət etməyə üstünlük verirdi. "Üç ox" ekspres qatarı sərnişinləri Doğu Türküstandan, Altaydan, Qazaxıstandan, Orta Asiyadan Xəzər sahillərinə çatdırır, burada "Azərbaycan" və "Türkmənistan" azman bərələri qatarları, avtobusları tərkinə alır və Bakının Türkan limanına çatdırırdı. Buradan isə ya Bakı-Tiflis-Batum-Sırp atabanıyla Türkiyəyə və oradan Avropaya, ya Bakı-Xudafərin-Sədərək-İqdır yoluyla yenə də Türkiyəyə, oradan Avropaya səyahət davam edirdi. "Qafqaz-tur" şirkəti isə Qara dəniz sahillərindən Xəzər sahillərinə, Neft daşlarından Bakurianiyə, Elbrusdan, Tiberdadan, Dambaydan Göyçə gölünə, Dilicana uzanan yollarla turistlərə bir aylıq rahat və xoş səyahət təklif edirdi.

Turistlərə yadigar-suvenirlər kimi Qubaçı ustalarının düzəltdiyi metal döymələr, Quba xalçaları, Lahıc misgərlərinin məmulatı, Şəki ipəkləri, Basqal kəlağayıları, Gürcustan çaxırları, erməni konyakları hədiyyə edilirdi.

Məlik "Bildiriş" bülleteninə göz atdı. Mirzə Fətəli Axundzadə Dövlət dram teatrında Hüseyn Cavid pyesləri həftəsi uğurla davam edirdi. Üzeyir Hacıbəyli Dövlət Opera və balet teatrı Milanın La skala teatrının solistlərinin qastrolları haqqında anons vermişdi. Hüseynqulu Sarablı Muğam teatrında Yeddi muğam silsiləsində həftənin hər günü bir dəstgah səslənəcəkdi – Çahargah, Segah, Rast, Şur, Bayatı Şiraz, Humayun, Şüştər... Hüseyn Ərəbli səhnəsində, gürcü teatrı Şekspirin "Koriolan" pyesini göstərəcəkdi, Sinema-klubda Çaplin-Fellini filmləri retrospektivi başlanırdı.

Qara Qarayev musiqi mərkəzində, Niyazi konsert salonunda, Fikrət Əmirov oda musiqisi evində, Tofiq Quliyev estrada teatrında, Rəşid Behbudov Mahnı teatrında, Vaqif Mustafazadə caz-klubunda

bayram konsertləri, İçəri şəhər teatrlarında Orta oyunu, Qaravəlli, Kilimarası, Zorxana, Şəbih tamaşaları və etnoqrafik bayram oyunları, Şah İsmayıl Xətai tarix muzeyində, Nizami ədəbiyyat muzeyində, Sultan Məhəmməd Milli rəsm qalereyasında, Hacı Zeynalabdin Tağıyev dünya mədəniyyəti muzeyində, Səttar Bəhlulzadə çağdaş sənət muzeyində, İlkəl sənət muzeyində, Ziya Bünyadov Ordu muzeyində, Həsən bəy Zərdabi və Mikayıl Müşfiq kitabxanalarında bayram sərgiləri açılırdı.

Məlik elektron yaddaş kitabçasında qeydlər etdi, əlbəttə hamısına getmək, hamısını seyr etmək, hamısını dinləmək imkanı yox idi – odur ki, çeşidli teatrları, muzeyləri əməkdaşları arasında bölüşdürdü – hərəsinə birini göndərəcəkdi, özü isə mütləq vaxt tapıb Qorqud dağının ətəyində açıq səma altında yerləşən İlkəl sənət muzeyinə getməlidir. Deyirlər ki, oranın ekspozisiyasına Lerikdən yeni tapılmış daş at, qoç heykəlləri əlavə edilib – nə isə ayrı aləmdir. Mütləq gedib baxmalıdır. Vaxt eləyə bilir ki... Heç İçərişəhərdəki Xalq sənəti muzeyinin yeni açılmış şöbələrində – zərgərlik, misgərlik, şəbəkə, dulusçuluq, təkulduz, xəttatlıq muzeylərinə də baş çəkə bilməyib. Dünən Puşkin mədəniyyət evində Dostoyevskinin "Karamazov qardaşları" romanının ikinci nəşrinin təqdimatı olub. Nə yazıq ki, vaxt tapıb bu romanın yeni tərcüməsini oxuya bilməyib. Heyf ki, keçən həftə Akademik Landau Yəhudi mərkəzində "Abram Qubermanın Azərbaycanda dini dözümlülük dəyərləri" məruzəsini də dinləyə bilmədi. Macal tapa bilir ki...

Behzad İran mədəniyyət evində Hafiz Şirazi gecəsinə dəvət etmişdilər, ora da gedə bilməmişdi. İran artistlərinin ifasında fars dilində Hafizi dinləməyin öz ləzzəti var.

Video-telefonun zəngi çalındı. Məlik dəstəyi qaldırdı və kiçik ekranda Aypərinin bir qədər narazı çöhrəsini gördü. Salam-kəlam, hal-əhval və bayram təbriklərindən sonra Məlik: Gözümə bir təhər dəyirsən – deyə xəbər aldı – qanın niyə qaradır?

Aypəri: Qanım qara olacaq da – dedi. – Bakıdan bəzi dekorları yubadıblar. Tamaşanı Novruz bayramına çatdıra bilmədik.

Aypəri bir neçə həftəydi ki, Təbrizdəydi. Əbdülqədir Marağayi teatrında "Koroğlu" operası yeni quruluşda hazırlanırdı, rəssam kimi Aypəri dəvət olunmuşdu. İlk tamaşanı bayramda vermək istəyirdilər və budur bax, Çənlibel səhnəsinin dekorları gəlib vaxtında çatmamışdı.

Məlik Aypərini fikrindən yayındırmaq üçün, söhbəti dəyişdi: – Nə oldu, Nigar tapdınız? – deyə soruşdu, tapdıqlarını bilirdi.

Aypəri: – Bəs deməmişdim sənə, axır ki, tapdıq – dedi – Səfiəddin Urməvi Konservatoriyasının 3-cü kurs tələbəsidir. Səhnə təcrübəsi azdır, amma səsi pis deyil – yenə əvvəlki söhbətə qayıtdı:

– Gör sən Allah, hər şey hazır idi, gör işimizi necə pozdular. Axı demişdim onlara “Qırat” marşrut avtobuslarıyla göndərin dekorları, yox, pula qənaət ediblər, “Dürat”la göndəriblər, odur ki, gecikir – hec cür sakit ola bilmirdi.

Məlik: – Əşi, kefini pozma – dedi – Şər deməsən xeyir gəlməz. Bir yandan elə yaxşı oldu, bir həftə sonra ilk tamaşaya mən də gələrəm Təbrizə.

– Hökmən “Qırat”la gəl.

– Mənim o qədər vaxtım hanı? Səhər uçağıyla gəlib gecə uçağıyla qayıdaram. Beyrək zəng eləmişdi, Burladan da ismarış var. Urumçuya uçur.

Aypəri: – Bilirəm – dedi – Mənə də ismarış göndərib. Beyrək də zəng eləmişdi. Deyir Şuşada axır çərşənbə qiyamət olub. Burda da çox təmtəraqlı keçdi. Gecələr Eynal-Zeynal dağında qalanmış tonqallar elə gözəl görünür ki... Bir-iki eskiz də çəkdim. Sabah da Ərkin təpəsində məşəl yandırılacaq.

Məlik: – Bilirəm – dedi – Bildir ordan veriliş hazırlamışdım, yadında deyil? Aypəri: – Əlbəttə yadımdadır – dedi – Yaxşı, di salamat qal. Bir də bayramını təbrik edir, öpürəm – indi Aypərinin kiçik ekrandakı çöhrəsində xoş bir təbəssüm vardı.

Məlik liftlə birinci mərtəbəyə endi, həyətə çıxdı, paltosunun cibindən pultu çıxartdı və qarajının qapısına tərəf tutub düyməni basdı. Qarajın qapıları açıldı. Pultun ikinci düyməsini basıb qarajdakı avtosunun qapılarını açdı. Məliyin avtomobili “Ceyran” idi. Beyrəklə Aypəri nə qədər israr eləsələr də “Maral” almırdı. Beyrək özü neçə ildi ki, “Maral” sürürdü və atasına da bu avtomobilin məziyyətlərini təriflə-məkldən yorulmurdu. Amma daha ucuz olsa da, qıvraq, çevik “Ceyran” markası Məliyin işinə daha çox yarayırdı. “Maral” avtomobilini Ford firmasının yardımıyla tikilmiş Gəncə avtomobil fabriki, “Ceyran”ı Fiat firmasının iştirakıyla qurulmuş Sumqayıt fabriki istehsal edirdi.

Məlik avtomobilini işə salıb qarajdan çıxdı, pultla qaraj qapılarını bağladı. Həyətdən sola burulub Şeyx Məhəmməd Xiyabani prospektinə tərəf sürdü. Məliyin mənzili Bakının Bayat məhəlləsində idi. Hansısa kitabda oxumuşdu ki, bir vaxtlar bura 8-ci kilometr adlanır-

mış. Əcəb qəribə addır – niyə 8-ci kilolmetr, hardan 8-ci kilometr, yəni hardan hesablamağa başlasan bura gəlib səkkizinci kilometr çıxır. Ümumiyyətlə, şəhərin müxtəlif mikrorayonlarına (o vaxt bu əcaib sözü işlədirmişlər) 1-ci, 2-ci, nə bilim neçənci mikrorayon deyərlərmiş. Buralarda tikilən evlərin görünüşünü də Allah göstərməsin (Məlik köhnə sinema arxivində, xronikalarda görmüşdü onları). Məlik şəhərin indiki məhəllələrinin adlarını bir-bir yadına saldı, Əfşar, Qacar, Qaşqay, Şahsevən, Kəngər, Bayandır, Borçalı, Zəngəzur, İqdır. Amma nə deyirsən de Məliyin yaşadığı Bayat məhəlləsi onun gözündə bütün başqalarından səfalı idi. Elə onun yaşadığı otuz mərtəbəli binanın arxasından başlanan Qarayazı parkı, parkın içindəki Uçan su şəlaləsi nəyə desən dəyər.

Məlik cib telefonunu çıxarıb Ankaraya, sonra Nyu-Yorka, Moskvaya və Tehrana zəng etdi, çoxdan tanıdığı və daima internetlə əlaqə saxladığı tele jurnalist dostlarıyla danışdı. Çox qabaqcadan onların razılığını almışdı ki, SNN, TRT-də, Moskvanın "Avrasiya" və Tehranın "İrani-növ" kanalları da Azərbaycanda keçirilən Novruz bayramının görüntülərini mütləq başqa TV-lərdən deyil, "Çağdaş"dan alsın. Bu həm "Çağdaş"a yaxşı reklam idi, həm də xeyli gəlir gətirəcəkdi. O biri kanalların rəhbərlərinin bağrı çatlayacaq – Məlik gülümsündü – ayıb olsun – deyə belə xudbin fikirlərə görə özünü məzəmmət elədi və – amma yəqin onlar da bir şey fikirləşiblər – deyə sakitləşdi. Axı o biri TV-lərdə işləyənlərin çoxusu da yüksək peşəkardılar və onun yaxın dostları idi.

Xiyabani prospektindən Çanaqqala meydanına çıxdı, bu meydanda ucalan Kamal Atatürkün möhtəşəm heykəlinin yanından burulub Qaraqoyunlular bulvarına girdi.

Qaraqoyunlular bulvarı Bakının yeddi ən məşhur bulvarından biriydi. Qara şəhər zavodları şəhərdən kənara Üç təpə tərəflərə köçürüləndən sonra Xəzər bulvarı Bayıldan Zığa qədər uzanırdı və Ginnesin kitabına düşmüşdü – bu sahil şəridi dünyada ən uzun bulvar idi. Cəfər Cabbarlı meydanından Nərimanov prospektinə qədər uzanan Füzuli bulvarı isə şəhərin ən şık, dəbdəbəli bulvarı sayılırdı, Ən bahalı mənzillər, ən şıq otellər burada yerləşirdi. Haçansa Respublika sarayı adlanan Füzuli sarayı da burda idi, Dram teatrı da, Opera teatrının yeni binası da. Sağ və sol tərəfdən şəhərin ən iri sinemaları "Aynur", "Dalğa", Cəfər Cabbarlı şəhər teatrı, saysız-hesabsız sərgi salonları nəzə-

rə çarpırdı. Əlibəy Hüseynzadə və Əhməd bəy Ağaoğlu küçələrinin Füzuli bulvarında kəsişdiyi yerdə bu iki dost mütəfəkkirin qoşa heykəli qoyulmuşdu.

Füzuli bulvarı da Xəzər bulvarı boyu uzanan Xəzər prospekti kimi gecələr o qədər gur çıl çıraqlı idi ki, yəqin bu işıq seli göyün yeddi qatından, kosmik gəmilərdən də görülüb seçilərdi.

Qarabağ bulvarı əksinə, daha sakit və kədərli idi. Bu bulvar boyu yerləşmiş anıtlar orijinallığı ilə seçilirdi. Qarabağ döyüşlərində həlak olmuş naməlum şəhidin məzarı üstündə yanan əbədi od – qədim ocaqlar şəklində düzəldilmişdi. Xocalı müsibətinin anıtı – yerlə-yeksan olmuş xarabalıq, yanıb qaralmış daş qalaqları, kösövlərdən ibarət idi və bu daşların, kösövlərin arasından torpaqdan daima tüstü süzülüb qalxırdı. Hər saatdan bir səslənən musiqi, Fikrət Əmirovun Şur simfonik muğamından bir parça anıtın təsir gücünü bir az da artırırdı. Dikuçar faciəsinin anıtı da qeyri-adi idi – parçalanıb yanmış metallik dikuçarın yarıqları arasında həlak olanların sifətləri həkk olunmuşdu. Və nəhayət bütün bu acı xatirələrin təsəllisi kimi Qarabağ dəmir yolu vağzalının qarşısında möhtəşəm Zəfər Tağı ucalırdı.

Son illər Bakıda qoyulmuş müxtəlif abidələr və anıt yerləri arasında Məlik ən çox Qarabağ bulvarında yerləşənləri bəyənirdi, bir də Millət meydanında ucalan Dirəniş abidəsini. Biləcəri tərəfdən 20 Yanvar prospektiylə şəhərin mərkəzinə tərəf irəliləyərkən Millət meydanında, haçansa 11 Qızıl Ordu abidəsinin yerində nəhəng bir tankın arxa tərəfini görürdün. Tank sanki at kimi şahə qalxmışdı. Qarşı tərəfdən baxanda isə yalın əlləriylə bu tanka qarşı çıxmış insanların gücüylə tankın qabaq tərəfinin havaya qaldırıldığını görürdün. Millət meydanında ucaldılmış Dirəniş abidəsi də, 20 Yanvar prospekti boyu insanların həlak olduqları nöqtələrdə çəkilmiş qərənfil şəkilləri də o uzaq illərin hələ də yaraları qövr edən müsibətini yada salırdı.

Azərbaycan sinemasından Kukla teatrına qədər açılmış Yeddi gözəl bulvarı isə boy sarıdan ən qısa, amma turistləri ən çox cəlb edən bulvarlardan idi. Buradakı bahalı dükanlar, "Yeddi gözəl" mod teatrı, sərgi salonları və restoranlar sanki bir– biriylə bəhsə girərək daha yaraşıqlı, daha cazibədar, daha cəlbedici olmağa çalışırdı. Amma bu bulvarda turistləri ən çox cəlb edən "Yeddi gözəl" fəvvarələri idi. Yeddi iqlimdən yeddi gözəlin rəngbərəng fiqurları axşamlar işıq effektləri vasitəsilə sanki Qara Qarayev musiqisinin müşayətilə rəqs edirdilər.

Turistlər bir də Bakıya qayıtmaq üçün fəvvarələrin hovuzuna qəpik-quruş atırdı. Qonaqları cəlb edən ikinci yer Cəfər Cabbarlı meydanındakı qüllə idi. Keçmiş Sabunçu vağzalı dəmiryol durağı kimi isttifadəsiz qalandan sonra indi bu binada “Arşın mal alan” Mədəniyyət və Ticarət Mərkəzi açılmışdı. Binanın qüllədəki pəncərələrindən hər gün gündüz saat on iki tamamda Üzeyir musiqisinin sədaları altında “Arşın mal alan” operettasının rəngli saxsılardan düzəldilmiş personajları çıxıb meydana toplaşanlara baş əyirdilər.

Araz bulvarı Vahid Azərbaycan meydanından başlayırdı. Səlcuq stadionu (əsaslı dəyişdirilmiş və genişləndirilmiş keçmiş respublika stadionu) qarşısında üç böyük Səlcuq hökmdarının – Sultan Toğrulun, Alp Arslanın və Məlik şahın at belində heykəlləri ucalırdı. Stadion girişinin sağ tərəfində Tofiq Bəhramov adına İdman muzeyində Azərbaycan idmançılarının qırxdan artıq Olimpiya və dünya çempionu medalları, saysız-hesabsız prizlər nümayiş etdirilirdi. Meydanın qarşı tərəfində bir yanda “Savalan” o biri tərəfdə “Şahdağ” otellərinin qarşısında Azərbaycan tarixinin on iki məşhur dövlət xadiminin heykəlləri qoyulmuşdu – Aranşah Cavanşir, Qızıl Arslan, Şirvanşah İbrahim, Cahanşah Ağqoyunlu, qaraqoyunlu Uzun Həsən, Şah İsmayıl Səfəvi bir tərəfdə – Nadir şah Əfşar, Qarabağlı Pənah xan, İbrahim xan Cavanşir, şəkili Hacı Çələbi xan, qubalı Fətəli xan, gəncəli Cavad xan o biri tərəfdə. İki tərəfin arasından isə Araz bulvarı başlanırdı. Araz bulvarında Güney və Quzey Azərbaycanın istiqlal mübarizəsinin altı Obeliski – Tikili daşı ucaldılmışdı. 1905-1906 Səttarxan hərəkatına həsr olunmuş Məşrutə obeliski, 28 Mayıs – Cümhuriyyət obeliski, Xiyabani hərəkatının Azadıstan obeliski, 1945-ci il 21 Azər obeliski, 1991-ci il Qüzey Azərbaycanın müstəqillik obeliski və Xudafərin-Qovuşma obeliski.

Yeddinci məşhur bulvar Aşıqlar bulvarı idi ki. Məlik avtosunda həmin bulvarın girəcəyinə yaxınlaşırdı. Hər səhər işə gedəndə avtosunu burada əyləyir, bulvarda yarım saat piyada gəzərdi. Haçansa Ermənikənd bulvarı adlanan bu bulvarın girəcəyində Aşıq Ələsgərə həsr olunmuş abidə qoyulmuşdu. Daha doğrusu Ələsgərin: *Çərşənbə günündə çeşmə başında gözüm bir alagöz xanıma düşdü* misralarının motiviylə düzəldilmişdi bu abidə. Bir çeşmə qurulmuşdu, çeşmə başında Aşıq Ələsgərin və onun çərşənbə günü rast gəldiyi ala göz xanımın surətləri yaradılmış, o məşhur qoşmanın bəndləri həkk olun-

muşdu. Məlik Aşıqlar bulvarı boyu irəlilədikcə bulaqların üstündə uşaqlıqdan əzbər bildiyi misraları həvəslə bir də oxuyurdu. *Qurbanı der:könlüm bundan sayrıdı, Nə etmişəm, yarım məndən ayrıdı, Ayrılıq-mı çəkmiş boynu əyridir, Heç yerdə görmədim düz bənövşəni.*

*Qaracaoğlan, çox ağladım, gülmədim, Aradım, dərdimə dərman bulmadım, Bunca gündür bir minnətə gəlmədim, Kərəm eylə məhzun göndərmə məni.*

*Dağların qarından bəyazdır sinən, Üstünə yıxılıb öləsim gəlir.*

*Duman, gəl get bu dağlardan, Dağlar başı bar eyləsin, Nə gözlərim səni görsün, nə könlüm qubar eyləsin.*

*Aşıq Qarabağlıdı, Xalın qara bağlıdı, Nə gedən var, nə gələn Yol-lar qara bağlıdı.*

*Belimizdə qılıncımız kirmani, Daşı dələr mizrağının dəmrəni. Haq-qımızda dövlət vermiş fərmanı, Fərman padişahın, dağlar bizimdir.*

*Məleykə boyludu, şirin ləhcəli, Əzəldən tamaşa olan bu dünya. Qoca cadugərdi, aldadar səni, Cavanlıq donunda qalan bu dünya.*

*Ölüm haqdı, çıxmaq olmaz əmirdən İpək tora həlqə salma dəmir-dən, Aydı, gündü gəlib keçər ömürdən, Tələsirik, görən yaza nə qaldı.*

*Bir gün ölsəm hamı deyər yazıqdır, Canı yanan ya bir olar, ya iki.*

*Yarın bağçasında güllər açılmış, Dərsəm öldürərlər, dərməsəm ölləm...*

*Gün ikindi, axşam olur, Gör ki, başa nələr gəlir, Veysəl gedər, adı qalar, Dostlar məni xatırlasın.*

Hər aşığın öz çeşməsi vardı və hərəsinin üstündə onun sözləri həkk olunmuşdu: Aşıq Qurbani, Abbas Tufarqanlı, Pir Sultan Abdal, Sarı Aşıq, Qaracaoğlan, Dadaloğlu, Əmrah, Aşıq Alı, Aşıq Bəsti, Mol-la Cuma, Aşıq Veysəl...

Məlik düşündü ki, nə yaxşı bu dərd, niskil, qəm – aşıq qoşmaların-da, gəraylılarda, bayatılarda, Füzuli qəzəllərində, neçə-neçə əski şai-rin yanıqlı şeirlərində, Segahın, Şüştərin, Humayunun hüznündə əbədi həkk olunub qalıb. Çünki öz ömrün də, xalqının günü-güzəranı da nə qədər qayğısız keçir-keçsin, insanın bəzən qüssəyə, kədərə, həsrətə də ehtiyacı olur. Bəlkə indi, bizim bütün ağrı-acılarımız ötənlərdə qal-dığından qəlbləri sarsıdan ədəbiyyat da yarana bilmir. Bir-birindən nəfis kitab nəşrləri, bir-birindən parlaq aylıqlar, həftəliklər... Amma insanın könlünü titrədən əsərə nə yazıq ki, rast gəlmirsən. Bəlkə bu da firavanlığımızın bədəli, əvəzidir. Kim bilir?

Adəti üzrə hər bulaqdan bir qurtum içib avtomobilinə qayıtdı, Aşıqlar bulvarından Firudin İbrahimi küçəsinə buruldu, Mirzə Cəlil Məmmədquluzadə heykəlinin, Qaçaq Nəbi İdman sarayının, Şeyx Şamil bağının yanından ötüb Gəncə meydanına çıxdı. Burada 20-ci ilin Gəncə üsyanına həsr olunmuş abidə ucalırdı.

Səməd Vurğun bağının düz qənşərində – Bülbül bağında böyük sənətkarın heykəli ucaldılmışdı və üzbəüz duran bu iki heykəl – şairin və müğənninin heykəlləri – sanki bir-birini salamlayırdı.

Qarşısında Əliağa Şıxlının və Səməd bəy Mehmandarlının qoşa heykəlləri ucaldılmış Hərb Akademiyasının yanından Füzuli bulvarına çıxdı.

Füzuli bulvarında Opera teatrının yeni binasına nəzər saldı. Operanın fasadında yeddi iri pəncərədə yeddi rəngbərəng vitraj çəkilmişdi. "Leyli və Məcnun", "Şah İsmayıl", "Aşıq Qərib", "Koroğlu" operalarına, "Qız qalası", "Yeddi gözəl", "Min bir gecə" baletlərinə həsr olunmuş əlvan vitrajlar gecələr daha cazibədar görünürdü. Memar və rəssam bu vitrajları, teatrın qarşısındakı iri hovuzu elə yerləşdirmişdilər ki, rəngli – şüşə şəkillər qarşıdakı hovuzda da əks olunurdu.

Məlik Əbülfəz Elçibəy prospektinə çıxdı, Durnalar parkının yanından keçdi. Durnalar parkında Vaqif və Vidadinin birgə heykəlləri sanki uzaqlara uçub gedən durna qatarının seyrinə dalmışdı.

Səfəvilər prospektinə çıxdı, Qızılbaşlar meydanından keçdi, Şəhidlər dağı istiqamətində irəlilədi.

Dağın 20 Yanvar, Qarabağ şəhidləri və 1918-ci il mart qurbanları cərgələrindən aşağıda yerləşən Şəhidlər muzeyinin eksponatları, şəkilləri, fotoları, sənədləri XX əsrdə xalqın başına gətirələn bütün müsibətləri əks etdirirdi. 1905, 1918-ci il mart, 1920-ci il aprel, 1921 Xiyabani hərəkatının tar-mar edilməsi, 1937, 1946-cı il 21 Azər, 1990-cı il – Qara yanvar, Baqanis Ayrım, Qukark, Xocalı faciələri...

Ana Yasa küçəsindən bu muzeyə qalxan pilləkənlərin iki tərəfində, açıq havada – terrorçu cinayətlərinin nəticələri – musiqiçi Rafiq Babayev həlak olduğu metro vaqonunun, Sumqayıt yolunda alimlərin tank tırtılları altında əzilmiş "Jiquli"sinin, Qanlı yanvarda güllləbaran edilmiş Təcili yardım maşınının, Yevlax yolunda partladılmış sərnişin avtobusunun qalıqları nümayiş etdirilirdi.

Məlik Şəhidlər dağının yuxarı girişindən yoxuşla iş yerinə çatdı, avtosunun açarlarını qaraj xidmətçisinə tapşırdı, avtomobili içəri salacaqdı.

Hələ xeyli vaxtı vardı. Yenicə ucaldılmış və bütün Yaxın Şərqdə ən uca qüllə sayılan TV qülləsinin aşırı sürətli liftiylə yuxarı qalxıb "Bulud" restoranına daxil oldu.

"Bulud" restoranı qüllənin ən üst qatında yerləşirdi və aramla hərlənirdi – yarım saat ərzində Bakının və bütün ətrafların mənzərəsini seyr edə bilərdin. "Bulud" restoranından da yuxarı "Buludüstü" kafesi vardı, amma o açıq havada idi, hələ bu ılıq mart günündə orada oturmaq olmazdı.

Restoran öz oxu ətrafında dövr etdikcə Məlik səhər yeməyini yeyir, ətirli Astara çayı içir və hər gün seyr etdiyi doğma şəhərinə baxdıqca baxırdı.

Əvvəlcə müştəri gözüylə Azadlıq meydanına baxdı. Bir neçə telekamera bu gün orda qurulmuşdu.

Keçmişlərdə Hökümət evi adlanan bina indi Odlar sarayı adlanırdı. Sarayın dörd qülləsinin üstündə dörd tərəfdən on altı daimi məşəl yanırdı – bu məşəllər Qüzey və Güney Azərbaycanın on altı tarixi ərazisini, vaxtilə xanlıqlar adlanan əraziləri təmsil edirdi – sağ cinahda Bakı, Gəncə, Qarabağ, Şirvan, Şəki, Naxçıvan, Lənkəran və Quba, sol cinahda Təbriz, Ərdəbil, Zəncan, Marağa, Urmiya, Qaradağ, Maku və Xoy.

Şəhidlər dağının üstündə də (deyilənə görə bir vaxtlar burada Kirov adlı bir inqilabçının abidəsi varmış) üç məşəl – Bakının rəmzi – şölələnirdi.

"Bulud" restoranı aramla hərləndikcə Məlik şəhərin beş girişində də yanan üçlü məşəlləri görə bilirdi. Balaxanı və Suraxanı şoselərinin kəsişdiyi yerdə, Xırdalan şossesində – Sulu təpədə, Lənkəran şosesində – Qaradağda, Sahil yolunda – Türkanda, bir də dənizdə, Böyük Zirə və Kiçik Zirə adalarının arasındakı haçansa Makarov bankası adlanan qaldırımda. Xəzərin səthi yenidən bir qədər aşağı düşəndən sonra bu qaldırım da, Səbayilin qalıqları da üzə çıxmışdı və Üççırağın birini də bu qaldırımda – şəhərin dəniz qapısında qurmuşdular.

"Bulud" hərlənib elə bir baxış nöqtəsinə çatmışdı ki, indi Nərgiz adası ovuc içi kimi görünürdü. Məlik xatırladı ki, bir vaxt bu adanın adı haqqında qızğın mübahisələr olmuşdu. Nargin adını dəyişəndə adanın keçmiş adına – Böyük Zirəyə etiraz olundu, Xəzərdə bir neçə Zirə adlı ada var, çaş-baş düşəcək – dedilər. Sonra kimsə xatırladı ki, indi çoxdan unudulmuş Anar adlı bir yazıçının hekayəsində bu ada Nərgiz adlanır. (Bu Anar deyilənə görə o vaxt mövcud olan Yazıçılar Birliyinin

sədri olub, sonra ömrünün axırınadək Suraxanı – Əzizbəyov avtobusunda konduktor işləyib).

Nə isə bu ad qəbul olundu, həm köhnə Nargin adına yaxın idi, həm də burda hər il Çiçək bayramları keçirilirdiyinə görə. İndi Nərgiz adası Xəzər hövzəsinin ən məşhur dincərlik və əyləncə yeri idi. Buna da vaxtilə etirazlar olmuşdu. Bu adanın faciəvi keçmişi var, sovet dönəmində nə qədər günahsız insanı burada güllələyib dənizə atıblar – deyirdilər. Və məhz elə buna görə də bu adada repressiya qurbanlarına abidə ucaldılıb. Bu müddəaya qarşı da dəlil gətirirdilər ki, həmin insanlar elə bu arzularına görə – milləti azad, xoşbəxt, şad görmək istədiklərinə görə qurban gediblər. Bu günün insanları uşaqlar və böyüklər – burada xoş istirahət edəcək, əylənəcək, sevinəcəklərsə, elə bu da qurban getmişlərin ruhunu şad edəcək. Hər nəysə təklif qəbul olundu və indi buradakı uşaqlar və böyüklərçün əyləncə yerlərinə gəmilərlə, katerlərlə, xüsusiylə yaz və yay aylarının bazar günlərində minlərlə insan gəlirdi. Adanın ən uca nöqtəsində Şeytan-çarxı – Karusel o qədər böyük idi ki, hətta Xəzər bulvarından, Bayıldan, Zığdan və əlbəttə bax burdan – "Bulud" restoranından aydınca görünürdü. Şeytan çarxı göy qurşağının yeddi rəngində idi və şəhərdən baxanda yarısı adanın o tərəfində qaldığına görə bu tərəfdən doğrudan da yeddi rəngli göy əyrisini xatırladırdı. Çarxda əylənənlər hündürə qalxdıqca bütün ada, dəniz, uzaq şəhər aydın görünürdü. Bu nöqtədən adanın düz yerində əlvan gül-çiçəkdən düzəldilmiş Azərbaycan xəritəsi daha qəşəng görünürdü.

"Min bir gecə", "Ömər Xəyyam", "Bəhlul Danəndə" əyləncə mərkəzləri səhərə qədər maraqlı proqramlar, konsertlər təqdim edirdi. "Vətəgə" restoranında yalnız Xəzərin və Kürün balıqları deyil, dünyanın hər yerindən gətirilən okean, dəniz, göl və dağ çaylarının nemətlərini dadmaq olardı.

Matəm günlərində təbii ki, adada bütün əyləncə yerləri qapanırdı. Bura gələn müxtəlif heyətlər Repressiya qurbanları abidəsi önünə əklillər qoyur, anma duruşunda durur və adanın dörd tərəfindən dənizə çiçəklər səpirdilər.

Adaya şəhərdən adi günlərdə iki saatdan bir, bazar günləri hər saat yola düşən dəniz tramvaylarıyla getmək olardı. "Qızıl balıq", "Ağ balıq", "Ala balıq", "Şahmaya", "Sazan" adlı dəniz tramvayları, taksikaterlər, matorlu, yelkənli və avarlı kirayə qayıqlar şəhərdən adaya,

adadan şəhərə şütüyürdü. Əlbəttə şəxsi yaxtaları – təknələri olanlar da istədikləri vaxt adaya gələ bilərdilər, amma küləkli havalarda buna icazə verilmirdi. Şəxsi təknələr Bayıl burnunda yaxt-klubun körpülərində lövbər salmışdı. Bir-birindən fərqli, əlvan və göyçək təknələr gül bağçasını xatırladırdı. Amma bu səmtin ən yaraşıqlı nəhəng gəmisi – üç ağ yelkənli qədim üslubda düzəldilmiş gəmi-otel idi. Adı da elə "Yelkən" idi. Qapalı yerlərində və göyərtisində yay və qış restoranları işləyirdi.

"Bulud" bir qədər də hərlənmiş və indi Bayıl yüksəkliyi aydın görünürdü. Bu yüksəkliyin ən uca yerində möhtəşəm Çənlibel qala-oteli yerləşirdi. Qalanın damında şəhərin və dənizin hər yerindən görünən bir heykəl ucalırdı – Qır atın belində Koroğlu heykəli.

Yalnız Nərgiz adasına deyil, Xəzərin başqa adalarına (onların çoxunda dincərliklər, çimərliklər və dəniz havası müalicəsinə möhtac olanlar üçün xəstələr evləri qurulmuşdu) şəhərin müxtəlif yerlərindən getmək olardı. Hətta bəzi nisbətən iri vapurlar Bakıdan çıxıb Salyana qədər gəlir, oradan Kür boyu Yevlaxadək ya da Araz boyu üzürdülər. Bu da türistlərin sevdikləri marşrutlardan idi. Xəzərdə üzən iri Azərbaycan gəmiləri "Dədə Qorqud", "Nizami" Həştərxana, Ənzəliyə, Mahaçqalaya, Qazaxıstan və Türkmənistana gedib gəlirdilər. Adi sərnişin daşıyan yaxud turizm kruizlərinə çıxan gəmilər Bakı dəniz limanından gedib-gəlirdisə, dəniz tramvayları daha çox ya Bayıl burnundan, ya da bulvardakı Xəzər muzey – akvariumun körpüsündən yola çıxırdı. İstifadədən çıxmış böyük şelf-qazma qurğularından biri bura gətirilib sahilə bənd edilmişdi və qurğunun müxtəlif mərtəbələrində Xəzər muzeyinin tarix, gəmiçilik, balıqçılıq, neft bölmələri, suyun altında – divarları sukeçməz qalın şüşəli salonlarda akvarium yerləşdirilmişdi.

"Bulud" hərlənib baxış nöqtəsini keçmiş İliç buxtası adlanan əraziyə tuşlamışdı. Neftçilərin çoxdan tərk etdikləri bu iri ərazini indi amerikalıların qurduqları "Disney nağıl dünyası" tutmuşdu. Disney şirkətiylə uzun danışıqlar və müəyyən maddi güzəştlərin hesabına bu yerin adı məhz Azərbaycan türkcəsində qəbul edildi: Disneyland ya Disneyuord yox – Disney nağıl dünyası. Məşhur Disney personajlarıyla bir sırada Cırtdanın, Divlərin, Pərilərin, Küpəgirən qarıların, sehrbaz dərvişlərin, Güləndə ağzından gül tökülən Gül Qəh-qəh xanımın, Ovçu Pirimin, Armudan bəyin, Qaraqaşın, Göyçək Fatmanın da məzəli fiqurları elektron idarəetmələr vasitəsilə yüz cür oyun çıxarıb uşaqların sonsuz sevincinə bais olurdu.

Burdan Qorqud dağına kanat yolu çəkilmişdi. Qorqud dağının şəhərə baxan yamacında Qızıl çadırda restoran, alaçıq, dəyə, muxuru şəklində içi komfortlu otaqlarda isə Qorqud otelinin ayrı-ayrı nömrələri yerləşirdi. Dağın Şıx çimərliyinə baxan səmtində Ağ Çadırda dastan teatrı və yenə də alaçıq – odalar vardı. O tərəfdəki böyük Təpəgöz mağarası da çocuqların sevimli əyləncə yerlərindən idi. Burada elektron cihazlarla idarə olunan nəhəng Təpəgöz fiqurunu görəndə uşaqlar azacıq vahimələnir, sonra Təpəgözün çıxardığı oyunlardan həzz alıb doyunca gülüşürdülər.

"Bulud" hərəkət etdikcə Qorqud dağının zirvəsi daha aydın görünürdü. Bu zirvədə ucalan nəhəng Dədə Qorqud abidələr kompleksinin siluetləri aydın seçilirdi. Dədə Qorqud kompleksi beş ayrı heykəl-sücetdən ibarət idi. Qopuzlu Dədə Qorqud özü, yağıları at belində zəbun edən Salur Qazan, Qırx incə belli qızla Burla xatun, bağlandığı böyük ağacı köklü-köməcli yerindən çıxaran Qaraca çoban və Beyrəklə Banuçiçək.

"Bulud" hərlənir və Məlik burdan görə bilmədiyi, amma qarış-qarış gəzdiyi yerləri xəyalında canlandırırdı. Səngəçaldan çıxan dəniz tramvayları Qaradağ, Şıx çimərliyi, Bibi-heybət, Bayıl və şəhərin mərkəzindəki duraqlardan keçərək Əhmədli, Günəşli, Zığ, Hövsan, Türkandan ötüb son dayanacaqlarına Şah dilindəki 100-cü buruğa çatırdılar. Uzun illər istifadəsiz qalmış Yüzüncü buruq da turistlər üçün görməli yerlərdən biri idi. Liftlə ya pilləkənlə buruğun təpəsinə qalxan turistlər dəniz durbinləri vasitəsilə bütün Abşeronu seyr edə bilərdilər. Yaxın vaxtlarda dəniz tramvayları Şah dilini də burulub qüzey Abşeron qəsəbələrinə, oradan Corat bağlarına və Sumqayıta qədər işləyəcəkdi.

Məlik Lökbatanın, Çeildağın vulkanlarını təsəvvüründə canlandırdı, təsəvvüründəcə daha uzaqlara – Ceyranbatan qoruğuna çatdı. Bilirdi ki, bu bayram günü orada xüsusi ayrılmış yerlərdə piknniklər – çölçü məclisləri qurulacaq, *Özün bişir, özün ye* guşələrində manqallardan qalxan tüstü, təndirlərdə yapılan çörəklər, kabab iyi, çal-çağır...

– Burnuna kabab iyi dəyməsin – deyə Məlik öz-özünü xəyallar aləmindən ayırdı – pendir-çörəyini ye, vaxta az qalıb. "Bulud" onun baxışlarını şəhər məhəllələrindən bir-bir keçirirdi. Uzaqdan öz otuzmərtəbəlik binalarını da sezdi, Qaçaqlar dağında Razin mağarası da yadına düşdü, Günəşlinin yeni göydələnlərini də gördü, Zığın Zeytun meşəsini də...

"Bulud" bayaqkı nöqtəsinə gəlmişdi və Məlik yenidən Azadlıq meydanına, Odlar sarayına baxmağa başladı.

Azadlıq meydanının yerinə Şeyx Səfi xalçasının min dəfə böyüdülmüş əksi rəngli daşlarla düzülmüşdü. Meydanın qarşısında, bulvarda çağdaş Azərbaycan istiqlalının beşiyi Gəncədən gətirilmiş nə bilim neçə əsrlik Xan Çinar, onun iki tərəfindən isə iki çinar pöhrəsi əkilmişdi. Bəzi şərhçilər bu pöhrələri Azadlıq və Məsuliyyət çinarları adlandırırdı ki, Azərbaycanın rəmzi olan Xan Çinar bu iki duyğunun – Azadlıq və Məsuliyyət duyğularının arasında daima baqi qala bilər. Pöhrə çinarlar isə il-ildən ucalaraq haçansa Xan Çinara boy verəcəkdi.

Məliyin yadına düşdü ki, elə burdaca Xan Çinarın altında bir göstərici qoyulub – məsafə göstəricisi. Yollar bu nöqtədən hesablanırdı.

Göstəricədə bu nöqtədən altı ox – altı istiqamətdə ən ucqar yerlərə olan məsafələr kilometrlər və dəniz milləriylə qeyd olunmuşdu. Şərq istiqamətində – Şah dəniz, Şimal istiqamətində Dərbənd, Şimal-Qərb istiqamətində Sınıq körpü, Qərb istiqamətində Sədərək, Cənub-Qərb istiqamətində Urmiyə, Cənub istiqamətində Zəncana qədər olan məsafələr.

Odlar sarayının fasadında, haçansa Leninin heykəli ucalan yerdə indi rəmzi bir fiqur ucalırdı: 90-cı illərin meydan günlərində üçrəngli bayrağı bura sancan igidin məşhur fotosuna əsasən yaradılmış heykəlsal divara dırmaşan adam və əlində üçrəngli bayraq. Heykəl daşdandı, əlindəki üçrəngli bayraq isə real bayraq idi, parçadan.

Məmməd Əmin Rəsulzadənin məşhur sözləri də bura həkk olunmuşdu: Bir dəfə ucalan bayraq bir daha enməz.

Odlar sarayının əsaslı rekonstruksiyasından sonra Milli Məclis burada yerləşirdi. Milli Məclisin iclas salonunda Dövlət bayrağı və gerbiylə bərabər, Ana Yasanın əsas müddəaları da həkk olunmuşdu:

*Birləşmiş Azərbaycan Respublikası Azəri türk millətinin vahid, azad, müstəqil, demokratik, dünyəvi dövlətidir. Azərbaycan Respublikasının bütün vətəndaşları irqindən, millətindən, dilindən, dinindən, sosial durumundan, sinfi mənsubiyyətindən, cinsindən asılı olmayaraq bərabər hüquqlara malikdirlər. Azərbaycan böyük Türk dünyasının ayrılmaz parçasıdır. Azərbaycan xalqı bütün türk xalqlarıyla və ölkədə yaşayan bütün milli azlıqlarla qardaşdır. Azərbaycan dünyanın bütün xalqlarıyla barış, dostluq, bütün dövlətlərlə qarşılıqlı faydalı əməkdaşlıq şəraitində yaşamaq niyyətindədir.*

Əlbəttə, bu müddəalar müəyyən diskussiyalara, mübahisələrə səbəb oldu, amma Milli Məclisdəki partiyaların və bitərəflərin ümumi razılaşması nəticəsində qəbul olundu.

Sağ və sol partiyalar bir vacib məsələdə də razılığa gələ bildi, dördü birlikdə hökümətə müraciət etdilər. Hökümət bu müraciətə müsbət yanaşdı və indi şəhərin mərkəzində ucaldılmış əzəmətli Panteonda – MİLLİ BARIŞ məqbərəsində dörd böyük siyasi xadimin məzarları yerləşir: Məmməd Əmin Rəsulzadənin, Əlimərdan bəy Topçubaşinin, Fətəli xan Xoylunun və Nəriman Nərimanov nəşləri o dövlətlərlə danışıqlar nəticəsində Ankaradan, Parisdən, Tiflisdən və Moskvadan Bakıya gətirilib burada torpağa tapşırıldı. Seyid Cəfər Pişəvərinin nəşi isə Təbrizə köçürüldü və möhtəşəm türbədə dəfn olundu.

Nəsiminin, Füzulinin Azərbaycana gətirilməsi bir qədər çətinliklərlə üzləşsə də axır ki, onların da, Mirzə Fətəlinin də nəşləri Bakıya gətirildi.

Şəhərin dağlıq hissəsində Nəsimi, Füzuli və Mirzə Fətəlinin türbələri yan-yanaşı ucalırdı, Nəsiminin və Füzulinin türbələri ənəvi Şərq memarlığı üslubundaydısa, Mirzə Fətəlinin türbəsi ən yeni modern Qərb memarlığı yönündə tikilib və bu da uzun zaman dartışmalara, mübahisələrə səbəb oldu. Amma indi artıq gözlər bu üç türbənin qonşuluğuna çoxdan alışıb və mübahisələr də unudulub gedib.

“Bulud” hərlənərək baxış nöqtəsini bir qədər də dəyişdi və Məliyin diqqətini indi də “Dəyirman” univermağı çəkdi. Köhnə dəyirmanın binasında yerləşən bu super dükanın qarşısında bir ay qabaq Abşeron üçün səciyyəvi olan rəngbərəng pərli yel dəyirmanları qoymuşdular və onlar binaya ayrı yaraşıq verirdi. “Dəyirman” Bakının iki ən böyük Univermağından biri idi və “Karvan” univermağıyla rəqabət aparırdı.

“Karvan” univermağının damında gecələr işıqlı məftillər vasitəsilə dəvə karvanının ləngərli hərəkətini əks etdirən reklamın qarşısında “Dəyirman” da indi bu əlvan yel dəyirmanlarını çıxarmışdı.

“Dəyirmandan” bir qədər bu tərəfə 18-ci il mart bağı görünürdü. Haçansa 26-lar bağı adlanan bu yerdə 1918-ci ilin mart günlərində minlərlə Azərbaycanlı qırmışdılar. İndi burada qoyulmuş Kədər heykəli də, hər saatdan bir səslənən Qara Qarayev rekviyemi də həqiqi ünvanını tapmışdı. O vaxt inqilabçı sayılan və xüsusi əzazilliyiylə fərqlənən bir neçə şəxsin də möcüzəvi şəkildə hifz olunub qalmış heykəllərini, bir çoxların istəyinə uymayaraq məhv etməmişdilər.

Haçansa məşum “KQB” binasının – indi Repressiya qurbanları muzeyinin həyətinə yığmışdılar onları. Bura ölümə göndərilən insanların yerinə indi özləri – ölümə göndərənlər – heykəl şəklində olsa da – burada dustaq idi, ömürlük-əbədi cəza müddətlərini çəkirdilər.

Məlik saatına baxdı – birin yarısı idi. İlin təhvil olacağı vaxta düz bir saat on iki dəqiqə qalırdı.

Çayçı Məliyin kredit kartını qeyd elədi və o, sağollaşıb liftə girdi, zirzəmi düyməsini basdı, liftdən çıxıb vaqonetə mindi və yeraltı yolun relsləriylə “Çağdaş”ın zirzəmisinə çatdı, buranın liftinə minib yeddinci mərtəbəyə qalxdı.

Onun daimi köməkçisi, pult rejissoru Ərxan artıq yerindəydi. Görüşdülər, bir-birinin bayramın təbrik etdilər.

Məlik kürsüsünə əyləşib monitorlara baxmağa başladı. Yanardağdan Qız qalasınacan yol boyu müxtəlif yerləri əks etdirən görüntüləri bir-bir gözdən keçirdi.

Ərxandan:

– Bəs Yanardağ hanı? – deyə soruşdu.

Ərxan: – Odey, birinci monitorda – dedi.

Məlik: – Bu “Yanardağ” motelidir, motel mənim nəyimə lazımdır, unutmusan ki, əsas obyekt yerdən çıxan odlardır.

Ərxan: – O da var – dedi – ehtiyat monitorda. Elə bildim moteldən başlayacayıq – bir qədər pərt kimi olmuşdu Ərxan.

Məliyin bu cavan və bacarıqlı köməkçisinə xoş münasibəti vardı, söhbəti zarafata salmaq istədi, – Yəqin – dedi – Yanardağ motelindəki qaraçı rəqslərinin xəyalına dalmısan.

Ərxan: – “Yanardağ” motelində qaraçı rəqsləri olmur – dedi – Atəş rəqsləri olur. Qaraçılar “Qaraçı” karvansarasında çıxış edir.

– O haradır elə?

– Qobustanda. Sofi Həmid – qoruq qəbiristanlığından bir az yuxarıda. Heç olmamısınız?

Məlik: – Yox – dedi – elə yerlər siz cavanlar üçündür. – Amma fikirləşdi ki, mütləq macal eləyib bu Qaraçı karvansarasına baş çəkməlidir. – Qobustandadır deyirsən?

– Bəli.

Məlik Qobustana axırıncı dəfə keçən yay İşıq – səs tamaşasına baxmaq üçün getmişdi. Hər bazar günü göstərilən bu doğrudan da fantastik tamaşaya baxmağa dəyərdi. Adam əlindən tərpənmək olmurdu.

Dəniz tramvayları, avtobuslar, maşınlar, hətta dikuçarlar bura axın-axın tamaşaçı daşıyırdı. Ekzotikanı sevən əcnəbi turistlər isə qədim at arabalarında, faytonlarda, dəvələrin gəcavələrində gəlirdilər.

Ərxan:

– Bu da odlar – dedi.

İndi birinci monitorda Yanardağın yerdən çıxan atəşləri görünürdü.

– Bir az da iri planda götürsünlər.

On dəqiqədən, yox, artıq səkkiz dəqiqədən sonra Ağ atlı, ağ buxara papaqlı, ağ çuxalı oğlan – onun adı mütləq Novruz olmalıydı, bu il lap gül eləmişdilər – adı Novruz, soyadı Bayramlı idi, bəli bu ağ atlı Novruz Bayramlı Yanardağın odlarından məşəl yandırmalı və dörd nala çaparaq Bakıya gətirməli idi məşəli, Qız qalasının təpəsinə çıxıb oradakı Böyük Çırağı yandırmalıydı. Özü də düz il təhvil olan anda – dəqiqəsinə yox, saniyəsinə söz ola bilməzdi.

Məlik elektron yaddaş dəftərində xronometraja baxdı. – Hazır olun, başladıq – dedi.

Ərxanın səsi gəldi: – Hazır – sonra bir dəqiqədən sonra – Məlik bəy, efirdəsiniz – dedi.

Məlik:

– Salam, sevgili tamaşaçılar – dedi – Bayramınız mübarək. Bu gözəl bayram və bütün gələcək günləriniz, aylarınız, illəriniz xoş keçsin.

Qoy qarşıdan gələn ilimiz də yola saldığımız il kimi hamımız üçün, bütün xalqımız, dövlətimiz üçün uğurlu olsun. "Çağdaş" televiziyasıyla bu xoş bayramın bütün həyəcanlı və fərəhli anlarını yaşaya biləcəksiniz. İndi kameralarımız Yanardağdan görüntülər göstərir. Torpağımızın dərinliklərindən qalxan və əbədi yanan bu təbii alovlar vətənimizin Odlar yurdu adlandırılmasına səbəb olub. İndi də bu torpağın özündən alınan alov Bakıya – tariximizin iftixarı olan Qız qalasına çatdırılacaq – deyəsən bir az təm-təraqlı oldu – deyə Məlik özözünü qınadı və daha sakit tonla davam elədi: – Burdan alışdırılan məşəli Bakıya ağ atlı oğlan Novruz Bayramlı yetirəcək.

Məlik düyməni basdı və kadr arxasından diktor Novruz Bayramlı haqqında qısa məlumat oxudu, eyni zamanda bu mətn ekranda da yazıldı:Anadan olduğu il, ay, gün, doğulduğu yer, təhsili, peşəsi, ailə vəziyyəti və sairə. At çapma üzrə idman ustası olması da qeyd olundu.

Məlik dünən Novruzun bilgisayarda müxtəlif şəkillərinə baxmışdı, amma nədisə indi monitorda oğlan daha da yaraşıqlı görünürdü – boy-buxun, nazik bığlar, çatma qaşlar. Ağ qiyafəsi də çox yaraşırdı bu 22 yaşlı oğlana. Altındakı ağ cins Qarabağ köhləni yerində oynayırdı.

Düz xronometrajla müəyyənləşdirilmiş anda ağ atlı oğlan odlara yanaşdı, məşəlini uzadıb alovlandırdı və dörd-nala çapmağa başladı.

Yol boyu düzülmüş kameralar Novruz Bayramlının irəliləyişini addım-addım izləyir, Məlik gah onun keçdiyi yerlərdən, gah da Novruz bayramı haqqında söhbətlər edirdi.

Ağ atlı oğlan Şubanı dağının ətəyindən çapıb qədim Karvan yoluyla Qurd qapısına üz tutdu.

Səkkizinci monitorun düyməsini basdı, ekranlarda Qurd qapısında qoyulmuş Boz qurd heykəli göründü. Məlik şərh etməyə başladı, Boz Qurd toteminin türk xalqları üçün nə anlam daşıdığından danışdı. Sonra kameraları 15 eylul memorialına çevirməyi tapşırdı.

– Əziz tamaşaçılar, bu yerlər əlbəttə sizə yaxşı tanışdır. Dəfələrlə bu memorialdan verilişlər vermişik, siz də yəqin dönə-dönə bura ekskursiyalara gəlmisiniz. 1918-ci il sentyabrın 15-də – bilirsiz ki, Türkiyə türkləri sentyabra eylul deyirlər, – İslam Qafqaz Ordusu məhz bu yerdən Bakıya girmiş və gənc Azərbaycan ordusunun döyüşçüləriylə çiyin-çiyinə şəhəri düşmənlərdən azad etmişdir. İndi bu memorialda bildiyiniz kimi Bakı uğrunda döyüşün diaraması qurulub. Diaramda bu zəfər yürüşünün təşəbbüsçüsü Ənvər paşanın və zəfər komandanları Nuru paşanın, Mürsəl paşanın surətləri var.

Buradan başlanan və bir-biriylə kəsişən üç geniş prospekt də onların şərəfinə adlandırılıb – Ənvər paşa prospekti, Nuru paşa prospekti, Mürsəl paşa prospekti... Ağ atlı Novruz məhz bu prospektlərdən keçəcəkdir. Görürsünüzmü, indi o yoxuşla Qurd qapısına tərəf çapır. Qapını ötdü. Mürsəl paşa prospektiylə 15 eylul meydanına üz tutdu.

Məlik bilirdi ki, bu meydan 15 eylul meydanı adlansa da, camaatın çoxu Eylulu iyulla qarışdırdıqları və Bakının Qurtuluş gününün sentyabrda olduğunu bildikləri üçün bu meydana ya üç paşa meydanı (üç prospekt burda qovuşurdu) ya da meydanda ucalan türk əsgərinin heykəlinə görə Məhmətcik meydanı deyirdilər.

Məlik əlindəki pultun düymələrini bir-bir basmağa başladı, görəsən o biri kanallar nə göstərir? AZRT – rəsmi təbriklər verirdi, "Turan"

Daşkənddən, Qazandan və Aşqabaddan, Araz Təbrizdən bayram görüntüləri göstərirdi. “Hilal”da, bayramın dini kökləri haqqında danışırdılar. “Ulduz” Ağ atlının yolunu izləyir, arada reklamlar və kliplər verirdi.

Ağ atlı artıq Azərneft meydanına enirdi, Məlik:

– Azərneft meydanında Buruğu iri planda götür, sonra ayrıca mancanağı – deyə göstəriş verdi.

Efir düyməsini basıb: – əziz dinləyicilər – dedi – Siz indi ekranlarınızda Azərneft meydanındakı buruğu görürsünüz. Bu buruq və onun daima hərəkətdə olan, gecə-gündüz durub dayanmadan qalxıb enən mancanağı (ekranda mancanağın iri planı göstərildi) torpaq və dəniz altındakı neft sərvətlərimizin tükənməzliyinin və onları üzə çıxaran neftçilərimizin şərəfli əməyinin rəmzidir. İndi Novruz Bayramlı bu meydana çıxacaq və meydanda dövrə vurub Xəzər prospektiylə Qız qalasına tərəf çapacaq. Görürsünüz bu an bütün prospektdə nəqliyyat hərəkəti dayandırılıb. Xəzər bulvarından da, qarşı tərəfdən də minlərlə insan Ağ atlının gəlişini gözləyir. – Efirdən çıxıb Ərxana dedi: – Qız qalasını götürün, əvvəl ümumi plan, sonra aşağı panorama.

Yenidən efirə çıxdı: – Neft sərvətimiz kimi mədəni, tarixi sərvətlərimiz də əbədidir. Budur uzaq minilliklərin yadigarı qədim Qız qalası. Onun ətəyində əlvan paltarlı qırx incə belli qızların əllərindəki səmənilər, rəngbərəng şamlar, bayram xonçaları bu şənliyə ayrı gözəllik verir.

Qızların arasından biri irəli çıxdı.

Məlik: – Bu da yaşıl paltarlı Bahar xatun. Görürsünüz, Novruz Qız qalasının ətəyində atdan düşür, Bahar xatunun təqdim etdiyi kuzədən şərbət içir, sonra əlindəki məşəli daha da ucaya qaldıraraq qalaya daxil olur.

Ərxan: – Qalanın içiylə, pilləkənlərlə qalxmasını göstərək? – deyə xəbər aldı – orda da kameralarımız qurulub.

Məlik: – Yox – dedi – qalanın içində alaqaranlıq kadrlar nəyimizə gərəkdir. Camaatı göstərin, sonra da qalanın damını, oğlan məşəllə birdən orda görünəndə daha effektli olar. – Mənalı gülümsündü – sonra da dərhal bizim sürpriz – dedi.

Sürpriz dedikləri Məliyin kiçik bicliyi idi. Qız qalasının damında Ağ atlı oğlan hər yerdən görünən çırağı odladığı anda – düz ilin təhvil olduğu saniyədə – eyni bir anda Abşeronun dörd qalasının – Nardaran, Ramana, Mərdəkan qalalarının, eləcə də Dərbənddə Narın qalanın,

İlisuda Şamil qalasının, Şəkidə Gələssən Görəssən qalasının, Dəvəçidə Çıraq qalanın, Qarabağda Əsgəran, Naxçıvanda Əlincə, Şamaxıda Gülüstan, Lahıcda Niyal, Güneydə Bəzz, Təbrizdə Ərk qalalarının zirvələrində məşəllər alışacaqdı. Bildir də, inişil də belə olmuşdu və Məlik o vaxt operatorlarına hamısını çəkməyi tapşırmışdı, lenti saxlayırdı. İndi Qız qalasında çıraq alışan kimi dalbadal bu ötən illərin görüntülərini göstərəcəkdi, tamaşaçıda elə təsəvvür yaranacaqdı ki, bütün bunlar bax indi, bu dəqiqə baş verir. Balaca bicliyi – sürprizi bu idi. Azacıq saxtakarlıq olsa da, yalan şey ki, təqdim etmirdi. Bütün bunlar bildir, inişil olduğu kimi indi də, bax bu dəqiqələrdə də baş verir. – Məlik məmnun-məmnun gülümsədi: Hər halda o biri kanallara doqquz qoyduq.

Böyük çıraq alışdı, İl təhvil oldu.

Bundan sonra şənliklər başlanacaqdı. Bu səfər Məlik şəhərin müxtəlif yerlərində keçirilən tədbirləri deyil, yalnız İçərişəhərdəkiləri ekrana gətirməyi qərarlaşdırmışdı.

Qız qalasının arxasında bazar meydanında tərəfdən-tərəfə çəkilmiş tarım iplərin üstündə kəndirbazlar öz məharətlərini nümayiş etdirirdilər. Bakı xanlarının bərpa olunmuş iqamətgahlarında Köhnə Bakı muzeyi yerləşirdi: mum fiqurları düzəldilmiş qoçu, dərviş, hambal (hambal Dadaş, Qoçu Nəcəfqulu, Lotu Cabbar), eləcə də fayton, qazalaq, konka kimi eksponatları olan, orta əsr Avropa rəssamlarının Bakını təsvir edən qravürləri, əsgi Bakının ilk foto-mənzərələri, Əzim Əzimzadənin karikatürləriylə süslənmiş muzey. Muzeyin qarşısındakı meydanda Keçəl və Kosa toplaşanları güldürürdü. Qoşa qala qapısından bura axın-axın insanlar gəlirdi.

Şirvanşahlar sarayında, xalça-palaz döşənmiş hamam hücrələrində güləşlər, qılınc oyunları göstərilirdi.

Dəstə-dəstə turistlər bilmirdilər hara baxsınlar bu oyunların, tamaşaların hansına? Qarşısında Məşədi İbadın paralon mulyajı qoyulmuş qənnadı dükanınamı baş çəksinlər, ya qarşısında eyni cür Hacı Qara fiquru görünən xırdavat dükanınamı? Bəlkə Dərviş ya Xarabat meyxanalarında vaxt keçirsinlər?

Məlik: – Proqramın ardını özün apar – deyə Ərxana lazımı tapşırıqlar verdi – Mən Türkana getməliyəm, onsuz da gecikirəm. Bir də hamınızın bayramı mübarək!

Avtosunu işə salıb Xəzər prospektinə endi. Prospekt artıq nəq-liyyatçün açılmışdı, amma yaman basırıq idi. Azadlıq meydanından keçib Qara şəhərə çıxandan sonra nəqliyyat bir az seyrəldi.

Avtosunun qutusundan kaset çıxarıb maqnitofona saldı, düyməni basdı. Baxın Çakonası səslənməyə başladı. Məliyin ən çox sevdiyi musiqi əsərlərindəndi.

Universitetlər şəhərciyi Hovsan da arxada qaldı, indi sahil yoluyla Türkana tərəf irəliləyirdi. Maqnitofonda Məliyin çox sevdiyi başqa bir əsər – Albinioninin Adajiosu səslənirdi. Məlik bu əsərlərin müəllifləri barədə – Bax və Albinioni barədə düşündü. Bu dahiləri Məliyə bu qə-dər yaxın, doğma, munis edən nəydi? Onları əsrlərin məsafəsi ayırır-dı, zaman, məkan, mühit, adət-ənənələr, mədəni irs, gələnəklər, dav-ranış qaydaları, ədaları, bir sözlə hər şey, hər şey tamam başqa idi... Amma Məliyi mat qoyan o idi ki, bu kamzollu, dar pantolonlu, yaxası jabolu, başında pudralı parik olan insanlar – Bax, Albinioni, Vivaldi, Korelli, Motsart – onun, Məliyin duyğularını necə də ülvi səslərlə ifa-də edə biliblər. Sanki bu uzaq ellərin, uzaq zamanların insanları onun, Məlik Məmmədlinin, XXI əsr Azəri türkünün ən dəruni hisslərini duya və belə ecazkar melodilərlə səsləndirə bilmişlər. Bu möcüzə deyildimi? Uzaq əsrlərin möcüzəsi...

Amma ağlına gəldi ki, bunları burada, avtosunda dinləyə bilməsi də XX-XXI əsrlərin möcüzəsidir. Nazik mixəyi lent dolanmış kiçicik ka-seti cihazın içinə salırsan və bir-birindən gözəl səslər, melodilər aləmi canlanır – yəqin o dövrün insanları da bu möcüzəyə mat qalardı.

Avtonun açıq pəncərələrindən xəfif gilavar Məliyin saçlarını yumşaq-yumşaq tumarlayırdı. Atobanın sağ tərəfində iri hərflərlə ya-zılmış TÜRKAN sözünü gördü.

Keçmiş qəsəbənin yerində salınmış Türkan şəhəri – müəyyən an-lamda Türk dünyasının mənəvi mərkəziydi. Bir çox ümumtürk iqtisa-diyyat, mədəniyyət, maliyə, KİV strukturları, müstəqil və muxtar Türk respublikalarının səfirlikləri, daimi nümayəndəlikləri burada yerləşirdi.

Türkanın girəcəyində yol haçalanırdı. Üst yol Dinlər meydanına aparırdı – burada Türkiyə dövlətinin inşa etdiyi əzəmətli Əhməd Ya-səvi məscidi, onun yanında xristian qaqauzlar üçün tikdirilmiş kiçik kilsə – sövmiyyə, qarşı tərəfdə yəhudi Qaraimlərin sinaqoqu, Tuvanın hədiyyə etdiyi Budda məbədi və Yakutların şaman otağı yerləşirdi.

Dinlər meydanından bir az aralı Manas idman kompleksində qapalı və açıq yarış, oyun meydançaları, üzgüçülük hovuzları vardı. İdman zonasından başlanan – bir ucu Türkan hava alanına, bir ucu Binə hava limanının yaxınlığındakı İpək yolu – fuarına – yarmarkasına qədər uzanan Ötükən ormanını Türk dünyasının hər guşəsindən gətirilib burda əkilmiş və nə yaxşı ki, tutmuş müxtəlif ağaclar bəzəyirdi. İpək yolu fuarında yalnız Türk dünyasından deyil, planetin hər yerindən gətirilən mallar nümayiş etdirilir və satılırdı. Nə yoxdu burda – Qazax-qırğız dombralarından tutmuş Dağıstan yapıncılarınadək, özbək xələtlərindən türkmən – ahal təkə atlarınacan, Çin kaşısı, Kaşan xalçaları, ərəb ədviyyatı, yapon şirmaları, Hindistan ətirli sandal çubuqları, hətta Afrika masqaları tapmaq olardı burda. Qərbin, Yaponiyanın, Koreyanın ən yeni texnologiyaları müxtəlif şirkətlərin diqqətini çəkirdi. "Aral", "İssık göl", "Altay", "Mərmərə", "Ağrı dağ" restoran, kafe və barlarında qazax Beşbarmağından, özbək plovundan Türkiyə türklərinin imambayıldısınacan hər növ təamı dadmaq olardı, qımız da içmək olardı, Zəm-zəm suyu da, yaşıl özbək çayı da...

Bütün bu mallar ya hava yoluyla Türkan hava alanına, ya gəmi-bərələrlə Türkan bərə limanına, yaxud da Türkan dəmir yol vağzalına qatarlarla çatdırılırdı. Uluslararası Binə hava limanından dünyanın hər yerinə uçmaq olardı, Türkan hava alanına qonan və oradan qalxan "Bayqonur" uçaqları Türk dövlətlərinin paytaxtarı və böyük şəhərləriylə gediş-gəlişi təmin edirdi.

Yollar ayrıcında Məlik sağa burulub Salavat Yulayev küçəsindən Orxon meydanına daxil oldu. Bu meydan dairəvi şəkildə qurulmuşdu. Meydanın tən ortasında üç Orxon kitabəsinin – Böyük, Kiçik Gültəkin, Tonüquq yazılarının on dəfə böyüdülmüş daş kopiyaları qoyulmuşdu. Meydanı dövrələmə müxtəlif ölçülü dörd bina əhatə edirdi: Universitet, Teatr, Elmi Mərkəz və Kitabxana binaları. Kamal Atatürk Universitetində bütün türk xalqlarının ölkəşünaslığı, tarixi, dili, ədəbiyyatı, coğrafiyası və iqtisadiyyatı üzrə mütəxəssislər hazırlanırdı. Müxtəlif ölkələrin teatr tamaşaları adətən Nazım Hikmət teatrında oynanılırdı. Bu axşam burda Kürd teatrının "Məhəmməd Qazi" tamaşası göstərilirdi.

Mahmud Qaşqarlı Türk Dünyası Araşdırmalar Mərkəzində türklərin ortaq tarixi, ortaq ədəbiyyat tarixləri üzrə tədqiqatlar aparılır, ortaq və ikitərəfli lüğətlər, Ümumi Türk Ensiklopediyası hazırlanır, əlifba,

dil və terminoloji uyğunlaşdırma komissiyası işləyirdi. Fərabi kitabxanasında Bakının, İstanbulun, Daşkəndin, Tehranın, Bağdadın, Qahirənin, Moskvanın, Peterburqun, Vaşinqtonun, Nyu-Yorkun, Londonun, Parisin, Berlinin, Romanın, Vyananın ən böyük kitabxanalarından, Matenadarandan türkolojiyə aid bütün kitabların, əlyazmaların mikrofilmlərindən, bilgisayarda yerləşdirilmiş surətlərindən istifadə etmək olardı.

Məlik Orxon meydanından Hunlar bulvarına çıxdı. Bulvarın sağ tərəfində 20 müstəqil və muxtar türk respublikasının səfirlikləri və daimi nümayəndəlikləri yerləşirdi. Sol tərəfdə isə Yusif Balasaqunlunun, Yunis İmrənin, Əlişir Nəvainin, Məhdumqulunun, Abayın, Abdulla Tuqayın və Qasparalı İsmayılın adlarını daşıyan uyqur, Anadolu, cağatay, qazax-qırğız, İdil-Ural və Krım-tatar mədəniyyət mərkəzləri fəaliyyət göstərir. İki qonşu binada – Ziya Göy alp ocağında və Sultanqaliyev klubunda sağ və sol təmayüllü siyasətçilər toplaşır, çeşidli məsələlər haqqında qızğın mübahisələr aparırdılar.

Hunlar bulvarından Oğuz meydanına çıxdı. Orxon meydanından fərqli olaraq bu meydan kvadrat şəklində idi və Səmərqəndin Registan meydanı üslubunda tikilmişdi. Meydanın forması da, binaların memarlığı da, kaşı üzlüklər də Səmərqəndi, Buxaranı, Xivəni andırırdı. İki tərəfdən iki ekiz uca bina "Turan" oteli və "Erkenekon" sarayı, onların arasında Türk muzeyi yerləşirdi, dördüncü tərəf boş qalmışdı – dənizə açıqdı.

"Turan" otelinin qarşısında tarixi türk imperiyalarının, dövlətlərinin sancaqları və tuğları görünürdü. "Erkenekon" sarayının qarşısında çağdaş türk respublikalarının bayraqları dalğalanırdı. "Erkenekon" sarayında Türk dünyasının iqtisadiyyat, mədəniyyət, elm, təhsil, informasiya, maliyyə, səhiyyə və idman komissiyaları yerləşirdi. Hava şirkətlərinin və turist təşkilatlarının büroları, xəbər ajansları və mətbuat-televiziya müxbirlərinin ofisləri də bu binadaydı. Mühüm tədbirlər böyük iclas salonunda keçirilirdi.

Məlik "Ceyran"ını muzeyin qarşısında saxladı, açarları avtomobil xidmətçisinə verdi. Üstündə "Türk dünyasının sərvətləri sərgisi – 22 mart – 22 aprel" yazılmış afişin yanından keçdi, jurnalist kitabçasını göstərib muzeyə daxil oldu. Açılışa gecikmişdi, amma yenə də adam əlindən tərpənmək olmurdu.

Böyük foyedə nümayiş etdirilən Şeyx Səfi xalçasının qarşısında xüsusi qalabalıq vardı. Məlik bu xalını Londonda Viktoriya və Albert

muzeyində görmüşdü, amma o yarıqaranlıq salondan fərqli olaraq burada, bol işıqlı yerdə Şeyx Səfi xalçası rəng verib rəng alırdı. Bəlkə Vətənə döndüyündən belə bərq vurur. Məlik: Yenə pafosa qapılma cənab Məmmədli – deyə özünü məzəmmmət elədi, – həm də ki, həmişəlik qayıtmayıb: cəmisi bir aylığa.

Uzun və üzücü danışıqlardan sonra Böyük Britaniya hökuməti bir aylığa xalçanın Bakıda nümayiş etdirilməsinə icazə vermişdi, özü də böyük mühafizəçi dəstəsinin müşayiətilə. Dünyanın ən qədim xalısı sayılan Paızırıq xalçası da ciddi mühafizə olunurudu – süzülüb dağılmış bu xalça güllədeşməz şüşənin arxasında asılmışdı.

Qazaxıstandan göndərilmiş Qızıl döyüşçü də eyni cür gülləkeçməz şüşələr arxasında idi, Drezdendən və Vatikandan gətirilmiş Kitabi Dədəm Qorqud əlyazmaları da. Xeyli adam Piri Rəis xəritəsinin qarşısında qulaq bələdçilərinin müxtəlif dillərdə izahatını dinləyirdilər, Piri Rəisin Kolumbun kəşfindən çox qabaq Amerika qitəsini xəritətsində göstərdiyinə ən çox təəccüb qalanlar yuxarı sinif şagirdləri və əcnəbi turistlər, özəlliklə amerikalılar idi.

Məlik elektron yaddaş dəftərçəsində lazımı qeydlər etdi, arxayın vaxta gəlib yaxşı bir proqram düzəltmək olar – deyə düşündü və muzeydən aralandı.

Bu səfər Güney sahil yoluyla deyil, Kəmər yoluyla Bakıya tərəf gedirdi, gecə-gündüzün tarazlaşdığı 22 mart gününün alatoranlığı idi. Məliyin ağlına gəldi ki, səhərdən heç nə yeməyib. Yol boyu yerləşən restoranları bir-bir yadına saldı. Amma artıq qərarını vermişdi: buralara yolu düşəndə hökmən Zığ yamacında yerləşən “Aylı gecələr” parkının “Bakı gecələri” restoranına gedərdi. Bu axşam da şam yeməyini orda yeyəcəkdi. Bu restoranı çox sevirdi. Əlbəttə mətbəxi sarıdan daha ləzzətli, hətta ekzotik restoranlar da var, amma Məliyi “Bakı gecələri”nin menyusu deyil, eyvanından açılan mənzərə cəlb edirdi. Sonsuz məhəbbətlə sevdiyi şəhərə adətən ya çox yuxarılardan ya da üzü dənizə durularsa sağ cinahdan baxardı. Şəhəri məhz bu səmtdən görmək imkanı hər gün olmurdu. Bura yolu düşəndə “Aylı gecələr” parkından, “Bakı gecələri” restoranının açıq eyvanından saatlarla Bakının gündə vərdiş etmədiyi görünüşünü seyr etməkdən zövq alırdı.

Sifarişini verdi, amma yeyib-içəndən sonra da durub getmək istəmirdi. “Qıpçaq” şərabını qurtum-qurtum içərək çil-çıraq içində alışıbyanan şəhərə, Xəzər, Füzuli bulvarlarında işıq seli kimi axan nəqliy-

yat karvanlarına, yelkənli qayıqların, əlvan gəmilərin belədən – belə şütüdüyü dənizə, Nərgiz adasının Şeytan çarxına – Göy qurşağına hey baxır, baxırdı.

Ağ Abşeron daşından bərpa olunmuş Səbail qəsri sanki dənizdən yox, əfsanələrdən, keçmişin, tarixin bağırından çıxıb qalxmışdı suların ortasında. Bayılda, Çənlibel qala-otelində qurulmuş güclü projektorlar Səbaili işıqlandırdıqca adam gördüklərinin həqiqətmi yuxumu olduğunu təyin edə bilmirdi. Məlik bilirdi ki, bir azdan Səbail qəsrində şeir gecəsi başlanacaq, görəsən şairlərimiz bu əfsanə-qəsrə layiq şeirlər yaza bilibmi?

Dənizdə üzən bəzi qayıqlarda bir-bir məşəllər alışmağa başlandı. Məlik: Bax bu təzə məsələdir – deyə düşündü – nə əcəb xəbər tutmamışam. – Belə bir tamaşa ilk dəfə idi. Yəqin Aleksandr Dümanın Bakıda, dənizdə odlar görməsi haqqında xatirələrini oxuyub, ilhamlanıblar. Hər halda kimin ağlına gəlibsə əhsən ona.

Bu dəqiqəni gözləsə də hər halda qəfil yaylım atəşlərindən diksindi, "Babək" və "Səttarxan" hərbi müdafiə gəmilərindən göyə rəngbərəng fişənglər atılmağa başlandı. Fişənglər əlvan kül dəmətləri kimi havaya topa-topa ucalır, sonra göydəcə dağılıb müxtəlif tərəflərə səpələnirdilər.

Nə qəribə, bütün bu əlvan bayram mənzərələri, hər tərəfdən səslənən oynaq, şən, nikbin musiqi sədaları, hara baxsan gördüyün gülər sifətlər içində Məlik birdən-birə qəfil qüssə hissi duydu. Nə idi buna səbəb? Qayibdən gələn bir səsmi, elektron poçtlarla, teleqrafla, efir dalğalarıyla deyil, nə isə məchul bir vasitəylə ona, Məliyə çatdırılan ismarışmı, həyatın faniliyi, ömrün ötücülüyü haqqında ayıq-sayıq xəbərdarlıqmı? Son illər dünya təbabətının görünməmiş uğurları nəticəsində dünyanın bütün qabaqcıl ölkələrində olduğu kimi Azərbaycanda da orta ömür həddi yetmiş-səksən yaş civarında idi. Məlik də bilirdi ki, irəlidə ən azı 20-25 il ömrü var. Amma axı bu da müəyyən bir mənzil, müəyyən bir hüdud idi.

Ta uşaqlığından Allaha inandığı üçün Məlik ölümdən sonrakı həyata, başqa bir dünyaya da inanırdı. Və düşünürdü ki, bəlkə o dünya bu dünyadan qat-qat gözəldir, rahatdır, xoşdur. Olsun. Amma hər halda insan, hətta bu dünyanın pis günlərini yaşamalı olan, ömrü məşəqqətlər içində keçən insan da həyatıyla vidalaşmaq istəmir. Ondaki, olsun qayğısız bir ölkədə, qayğısız bir zamanda yaşayan qayğısız insan.

Qayğısız... Məlik tez-tez bu sözü ürəyində təkrar edirdi, amma doğrudanmı onun ömrü də, başqa vətəndaşlarının həyatı kimi tam qayğısız idi. Əlbəttə yox, ictimai qayğılardan, iş, mənzil, məişət, maddi-maliyyə qayğılarından qurtulmaq hələ qayğısız yaşamaq deyil. Heç bir quruluş, ən adil cəmiyyət, ən firavan şərait belə insanı tənhalıq saatlarından, qarşılıqsız məhəbbətin, qısqanclığın, xəyal qırıqlığının acılarından, yaxınlarının itgilərindən xilas edə bilmir.

Məlik xatırladı ki, neçə il bundan qabaq rəhmətə getmiş valideynlərinin, bildir torpağa tapşırdıqları bibisi qızının ağrılarını hələ də çəkir.

Əlbəttə o özü də, xalqı da çox böyük bədbəxtçiliklərə düçar ola bilərdi. Neçə il bundan əvvəl siyasi qarşıdurmaların qanlı toqquşmalar, vətəndaş hərbi həddinə çatdığı günlərdə, daxili separatçı həmlələrin və xarici təcavüzün təhlükələri reallaşanda hadisələr tamam başqa axarda gedə bilərdi. Yəqin Məlik də nəinki indi burada, bu “Aylı gecələr” parkında, heç bəlkə Bakıda, Azərbaycanda, ola bilsin həyatda, dünyada da qala bilməzdi. Xoşbəxtlikdən bütün bunların qarşısı alındı, xalqın, millətin əzəli özünüqoruma instinkti hər növ hakimiyyət hərisliyinə qalib gəldi və o günlərdən başlayan əvvəl-əvvəl tədrici, get-gedə daha iti, yeyin inkişaf sürəti gətirib bu günkü arxayın duruma çatdı. İndi işsiz, kasıb, bədbəxt-biçarə vətəndaşı yoxdu Azərbaycanın. Bədbəxt yoxdur, amma hamı xoşbəxtdirmi? Məsələ də elə bundadır. Xalq, Millət bədbəxt olanda onun bütün övladları da bədbəxtdir, amma xalq, millət xoşbəxt olanda onun hər bir övladı ayrı-ayrılıqda “mən bəxtiyaram” – deyə bilmir. Təbii ki, ölkəsinin, dövlətinin talei sarıdan arxayındır, xoşbəxtdir, amma hər şəxs özü – özlüyündə haçansa Tənhalıqla, Ayrılıqla, ən sonunda Ölümlə üz-üzə durmayıbmı?

Nə bədbin fikirlərdir belə, bu xoş bayram günündə başıma gəlir. Filosofluq eləməyə vaxt tapdın. Şəhərə bax, gör bir nə aləmdir, nə gözəllikdir.

Projektorlarla ən münasib şəkildə işıqlandırılmış nəhəng Dədə Qorqud, Koroğlu heykəlləri, su pərisi kimi sulardan baş qaldıran Səbail, zirvəsində Novruz çırağı yanan Qız qalası, dənizdəki ağ yelkənli, əlvan rəngli gəmilər, təknələr, qayıqlar, Nərgizdəki Nənə qurşağı-şeytan çarxı, “Karvan” univermağının damında ləngərlə addımlayan dəvə karvanı, Odlar sarayının məşəlləri – elə bütün bunları görmək üçün dünyaya gəlməyə və yaşamağa dəyərdi.

Getmək zamanı gələndə də nə qəm, nə isə görüb, nə isə edib, insan kimi yaşayıb, insan kimi getməyin nə qorxusu var. Biz gedəcəyik, amma Qız qalası qalacaq, şəkilli Qobustan qayaları qalacaq, İçəri şəhərin dar küçələri qalacaq, Şekspir və Füzuli, Bax və Segah qalacaq...

Amma hər halda maraqlıdır, bizdən sonra nə olacaq, necə olacaq? Məlik haçansa uzaq gəncliyində oxuduğu bir şeiri xatırladı:

Görəsən kim yandıracaq
Yeni çıraqları Xəzər sahilində?
Görəsən kim deyəcək yeni nəğməni,
Nə dilində?

Şairin nigarançılığı əbəs imiş. Xəzər sahilində çıraqları yenə də biz yandırırıq və yeni nəğmələri də öz dilimizdə oxuyuruq.

Bəlkə də nənələrinin təsiriylə Məlik gözünü açandan Allaha sidq-ürəklə tapınmışdı. Dindar deyildi. Dini ritualları heç vaxt icra etməmişdi – namaz qılmırdı, oruc tutmurdu, heç ziyarətə getmək də qismət olmamışdı ona. Buna baxmayaraq hər axşam yatmazdan qabaq, özünün tərtib etdiyi və bəzən hətta televiziya proqramlarında da səsləndirdiyi duanı ürəyində təkrar edirdi. İndi yatmasına hələ xeyli vaxt vardı, amma hansı daxili tələbatlasa bax burada bu "Aylı gecələr" parkında "Bakı gecələri" restoranının Xəzərə baxan açıq eyvanında, hər il təkrar olunan bu təkrarsız günün ilıq axşamında duasını ürəyində kəlmə-kəlmə vird edirdi:

İlahi, bu günümüz üçün sənə min şükür. Bu xoşbəxtliyi xalqıma, dostlarıma, ailəmə çox görmə. Ən pis günümüz bu olsun. Heç birimiz heç vaxt neyləyim, necə eləyim – deməli olmayaq. Tarix boyu çox əzablara, məşəqqətlə tuş olduq, ağır günlər yaşadıq, öldü-qaldıyla üz-üzə durduq. Axır ki, iradəmizlə, ağlımızla, halal zəhmətimizlə ağ günə çıxdıq, bu günümüzü qazandıq. Bu günümüz sonsuza qədər davam etsin, Uca Tanrım. Amin.

# İKİNCİ NAĞIL*

*Bir də gördü ki, ağ qoçnan, qara qoç budu döyüşə-döyüşə gəlir. Məlikməmməd o saat sıçrayıb ağ qoçun belinə mindi. Amma ağ qoç bunu qara qoçun belinə tulladı. Qara qoç da Məlikməmmədi götürüb qaranlıq dünyaya apardı.*

Məlikməmmədin nağılı

## I

Məlik Məmmədlini əzan səsi oyatdı. Gözlərini ağır-ağır açdı, pəncərəyə baxdı, hələ qaranlıqdı. Elə həmin andaca qapı döyüldü.

– Kimdir?

Qapının dalından səs gəldi: – Ağa durun, sabah namazının vaxtıdır.

Qaranlıqda dünən gecə düşdüyü və dərhal daş kimi yuxuya getdiyi bu otel otağını təsəvvüründə canlandırdı, bir çarpayı, bir dolab, bir masa vardı otaqda, kətillər yoxdu, döşəməyə nimdaş həsir salınmış və iki mütəkkə atılmışdı.

Qapının dalından səs gəldi:

– Ağa, namaz yeri birinci mərtəbədə, mehmanxana məscidindədir.

Məlik əlini atıb zəif gecə çırağını yandırdı, otağın küncündə Qiblə istiqaməti göstərilmiş və balaca namazlıq xalça salınmışdı.

Məlik: – Mən namazı odamda qılacam – dedi.

Qapının dalından: – Xub – dedilər.

Məlik durub pəncərəyə yanaşdı, hava hələ də açılmamışdı. Görəcəyi işləri qeyd etdiyi cib təqviminə baxdı – martın 22-si idi – gündüzlə gecənin tarazlaşdığı gün. Yadına düşdü ki, haçansa, çox uzaqlarda qalmış bir əyyamda bu gün Novruz bayramını qeyd edərdilər. Dərindən köksünü ötürdü. Elə otaqdaca qurulmuş əl-üzyuyanda üzünü yudu, balaca tutqun güzgüyə baxdı, bir elə dünənki gün ərzində saqqalı xeyli uzanmışdı. Amma üzünü qırxmadı.

Ərxanın sözlərini unutmamışdı: – Orda saqqallı gəzsəniz daha yaxşıdır.

*QEYD: İkinci nağılda cərəyan edən hadisələr xronoloji zaman etibarilə Birinci nağılın davamı deyil. Bu iki bir-birinə alternativ olan olaylar eyni vaxt kəsiyində təsəvvür edilir.

Otaqdan çıxmağa tələsmirdi. Qoy elə bilsinlər ki, namaz qılır. Bura ayağını basandan bəri hər addımı güdülürdü – bunu bilirdi. Amma yəqin, texniki səviyyələri elə deyildi ki, otel otağının içində izləyici cihazlar qura bilsinlər.

Əzan səsi zonanın hər tərəfinə yayılırdı.

Zona! Məlik ürəyində nəfəskəsici bir sancı duydu – onun doğulduğu, boya-başa çatdığı, oxuduğu, işlədiyi, sevib-sevildiyi, ailə qurduğu, oğul-uşaq atası olduğu şəhər indi Zona idi. Daha doğrusu Zonalar. Ən dəqiqi – üç Zona. Üç Zonaya bölünmüşdü onun Bakısı.

Dünya bu üç siyasi quruluşa malik olan hissələri məhz elə belə, Zona adlandırsa da, xarici kütləvi informasiya vasitələri imkan tapanda və xəsis məlumatlar alanda Birinci Zona, İkinci Zona, Üçüncü Zona istilahlarını işlətsələr də bu bölgələrin rəsmi adları da vardı – Birinrci Zona BEHİŞTİ BADİ-KÜBƏ, İkinci Zona BAKI KOMMUNASI, Üçüncü Zona BAKU SİTİ adlanırdı.

Neçə il bundan qabaq bir telejurnalist kimi Bakıdan İstanbula on günlüyə ezamiyyətə gedərkən Məlik heç ağlına gətirə bilərdimi ki, bu ezamiyyət belə uzun – neçə illər – çəkəcək, onun da, başqa ölkələrdə qalmış milyonlarla azərbaycanlının da vətənlərinə yolu bağlanacaq. Burada elə müdhiş hadisələr baş verəcək ki, hər bir əsil azərbaycanlı kimi Məliyin də daha heç vaxt üzü gülməyəcək.

İndi neçə ildən sonra bura qayıdışın nə qədər üzücü olduğunu təsəvvür etsə belə, dünən keçirdiyi əzablar düşündüklərindən də ağır oldu.

Məlik buradan getdiyi gündən bəri Türkiyədə yaşamalı olmuşdu. Orda da əvvəl-əvvəl çox əziyyətlər çəkdi. Maddi çətinliklər öz yerində, Azərbaycanda qalmış ailəsi haqqında heç bir məlumat ala bilməməsi və nəinki yollar qapanandan, hətta poçt, teleqraf, telefon əlaqələri də kəsiləndən sonra arvadı Aypərinin, oğlu Beyrəyin, qızı Burlanın o məşum günlərdən sonra sağ qalıb-qalmamasını da bilmirdi.

Son illərin yeganə sevinci Ərxanın gətirdiyi müjdəydi. Ərxan neçə ildən bəri Azərbaycandan çıxıb Türkiyəyə gələ bilən yeganə tanışı idi. Nə yolla gəlmişdi, Məlik bilmirdi, doğrusu heç maraqlanmadı da...

Təxmin edə bilərdi ki, hansı Zonanınsa gizli xidmət orqanlarıyla bağlıdır, yoxsa Ordan çıxıb Bura gələ bilərdimi? Hansı zonanın-dinçilərinmi, kommunistlərinmi, demokratlarınmı xidmətində idi Ərxan – Məliyə gətirdiyi müjdənin müqabilində bunun nə əhəmiyyəti vardı?

Arvadı da, oğlu da, qızı da, o bəlalı günlərdən, o müsibətlərdən salamat çıxa biliblərmiş, üçü də sağ imiş. Bu şəraitdə, bu dövrdə, bu günlərdə bundan artıq nə sevinc gözləyə bilərdi ki?

Ərxan hər üçünün ünvanını, telefon nömrələrini gətirmişdi. Əlbəttə burdan, İstanbuldan zəng eləmək qeyri-mümkündü, amma Məlik ona təəccübləndi ki, bir yerdə deyil, hərəsi ayrı-ayrı ünvanlarda yaşayır.

Ərxan gülümsündü: nəinki ayrı-ayrı ünvanlarda, ayrı-ayrı zonalarda yaşayırlar – dedi.

Ərxan haçansa, dünyanın düz vaxtında Məliyin yanında işləmişdi, vaxtilə Məlik ona yəqin ki çox yaxşılıqlar eləmişdi, amma bütün ömrünü "Balığı at dəryaya, balıq bilməsə də, Xalıq bilər" düsturuyla yaşamış Məlik məhz hansı yaxşılığı etdiyini yaddaşına yük eləməmişdi. İndi nadir bir keyfiyyətlə – insanın yaxşılığı unutmamasıyla rastlaşıb təəccüb qalmışdı. Əlbəttə Ərxan İstanbula çox güman ki, müəyyən tapşırıqla gəlmişdi, amma Məliyi, dediyi kimi öz təşəbbüsüylə axtarıb tapmış və ona bu xoş xəbəri çatdırmışdı. – Bilsələr ki, sizinlə görüşmüşəm, dərimə saman təpərlər – dedi. Bilsələr? Kimlər bilsə – dinçilər, kommunistlər, demokratlar? Məlik soruşmadı, əvvəla Ərxan olanı deməyəcəkdi, ikinci də Məliyin bu məsələlərə zərrə qədər də marağı qalmamışdı. Bütün bu olub-keçənlərdən sonra onu dünyaya bağlayan heç nə yoxdu. Xəstəliyindən də, ömür möhlətinin bitə-bitdə olmasından da xəbərdar idi. Tək bir arzusu vardı – heç olmasa həyatının sonunda bircə dəfə də olsa arvadını, övladlarını görsün.

Ərxan sanki möcüzələr aləmindən gəlmiş bir sehrbaz idi. Məliyin bu istəyini sanki gözlərindən oxumuşdu.

– Xanımla, balalarla görüşmək istərdinizmi – deyə soruşanda Məlik qulaqlarına inanmadı. Bu mümkün idimi? Ərxan: – Dünyada mümkün olmayan heç nəsnə yoxdur – dedi – Mən danışmışam. Sizi Türkiyə qəzetlərinin birindən ezam edəcəklər, guya hər üç zona haqqında materiallar hazırlayacaqsınız. Məlik: Axı heç bir türk jurnalistini ora buraxmırlar – dedi. ORA kəlməsini işlətdi, Bakıya, Bakısına Zona deməyə dili gəlmirdi.

İndi Vətən Məlikçün ORA idi.

Ərxan: – Doğrudur – dedi – yalnız Türkiyədən deyil, ümumiyyətlə bütün dünyada hər üç zonanı görəcək ilk jurnalist olacaqsınız. Çünki ictimai təmayülündən, siyasi baxışlarından, yaşadığı ölkədən asılı olaraq hər hansı Zonaya tək-tük hallarda jurnalistlər gələ bilir, amma hər üçünə getməyə icazə alan ilk və tək jurnalist siz olacaqsınız..

Axır ki dözmədi, soruşdu:

– Bunu necə edə bildin, Ərxan?

– Kimsəyə desəniz ki, bunu mən etmişəm, bir daha nə siz, nə də heç kəs mənim üzümü görə bilməyəcək.

– Kimsəyə demərəm, əlbəttə, amma mənə ki, deyə bilərsən.

– İnciməyin, yox, deyə bilmərəm. Bəlkə haçansa elə bir vaxt gəldi ki, bu sirri aça bildim, hələlik isə sizə yalnız daşdan keçən sənədləri almaq, anketləri doldurmaq lazımdır – təkrar etdi – Sizə elə sənəd veriləcək ki, hər üç Zonaya gedə biləsiniz.

– Nəyimə lazımdır üç Zona – axır ki, bu sözü işlətməli oldu – mən yalnız ailəmlə görüşmək istəyirəm.

Ərxan kədərlə gülümsündü: – İş ondadır ki, onlar hərəsi bir zonada yaşayır. Bir zonadan o birinə keçməksə yasaqdır.

Hər şeyi Ərxan dediyi kimi etdi, lazımı sənədləri aldı. Üç ayrı-ayrı sənəddə göstərilirdi ki, o, qəzetəçi Məlik Məhmədoğlu, yazılar hazırlamaq üçün Behişti Badi-kubəyə, Bakı Kommunasına və Baku-sitiyə ezam olunur.

Özü pərdə arxasında qalsa da, bütün bunlar Ərxanın yardımıyla olunduğunu Məlik yaxşı dərk edirdi. Amma bilinmirdi, bütün bunların müqabilində Ərxan ondan nə istəyəcək. Artıq xeyli müddətdi ki, insanların təmənnasız xeyirxahlığına, haçansa edilmiş yaxşılığı unutmamalarına inamını itirmişdi.

Hər halda nə olur-olsun, Ərxan ona ailəsindən xəbər gətirmişdi. Məlik sonu hətta ölümlə nəticələnə biləcək bu səfərə çıxmağa hazırdı.

Blokada şərtlərinə görə Türkiyədən xaricə yalnız bir yolla çıxmağa icazə verilirdi – Cenevrəyə uçmalıydı, oradan Amerika uçağıyla yola düşə bilərdi.

Ərxan onu agah etmişdi ki, üç Zonanın bir aeroportu var və o, Dekade adlanır.

– Dekade nə deməkdir?

– DKD – abbreviaturadır, üç sözün baş hərfi – Din, Kommuna, Demokratiya.

Məlik gülümsündü – son illərdə üzündə görünən ilk təbəssüm idi.

Ərxan ona lazımı izahatlar verirdi: – Üç Zonanın bir hava limanı olduğundan üç sərhəd məntəqəsindən, üç gömrükdən keçməli olacaqsınız. Çalışın, az şey götürün, özü də hər Zonanın xüsusiyyətini nəzərdə tutun ki, gömrükdə əlinizdən almasınlar. Hə, bir də – Ərxan əlini

cibinə atdı, bir xeyli Amerika dolları çıxarıb Məliyə uzatdı – Orada hər addımda sizə lazım olacaq.

Məlik pulu heç cür götürmək istəmirdi.

– Param var – deyirdi.

Ərxan: – O parayla siz heç hava alanından çıxa bilməzsiniz, ondakı olsun şəhərə çatmaq. Özünüz bilin, bu paranı götürməsəz, getməyə dəyməz.

Məlik istər-istəməz pulları aldı: – Bilmirəm, sənin xəcalətindən necə çıxacam – dedi.

Ərxan: – Mən ömrüm boyu sizin xəcalətinizdən çıxa bilməyəcəm. Siz mənim balamı xilas etmisiniz.

Birdən Məliyin yadına düşdü ki, çox illər qabaq, hələ O həyatda və O vətəndə Ərxanın çox gənc yaşlarında iki oğlu olmuş və dünyaya gələndən bir ay sonra hər ikisi ürək çatışmamazlığından ölmüşdü.

Üçüncü oğlu da eyni ürək şikəstliyiylə doğulanda o vaxtlın çox populyar jurnalisti Məlik Bakının ən mahir mütəxəssis həkimlərini ayağa qaldırdı və uşaq xilas olundu. Bilmirdi uşaq indi həyatdadırmı, amma hər halda soruşdu: – Oğlun necədir? – Adını unutmuşdu.

Ərxan: – Top kimi – dedi və əlavə etdi: – sizin sayənizdə.

Məlik bir daha təşəkkür etdi, pulları cibinə qoyanda: – imkanım olan kimi borcumu qaytaracam – dedi.

Ərxan: – Siz mənə yox, mən sizə borcluyam – dedi – Yadınızdamı, o vaxt, mətbəədə yığıcı köməkçisi işləyirdim, siz də hələ məşhur jurnalist yox, adicə müxbir idiniz. Yenə də donluqlarımızı yubatmışdılar, cibimdə çörək almağa bir qəpik pulum yoxdu. Siz bunu bildiniz və cibinizdən iki manat çıxardınız: – mənim də indi olanım budur – dediniz – bir manatını, tən yarısını mənə uzatdınız.

– Bir manat hara, sənin mənə verdiyin bu paralar hara?

– O bir manat bu paralardan artıqdır. Çünki mən indi paramın ancaq kiçik bir hissəsini sizə verdim, siz isə o vaxt olanınızın yarısını qıydınız mənə.

Vidalaşarkən Ərxan: – Orda hər nə görsəniz, bədbinləşməyin – dedi – çox qəribəliklərlə rastlaşacaqsınız.

Doğrudan da qəribəliklər elə uçaqdaykən başladı.

Cenevrədən qalxmalarından üç saat yarım keçmiş təyyarə bələdçiləri üç dildə – ingilis, rus və fars dillərində – elan etdilər ki, uçaq enir, sərnişinlər qoruyucu kəmərləri bağlamalıdır.

Məlik pəncərədən yerə baxırdı. Neçə ildir ancaq hərdən-birdən yuxularında gördüyü şəhəri göyün ucalığından seyr edirdı. Şəhərin çox hissəsi ya tamam qaranlıqdı, ya da adda-budda zəif işıqlar görünürdü. Bir hissəsi isə gur çil-çırağa qərq olmuşdu.

Bələdçi bir-bir sıraları gəzib qadın sərnişinlərə çadralar paylayırdı. İndiyə qədər üzü açıq, hətta mini-tumanlarda və dekolteli paltarlarda oturmuş qadınlar bir-bir çadralara bürünməyə başladılar. Qadın bələdçilər diqqət edirdilər ki, saçlarının bircə tükü də görünməsin. Məlik buna hazır idi, bilirdi ki, birinci olaraq Behişti Badi-kubənin sərhəd məntəqəsindən keçəcəklər, odur ki, ilk olaraq bu Zonanın hicab qanuna tabe olunmalıdır. Amma saqqallı bələdçi ona yanaşıb qalsutukunu açmağı təklif edəndə, təəccübünü gizlədə bilmədi. – Mənim bu qalstukumun kimə nə zərəri dəyə bilər?

Bələdçi başını buladı: – Vaqiən ağa düz buyurur, amma qəvaid belədir – dedi.

Məlik fikir verdi ki, digər sərnişinlər də dinməz-sölyməz qalstuklarını çıxarıb bələdçiyə verir və bələdçi hər qalstukun üstündə sancaqla sərnişinin bilet nömrəsini qeyd edir. Sərnişinləri arxayınlaşdırdı ki, geri dönərkən qalstukları qaytarılacaq.

Təyyarədən enəndən sonra ərəb əlifbasıyla BEHİŞTİ BADİKUBƏ sözləri yazılmış iri lövhənin altında yerləşən sərhəd məntəqəsinə yanaşdılar. Məntəqənin üstündə hilallı yaşıl bayraq dalğalanırdı.

Sərhədçilər hər sərnişinin sənədlərini azı yarım saat yoxlayırdılar, dönə-dönə pasportlardakı şəkillərə və pasport sahiblərinin sifətlərinə diqqətlə baxır, bəzən harasa gedib nə barədəsə məsləhətləşir, sonra geri qayıdıb sənədləri bir daha yoxlayırdılar. Bir neçə sərnişini kənara çağırıb harasa apardılar.

Məliyin ürəyi şiddətlə döyünürdü, indi bir şey tapacaqlar, bir qəmbərqulu çıxacaq və bu qədər arzu etdiyi, bu qədər vaxt gözlədiyi istəyinə çata bilməyəcək. Sərhədçinin səsi onu fikirlərindən ayırdı. Növbə Məliyə çatmışdı. Sərhədçi: – Ağa, hüviyyət kağızını göstər – dedi.

Məlik pasportunu və ona verilən sənədi uzatdı. Sərhədçi aldıqlarını xeyli müddət o yan bu yana çevirəndən sonra, möhür basıb qaytardı. Məlik ürəyində "Allaha çox şükür" deyib sərhədi adladı.

Gömrükdə yoxlamalar daha uzun çəkdi və növbə Məliyə düz iki saatdan sonra çatdı. Saqqallı gömrükçü çantasını açmağı tələb etdi, çantaya yığdığı şeyləri, üç dəst köynəyi, alt və ev paltarını, sabunu, diş fırçası və diş məcununu, ülgücünü, bir blok siqareti və kasetçalarla iki

kaseti ələk-vələk elədi, nəhayət ikinci qalstuku əlinə götürüb, soruşdu ki, bəs təyyarədə qalstukunu almayıblar?

Məlik: – aldılar – dedi.

Gömrükçü: – Bəs onda bu nəmənədi? – deyə çantadakı qalsutuku havada fırlatdı. Məlik bilmirdi nə desin: – Bu da... be... belə – ikinci qalstuk... ehti... ehtiyat üçün – deyə kəkələdi. Elə bil sərhədçilərin də, gömrükçülərin də zəhmi onu basmışdı, heç bir günahı olmadan özünü müqəssir hiss edirdi.

Gömrükçü: – Şeytan xaltasının biri bəs eləmir? – dedi – bəlkə bunu kiməsə bəxşiş vermək ya satmaq istəyirsən?

Məlik:– Əstafurullah – dedi – mən alverçi deyiləm, bu köhnə qalstuku da kimə bağışlaya bilərəm?

Gömrükçü onu dinləmədən qalstuku kənara, müsadirə olunmuş əşyalar qutusuna atdı. Bu qalstukla müəyyən xatirələr bağlıydı və Məlik onu itirmək istəmirdi. Ərxanın tövsiyyəsi yadına düşdü:bu əlbəttə risq idi, hər şeyi korlaya bilərdi, amma tərs damarı tutmuşdu və ətrafa döyükübcibindən ehmallıca əlli dollar çıxardı, gömrükçüyə tərəf tutdu, – bu qalstuk qardaşım rəhmətlikdən yadigardı – dedi.

Gömrükçü cəld bir hərəkətdə əlli dolları ovcunda gizlədib:

– Xub, bu başqa məsələ – dedi – madam ki, rəhmətlik bəradərindən yadigardır, nə söz ola bilər – qalstuku qutudan çıxarıb Məliyə uzatdı. Bütün bu hərəkətləri – qalstuku qutuya atmağı və qutudan çıxarmağı, pulu qamarlamağı elə becid və məharətlə icra edirdi ki, bu işin peşəkarı olduğu aydınlaşırdı.

Məlik bu sərhədi və bu kömrüyü keçib ikinci sərhəd məntəqəsinin qabağına çıxdı. Məntəqənin üstündə qırmızı rəngli oraq-çəkicli bayraq dalğalanırdı, kiril əlifbasıyla azərbaycanca və rusca BAKI KOMMUNASI "БАКИНСКАЯ КОММУНА" sözləri yazılmışdı.

Divarda çox iri portret vardı. Zəhmli kişinin sifətinin xeyli hissəsini zil qara eynək şüşələri tuturdu. Portretin üstündə böyük hərflərlə:

KOMMUNİZMİN QƏLƏBƏSİ LABÜDDÜR, ÇÜNKİ MÜTLƏQDİR. MARAT.

Portretin altında isə BAŞ KOMİSSAR MARAT YOLDAŞIN RƏHBƏRLİYİ ALTINDA BÜTÜN DÜNYADA KOMMUNİZMİN TAM QƏLƏBƏSİNƏ DOĞRU İRƏLİ – sözləri yazılmışdı.

Sərhəd məntəqəsinə növbədə dayanarkən Məlik Ərxanın dediklərini xatırladı: Baş komissar Marat Qaragözovun gözlərini görən ol-

mayıb. Deyilənə görə gözləri çaşdı, odur ki, heç vaxt tünd qara eynəyi çıxarmır.

Xeyli müddətdən sonra növbə Məliyə çatanda sərhədçi sənədlərinə gözucu nəzər salıb:

– Anketi bizim əlifbayla doldurun – dedi – Azərbaycan və rus dillərində.

Məlik cərgədən çıxdı, piştaxtaya yanaşıb cavabları kiril əlifbasıyla yazdı və geri dönəndə təzədən növbəyə durmalı oldu.

Nəhayət, sərhədi keçdi, amma Gömrükdə yenə ilişdi. Gömrükçü kasetçaları və kasetləri əlində fırladıb: – Bunlar nədi? – dedi.

Məlik: – Musiqidir – dedi – Azərbaycan bəstəkarlarının mahnıları. Türkiyədə anonim Azeri şarkıları adıyla çıxıb.

Gömrükçü:

– Türkiyədə? – dedi – bura pantürkist kasetləri gətirmək olmaz.

Məlik, ürəyində:– Ya bəxt – deyib əlli dolların ucunu gömrükçüyə göstərdi:

– Keçən əsrdə yaşamış sovet bəstəkarlarının mahnılarıdır.

Gömrükçü eyni cəld hərəkətlə pulu aldı – hə, sovet bəstəkarları – dedi – onda mojna.

Gömrükçü indi də kasetçaları əlində o yan bu yana çevirirdi.

– Bəs bu nədi?

– Bu da kasetçaldıran.

Gömrükçü kasetçaların düyməsini basdı, radiodan səslər gəldi.

– Bu ki radiodur – dedi.

– Həm radiodur, həm kasetçalar.

– Bizdə yad radiolara qulaq asmaq zapreşeno.

Məlik əlli dollar da tərləməli oldu. İndi bu işi daha arxayın edirdi.

Üçüncü sərhəd məntəqəsinə çatdı.

Burda da göy bayraq dalğalanırdı. Məlik acı-acı düşündü: üç sərhəd – üç bayraq – yaşıl, qırmızı, göy. Üçü bir yerdə olsaydı keçmiş Azərabycanın bayrağı olardı.

Sərhədçi sənədlərə göz ucu baxıb təklif etdi ki, Məlik baş barmağını kiçik disketə bassın, sonra onun barmaq izləri olan disketi bilgisayara saldı, hansısa düymələri basıb ekrana baxdı və: – Keçə bilərsiniz – dedi.

Bu gömrükçü də əşyaları bir-bir yoxladı, soruşdu:

– Narkotik?

Məlik: – Yox canım, məndə narkotik nə gəzir?

Gömrükçü çantadakı bir blok türk siqaretini götürdü:

– Bu nədir?

– Siqaret. Türk siqareti.

Gömrükçü: – Bura Amerika siqaretlərindən başqa ayrı siqaret gətirmək olmaz – dedi – musadirə edilir – sonra nədənsə əlavə etdi – Heç türk siqareti çəkməmişəm.

Məlik: – Mən yaman çəkənəm – dedi – Bu siqaretlərə də alışmışam.

Yarsı sənin, yarsı mənim.

Gömrükçü: – Okey – dedi və cəld bloku açıb altı qutu çıxardı, dördünü Məliyə qaytardı.

Gömrükdən keçən kimi Məlik çox iri reklamlar gördü. Birində təyyarənin içində xoş bir təbəssümlə sərnişinlərə (onların da sifətlərində təbəssüm vardı) "Koka-kola" paylayan stüardessanın şəkli və altında latın hərfləriylə yazı verilmişdi:

ÇIXANDA YOLA – İÇ "KOKA-KOLA".

İkinci reklamda kovboy qiyafəli, iri şlyapalı, böyründə yekə tapancalı gənc oğlan – (gülüşü bu qulağından o qulağınadək) təyyarə trapından düşən sərnişinlərə açıq Malboro qutusunu uzadırdı. Altında latın hərfləriylə GƏLMİSƏN BURA, AL, ÇƏK "MALBORO" – sözləri yazılmışdı.

Məlik aeroport binasından açıq havaya çıxanda saatına baxdı: gecə üçün yarısı. Təyyarə yerə enəndə gündüz dördün yarısı idi. Sərhədlərdən və gömrüklərdən on bir saata keçmişdilər. Cenevrədən burasa üç saat yarıma gəldik – deyə düşündü.

Taksi dayanacağına yanaşıb ən qabaqda dayanan maşına yanaşdı, əlini uzadıb qapını açmaq istədi, qapı içəridən bağlıydı, bu zaman arxa sıralardan çıxıb gələn taksi onun qarşısında dayandı. Sürücü qapını açıb onu içəri dəvət etdi.

Məlik arxa tərəfdə əyləşdi, elə bu vaxt kimsə maşının qabaq qapısını açdı. Saqqallı cavan oğlan Məliyə müraciət edərək: – Ağa, yorulmuyasız – dedi – bəndəniz də şəhərə gedir, qailsə mən də sizlə gedim.

Məlik: – Buyurun – dedi.

Taksi hər iki tərəfinə məftilli çəpərlər çəkilmiş yolla irəliləyirdi. Yol sağ tərəfdə, məftilli çəpərin dalında yanan gur çil-çıraqla işıqlanırdı.

Sol çəpərin arxası qaranlıq idi.

Məlik fikir verdi ki, məftil çəpərlərin dibində xeyli it ölüsü sərələnib.

– Bu leşlər niyə bura düşüb?

Şofer: – Əhməq məxluqdur da – dedi – özlərini çəpərə çırpır, çəpərə də bərq buraxıblar.

– Niyə elektrik buraxıblar ki?

Saqqallı oğlan:

– Kafərlər buraxıb – dedi – Qorxurlar ki, o tayın adamları qaçıb bizim tərəfə keçər.

Sürücü:

– Ac itlərdi də – dedi – gecə hamısının leşin yığışdırıb yandıracaqlar.

Məlik ətraflara baxır, amma heç yeri tanımırdı. Məftil çəpərlərin arxasında şumlanmış neytral sahə, sahədən o yana sağda rəngbərəng reklamların latın həfrlriylə yazılmış mətnlərinə görə buranın Baku siti olduğunu müəyyənləşdirmək olardı.

Sol tərəf zülmət qaranlıq idi:

– Bu tərəf Badi-Kubədir?

Saqqallı oğlan:

– Xeyr ağa, xeyr. Bu tərəf də kafərlərin şeytan yuvasıdır. Özləri Bəkinski qəmuna deyirlər. Bizim Behişti Badi-Kubəmiz irəlidədir.

Birdən Məlik Suraxanı yolunu tanıdı – Bu Suraxanı yoludur – dedi – eləmi?

Şofer: – Bəli ağa, ora Surə xanədir.

Məlik köksünü ötürdü: – Uşaqlıqda burda yaşamışam – dedi – Evimiz Atəşgahın yanında idi.

Sürücü: – Harda? – deyə xəbər aldı

Saqqallı oğlan: – Atəşpərəstlərin bir yeri vardı – deyə izah etdi.

Məlik: – İndi durmur Atəşgah?

Oğlan: – Yox, söküldü – dedi – müsəlman kişvərində kafər bütxanəsinə nə hacət?

Taksi bağlı şlaqbaumun qarşısında dayandı, polis xidmətçisi onlara yanaşdı, hər üçü sənədlərini göstərdi, polis: – Xeyli xub. Xeyri şəb – deyə şlaqbaumu qaldırdı.

Saqqallı oğlan:

– Ağa, Behişti Bad-Kubəyə xoş gəldiniz, səfa gətirdiniz – dedi.

Qarşılarında böyük bir qafilə irəliləyirdi – arabalar, arabaların ardından piyada gedən xeyli adam.

– Bunlar kimdi, hara gedirlər gecənin bu vaxtında?.

Sürücü: – Yanardağa – dedi.

Məlik maşının qabaq güzgüsündə gördü ki, saqqallı oğlan sürücüyə məzəmmətlə baxır.

Saqqallı oğlan: – Xeyr ağa – dedi – şofer bəradərimiz düz buyurmadı, bunlar Nardaran pirinə ziyarətə gedirlər. Gecəykən yola çıxıblar ki, sübh namazına ora çatsınlar.

Məlik Nardaranın buralardan xeyli uzaq olduğunu xatırladı:

– Bu qədər yolu piyada gedəcəklər?

– Ağa bilir ki, ziyarətə piyadə getməyin savabı daha əfzəldi.

Taksi qafiləni ötüb keçdikcə faraların işığında Məlik arabalara yüklənmiş qazanlara diqqət elədi.

Saqqallı oğlan sürücüyə: – "İrşad" mehmanxanasına sür – dedi

Məlik dünyagörmüş adam idi. Elə birinci addımdan duymuşdu ki, bu saqqallı oğlanı onu güdmək üçün göndəriblər, amma görünür çox naşıymış, özünü çox tez faş etdi, yoxsa "İrşad" otelinə düşəcəyimi bilirsə də dilindən qaçırmazdı.

– Nə bildiniz ki, mənə "İrşad" otelində yer ayırıblar – deyə soruşmaqdan özünü saxlaya bilmədi.

Şofer: – Tək bir mehmanxana var da – dedi.

Saqqallı oğlan yenə şoferə məzəmmətlə baxdı: – Yox – dedi – başqa yerlər də var, amma fikr elədim ki, sizin kimi alicənaba yaraşan "İrşad" olar. Yoxsa bir qələtim var?

– Yox, düz deyirsiz, "İrşad"da yer ayırıblar mənimçün. Bağışlayın, tanış olmadıq, mənim adım Məlikdir, Məlik Məhmədoğlu, jurnalistəm – qoy yazıq pis vəziyyətdə qalmasın – deyə düşündu, güya özüm haqqında bu məlumatları mən özüm verirəm ona, hərçənd ki, yəqin hamısını bilir.

Saqqallı oğlan: – Çox xoşhaləm – dedi – sizin kimi məruf və namdar insanla tanış olmağa. Mənim ismim İmamquludur. İmamqulu Bəhbəhani.

Taksi artıq şəhərin yarıqaranlıq küçələriylə irəliləyirdi, birdən Məlik diksindi – taksilərinin faralarıyla işıqlandırılmış yanıq-uçuq binanı tanımışdı – bu keçmiş İsmailiyyə – Akademiya binası idi. Binanın yalnız divarları qalmışdı, çərçivələri yanıb kösöy olmuş pəncərələri skeletin, ölü kəlləsinin oyuq göz çuxurlarını andırırdı.

– Bura niyə bu gündədi?

İmamqulu: – O məlum məğşuşat günlərində kafərlər xakisar eləyib buranı – dedi.

Məlik: – Dur, dur – deyə həyəcanla səsləndi – İsmailiyyə binasının yanındakı yer bom boş çöllük idi – axı burda bir bina da vardı – əlyazmaları olan bina.

İmamqulu: – Ağa, səd heyf, şuriş zamanı o bina da, bu xiyabandakı çox bina da yandı – dağıldı.

– Necə yandı, bəs əlyazmaları?

– Ağa, səd heyf, bina yananda əlyazmaları salim qalarmı?

Məlik başını tutdu: – Aman Tanrım, bütün tariximiz, keçmişimiz o yazılarda idi.

– Ağa, siz bərgüzidə fərhəng adamısız, ehsasatınızı başa düşürəm. Amma çi faidə? Qəzavü-qədər beləymiş. Leyk mürur zaman xeyli yeni kitab nəşr olunub. Elə bu günlərdə ağayi Kəsrəvinin bütün kitabları çıxdı. – Birdən nə isə yadına düşmüş kimi dedi: – Söz yerinə çəkər, heç bilirsiz bu hansı xiyabandır?

– Təxmin edirəm, bir vaxt bura Nikolayevski, sonra Kommunist, sonra da İstiqlaliyyət küçəsi adlanıb.

İmamqulu məmnun gülümsədi:

– İndi Əhməd Kəsrəvi xiyabanıdır. Bizim həqiqi mənşəimizi təyin edən alimi-büzürgün naminə.

Taksi adı neçə dəfə dəyişən, binaları dönə-dönə yanıb dağılan bu talesiz küçəylə irəliləyirdi. Məlik xatırladı ki, burada gözəl bir bağ vardı. İndi tamamilə bom boş, ağacsız bu sahəni yalnız yanındakı Filarmoniya binasına görə tanıya bildi. Şükür, deyəsən Filarmoniya salamat qalıb. Amma buranın indi məhz Filarmoniya olmasından şübhəliydi.

Filarmoniyanı göstərib: – Ora nədir? – soruşdu.

İmamqulu və sürücü eyni vaxtda:– Cümə məscidi – dedilər. İmamqulu əlavə etdi: – Behişti Bad-Kubənin ən böyük məscididir. Sübh əzanını onun minarələrindən çəkəndə eşidəcəksiz, "İrşad" mehmanxanası bura lap yaxındır.

Mehmanxananın qabağına gəlib çatdılar. Sürücü Məliyin çantasını götürdü. İmamqulu da maşından düşdü: – Ağayi Məlik – dedi – icazə verin xidmətinizdə olum.

Məlik cibindən dollar çıxarıb sürücüyə vermək istəyəndə İmamqulu: Ağa, o şeytan pulunu qəbul etməz – dedi – heç narahat olmayın, verdim – dedi.

Mehmanxananın inzibatçısı – saqqalı ağarmış kişi yuxulu gözlərini ovuşdura-ovuşdura Məliyin pasportunu aldı, ərəb əlifbasıyla anketi uzatdı ona.

Məlik adını yazmağa başlamışdı ki, çiyninin arxasından ona baxan İmamqulu: – Ağa, şeytan əlifbasıyla yazmaq qəvaidə ziddir – dedi.

– Ərəb əlifbasıyla doldurmaq lazımdır?

– İslami əlifbayla

Məlik: – Mən ərəb... e... islami əlifbayla oxuya bilirəm, amma heyf ki, yaza bilmirəm – dedi.

– Siz heç rəncidə olmayın, mən yazaram.

Adı, soyadı, doğum ili, doğum yeri – Məlik bir-bir bunları İmamquluya diktə etdikcə duyurdu ki, bütün bu məlumatları İmamqulu elə onun özü qədər bilir.

Nəhayət, formal işlər bitdi. İnzibatçı açarı Məliyə uzadıb: – şumarə 12-dedi.

İmamqulu Məliyin çantasını götürüb onu ta ikinci mərtəbəyə, otağının qapısına qədər ötürdü, içəri girib bir nəzər də atdı, sonra:

– Şəb – xeyir – dedi – Allahın inayətiylə inşallah yenə görüşərik.

Məlik saatına baxdı. Dördə on beş dəqiqə işləyirdi. Yerli vaxtla altıya. Yerli vaxt!.. – acı-acı düşündü – doğma şəhərimin vaxtına yerli vaxt deyirəm. Əlbəttə belə erkən saatda Aypəriyə telefon edə bilməzdi. – Bıy – otağa göz gəzdirdi – heç telefon da yoxmuş ki...

Səhər açılsın, düşüb aşağıdan zəng edər. Yatağına girdi və bu uzun günün bütün qarabasma kimi görünən təəssüratlarından sonra daş kimi yatdı.

İmamqulu düz deyirmiş. Səhərisi gün də bir-birini gördülər. Məlik səhər otelin birinci mərtəbəsinə enəndə İmamqulu Bəhbəhani yumşaq divanda bardaş qurub oturmuşdu. Məliyi görüb ayağa qalxdı.

– Ağa, sabahınız xeyir. Dedim hər halda qəribsiniz. Bəlkə yardıma ehtiyacınız oldu. Qulluğunuzda amadəyəm.

Məlik: – Sağ olun – dedi – bir çay içmək pis olmazdı.

– Əlbətməkin, əlbətməkin.

Kiçik çayxanaya keçdilər. Saqqallı xidmətçi qabaqlarına çay-çörək gətirdi. İmamqulu əlindəki qəzeti Məliyə uzatdı: – “Siratül-müstəqim” rüznaməsidir – dedi – baxırsız?

Məlik: – Sonra baxaram – dedi – qəzetin birinci səhifəsindəki böyük şəkli göstəriib: – Ağayi Müşteyiddi? – deyə xəbər aldı.

İmamqulu: – Bəli – dedi – Ali müşteyidimiz zişan ağayi Badikübeyidir. Möüzəsi nəşr olunub. Bu axşam İman televizionunda da bərnaməsi var, vaqiən arif-bəsər, əhli ürfandır. Elmi – əbdanda da, elmi ədyanda da bibədəl zatdır. Manəndi yoxdur.

Məlik haçansa klassik ədəbiyyatdan bildiyi, amma az qala unutduğu fars-ərəb sözlərini İmamqulunun dilindən ölçüsüz-biçisiz eşitdikcə: – fağır dilimiz – deyə düşünürdü – gör nə günə qalıb ki, bu Azərbaycan balası iki cümləni təmiz ana dilində deyə bilmir.

Məlik artıq aydın dərk edirdi ki, burada, bu Behiştdə qaldığı bütün müddət ərzində İmamqulu onun yaxasından əl çəkən deyil, hər addımını qarabaqara izləyəcək. Arvadıyla görüşmək istəyini də biləcək,

bəlkə elə çoxdan bilir. Əlbəttə bilir, lap yəqin bilir. – Mən bir yerə telefon etməliyəm – dedi.

– Baçeşm ağa, şümarəni ərz eləyin.

Məlik Aypərinin telefon nömrəsinin dörd rəqəmini dedi, axırıncı rəqəmi deməzdən, ağlına nə isə gəldi, tamam başqa bir rəqəm dedi. İmamqulunu yoxlamaq istədi. Görən İmamqulu bu nömrəni də bilirmi?

– Telefon edin, Aypəri xanımla danışacam.

İmamqulu bir qədər təəccüblə: – Kiminnən? – deyə soruşdu.

– Aypəri xanımla. Mənim arvadımdır – İmamqulunun mat-mat baxdığını görüb – övrətim – deyə əlavə etdi – zövcəm, halalım...

– Əlbətməkin, əlbətməkin...

İmamqulu inzibatçıya yanaşıb onunla uzun-uzadı nə isə danışdı.

İnzibatçı telefonu götürüb harasa zəng elədi. Kiminləsə də danışdı, sonra dəstəyi qoyub İmamquluya razılıq işarəsi verdi. İndi də telefonu İmamqulu qaldırdı, Məlik verən rəqəmlər olan kağıza baxıb nömrələri çəkməyə başladı, sonra birdən, qaşları çatıldı. Məlik: yəqin ki, axırıncı rəqəmə təəccüb qalıb, – deyə düşündü – görəsən gümanım düz çıxacaqmı.

İmamqulu əvvəl kağızı götürüb Məliyə yanaşmaq istədi, sonra nə isə fikirləşib axırıncı rəqəmi də çəkdi. Görəsən nə çəkdi, Məlik yazan səhv rəqəmimi? Yaxud hər ikisinin bildiyi doğru rəqəmi çevirib oyunu açıq aparmaq qərarına gəlib.

Bir az gözləyib danışmağa başladı, nə danışdığını Məlik eşitmirdi.

Sonra dəstəyi kənara qoyub Məliyə əl elədi: – Buyurun ağa – Məlik durub yaxınlaşanda dəstəyi ona uzatdı: – xanım Mahruxdur – dedi.

– Xanım Mahrux? Xanım Mahrux kimdir?

İmamqulu: – Buyurdunuz ki, zövcənizdir.

Bəlkə Məlik yanılırmış, bəlkə İmamqulu axırıncı rəqəmin doğrusunu həqiqətən də bilmirmiş, Məlik yazan nömrəni çevirib və ayrı yerə düşüb. Kağızı İmamquludan alıb: – Axırıncı rəqəmi səhv yazmışam – demək istəyirdi ki, birdən ağlına nə isə gəldi – telefon dəstəyini götürüb – Allo – dedi.

Cavab gəldi:

– Bəli.

Bu o idi, onun Aypərisi. Yəqin özü kimi səsi də xeyli qocalmışdı, aradan gör neçə il keçmişdi. Səsi boğuq, solğun, kədərli idi, amma onun səsiydi. Məlik bu səsi dünyada heç bir səslə dəyişik sala bilməzdi.

Məlik: – Salam Aypəri, mənəm – dedi.

Qadın: – Bağışlayın, ağa, səhv telefon etmisiz – dedi

– Necə səhv? Mənəm Aypəri, Məlikdi. Ancaq üç gün bundan qabaq sənin sağ-salamat olduğunu bilmişəm, adresini, telefonunu veriblər mənə. İndi burdayam, "İrşad" otelində. Hara gəlim? Necə görüşək?

Dəstək tam bir sükuta qərq olmuşdu. Məliyə elə gəldi ki, boğuq hıçqırıq səsi eşidir. Bəlkə də yanılırdı. Bir azdan sonra qadın:

– Bir saatdan sonra "İrşad" mehmanxanasının lobbisinə gələrəm – dedi və dərhal xətti qapatdı.

Məlik saatına baxıb İmamquluya yanaşdı:

– Çox sağ olun – dedi – məni calaşdırdınız. Amma niyə onu Mahrux xanım adlandırdınız.

– Özü dedi. Soruşdum kimdi, dedi: xanım Mahrux.

İmamqulu son rəqəmin üstünü vurmadı, Məlik də özünü o yerə qoymadı. Onsuz da hər şey aydın idi, izaha nə ehtiyac qalırdı.

* * *

Məlik mehmanxananın foyesində üzü qapıya tərəf oturub gözləyir, siqareti – siqaretə calayırdı. İmamqulu bir qədər aralıda oturub, guya ki, "Siratül – müstəqim" qəzetini oxumaqda, ara-sıra da "İMAN" telefiziyasının moizələrinə qulaq asmaqda idi.

Məlik: – Televiziya ancaq moizələr verir? – deyə xəbər aldı.

– Yox niyə ki, xəbərlər, dualar, din tarixinə aid verilişlər... Məscidlərdən beş rükət namaz da göstərir.

– Bəs tamaşa, şeir, musiqi?

– Aşura günü şaxsey-vaxsey göstərilir, mərsiyyələr, nohələr oxunur.

– Rəqs, mahnı, muğam necə?

– Əstafürrullah ağa, bunlar ki, şeytan əmməlləridir.

Məlik:

– Muğam da? – deyə soruşmaq istəyirdi ki, qapıdan girən qadını gördü. Təpədən dırnağa qara çadraya bürünmüşdü, bircə gözləri görünürdü, Məlik onu gözlərindən tanıdı. Haçansa bu qaynar baxışlı gözlər indi sönük, yorğun, kədərli idi – amma hər halda onun, Aypərinin gözləri idi.

Məlik yerindən sıçradı, neçə ildi öldüsünü – qaldısını bilmədiyi arvadına tərəf atıldı. Qadın sanki həyulə görübmüş kimi geri çəkildi, bir qədər aralı dayandı. Məlik də duruxdu, məsafəni yavaş addımlarla qət edib ağuşunu açmaq istədi. Qadının yenə bürüşüb bir addım geri çəkildiyini görüb dayandı, ancaq əlini uzatdı.

Əli havada qaldı.

Məlik hiss edirdi ki, İmamqulu qulaqlarını şəkləyib onların hər hərəkətini izləyir.

Qadın: – Bağışlayın ağa – dedi – naməhrəmə əl verə bilmərəm.

– Naməhrəmə? Mənəm e Aypəri, Məlik, sənin ərin.

Qadın: – Mənim adım Mahruxdur – dedi.

– E... e... Mahrux olsun, hər halda mənim kəbinli arvadımsan.

Qadın: – Yox – dedi – məsələ ondadır. Biz heç vaxt şəriətlə kəbin kəsdirməmişik.

Məlik deməyə söz tapmırdı.

– Yaxşı – dedi – bəs balalarımız nə olsun? İki balamız var axı. Onların anası deyilsən?

Qadın: – O mənim günahım idi – dedi – Min dəfə tövbə etmişəm ki, qadir Allah günahımı bağışlasın.

İmamqulu özünü saxlaya bilməyib söhbətə qarışdı:

– Allah rəhimlidir, rəhmandır – dedi – keçər günahınızdan.

Məlik donub qalmışdı: – Necə günah? Məgər ana olmaq günahdır?

– Şəriətlə kəbin kəsdirməmişiksə, əlbəttə günahdır. Zinadır – dedi Aypəri-Mahrux.

İmamqulu onun sözünə qüvvət verdi: – Mənkuhə deyil – dedi

– Yaxşı, əyləş... ee... əyləşin.

Qadın qarşıdakı kürsüdə, Məlikdən və İmamquludan xeyli aralı oturdu.

Məlik danışmağa söz tapmırdı, bilmirdi nə desin, nədən başlasın.

Qadın da dinib-danışmırdı. Aralığa üzücü sükut çökmüşdü. Nəhayət Məlik:

– Yaxşı, bəs Beyrəklə, Burlayla da əlaqən yoxdur? Doğma övladlarınla?

Mahrux-Aypəri:

– Onlar mənim övladlarım deyil – dedi, – Şeytani-büzürglərin xidmətində olan mürtədlərdir.

Məlik yalnız: – əcəbdir – deyə bildi...

Yenə sükut çökdü. Mahrux: (artıq o Məlikçün doğrudan da uzun illər bir yastığa baş qoyduqları arvadı Aypəri yox, heç bir vaxt tanımadığı Mahrux idi):

– Ağanın mənə bir ərzi yoxsa mürəxəssis olum – dedi.

Məlik dərk edirdi ki, bax indi, bu dəqiqə keçmiş arvadını yenidən, bu səfər həmişəlik itirəcək.

– Dayan görüm, mürəxxəs olmağa tələsmə, de görüm, necəsən, ee... necəsiniz? Gününüz – güzaranınız, dolaşığınız necədir?

– Sağ olun, lap yaxşıdır. Allahın köməyiylə heç bir şeyə ehtiyacımız yoxdur.

– Harda işləyirsən... e... e... işləyirsiniz?

– Allahın köməyilə ünas mədrəsəsində dərs verirəm. Xəttatlıq dərsi.

– Axı sən... siz... rəssam idiniz...

– O bir cavanlıq xətası idi... İnsan şəkli çəkmək günahdır... İnşallah rəhmani-rəhim bu günahımdan da keçər.

– Mədrəsədə xəttatlıq dərsi verirsən? – Deyə indicə eşitdiyi məlumatı bir də mənasız yerə soruşdu. Danışmağa ayrı söz tapmırdı.

– Bəli ağa, şagirdlərimə nəsx, nəstəliq, kufi xətlərlə “Qurani-Kərim”in üzünü köçürməyi öyrədirəm.

– Dərslər nə dilindədir?

Mahrux cavab verməmiş İmamqulu:

– Əlbəttə zəbanı Azərbaycanda. Və zəbani-farsda – dedi – dəbistanda da dərslər də hər iki lisanda keçirilir. Danişgahımız da var.

Məlik: – Bəs nə əcəb Universitetdə – e... danişgahda dərs demirsən?

Mahrüx: – orda dərslər farscadır – dedi və dərhal dilini dişlədi.

İmamqulu da dərhal: – Amma tüllablar ana dillərini də bilirlər – dedi. – İnsan bəqədri – qüvvət nə qədər çox lisan bilsə o qədər faidəsi var. Elə deyilmi ağa?

– Bəli, əlbəttə

Bütün bu əndişələr içində Məlik tamamilə unutmuşdu ki, bu gün Novruz bayramıdır.

– Bayramınız mübarək – dedi.

Mahrux təəccüblə:

– Nə bayram? – deyə soruşdu.

– Novruz bayramı.

– Novruz?

İmamqulu yenə söhbətə müdaxilə elədi: – Həzrət Əlinin taxta çıxdığı gün – dedi.

Mahrux laqeyd bir tərzdə:

– Hə, sağ olun – dedi.

Məlik pəncərədən dünən gecə rastlaşdıqları arabalı, piyada adamların qafiləsini gördü. – Bunlar da Nardaran pirinə gedirlər? – deyə xəbər aldı.

İmamqulu:

– Bəli, ağa – dedi. – bəlkə də Buzovnaya, Əliayağına.

Mahrux yenə durmağa cəhd etdi. Məlik qəti qərara gəldi:

– Ağayi Bəhbəhani – dedi – bu qadın mənim siz demiş mənkuhəm olsa da olmasa da otuz il kəbinli... yaxşı, qanuni arvadım olub. O vaxtın qanunlarıyla rəsmən evlənmişik. İzn ver beş dəqiqə təklikdə danışaq. Bəlkə bir sözümüz var. Olarmı?

İmamqulu:

– Əlbətməkin ağa, – dedi – nə söz ola bilər, – ayağa durub kənara çəkildi, xeyli aralı oturdu, amma gözü yenə onlarda idi.

Pəncərənin qarşısından keçən qafilə qurtarmaq bilmirdi.

Məlik: Pirə gedirlər, arabalara niyə bu qədər qab-qacaq yığıblar? – dedi.

Mahrux da qanrılıb pəncərəyə, sonra aralıda oturmuş İmamquluya baxdı, üzünü yana çevirib:

– Pirə-zada getmirlər – dedi – Yanardağa gedirlər.

– Yanardağa?

Qadın yenə üzünü Məliyə tərəf çevirmədən:

– Evlərdə qaz da yoxdur, odun da, bütün ağacları qırıb qurtarıblar, ayından-oyundan tapıb Yanardağa gedirlər, orada yerdən çıxan odların üstündə xörək bişirirlər.

Bütün bunları birnəfəsə dedi və yenidən üzünü Məliyə tərəf çevirdi, başını qaldırıb onun üzünə baxmırdı, amma sözləri qeyri-adi şəkildə tələffüz edərək – Bəli, Ağa, pirə gedirlər. Bizim camaat çox mömün camaatdır – dedi.

Məlik başa düşdü. O özü arxası İmamquluya oturmuşdu, İmamqulu uzaqdan Mahruxun ağzına baxırdı – yəqin ki, sözləri dodaqdan oxumaq səriştəsinə yiyələnmişdi.

Mahrux yenə üzünü pəncərəyə tərəf tutaraq, güya qafiləni seyr edirmiş kimi:

– Burda nə eşitsən, inanma – dedi – mənim dediklərimə də inanma, – sonra yenə Məlik tərəfə dönüb – Şagirdlərim elə həvəslə çalışırlar ki – dedi – mədrəsəni bitirənə qədər Quranı başdan ayağa yeddi dəfə köçürürlər.

Məlik:

– Mən səni burdan qurtaracam – dedi.

Mahrux qəmli-qəmli:

– Bu qeyri-mümkündür – dedi, bunu üzünü Məliyə tərəf tutarkən demişdi və dərhal səhvini başa düşüb: – Bəli, bu tamamilə qeyri-mümkündür – dedi – biz Şeytani büzürglərlə ünsiyyət yarada bilmərik. Lap oğlun, qızın da olsa.

Daha danışmağa söz qalmamışdı. Mahruxmu, Aypərimi ayağa qalxdı:

– Ağa, çox xoşhal oldum – dedi, sonra çarşabıyla ağzını yaşmaqladı və çarşabın altından dodaqları görünmədən yavaş səslə: – Mən səni ölmüş bilirdim, sən də bundan sonra məni ölmüş bil – dedi.

Dikəldi. Gözləri dolmuşdu.

Onun durduğunu görüb İmamqulu da yanaşdı. Aypərinin gözündən süzülən bir damla yaşı yəqin o da gördü və başını aşağı saldı. Bəlkə yazacağı hesabatda bu göz yaşını qeyd etməyəcəkdi. Axı haçansa o da insan olmuşdu.

Mahrux:

– Salamat qalın ağa, – İmamquluya – ağa, siz də salim olun – dedi. Çevrildi, qapıya tərəf getdi. Məliyə elə gəldi ki, çiyinləri titrəyir. Bəlkə səssiz hıçqırırdı.

Qapıdan çıxdı, uzaqlaşıb gözdən itdi. Ta uzaqlarda qara bir siluetə çevrilənəcən Məlik uzun-uzun onun ardınca baxdı, sonra ayağa durdu.

– Ağayi Bəhbəhani – dedi – mən bu gün getməliyəm, tapşırın hesabımı hazırlasınlar.

İmamqulu:

– Ağa, nə tələsik işiniz var ki – dedi. Bir-iki gün qalıb bizi feyziyab edəydiniz. Kişvərimizin görməli yerlərini görərdiz.

Məlik:

– Gördüyümü gördüm – dedi, sonra bu sözlərin ikibaşlı səslənməsindən ehtiyat edərək – Allah başatan versin – deyə əlavə etdi.

– Buyurun ağa, əmrinizə müntəzirəm.

Nömrəsinə qalxdı, əşyalarını çantasına yığarkən, kasetlərin yox olduğunu gördü. Kim götürüb görəsən? İmamqulu bütün bu vaxt ərzində onunlaydı, otağa gələ bilməzdi. Kasetçalar yerində idi. Amma kasetlər yoxdu. Kimə gərək ola bilər onlar? Yalnız otaq xidmətçisi götürə bilərdi. Onun nəyinə lazımdır? Birdən Məliyin ağlına qəribə bir fikir gəldi, bəlkə də yanılırdı. Ona elə gəldi ki, ola bilsin böyük risqə gedərək otel xidmətçisi kasetləri oğurlayıb, gizli bir yer tapıb onlara qulaq asacaq. Kim bilir? Bəlkə də...

Aşağı endi, hesab kağızını aldı, dollar verdi, qalığını inzibatçı tümənlə qaytardı.

– Bunlar mənim nəyimə gərək?

İmamqulu:

– Bəlkə gərək oldu, xırda-xuruşdur. Dilənçiyə verərsiz.

– Burda dilənçi var ki? – Məlik istehzasıyla sanki qisasını alırdı.

İmamqulu qorxmuş halda:

– Əlbətməkin yoxdur – dedi – qırmızıların tərəfinə keçəndə lazım olar, deyirlər orda addımbaşı dilənçilər düzülüb.

– Orda məyər sizin pullar keçərlidir?

İmamqulu çaşıb-qalmışdı, nə deyəcəyini bilmirdi. Ağzından qaçırmışdı, indi bilmirdi vəziyyətdən necə çıxsın.

Məliyin ona yazığı gəldi. Axı bu buyruq qulunun nə təqsiri var ki, onu belə müşgülə salır.

– Yaxşı, salamat qalın.

İmamqulu son dərəcə nəzakətlə:

– Ağa mən özüm sizi rədd edəcəm – dedi.

Məlik tutuldu, bu nəzakətli davranış hara, belə qaba sözlər hara? Sonra yadına düşdü, indi burda danışılan dildə rədd etmək sadəcə sərhəddi keçirmək deməkdir. İmamqulu heç bir nəzakətsizlik etməmişdi.

Oteldən çıxıb yerlə-yeksan olmuş İçəri şəhərin dağılmış küçələriylə addımladılar. Qoşa qala qapılarının yanına çıxdılar. Qoşa qala qapıları dururdu, amma indi çox mənasız bir görkəmi vardı, çünki ətrafındakı qala divarları sökülmüşdü, məlum deyil ki, indi bu qapıların nə əhəmyyəti var?

– Qala divarları hər yerdə sökülüb?

İmamqulu:

– Bəli ağa – dedi – o daşlardan tazə divarlar çəkilib: Badi-Kubəylə kafərlər arasında.

Məlik cavabından qorxaraq bir sual da verdi:

– Qız qalası da sökülüb?.

– O qala kafərlər tərəfində qalıb. Deyilənə görə, indi ora taxta-şalban ambarıdır.

Yeni yöndəmsiz divarlar qoşa qala qapısından bir az aralı çəkilmişdi. Sərhəd keçidi də buradakı dar qapı idi. İmamqulu Məliyi qapıya qədər ötürdü. Bu tərəfdə hilallı yaşıl bayraq, o tərəfdə oraq-çəkicli qırmızı bayraq dalğalanırdı.

İmamqulu: – Ağa Allahın köməkliyilə yolunuz açıq olsun – dedi və Məlik sərhəddin o tayından bir də çevrilib baxanda gördü ki, İmamqulu hələ də onu izləyir. Məliyə elə gəldi ki, indi İmamqulunun gözlərində sonsuz bir qüssə vardı.

## II

Sərhəddin bu tayında ilk gördüyü bina ona tanış gəldi. Əlbəttə yanılmırdı, bu Nizami muzeyinin binasıydı. Amma nə isə tamam başqa cür görünürdü, elə bil dəyişmişdi. Diqqətlə baxıb başa düşdü, binanın şərq üslubunda tağlı qapıları, pəncərələri indi dümdüz edilmişdi və dəmir barmaqlıqlar ardında idi. Rəngbərəng kaşılar da yoxdu.

Məlik binanın fasadına baxdı. Buradakı altı lodci də dəyişdirilmiş, kaşısızlaşdırılmış və dördkünc kvadratlar biçiminə salınmışdı. Məlik heykəllərə baxdı və əvvəlcə gözünə inanmadı. Şairlərin, ədiblərin yerini indi tamam başqa heykəllər tutmuşdu. Məlik birinci üçünü tanıdı – Engels, Lenin, Stalin, o biri üçünü isə heç cür tanıya bilmədi.

Bəs Nizaminin heykəli? Çevrilib qarşı tərəfə baxdı. Nizami heykəlinin yerində indi daha da uca bir kişi heykəli dayanmışdı. Heykəl ağ mərmərdən, eynəkləri qara mərmərdəndi. Marat!

Əlbəttə, Maratın heykəlidir – deyə tapdı. Heykəlin hər iki tərəfində iki gözətçi əsgər farağat dayanmışdı.

Keçmiş muzeyin qarşısında iri kiril hərfləriylə Azərbaycan və rusca MARAT MEYDANI sözləri yazılmışdı. Muzeyin yan tərəfinə də lövhə vurulmuşdu: MARAT QARAGÖZOV KÜÇƏSİ.

Ərxanın verdiyi adres məhz bu küçə idi. Uzaqdan binanın girişində yazılmış BAKI KOMMUNASI BAŞ KOMİSSARLIĞI sözlərini oxudu. Beyrəyi burda tapacaqdı.

Bir-iki addım atan kimi on-on iki yaşlı qız uşağı, qucağında da dörd-beş yaşlı oğlan – onun qabağını kəsdi, bu əcnəbiyə hansı dildə müraciət etdiyini bilmədiyindən əliylə balaca uşağın ağzını göstərdi – bu bütün dillərdə aydın olan bir işarəydi – yəni acdır. Qızın üst-başı cır-cındır içində idi. Məlik əlini cibinə atdı. Əlinə ilk keçən tümənlər oldu, tümənləri qıza uzatdı. Qız aldı, baxdı, baxdı, sonra tüpürüb yerə atdı. Məlik dərhal məsələni anladı – burada o pulların qara qəpikcə qiyməti yoxdu.

Pərt olmuşdu. Yenidən əlini cibinə atdı, bir dollar çıxarıb qıza uzatdı. Qızın gözləri işıldadı, elə həmin andaca, sanki hardansa yerin

altından çıxıb bir dəstə dilənçi onu dövrəyə aldılar. İmamqulunun sözləri yalan deyilmiş.

Qəribədir, çoxusu eyni cütlük şəklində idilər – on-on iki yaşlı, cındırından cin ürkən qızlar və qucaqlarında dörd-beş yaşlı, güman ki, qardaşları. Hamısı da eyni ədayla balacanın ağzını göstərirdilər, yəni ki, acdır.

Məlik yenə əlini cibinə atdı, iki beş dollarlıq, bir on dollarlıq çıxartdı, pulları havada qapdılar və ələ keçirə bilməyənlər bir-birini didməyə başladı. Daha xırda pulu yoxdu, amma indi azı üç-beş dəfə çoxalmış dilənçi dəstəsi onu heç cür aradan çıxmağa qoymurdu. Nəhayət milis fiti eşidildi və milis onlara tərəf gəldikdə hamısı elə bil kül kimi sovrulub yox oldular. Yalnız bir ayağı şikəst olan qızcığaz axsaya-axsaya geri qaldığından milis onu yaxaladı, əlini paltarının yaxasından içəri salıb on dolları çıxartdı, cibinə qoydu və qıza bir təpik vurub qovdu.

Məlik Komissarlıq binasının üstündə Maratın iri şəkli olan qapısından içəri girdi. Qapıda da milislər dayanmışdı. Məlik:

– Mənə Beyrək Məmmədli lazımdır – dedi – Burada işləyir.

Milis yandakı pəncərəni göstərdi:

– Tuda.

Üstündə Maratın boz kitelli şəkli olan pəncərənin ardında boz kitelli, döşü dairəvi qırmızı nişanlı, qara eynəkli kişi oturmuşdu.

Məlik:

– Beyrək Məmmədlini görmək istəyirəm – dedi və əlavə etdi – atasıyam.

Kişi:

– Burda takoy adam yox – dedi.

Məlik: – Ola bilməz – dedi – Məmmədli Beyrək. Nəqliyyat mühəndisidir. İnjener-elektrik.

Kişi telefonu götürüb harasa zəng elədi, Məlik eşitməsin deyə xısın-xısın danışdı, sonra Məliyə anket uzatdı: – Zapolnyayte – dedi – Azərbaycan və rus dillərində.

Məlik anketi doldurub kişiyə uzatdı.

– Dokument!

Məlik sənədlərini də verdi. Kişi uzun zaman sənədlərə və anketdəki cavablara baxdı, onları tutuşdurdu, sonra anketi Məliyə qaytardı:

– Nepravilna – dedi.

– Nə düz deyil?

– Data nepravilna

Məlik anketin altında qoyduğu tarixə bir də nəzər saldı: 22 mart. – Məgər bu gün mart ayının 22-si deyil?

Kişi:

– Net – dedi – Mart ayının yox, Marat ayının.

– Marat ayının?

– Uje iki ildir bu ay belə adlanır, xəbər yoxdur?

– Yox.

Məlik anketi yenidən doldurdu və altında 22 marat tarixini qoyub qaytardı.

– İkinci etaj. 5-ci otaq. Yoldaş Telman Qaraxanovun yanına.

Məlik pilləkənlərlə qalxmağa başladı. Pilləkən boyu Maratın müxtəlif şəkilləri vurulmuşdu: Marat at belində, Marat piano arxasında.

Beşinci otağa çatdı, qara meşin qapını açıb içəri girdi.

Boz kitelli, döşü qırmızı nişanlı qız:

– Kto vı, kim lazımdır? – dedi

– Yoldaş Qaraxanov – Məlik sənədlərini və anketi qıza uzatdı.

Qız diqqətlə yoxladıqdan sonra: – Minutu – deyə sənədləri, anketi götürüb qarşıdakı meşin qapılardan içəri keçdi.

Məlik qəbul otağına nəzər saldı. Dörd divarın dördündə də Maratın eyni, boz kitelli şəkilləri asılmışdı.

Divarlarda:

*Bütün dünya proletarları birləşin!*

*Yaşasın Şanlı Bakı Kommunasının varisi şanlı Bakı Kommunası!*

*Bütün dünyada Kommunizmin tam qələbəsi mütləqdir, çünki labüddür. Marat* – sözləri yazılmışdı.

Kiçik masada bir qalın kitab, bir də cib dəftərçəsi boyda qırmızı cildli kitabça və "*Bakinskaya İskra*" qəzeti qoyulmşdu.

YOLDAŞ MARATIN ŞƏRƏFLİ HƏYAT YOLU adlı kitabın üstündə Maratın şəkli vardı. Şəkli balaca qırmızı kitabın üstündə də gördü. Balaca kitabı götürdü. Maratın ayrı-ayrı kəlamları yazılmışdı. Bir-ikisini oxudu:

*Xalqın arzusu – Partiyanın arzusudur.*

*Bizim işimiz haqdır, çünki biz haqlıyıq.*

*Gələcək ayrı-ayrı millətlərə deyil – proletariata məxsusdur.*

Məlik kitabçanı qapayıb Bakinskaya İskra qəzetini götürdü.

Tarixinə baxdı:22 marat. Bugünküydü. Qəzet iki dildə – Azərbaycanca və ruscaydı. Başında yenə dünya proletarlarının birləşməsi

haqqında şüar və Maratın kommunizmin tam qələbəsi haqqında kəlamı verilmişdi.

Birinci səhifədə Maratın qara gözlüklü, kitelli şəkli dərc olunmuş və altında iki dildə bu sözlər yazılmışdı:

*Baş Komissar Marat Qaragözov bəşəriyyətin min illər boyü həsrətlə yolunu gözlədiyi mətin və müdrik Kommunistdir.*

Qız qapıdan çıxdı.

– Keçin – dedi.

Məlik Qaraxanovun kabinetinə daxil oldu. Qaraxanov çox iri masanın arxasında oturmuşdu. Məliyi görəndə ayağa durdu. Amma qəribədir, oturduğu vəziyyətdə durduğu vəziyyətdən daha uca görünürdü. Masanın arxasından qalxanda sanki balacalaşdı. Ümumiyətlə çox qısaboy idi. Əynində döşü qırmızı nişanlı boz kitel, gözlərində qara eynək vardı.

Əlini uzatdı, əli çiy ət şəntiri kimi süst və soyuq idi. Qarşısına Məliyin sənədləri və anketini qoyduğuna baxmayaraq soruşdu:

– Kto vı, bura otkuda, kak, nə üçün gəlmisiz?

Məlik adını, soyadını, haradan və necə gəldiyini söylədi.

Qaraxanov mənalı:

– Aa... Turtsiya – dedi – ponyatno.

Məlik gəlməyinin məqsədini söylədi: Bakı Kommunası haqqında Türkiyə mətbuatında obyektiv yazılar yazmaq istəyirəm.

Telman Qaraxanov:

– Mən burjua pressasının obyektivliyinə inanmıram – dedi – amma mənim ponimaniyamda sizin zadaçanız oğlunuzu görməkdir.

– Bəli, bunu gizlətmirəm. Eşitdiyimə görə oğlum burada işləyir. Beyrək Məmmədli.

Qaraxanov ağızucu gülümsündü:

– Yəqin siz Boris Mamedovu imeyete v vidu – dedi – Bəli svedeniyamız var ki, o na samom dele sizin oğlunuzdur.

– Necə Boris, axı onun adı Beyrəkdi... e... Beyrək idi.

– Çoxdan dəyişib. Kstati Beyrək nə deməkdir?

– Beyrək Dədə Qorqud dastanının qəhrəmanlarındandır.

Qaraxanov fikrə getdi:

– Dədə Qorqud, Dədə Qorqud – deyə bir neçə dəfə təkrar etdi – a vspomnil, eto zapreşennaya antinarrodnaya panturkistskaya skazka.

Mübahisə etməyin mənası yoxdu – nə yer o yerdi, nə zaman o zamandı. Məlik sadəcə: – Oğlumu görə bilərəm? – deyə soruşdu.

– Koneçno – Qaraxanov telefonun dəstəyini qaldırdı.

– Borya – dedi – zaydi ko mne, tut tvoy otes prişol – qulaq asıb güldü: – da net, ne s toqo sveta, iz Turtsiyi – sonra əlavə etdi – vproçem eto odno i to je...

– Məlik otağa göz gəzdirdi. Sənayenin, təhsilin, maarıfin inkişafı haqqında diaqramalar, cədvəllər, yenə artıq tanış olduğu şüarlar və hər divarda boz kitelli, qara eynəkli adamın eyni şəkli. Amma bir divarda başqa şəkillər də vardı: Üçü məlum – Engels, Lenin, Stalin... Dördüncünü – keçi saqqal kişini tanımadı. Deyəsən elə Nizami muzeyinin fasadındakı heykəllərdən biri də onun idi.

Qaraxanovdan:

– Bu kimdir? – deyə soruşdu.

Qaraxanov təntənəli bir səslə: Yoldaş Stepan Şaumyan – dedi – Birinci şanlı Bakı Kommunasının rəhbəri. Biz ikinci şanlı Bakı kommunası o şanlı Kommunanın prodoljateliyik.

Məlik: – Axı bu erməni Şaumyan – deyə sözə başlamaq istəyirdi ki, Qaraxanaov kəskin bir tərzdə onun sözünü kəsib: – Yoldaş Şaumyan erməni deyil, kommunistdir – dedi.

Məlik özünü nə qədər təhlükəyə atdığını aydın dərk etsə də dözə bilmədi:

– Bilirsiz bu kommunist-daşnak 18-ci ildə elə bu mart... bağışlayın... marat ayında nə qədər azərbaycanlı qırıb?

Qaraxanov daha da qəzəbli görkəm alaraq: – O Azərbaycanlıları yox, müsavatçıları nakazat eləyib – dedi – Azərbaycan, rus və erməni proletariatının qəddar düşməni müsavatçıları...

Ağzı köpüklənirdi, sonra bir stəkan su içib bir qədər sakitləşdi: – Əlbəttə – dedi – siz Türkiyəlisiniz, soznaniyanız burjua propoqandasıyla zəhərlənib. Elə bizim öz millətçilərimiz də vaxtilə Şaumyan yoldaşa, Bakı kommunasına çox böhtanlar atıb. Pozor. İndi biz istoriçeski pravdanı vosstanovit elədik. Biz, baş komissar Marat yoldaşın rəhbərlik etdiyi Bakı bolşevikləri. Bəli, biz qordimsya ki, Qafqazda Proletariat diktaturasanın znamyasını yenə də Bakı proletariatı qaldırdı.

Bakı həmişə inqilabın kolıbeli... e... e...

Məlik qeyri-ixtiyarı: – Beşiyi – dedi

– Verno, beşiyi olub. İndi Rusiyada da kommunistlər vlasta gələndən sonra, bütün mir bildi ki, bu düz yola birinci biz... başladıq.

– Rusiyada kommunistlər demokratik seçkilərlə hakimiyyətə gəldi, amma gələn kimi Dumanı qovdular.

– İ pravilno sdelali. Bu boşboğaz boltunlar sobraniyası proletariata lazım deyil. Skoro SSSR-i vosstanovit edəcəyik, və bu işin də pioneri Bakı kommunistləri olacaq.

Məlik hiss elədi ki, ürəyi sıxılır, söhbəti dəyişmək üçün:

– Bəs o muzeyin... qabağındakı o biri heykəllər kimindir? – dedi.

– Hansı muzeyin?

– Bağışlayın... Unutdum ki, indi bura kommissarlıqdır. Vaxtilə burda Nizami muzeyi yerləşirdi.

– Nizami? Nizami. Ax da – eto poet.

– O da yasaq edilib? – Qaraxanovun yasaq sözünü anlamadığını görüb – zapreşennudur? – dedi.

– Net, poçemü je... Prosto belə kitabları çap eləmirik, feodolizm şairləri proletariata lazım deyil. Kstati, bax – masasının üstündəki qalın kitabı göstərdi – Marat yoldaşın yeni bioqrafiyası çıxıb. Sovetuyu, oxuyun, çox interesnı kitabdır.

– Kim yazıb?

– Kitabları otdelni adamlar yazmır. Eto kollektivnıy trud qruppı proletarskix pisateley. Onlar bütün proletar sinfinin ürək sözlərini vıracat eləyən belə kitablarda öz adlarını yazmağa ne nucnı sayırlar – Məliyin bayaqki sualını xatırlayıb: Hə, orda Komissarlığın qabağındakı heykəlləri spraşivat elədiniz. Bu ən veliki kommunistlərin heykəlləridir: Yoldaş Engels, yoldaş Vladimir İliç Lenin, yoldaş İosif Vissarionoviç Stalin, yoldaş Stepan Şaumyan, yoldaş Kirov və yoldaş Orconikizde...

– Alman, rus, gürcü, erməni... Bəs heç azərbaycanlı kommunist olmayıb?

Qaraxanov başını tutdu:

– O nesçatnıy çelovek, obolvanennıy burjuazno – nasionalistiçeskimi predrasudkami – dedi – priçem burda rus, erməni. Onlar kommunistdirlər, kommunistin milləti olmur. Onun milləti... proletariatdır. Budur bax, yoldaş Marat nə deyir – ayağa durdu, balaca qırmızı kitabçanı açıb oxudu: Gələcək ayrı-ayrı millətlərə deyil, proletariata məxsusdur. Ponyatno? Yox, əgər siz hələ kimin hansı nasiyadan olmasına vnimaniyə obraşat eləyirsiz onda bəs yoldaş Maratın o boyda böyük heykəlini görmədiz? O ki sizin ponimaniyanızla desək, azərbaycanlıdır.

– Bəli, əlbəttə.

Məlik bayaq binanın qarşında heykəllərə, indi otaqda şəkillərə baxanda da nəyinsə, daha doğrusu kiminsə burda çatmadığını düşün-

müşdü, amma heç cür anlaya bilmirdi ki, bu çatmayan, olmayan nədir, kimdir, indi birdən-birə xatırladı:Marks, əlbəttə Karl Marks.

– Bəs yoldaş Marks niyə yoxdur? – dedi – nə orda, nə – divarı göstərdi – burda.

Qaraxanov bir an susduqdan sonra:

– Da, – dedi – bu slojnı voprosdu. Məsələ ondadır ki, biz yoldaş Marksı elmi kommunizmin osnovateli kimi tsenim. Amma o evrey idi. Bizim isə əsas düşmənimiz... dünya imperializmi və sionizmdir. Marksın pamyatnikin qoysaq, şəklini azsaq eto moqut nepravilno ponyat.

Elə bu vaxt qapı açıldı və döşü qırmızı nişanlı, boz kitelli, qara eynəkli bir adam içəri girdi, gözucu Məliyə tərəf baxdı.

Məlik də ona baxdı. Qaraxanov əyri bir təbəssümlə:

– Oğlunuzu tanımadınız – dedi – Borya, snimi oçki.

Gələn adam qara eynəklərini çıxartdı. Beyrək idi. Amma Məliyə elə soyuq nəzərlərlə baxırdı ki... Məlik oğlunun boynunu qucaqlamaq istədi, amma durdu: bəlkə kommunistlər oğulla-atanın qucaqlaşmasını da qadağan ediblər. Sadəcə əlini uzatdı və Beyrək də ona əl verdi. Elə bu vaxt qara telefon səsləndi. Qaraxanov cəld dəstəyi götürdü, dərhal ayağa durub: Sluşayu tovariş Marat – dedi, ayağa duranda yenə boyu kiçildi – Siyu minutu budu. – Məni yoldaş Marat çağırır, Borya idite sənin otağına.

Qapıdan çıxarkən Qaraxanov:

– Prosveti otsa – dedi – yoldaş Şaumyanın tarixi zasluqası haqqında çox oşiboçnı fikirdədir. Bir az deyəsən, nasionalist və pantürkist uklonu da var.

Qapıdan çıxdılar. Beyrək dəhlizdə duran döşü qırmızı nişanlı, boz kitelli, qara eynəkli adamlardan birini çağırdı. Cibindən pul çıxartdı: – Al bu yüz rublu – dedi: bufetdən bir vodka al, bir də pirojkidən, selyotkadan, nə tapsan.

Məlik fikir verdi ki, pulun üstündə də Maratın şəkli var. Bilmirdi nədən başlasın: – Yüz rubl neçə dollardır? – deyə soruşdu.

Beyrək:– Yüz rubl elə yüz dollardır – dedi

Məlik: – Yüz dollara alırsan arağı? Nə baha?

– Rəsmi kursla bir rubl bir manatdır – istehzayla güldü – əslində yüz rubl bir dollardır.

– Onda da çox ucuzluqdur ki, bir dollara araq, pirojki...

– Ancaq bizim binada, komissarlığın bufetində belədir, şəhərdə hər şey on qat bahadır.

Maratın şəkilləri və cürbəcür şüarlar, diaqramlar asılmış dəhlizlə liftə çatdılar. Beyrək: – Burda işləməyin də öz üstünlükləri var – dedi.

Liftə girdilər. Liftin içində də Maratın şəkilləri asılmışdı. Boz kitel, qara eynəklər. Bircə döşündə qırmızı nişan yoxdu. Məlik Beyrəyin döşündəki qırmızı nişana baxdı – Maratın şəkli vardı nişanın üstündə.

Liftdən çıxıb meşin qapılı otağa yanaşdılar, Beyrək açarla qapını açdı, içəri keçdilər. Yenə həmin şəkillər, həmin şüarlar. Amma bu otaqda çoxlu texniki cihazlar və bir neçə televizor da qoyulmuşdu. Hər yerdə Maratın şəkilləri vardı, amma bir şəkil Məliyin diqqətini çəkdi. Uyuyan uşaq – 5-6 yaşlı qızcığaz. – Bu kimdir – deyə soruşdu. Düşündü ki, bəlkə Beyrəyin qızıdır, yəni nəvəm.

– Qızındır?

– Yox, biz rəssamın çəkdiyi şəkildir. Altındakı yazını oxu. Məlik eynəyini taxıb yazını oxudu. “Yuxuda Marat yoldaşı görür”.

Beyrək: – Yoldaş Qaraxanova Şaumyan haqqında nə demisən ki? – deyə soruşdu.

Məlik: – Heç nə, dedim ki, Şaumyan daşnak idi.

– Söz tapmısan danışmağa. Özü də kimə? Qaraxanovun anası ermənidir.

Susdular. Bu üzücü sükutu pozmaq üçün Məlik necə, hardan və nə məqsədlə gəldiyindən danışmağa başladı, amma deyəsən bütün bunlar Beyrəyi... e... Borisi qətiyyən maraqlandırmırdı.

Məlik:

– O zonada... ananla görüşdüm – dedi – Onunla əlaqə saxlayırsan?

Beyrək laqeyd bir tonla:

– Yox – dedi – eşitmişəm ki, mollalıq eləyir. Mənim mollalarla aram yoxdur – sonra əlavə etdi – elə bizi bu günə bir az da mollalar qoymadılar?

– Molla, ya qeyri molla, axı o sənin anandır...

Beyrək üzündə istehzalı bir ifadə göründü – Ana, ata – dedi – keçmiş əsrlərin puç olmuş xülyaları – sonra əlavə etdi – bu dünyada insanın özündən başqa heç kəsi yoxdur.

Məliyi dəhşət bürüdü: – Belə yaşamaq olar?

Beyrək: – Görürsən ki, yaşayıram – dedi

– Burlayla necə, onunla da əlaqən yoxdur?

– Xeyr, o da rəqqasəlik eləyir, Baku sitidə göbək atıb kapitalistləri əyləndirir.

Məlik: Göbək rəqsi? – deyə soruşdu, sonra öz-özünə: – Deyəsən mən bura yalnız sarsıntılar keçirmək üçün gəlmişəm – deyə düşündü.

Beyrək cavab vermədi. Araya yenə sükut çökdü. Sonra Məlik:

– Dolanışığın necədir? – deyə soruşdu.

– Mənimki pis deyil. Bu binada işləyənlərin çoxu kimi.

– Bu binada? Bəs bu binadan kənarda?

– Özün görmədin? Dilənçilər qabağını kəsmədi?

– Gördüm. Dilənçi çoxdur?

Beyrək:

– Əhalinin yarıdan çoxu. – dedi, sonra istehzayla əlavə etdi: – proletar balaları.

– Bu uşaqlar bir yerdə işləmir, oxumur?

– Ha, ha... İş var ki, işləsinlər? Oxumaq... – qəhqəhə çəkdi – cəmisi iki məktəb var, orda da komissarlıqda işləyənlərin balaları oxuyur.

Məlik siqaret çıxarıb odladı – çəkirsən?

– Yox – sonra qutuya baxıb – türk siqaretidir? – dedi

– Bəli.

– Ver birin çəkim.

Beyrək siqaretini alışdırdlı, bir qullab alıb: – Bilirsən, məktəblərdə bütün siniflərdə dərslər necə başlayır?

– Yox, hardan bilim.

– Əvvəlcə Marat yoldaşın şəninə şüarlar deyirlər, sonra da qarğış etməyə başlayırlar.

– Qarğış?

– Bəli. Marat yoldaşın, proletariatın və Bakı kommunasının düşmənlərinin gözləri çıxsın, vərəm olsunlar, infarkt olsunlar, rak olsunlar, SPİD olsunlar. Marata əl qaldıranın əli qurusun, onun haqqında pis danışanın dili qurusun.

Məlik: – Yadımdadır, uşaqlıqda bizim kənddə bir qoca qarı vardı. Elə hey hamıya bax eynən beləcə qarğış edərdi.

– SPİD-dən də xəbəri vardı?

– Yox, amma o da deyərdi ki, nə bilim filankəsin gözü çıxsın, ciyəri yansın, dili tutulsun, qan qussun. Allah ona qotur versin, dırnaq verməsin.

Beyrək güldü: – Bax bu nə isə təzə sözdü – dedi – gərək yazaq, Marat yoldaşa verək, mətnə əlavə etsin.

Yenə siqaretdən dərin bir qullab aldı.

– Qara eynək niyə taxırsan, gözlərin pis görür? Fikir verdim, Qaraxanov da bu cür qara eynək taxır, o biri adamlar da... Hamısı da boz kitelli. Niyə?

– Ayrı geyim məsləhət görülmür.

– Qara eynəklər də məcburidir?

– Yox, bu yalnız yoldaş Maratla həmrəylik nişanəsidir. Könüllüdür, amma bu binada işləyənlərin hamısı buna riayət edir.

– Deyirlər ki, bu yoldaş Marat çaşdır, ona görə də qara eynək taxır. Sənə nə düşüb, ceyran kimi gözlərin var – oğluna xoş söz dedi ki, bəlkə aralarındaki buz bir az əriyə. Beyrək buna məhəl qoymadı:

– Çaş-zad deyil yoldaş Marat – dedi – sonra gözlənilməz bir hiddətlə əlavə etdi – intəhası gözlərini qan tutub, o qədər adam qırıb ki, heç kəsin gözünə dik baxa bilmir.

Məlik donub qaldı. Ətrafadaki cihazlara göz gəzdirdi:

– Qorxmursan belə danışmağa? Dinləyib eləyə bilərlər.

– Nədən qorxacam? Mənə nə eləyə bilərlər? Burda mütəxəssis bir mənəm. Mənə ehtiyacları var, hamısı kəmsavad adamlardır burda rəhbərlik eləyənlər. Biri keçmiş aşbaz, biri keçmiş süpürgəçi, biri keçmiş hambal. Ən savadlıları Qaraxanovdur ki, o da otuz il çəkməçilik eləyib.

– Bəs Marat?

– Keçmişdə şəhərin məşhur dəlləklərindən imiş.

– O nə millətdir?

– Allah bilir. Guya azərbaycanlıdır, amma ildə-ayda bir dəfə azərbaycanca danışanda elə danışır ki, danışmasa ondan yaxşıdır – Məlik fikir verdi ki, Beyrək özü təmiz azərbaycanca danışır, Qaraxanov kimi kəlməbaşı rus sözləri işlətmir.

– Deyirlər Maratın yəhudi qanı da var, ona görə belə qəddar antisemitdir, olan-qalan yəhudilərin başına it oyunu açır. Bu kitabı görürsən – masasının üstündəki yeni qalın kitabı göstərdi – Maratın yalançılar sözü olmasın əllinci bioqrafiyasıdır. Hər kitabda da tərcümeyi-halına yeni-yeni faktlar artırırlar. Yazılanları vaxt etibarilə hesablayan olsa, görər ki, azı yüz il ömür sürüb. Gah yazırlar ki, Maonun, Kim İr Senin hərbi müşaviri olub, gah yazırlar ki, Fidel Kastroya kommunizmin nəzəriyyəsini öyrədib, ya nə bilim Afrikada zənciləri müstəmləkəçilərə qarşı üsyana qaldırıb. Amma əslində bütün bu vaxtlar Bakıda dəlləklik edirmiş...

– Bəs bunu bilənlər yoxdur?

– Var idi. Hamısını ilim-ilim itirdilər, izləri-tozları qalmadı. Bütün başını qırxdıgı köhnə müştərilərini bir-bir tapdırıb qırdırdı. Təsadüfən bir-iki – qalanı varsa, onlar da Marat yoldaşın gizli inqilabi fəailyyəti haqqında xatirələr danışır. Bəli, bir vaxt dəllək olub, indi də bizim başımızda eləyir dəlləkliyini – rişxəndlə: – Baş komissar! – dedi – doğrudan da ömrü boyu işi başla olub. Əvvəl baş qırxıb, indi də baş kəsir.

– Belə danışma Beyrək, bir az ehtiyatlı ol, bəlkə dinləyirlər. Sonra altını çəkərsən.

– Qorxma. Mənim burda işim bilirsən nədir? Xarici radioları, televizorları, interneti zərərsizləşdirmək, yəni heç kəs heç nəyi eşidə, görə bilməsin. Amma bax bu otağımda elə qurğular qurmuşam ki, heç bir danışığı eşidə bilmirlər. Odur ki, istədiyimi danışa bilərəm. Əlbəttə, əgər sən gedib məni satmasan.

– Utanmırsan, mənə belə söz deyirsən. Mən sənin atanam axı...

Beyrək acı bir təbəssümlə:– Bilirsən neçə oğul atasından, neçə ata oğlundan PP-yə danos verib, qanına bais olub?

– Pipi nədir?

– PP – Proletar Patrulu. Kommunanın gizli xəfiyyəsi.

Qapı açıldı və boz kitelli, qara eynəkli adam bir şüşə araq, iki pirocki gətirdi. Arağın üstündə Maratın şəkli çəkilmişdi.

Beyrək: – Aclığın var? – dedi – bu görüşdə atasına dediyi ilk insani söz idi.

– Yox. – Nəhayət Məlik qərara gəldi. – Mənimlə niyə belə soyuq davranırsan, Beyrək? Gör neçə ildir görüşməmişik. Mən elə həsrət çəkirdim ailəmi görməyə, elə can atırdım... Bilsən necə çətinliklə gələ bildim bura.

– Gəlib gördün, feyziyab oldun?

– Mənimlə belə danışma. Mənim nə təqsirim var axı?

Beyrək cavab vermədi. Dolabdan bir qədəh və bir stəkan çıxardı. Arağ şüşəsini açdı, Məliyin qədəhinə süzdü, sonra öz stəkanını ləbaləb doldurdu, yenə də heç nə demədən stəkandakı arağı bir nəfəsə başına çəkdi. Heç yavanlıq da eləmədi, eləcə biləyini iylədi. Məliyin yadına düşdü ki, haçansa görmüşdü, bəzi ruslar arağı belə içir. Handan hana Beyrək-Boris dilləndi:

– Deyirsən nə təqsirim var? Bəs bütün bu illər hardaydın, ailəm dediyindən xəbərin vardı? Gedib özünçün Türkiyədə rahat yaşamısan, indi də durub gəlmisən ki, ailəmə baş çəkim... Deyirsən nə bilim, ata belə gəldi, ana belə getdi, budur səncə atalıq?

– Düz demirsən, Beyrək. Özün də bilirsən, bütün yollar qapanıb, bütün əlaqələr kəsilib. Mən necə sizinlə əlaqə yarada bilərdim ki, heç sağ qalıb-qalmadığınızdan da xəbər tuta bilmirdim.

– Bəs bizi atıb Türkiyəyə gedəndə necə?

– Yenə düz demirsən. Mən sizi atmamışdım, on günlüyə ezamiyyətə getmişdim.

– Neçə il çəkdi ezamiyyətin?

– Nə bileydim ki, belə hadisələr baş verəcək. Mən axı burdan gedəndə hardan biləydim ki, bütün bunlar olacaq.

– Xeyr, bağışlayacaqsan. Bu hadisələr, elə sən burda olanda başlamadı? Sən ölkənin tanınmış jurnalisti idin, görmürdün ki, hadisələr hansı məcrada gedir? Qəzetlərin nə yazdığını oxumurdun, televizorda, radioda nə səsləndiyini eşitmirdin? Bilmirdin ki, bir-birinə ədavət, kin püskürən bütün bu yazılar, çıxışlar, bu qan-qan deyən adamlar cəmiyyətdə elə bir nifrət potensialı yaradır ki, bir gün böyük partlayış baş verəcək, hər şey alt-üst olacaq? Oldu da. Qurunun oduna yaş da yandı.

– Partlayış mən gedəndən sonra, cəmisi on-on beş günün içində oldu.

– Amma sən burda olanda qarşısını ala bilmədin...

– Qarşısını necə alaydım?

– Niyə, ölkənin nüfüzlu ziyalısıydın. Adamları ağıllarını başına yığmağa çağıraydın, deyəydin ki, qardaşlar, bunun axırı fəlakətdir, qandır, ölümdür, bir-birinizə qənim kəsilməyin, qardaş qanı tökməyin.

– Yəqin unutmusan Beyrək, Mən çox dedim, lap çox, eşitmədilər. Danışdıq, qulaq asmadılar, yazdıq, oxuyan olmadı. Gözlərini qan tutmuşdu, heç nə görmürdülər. Çığır-bağırdan qulaqları batmışdı, heç nə eşitmirdilər. Eşitmək istəmirdilər. Öz səslərindən başqa heç nə eşitmək istəmirdilər – deyə təkrar etdi.

– Eh... – Beyrək bir stəkan da araq süzüb başına çəkdi, pirojkidən bir tikə dişlədi.

– Sən gedəndən sonra bilirsən nələr oldu?

Məlik: – Bilirəm – dedi – Bakıda, rayonlarda toqquşmalar, vətəndaş müharibəsi... Ceyhan borusunun partladılması. Orda yazırdılar ki, bunu ASALA ya da PKK edib.

– ASALA ya PKK, nə fərqi var? Hər halda üç gün sonra Ermənistan Atom stansiyasında partlayış oldu. Ermənistan ərazisi də, Qarabağ da indi azı üç yüz il insanlarçün yaşanılmaz hala gəldi. – Beyrək acı-acı güldü – Qarabağ məsələsi də bir dəfəlik belə həll olundu.

Məlik: – Onu da Türklərin boynuna qoydular – dedi – Erməni diasporası dünyada bir vay-şivən qaldırdı ki, XX əsrdə bir soyqırımı olub, bu da ikinci genosid. Türkiyəni bütün beynəlxalq təşkilatlardan təcrid etdilər, iqtisadi və nəqliyyat blokadasına aldılar. Halbuki bu işdə Türkiyənin əli olduğunu indiyədək heç kəs sübut edə bilməyib.

Beyrək:

– Edə də bilməz – dedi – amma bunun nə əhəmiyyəti var? Dünya yalanla idarə olunur. Yalanla və güclə. Həqq qəvinindir – eşitməmisən?

Məlik fikir verdi ki, Beyrək bu qədər içsə də nə nitqinin məntiqi, nə da danışığı pozulurdu. Elə bil heç içməmişdi. Bircə gözləri azacıq dumanlanmışdı.

– Sonra da – Mingəçevir...

O, bu sözü çətinliklə tələffüz etdi. Arağın təsirindəndimi ya bütün azərbaycanlıların ən ağır faciəsindən, ən böyük ağrısından xəbər verən bir sözü dilinə gətirməyindənmi?

– Kim partlatmışdı Mingcəçevir bəndini? Daxildə çəkişən qüvvələr, kompüterin səhvi nəticəsində raketlərin yolundan sapması, separatçı ya xarici qüvvələr? Açılmamış və heç bir vaxt açılmayacaq sirr...

Məlik bilirdi: Ermənistan atom stansiyasının partlayışı kimi Mingəçevir bəndinin dağılması da tək XXI əsrin deyil, bəlkə də bütün əsrlərin ən böyük fəlakəti, ən nəhəng ekoloji və humanitar musibəti idi. Azərbaycanın bütün aran rayonları su altında qalmışdı. Əhalinin bir hissəsi dağlara qaçmışdı.

Məlik:

– Ora xəbər çatdı ki, salamat qala bilənlər dağlara çəkilib – dedi – onların vəziyyəti necədir?

– Necə olacaq? Tam dərəbəylik. Hər dərədə, daha doğrusu hər dağda bir bəy var. Bir bəy, bir ağa, bir kəndxuda, bir quldurbaşı, bir kərtənkələ, nə bilim kim. İbtidai icma, əşirət dövrü... Hər boynu yoğun camaatı qul kimi saxlayıb qan uddurur.

– Elə o vaxtdan Bakı da üç yerə bölündü.

– Bəli. BMT qərar çıxartdı. Burada tam bir anarxiyanın qarşısını almaq üçün üç dövlətə mandat verildi. Axı burda neft var, böyük dövlətlər onu əldən verərdi heç. İndi bu üç zonada guya ki, üç müstəqil hakimiyyət yaradıblar. Bu nə cür müstəqillikdir özün təsəvvür edə bilərsən. Yoldaş Marat tualetə gedəndə də xaricə telefon edib icazə istəyir...

Məlik Beyrəyin içindəki sonsuz ağrını duyurdu, amma nə edə bilərdi? Nə çarə qıla bilərdi, oğlunun da, özünün də, xalqının da bu dözülməz dərdlərinə?

– Oğlum, – dedi – heç olmasa sən burdan canını qurtarıb çıxaydın.
– Bu qeyri-mümkündür – Beyrək özü də bilmədən eynən Aypərinin sözlərini təkrar etdi. – Burdan quş quşluğuyla uçub qurtara bilməz. Kommunanın divarlarını görmədin? Keçən il birisi bu divarı dırmaşıb aşmaq istədi, elə yerindəcə gülləylə vurub torpağa sərdilər. Heç kəs heç adını da bilmədi. Bura şəhər deyil – divarlarla dövrələnmiş konslagerdir. Burdan bircə çıxış yolu var – qəbrstanlığa, o dünyaya – gülümsündü – Belə – belə işlər, ata... – İlk dəfə Məliyə belə dedi.

Sonra sanki qeyri-ixtiyari, mexaniki bir hərəkətlə Məliyin dilinə də vurmadığı qədəhini götürüb başına çəkdi – nə qədər gec deyil, burdan uzaqlaşıb get – dedi. – Xoşbəxtsən ki, hələ bu imkanın var. Ayrı xoşbəxtlik axtarma. Biz də burda bir təhər başımızı girləyək, görək əcəl haçan insaf eləyib dadımıza çatdı.

– Beyrək, sənin belə danışmağın, mənimçün ölümdən betərdir.

– Eh, havayı sözlər danışmağa nə var ki?

– Havayı sözlər deyil bu. Nə isə etməliyik. Nə isə etmək lazımdır. Yəni bütün bunları dəyişmək istəyən adamlar qalmayıb burda? Hamı burda elə sənin kimi bədbinləşib, hər şeydən əlini üzüb?

– Yox, niyə ki, ümidini üzməyənlər də vardı.

– Vardı? Bəs indi hardadırlar?

– Xəzərin dibində. Bəxti gətirənlər – Nargin adasında.

– Nargin adasında?

– Bəli, o adanı Bakı Kommunasının ərazisinə daxil etdilər, indi orda möhtəşəm bir konslager qurublar. Mənim bu sənətim olmasaydı, mənə möhtac olmasaydılar, mənim də ən yaxşı halda yerim ordaydı. Niyə də olmasın? Atam Türkiyədə, anam və bacım düşmən qonşuların ərazisində... Amma elə böyük fərq də yoxdur, orda konslager dənizlə əhatə olunub, burda divarlarla.

Məlik əlləriylə üzünü qapadı.

Beyrək: – Kefini pozma ata, – dedi – böyük musibətlərin yanında bizim ailənin taleyi nədir ki... Mən özüm də hər şeyə qane olmuşam. Dolanışığım var. Camaat baxmasın deyə pozduğum xarici televiziyalara özüm gizlində baxıram. Bəzi kitabları qoruyub saxlaya bilmişəm – Cəlil Məmmədquluzadəni, Sabiri. Hərdən oxuyuram. Dostoyevskini daha çox oxuyuram. “Şeytanlar”ı. Zalım oğlu elə bil hər şeyi qabaqcadan görüb. Əlbəttə mənim Marat kimi, hətta Qaraxanov kimi pulum-sərvətim yoxdur, amma hər halda...

– Yəni onlar dövlətlidir? Bəs kommnistlər bərabərlikdən dəm vururlar, proletar rəhbərləridir...

– Proletar, kommunist – xeyli güldü, – bu artıq bir az sərxoş gülüş idi – bu sözlərə inanan var? – dedi – Qaraxanovun Fransada, Maratın dünyanın beş qitəsində villaları var, deyirlər ki, Amerika milyarderləri, ərəb şeyxləri qələt eləyər onun yanında.

Birdən Məliyin yadına düşdü:

– Pianino çalır Marat? – dedi.

– Pianino? – Beyrək təəccüblə gözlərini ovuşdurdu, arağın təsiri hiss olunurudu. – Bu hardan çıxdı?

– Pilləkənin yanında şəklini gördüm, piano arxasında.

– Hə... – Beyrək qəhqəhə çəkdi – şəkildir də çəkdirib, heç çijik-pijik də çala bilmir. O biri şəkli də gördün, at belində?

– Gördüm.

– Ömründə nəinki ata, heç eşşəyə də minməyib. Heykəlini də gördün də Maratın?

– Bəli.

– Gördün necə ucadır? Boy-buxun da ki, maşallah. Əslində Marat Qaraxanovdan da potaboydur. Qaraxanovun çiynindəndir.

Beyrək bir qədəh də süzüb içdi. – Əşi bu Marat dəsgahdır – dedi – deməklə qurtaran deyil. Bir arvad uşaq doğub dörd kilo yarım. Televiziyada deyirlər ki, Maratın şərəfinə belə böyük uşaq doğulub. Üç gündən sonra Maratın ad günüdür. Bir ay qabaq səbəbsiz-flansız xüsusi olaraq on-on beş adamı tutub basıb ki, öz ad günü şərəfinə amnistiya verib beş-altısın buraxsın. Bu adam özü özündən doymur ki, doymur.

Telefon oldu, Beyrək dəstəyi qaldırdı:

– Da, yaxşı indi gəlirəm – sonra Məliyə – bağışla, Qaraxanov çağırır – dedi – gedək, sənin də buraxılış vərəqinə qol çəksin. Yoxsa burdan çıxa bilməzsən.

Qaraxanovun otağına girdilər. Qaraxanov ayağa durdu və yenə də balacalaşdı. Qəribədir: Stolunun üstündə balaca boşqabda səməni vardı.

Beyrəyə: – Vot – dedi – lyubuysya. Yoldaş Marat çağırmışdı, okazıvaetsya bu gün kakoy-to bayram. Novruz çto li? Tak vot, PP xəbər verib ki, bazarda kimsə bu zeleni satırmış, səməni, çto li, – səməninin bir qırağından qoparıb ağzına qoydu, bir az çeynədi, sonra tüpürdü – fu, kakaya qadost. Bunu da insan yeyər? Stəkandan su içib ağzını yaxaladı.

Məlik maddım-maddım oğluna baxdı, Beyrəyin heç tükü də tərpənmədi. Qaraxanov sözünə davam etdi: – Marat yoldaş dedi ki, xarici radio ilin təxvil, təxvil çto li, olmasının saatını deyib, bunu da eşidən olub. Kuda smotrit Boris dedi yoldaş Marat, nemedlenno primite merı. Pozor. Özü də haçan? Dünya proletariatının böyük prazdniki – Marat yoldaşın den rocdeniyasına üç gün qalmış. Razberites s etim.

– Sonra Məliyə baxıb – gedirsiz – dedi – verin kağıza qol çəkim, – qol çəkdi, – sonra yenə Beyrəyə müraciətlə: – Nu kak, prosvetil eqo nasçet tovarişa Şaumyana?

Beyrək: – Razumeetsya – dedi – söz verdi ki, Şaumyan yoldaşın əsərlərini türkcəyə tərcümə edib orda çap elətdirəcək.

Qaraxanov məmnun-məmnun gülümsədi.

– Eto xoroşo – dedi – nə olsun Türkiyə düşmən qosudarstvodur, biz orada da proletariatı oyatmalıyıq ki, bütün dünyada kommunizmin qələbəsinə qotovı olsunlar. – Məliyə müraciətlə: – papaşa – dedi – siz də unutmayın – ən böyük düşmənimiz imperializm və pantürkizmdir.

Məlik:

– Bəs sionizm? – dedi.

– Əbəttə i sionizm.

– Bəs panislamizm, buddizm, katolisizm, protestantizm, parlamentarizm...

– Əlbəttə, əlbəttə – Qaraxanov başıyla təsdiq edirdi. Məliyin də elə bil gic damarı tutmuşdu, vaxtilə Sovet cəmiyyətinin tarixinə dair oxuduğu kitabları xatırlayıb:

– Bəs sürrealizm, impressionizm, modernizm... – deyirdi.

Qaraxanovun sifətində gərgin bir ifadə vardi, bu sözləri bəlkə də ilk dəfə eşidirdi, nə demək olduğunu bilmirdi və bilmirdi ki, bütün bunlar doğrudanmı proletariatın düşmənləridir?

Məlik davam edirdi: – freydizm, feminizm, filatelizm, fetişizm...

Qaraxanov axır ki, arxayın nəfəs aldı, fetişizmi faşizm başa düşüb: – koneçno – dedi – faşizm də neprimiri düşmənimizdir. – Beyrəyə müraciətlə – Vicu əməlli-başlı işləmisən papaşayla. Nu xoroşo. Sağ olun.

Beyrək Məliyi qapıyacan ötürdü.

– Bu Qaragözov küçəsiylə get, Marat meydanından sonra Baş komissar küçəsinə burul. Üçüncü zonanın sərhəd keçidi ordadır.

Məlik: – Oğlum – dedi – çox içmə.

Beyrək yorğun-yorğun:

– Yaxşı – dedi.

Məlik bilmirdi daha nə desin. Beyrək saatına baxdı, bunu vaxtı olmadığına işarə kimi də başa düşmək olardı. Ayrılmalıydılar.

Məlik: – Bir dəqiqə eynəklərini çıxar – dedi – gözlərini görmək istəyirəm, bəlkə daha heç vaxt görə bilmədim.

Beyrək: – Boje, kakiye santimentı – dedi, amma bir anlığa eynəyini çıxartdı. Gözləri bom-boş idi, heç bir ifadə yoxdu onlarda. Əlini uzatdı:

– Əlvida – dedi, sonra birdən soruşdu: – Türkiyədə insanlar necə yaşayır?

Məlik: – İnsan kimi – dedi.

## III

Divarın dar qapısından keçən kimi Məlik telefonu soruşdu.

– Orda avtomat var, jeton alın – dedilər. Jeton aldı, avtomat – telefon köşkünə girdi və Burlanın nömrəsini yığdı. Bir azdan dəstəkdən səs gəldi: Hello! – Burlanın səsi idi, amma nədirsə başqa cür səsləndi, Bir an sonra Məlik başa düşdü: avtocavabçıdır, özü də cavab ingiliscə səslənir. Məlik bir az bilirdi ingiliscə: – Mən evdə yoxam – sözlərini eşitdi. – Siqnaldan sonra mesajınızı verin.

Siqnal gəldi.

– Salam, Burla Xatun – ancaq uşaqlıqda onu belə, tam adıyla çağırardı. – Mənəm, Məlik, atan... burdayam, səni görmək istəyirəm. Bir azdan yenə zəng edərəm...

Telefonu asmaq istəyirdi ki, dəstəkdən səs gəldi:

– Ata – bu Burlanın səsi idi, özü də lentə yazılmış mexaniki səsi yox, canlı səsiydi və bu səs titrəyirdi.

– Qızım, Burla...

– Ata, sən sağsanmış. Hardan gəlib çıxdın bura?

– Uzun söhbətdir. Görüşəndə danışaram. Səni görə bilərəm?

– Əlbəttə, hardasan?

– Sərhəd keçidinin yanında. Kommunadan gəlirəm.

– Ordan iki keçid var. Hansının yanındasan. Hansı küçədə?

Məlik avtomat köşəsindən küçənin latın hərfləriylə yazılmış adını oxudu:

– Burda 42-ci paralel avenyu yazılıb. Avtomat köşkündən danışıram.

– Ordan heç yerə tərpənmə. Maşınımı göndərirəm. On dəqiqədən sonra orda olacaq. Qara “Mersedes”dir. Şoferin adı Fildir.

– Oldu.

Doğrudan da düz on dəqiqədən sonra qara “Mersedes” köşkün düz qabağında dayandı. Tünd göy kostyumlu, ağ köynəkli, yaxasında qara bant olan sürücü cəld maşından düşdü. Ağ əlcəyini çıxarıb Məliyə əl verdi, sonra nəzakətlə maşının dal qapısını açıb – pliz – dedi. Maşının içi sərin və ətirli idi. Radiosundan ingilis dilində xəbərlər səslənirdi. Geniş prospektlə irəliləyirdilər. Hər iki tərəfdə çox şıq mağaza vitrinləri, çoxlu reklamlar vardı.

Maşın işıqforun qırmızı işığı qarşısında dayandı. Dərhal yeddi-səkkiz yaşında uşaq yüyürüb “Mersedes”in qabaq şüşələrini silməyə başladı. Başqa uşaqlar ba o biri maşınların şüşələrini silirdilər. Şofer şüşəni açıb uşağa bir neçə pens verdi. Uşaq cəld yeni gəlib dayanmış başqa maşına tərəf qaçdı. İşıqforun işığı dəyişdi, maşınlar hərəkətə keçdi. “Mersedes” şəhərin yuxarı hissəsində fiqurlu çəpərlə dövrələnmiş abad həyətə daxil oldu. Sarı kombinzonlu bağban qazonları sulayırdı. Məliyə elə gəldi ki, buralar ona hardansa tanışdır, amma tanınılmaz dərəcədə dəyişmişdir.

Şofer maşını həyətin içindəki üçmərtəbəli evin qarşısında saxladı, cəld düşüb dal qapını açdı. Məlik də maşından endi, Fil:

– Pliz – deyə onu evin qapısna tərəf yönəltdi. Qapıdan girən kimi pəhləvan cüssəli bir oğlan Məliyin qarşısını kəsdi, onun üst-başına əl gəzdirməyə başladı, Fil tələsik ona ingiliscə: – miss Buranın atasıdır – dedi.

Pəzəvəng əl çəkdi, Fil: – Sorri – dedi – miss Buranın bodiqardıdır – son cümlədəki iki sözün şəkilçiləri azərbaycancaydı. Məlik:

– Azərbaycanlısınız? – deyə xəbər aldı.

– Of kouz. Əlbəttə. May neym e... e... adım Fizuli.

Liftə girdilər. Liftin içi də ətir qoxuyurdu, Fizuli-Fil ikinci mərtəbənin düyməsini basdı, qalxdılar. Palıd ağacından olan qapının qarşısına çıxdılar. Fil zəngi basdı, qapı açıldı və Burla, onun balaca Burla xatunu, – indi o doğrudan da yaraşıqlı, xanım-xatın bir qadın olmuşdu – Məliyin boynuna atıldı – Ata, atacan – dedi – bilsən səni görməyimə necə şadam.

– Mənim qədər şad ola bilməzsən, Burla – dedi Məlik.

– Paltonu çıxar. Ver özüm asım – sonra şoferə ingiliscə nəsə dedi.

Fil əlini papağının dimdiyinə uzadıb getdı.

Məlik:
– Bu niyə ingiliscə danışır? – deyə soruşdu.
– İngilis məktəbində oxuyub.
– Azərbaycanca heç bilmir?
– Niyə bilmir?
– Onda de, mənimlə öz dilimizdə danışsın.
– Baş üstə.

Məlik paltosunu çıxara-çıxara dəhlizdəki iri əlvan afişə nəzər saldı və diksindi: afişdə Burlanın çox böyük yarılüt şəkli vardı.

Məlik: – Sənsən? – deyə qeyri-ixtiyarı soruşdu.

Burla: – Yox, tanışımdır – dedi, güldü – bu barədə sonra danışarıq, keç içəri.

Otağa girən kimi Məlik qarşı divarı boya boy tutan pəncərədən dənizin çox geniş mənzərəsini gördü, amma diqqət edib başa düşdü ki, bu pəncərə deyil, şəffaf şüşənin arxasında göy dənizin, sarı qumlu sahilin fotosudur. Foto o qədər dəqiq və aydın çəkilmişdi ki, adama elə gəlirdi real mənzərədir, pəncərədən görünür. Sağ divarda da şəffaf şüşənin arxasında başı qarlı sıra dağlar görünürdü. Sol divarda sıx meşə, baş-başa vermiş ağaclar, üstünü yarpaqlı budaqlar yaşıl çətir kimi örtmüş meşə yolu. Məlik girdiyi qapı tərəfə çevrildi, bu divarda da köpüklənən dağ çayı, şəlalə şəkli vardı. Burla qapını örtəndə şəlalə sanki qapının üstündən aşağı axmağa başladı.

– Bəs bu otağın pəncərəsi yoxdur?

Burla: – Pəncərə nə lazımdır – dedi – bu murdar şəhərə baxmağa? Belədə hara baxıram ürəyim açılır.

Otağın küncündəki bara yanaşdı:

– Nə içəcəksən, viski, şerri-brendi, cin tonik, tekila, vodka, konyak...
– Dayan, dayan küyə basma görüm... Çay içərdim.

Burla daxili telefonu götürüb – Lera, uan ti – dedi – sonra xoş bir təbəssümlə Məliyə baxıb – unutmuşdum, sən axı xalis müsəlman kişisisən. Ancaq çay içirsən, o nədir o... o kişi... hə Məşədi İbad kimi. Gərək ki, belə bir müzikl də vardı, uşaqlıqda görmüşdüm.

Məlik: – vardı – dedi.

Burla: – Dayan bir sənə yaxşı-yaxşı baxım. Bir az qocalmısan.

– Bir az yox, lap çox. İllah da son iki gündə.
– Nə olub ki, son iki gündə?

Məlik bu son iki gün haqqında da, həyatının son illəri barədə də qısaca danışdı.

Burla ah çəkib: – Yazıq anam – dedi – belə də yaşamaq olar?

– Bəs ananla əlaqə yaratmağa çalışmamısan?

– Bu mümkün deyil, ora bütün yollar bağlıdır. Heç telefonla, teleqramla, məktubla da əlaqə saxlamaq olmaz.

– Beyrəklə necə?

– İnternetdən onun e-mailini öyrəndim, mesaj göndərdim, özüm haqqında yazdım. Heç bir cavab gəlmədi. Mənim də doğrusu başım elə qarışıqdır ki, daha yazmağa vaxt tapmadım. Bir də ki, görünür mənimlə yazışmaq istəmir. Ordakı rejimi özün gördün də... Bəlkə qorxur. İşıq necədir səninçin?

Otağın işığını nəzərdə tuturdu.

– Bir az qaranlıq deyil ki?

– Mən belə işığı sevirəm, ala toranlığı.

Məlik: – Mənə elə gəlir ki, hər halda pəncərə olsaydı – deyə sözə başladı, Burla:

– Əşi neyləyirsən pəncərəni? Mənzərəyə baxmaq üçün? – buyur doyunca bax, bu mənzərələr xoşuna gəlmir, buyur başqasına bax. – pultu götürüb düyməni basdı və dərhal dörd divarın dördündə də mənzərələr dəyişdi – indi qumlu səhra, buzlu çöl, əcaib qayalar, uzandıqca uzanan yollar görünürdü.

– Pəncərə? Bəlkə işığa görə deyirsən? Bu da sənə gün işığı – düyməni basdı və tavandakı alçibanlardan bol günəş işığı süzüldü otağa.

Məlik mat qalmışdı, Burla onun təəccübündən ləzzət alırdı sanki:

– Hə nə qaldı, hava? Hansı havanı xoşlayırsan, dəniz havası, dağ havası, meşə, çöl?. – bir bir pultun düymələrini basırdı və doğrudan da otağa gah dağ havası, gah dəniz mehi, gah şaxta təmizliyi, gah yağışdan sonrakı nəm hava dolurdu.

Məlik: – Bu sehirli otağın daha hansı möcüzələri var? – deyə soruşdu.

Burla: – Mən ancaq burda dincələ bilirəm, bütün əsəblərim sakitləşir – dedi – sonra Məliyin sualını cavablandırdı – sehirləri hələ çoxdur – yenə hansısa düyməni basdı, quş səsləri, dənizin uğultusu, yarpaqların pıçıltısı, bülbüllərin cəh-cəhi eşidildi.

Məlik: – Doğrudan möcüzədi – dedi – mən indiyəcən belə şey görməmişdim.

– Hələ bu harasıdır? – Burla başqa bir pultu götürdü, düymələri basdı. Otağa əvvəl qızılgül, başqa düyməni basanda bənöbşə iyi, daha sonra bir-birinin ardınca bədmüşk, iydə ağacının ətirləri, təzə çalınmış ot qoxusu doldu.

– Bunları necə düzəltdirmisən? – neçəyə başa gəlib – demək istəmirdi.

Burla: – Bu mənim dünyamdır – dedi – bütün dünyadan ayrılıb çəkildiyim dünya.

– Amma süni dünyadır axı.

– Süni dünya gerçək dünyadan min qat yaxşıdır – dedi Burla – beş duyğunla istədiyini istədiyin vaxt duya bilirsən. İstəyirsən gündüz vaxtı gecə olsun, gecə vaxtı gündüz. Bax. – Burla bir düyməni də basdı, otaq qaranlığa qərq oldu. Burlanın səsi gəldi: – Başını qaldır, tavana bax.

Tavan ulduzlu göydü. Kahkəşan, süd yolu, bürclər...

Burlanın səsi də sanki kainatın dərinliklərindən gəlirdi:

– Bax, indi ay doğacaq. Ulduzlar sönəcək.

Haradansa divarların üstündən ay çıxıb tavana ucaldı.

Məlik: – Yaxşı, bəsdir – dedi – çıxar bizi işıqlı dünyaya.

Otaq yenə gur gün işığına qərq oldu. Qapını tıqqıldatdılar, Burla:

– Yes – dedi.

Ağ döşlüklü xidmətçi qız otağa daxil oldu, Məliyə ədəblə salam verdi, padnosda gətirdiyi çayı, konfetləri onun qabağına qoydu. Sonra beləcə səssiz çevrilib çıxdı.

– Necə oldu ki, üçünüz də ayrı-ayrı zonalara düşdünüz?

Burla köksünü ötürdü: – Eh, getsin o günlər gəlməsin. O gün mən evdəydim. Hə, sən fikir verdinmi, bu ev elə bizim köhnə evimizdir?

– Köhnə evimiz?

– Bəli, təəccüblənmə, bizim köhnə evimiz, yəni o birmərtəbəli daxmamızın yerində tikdirdim bu üç mərtəbəni.

– Üç mərtəbəsi də sənindir?

– Əlbəttə.

Məlik: – Hansı pula? – deyə soruşmaq istəyirdi, amma cavabdan qorxub soruşmurdu, ayrı sual verdi: Deməli o gün sən evdəymişsən? – çayından bir qurtum aldı.

– Zökəm olmuşdum, evdə yatırdım. Anam da, Beyrək də işdəydilər, hərəsi öz idarəsində. İşləri də, bilirsən şəhərin müxtəlif səmtlərindədir.

Atışma başladı, bir neçə saatın içində şəhərin hər yerində barrikadalar qurdular, bu küçədən o küçəyə keçmək olmurdu. Sonra da ki, o müsibət, dağıntılar, yanğınlar... əvvəl-əvvəl heç olmasa bir-birimizlə telefonla danışa bilirdik, iki gündən sonra telefon əlaqəsi də kəsildi.

– Sonra da şəhərin üç zonaya bölünməsi...

– Bəli, qabaqca zonalar arasında tikanlı məftillər çəkildi, sonra da bu eybəcər divarları tikdilər.

– Babanın, nənənin, yəni mənim atamın, anamın qəbirləri də deyəsən bu zonaya düşüb.

– Hə? Hardadırlar ki?

– Bıy, yadından çıxıb, neçə dəfə sən də getmişdin axı qəbir üstə, şəhərin yuxarı tərəfindədir...

– Hə, hə bildim. İndi orda Luna-parkdır.

– Nə, Luna-park?

– Hə, Luna-park. Qəbirlər onsuz da dağılıb, itib-batıb getmişdi. Orda Luna park qurublar. Elə o biri qəbirstanlıqların yerində də reqbi, beysbol, qolf meydançaları düzəldiblər.

– Bəs ölüləri harda basdırırlar?

– Basdırmırlar, krematorilərdə yandırırlar. Yaxşı, bəsdir, ölülərdən danışdıq – durub atasının boynunu qucaqladı, başını sığalladı – axı biz səni də ölmüş bilirdik, sağsan, gəlib çıxmısan. Elə bil ömrümə gün doğdu – gülümsündü – əsil gün, daha – tavanı göstərdi – belə günəş yox – çayı içib qurtardığını gördü – Çay istəyirsən?

– Bir stəkan da içərdim...

Burla əlini daxili telefonun dəstəyinə uzatdı – bu saat Leraya deyim – sonra nədənsə dəstəyi götürmədi – Özüm gətirəcəm – dedi – istəyirəm sənə özüm qulluq eləyim.

Otaqdan çıxdı. Məliyin gözü masanın üstündəki ala-bəzək “Monitor” jurnalına sataşdı. Jurnalı əlinə aldı, açdı. Burlanın bir neçə yarıçılpaq rəngli şəkilləri dərc olunmuşdu. Daha burda heç bir söz ola bilməzdi – tanışı-filanı deyildi, özüydü ki, var.

Bu vaxt Burla içəri girdi və atasının jurnala baxdığını gördü. Məliyin qaş-qabağı yer süpürürdü.

Burla dərhal hər şeyi başa düşdü: – Allah bu jürnalist tayfasının bəlasını versin – dedi – yalan yazmaqdan başqa işləri-peşələri yoxdur. Yazırlar guya mənim səkkiz pişiyim, dörd itim var. Halbuki mənim cəmisi üç pişiyim və bircə itim var.

– Nə pişik, nə it, canım? Bu nə şəkillərdir belə, lüt-ətcəbala, ayıb deyil?

– Bilirdim ki, xoşuna gəlməyəcək, axı sən köhnə müsəlman kişisisən. Amma köbək rəqslərinə də ən çox baxan elə müsəlman kişiləridi. Bəli, mən rəqqasəyəm. Bilmirdin?

– Rəqqasəsən öz işindir, amma bu lüt şəkillər nədir?

– Səncə rəqqasə şubada rəqs eləməlidir. Qəribə insanlarsız e...

Plyaja getmirsiniz, bikinili qızları görmürsünüz plyajda? Deməli canlı çılpaq gəzmək olar, amma şəkil çəkdirmək olmaz? Gözəl qadın bədəni insanlara zövq verirsə, onu niyə gizlətməlisən? Heç muzeydə olmamısan? Çılpaq Veneraları, Maxanı, Olimpiyanı görməmisən?

– Bilməzdim ki, mənim qızım Venera olacaq. Kaş öləydim, bu günü görməyəydim.

– Boşla sən Allah. O cür müsibətlərdən sonra bu da faciəymiş... Elə bilirsiz, qadın çılpaq rəqs edirsə, deməli fahişədir. Amma bil, mən – otağı göstərdi, – nə qazanmışamsa səhnədə qazanmışam, yataqlarda yox, sənətimlə qazanmışam. Mən buranın ən məşhur şou-ulduzuyam.

– Ayrı sənət seçə bilmirdin?

– Ayrı sənət? Hansı sənət? Müəllimlik edib acından öləydim? Mənim nə ərim var ki, məni dolandırsın, nə varlı aşnam, hər şeyi əlimin zəhmətiylə qazanmışam. Yaxşı, göbəyimin zəhmətiylə olsun. Mən göbək rəqsi edirəm. Özü də hamıdan yaxşı edirəm.

– Adın da ki, deyəsən dəyişib, Bura olub.

– Menecerim dedi ki, bu ad daha cəlbedicidir.

Burla-Bura yerindən durub Məliyə yanaşdı, yenə onun boynunu qucaqladı: – Ata, atacan – dedi – məndən incimə. Sənə yaxşı xəbər verəcəm. Ürəyindən olacaq. Sənətimi dəyişirəm.

– Dəyişirsən? İndi nə olacaqsan? Striptiz ulduzu.

– Xeyr, mer olacam.

– Nə?

– Bəli, mer, Baku-sitinin meri. Türkiyədə deyəsən Bələdiyyə Başqanı deyirlər.

– Sən? Mer? Bələdiyyə başqanı? Səndən mer olar?

Burla elə bil incidi, dodaqlarını büzdü.

– Niyə olmur? – dedi – savadım, ağlım kimdən əskikdir? O boşboğaz siyasi avaralardan? Üç aydan sonra seçkilər olacaq. Demokratik cəmiyyətdə yaşamırıq? On adam namizədliyini verib, mən onların hamısından populyaram. Bizdə pop sənətçiləri ən məşhur, ən nüfuzlu adamlardır. Konsertlərimə bilet tapmaq mümkün olmur. Radio-televiziya səhərdən axşama məndən danışır. Jurnal-qəzetlər məndən yazır. Camaat məni sevir. Yüz faiz əmin ol, mənə səs verəcəklər.

– Yaxşı, tutalım lap belədir, amma nəyinə lazımdır sənin mer olmaq?

– İyirmi beş yaşım var. Tutalım lap iki-üç il də rəqs etdim. Sonra? Necə dolanacam? Mən bu həyat tərzinə alışmışam, necə təmin edə-

cəm bu sayaq dolanışığı? Ərə getmək fikrim yoxdur. Heç kəsin də hesabına dolanmaq istəmirəm. Çox fikirləşib axır qərara gəldim ki, ən düzgün iş mer olmaqdır – gülüb alnını göstərdi – məni bir əlli tutma, sənin qızının ağlı başındadır.

Çöl qapısının zəngi çalındı. Bir azdan otağa uca boylu oğlan daxil oldu.

– Qud dey, darlinq – dedi. Burlayla bir-birinə sarıldılar, marça març öpüşdülər.

Oğlanın əynindəkı qara atlasdan dar şalvar daha çox alt tumanına oxşayırdı. Əynində krujevalı ağ ipək köynək vardı. Çiyinlərindən aşağı, az qala belinə qədər uzanan saçlarına arxadan qırmızı bant bağlamışdı. Bir qulağına sırğa taxmışdı.

Burla: – Tanış ol, Can – dedi – atamdır.

– Sənin atan varmış? – Can işvəli bir səslə dilləndi, sonra əzilib büzülə-büzülə Məlik oturan yerə yanaşdı, əyilib onun əlindən öpdü. Məlik onu yaxından görəndə sezdi ki, sifəti pudralı, gözləri sürməlidir. Oğlan dikəlib ədayla dedi: – Cəh-cəh Can.

Məlik başa düşmədi ki, nə deyir.

Burla: Cəh-cəh Can bizim ən məşhur pop-ulduzdur – sonra əlavə etdi – əlbəttə məndən sonra.

– O, darlinq, əlbəttə səndən sonra.

Cəh-cəh Can aralanandan sonra Məlik baxdı ki, əlinin öpülmüş yerində qırmızı pomada yeri qalıb.

Məlik soruşdu: – Siz də göbək atırsınız?

Oğlan əlini dəsmal kimi yellədə-yellədə ağzına tutdu, bir xeyli güldü.

Burla: – Can brik-brakın Allahıdır – dedi – həm sözlərini özü yazır, həm musiqisini, həm də özü oxuyur. Axşam birgə konsertimiz var, gəlib özün görərsən.

Cəh-cəh Can:

– Darlinq, onli fayf minits – kənara çəkilib Burlayla nə isə pıçıldaşdılar, sonra yenə bir-birinə sarıldılar. Məlik üzünü yana çevirdi. Cəh-cəh Can Burlaya:

– Bay, bay, bebi – deyib qapıya tərəf getdi, Məliyə də əl elədi: bay, bay atacan.

Məlik qorxdu ki, yenə yanaşar, pomadalı dodaqlarıyla əlindən, ya Allah göstərməsin, üzündən öpər. Amma yaxşı ki, yalnız uzaqdan öpüş göndərib əndamını burcuda-burcuda otaqdan çıxdı.

Məlik: – Aşnandır? – dedi, Burla özü davranışıyla onu belə açıq-saçıq danışmağa vadar edirdi.

– Nə? Can? Cəh-cəh Can? – gülməyə başladı.

– Nə bilim Cəh-cəhdi, Bəh-bəhdi, nədi? Bir-birinizə elə sarılmışdınız ki?

Burla hələ də gülürdü:

– Candan aşna olar? ha... ha... O xalis geydir...

– Nədir?

– Gey... eşitməmisən? Belə... Mavi.. Necə başa salım, belə qadınlarla maraqlanmır... e... kişiləri xoşlayır.

Məlik: – Başa düşdüm – dedi.

– Mənim sənət yoldaşımdır. Dostumdur.

– Əcəb dostların var.

– Əla oğlandır... e... adamdır. Əsil dostdur, mənim seçki kampaniyam üçün brik-brak yazıb.

– Brik-brak nədi?

– Bıy, bilmirsən? İndi dünyada ən populyar ritmdir ki... Bizdə bu ritmi Cəh-cəh Can yaratmağa başladı. Brik-brak şahzadəsi qoyublar adını. Gənclər dəlisidirlər onun...

– Bəs o nə əcəb mer olmaq istəmir?

Burla çiyinlərini çəkdi: – Nə bilim, bəlkə də ürəyindən keçir, amma hər halda söz verib ki, bu seçkilərdə məni dəstəkləyəcək.

Birdən Burlanın ağlına nə isə gəldi:

– Ata, bəlkə elə sən də qalıb mənim kampaniyamda iştirak edəsən? Bilirsən nə effekti olar, rəqqasə və onun mötəbər atası.

– Bir o çatmırdı...

Burla dodaqlarını büzdü:

– Yəni məni heç layiq bilmirsən o vəzifəyə.

Məlik susdu.

– Sonra da qalarsan burda, mənim müşavirim olarsan. Bilirəm axı, mütləq seçiləcəm.

Məlik yenə dinmədi.

Burla: – Bağışla ata, məşqə getməliyəm – dedi – Lera səni yedizdirəcək. Bir saatdan sonra aşağı düş, Fil səni konsertə gətirəcək. Özün görərsən ki, dəhşətli bir şey yoxdur. Konsertdən sonra kokteyl olacaq, sonra da səhərəcən səninlə söhbət edərik.

Otaqdan çıxdı. Məlik quruyub qalmışdı. Nə edəcəyini, necə davranacağını bilmirdi. Burla otağa qayıtdı, çox bahalı xəz şubadaydı.

Məliyə yanaşdı, lap uşaqlıqda olduğu kimi başını onun çiyninə qoydu. Məlik yanağında şubanın yumşaq tüklərini hiss etdi, burnunu Burlanın zərif ətir qoxusu çaldı.

Burla çox yavaş səslə, pıçıltıyla: – Atacan, qal burda – dedi – bilsən nə qədər yalqızam. – sonra cəld sıçrayıb otaqdan çıxdı.

Bir saatdan sonra Məlik həyətə düşdü, Fil tez yüyürüb qapını açdı.

Məlik: Hara gedirik? – dedi.

Fil təəccüblə: – Konsertə – dedi.

– Hardadır konsert?

– "Şahsaray" kabaredə.

– Ora haradır?

– Hansısa şahlar sarayı.

– İndi ora kabaredir?

– Yes... sorri... bağışlayın, Miss Bura dedi ki, mən sizlə öz dilimizdə danışım. Ay em... mən... e... petriot... Öz neyşn sevirəm.

Məlik baxdı ki, bayaqki geniş prospektlə irəliləyirlər.

– Bu küçənin adı nə oldu?

– 42-ci paralel avenyu.

– 42-ci paralel niyə?

– Nyu-York siti də, Baku siti də, 42 paraleldə... paraleldədir...

– Belə de.

"Mersedes" keçmiş Şirvanşahlar sarayının aşağı girişi – Murad qapılarının qarşısında dayandı.

Sarayın ancaq divarları qalmışdı, bütün görkəmi dəyişmişdi. Hər yerdə yanıb-sönən reklamlar, əlvan afişlər...

Divarın üstündə iri qırmızı, sarı, yaşıl neon hərflərlə sözlər axıb gedirdi:

ŞAHSARAY KABARE.

EROTİK ŞOU: DEKAMERON – KAMASUTRA – MİN BİR GECƏ. OST-VEST SEKS SİNTEZ.

RETRO: GÖBƏK RƏQSİ – KANKAN – STRİPTİZ

DİSK-JOKEY SİMURQ SİD

Bu reklam söndü, sonra daha iri həfrlərlə yazılmış adlar keçməyə başladı:

BRİK-BRAK ŞAHZADƏSİ CƏH-CƏH CAN

SUPER-STAR BURA

Fil Məliyi içəri keçirdi, Sarayın böyük otağının divarları başdan ayağa reklam idi-içgilər, siqaretlər, sabunlar, təmiziləyici tozlar, gi-

giyenik paketlər, tualet kağızları reklam olunurdu. Ortada səhnə qurulmuşdu. İki qarşı-qarşı tərəfdən masalar düzülmüşdü, tamaşaçılar ayrı-ayrı masaların başında iki-bir, dörd-bir oturmuşdu. Qabaq masalarda sinli kişilər, bəziləri cavan qızlarla əyləşmişdi. Arxa masaların ətrafında, üstündə, altında oturanlar, duranlar, uzananlar cavanlar idi. Uzunsaçlı oğlanlar, qısa saçlı qızlar. Ayırd eləmək olmurdu ki, hansı oğlan, hansı qızdır. Bəzi qızlar oğlanların dizi üstündə oturmuşdu, qol-boyun olub yalaşırdılar. Amma kim bilir hansı qız, hansı oğlandır? Bəlkə oğlan qızın dizi üstündə oturub? Ya ikisi də oğlandır? Ya hər ikisi qız? Hamısının da çənələri işləyirdi – saqqız çeynəyirdilər.

Məlik daha heç nəyə təəccüb qalmırdı.

Salonda bir neçə televiziya kanalının kameraları qurulmuşdu, yazıları oxudu: FİRST TV(först TV), FACE TV(Feys TV), Uorld TV, Grand TV.

Masaların arasında bikinili qızlar ora-bura şütüyür, tamaşaçılara içkilər, məzələr paylayırdılar. Masa başında cavan məşuqəsiz oturmuş sinli kişilər onların dizlərini tumarlayır, büstqalterlərinə dollar soxuşdururdular. Xidmətçi qızlar işvəylə təşəkkür edirdi.

Fil Məliyi masasında əyləşdirib getdi. Bir azdan masaya əcaib bir məxluq yanaşdı və salamsız-kəlamsız oturdu. Təyin etmək olmurdu qocadır, cavandır, qadındır, kişidir. Başının vız saçlarını yaşıl rəngə boyamışdı, sifətinin bir yanağı mavi, bir yanağı çəhrayı idi. Cibindən siqaret çıxarıb çəkməyə başladı. Məlik anaşaya bənzər iy duydu.

Məxluq dumanlı gözlərlə Məliyi süzüb, siqaret qutusunu uzatdı. Məlik başını buladı. Məxluq təəccüblə çiyinlərini çəkdi.

İşıqlar söndü. Salona tam bir qaranlıq çökdü. Sonra dörd tərəfdəki güclü dinamiklərdən gələn qulaqbatırıcı musiqi sədaları altında səhnənin ortası işıqlandı.

İşıq şüasının altında cürübbəz bir oğlan göründü, atılıb-düşməyə, o yan-bu yana çevrilməyə başladı. Qurşağacan çılpaq idi, sinəsində, belində erotik mövzularda döymələr vardı.

Məliyin yanında oturan məxluq, birdən dilləndi, səhnədəki oğlanı göstərib: narkomandı – dedi.

Bu məxluqun ağzından çıxan ilk söz idi və Məlik düşündü ki, kor kora kor deməsə bağrı çatlayar. Məxluq yenə siqareti sümürürdü. Məlik soruşdu: – Nəşədi?

Məxluq başını buladı: – Marixuana – dedi.

Səhnədəki oğlan isə xeyli tullanandan sonra nəhayət toxtadı, mikrofonu ağzına tutub:

– Ay em disk jokey Simurq Sid – dedi – Qud ivninq ledi end qamilton.

Salondakılar qəh-qəhə çəkdilər, əl çaldılar, çaqqal kimi ulamağa başladılar. Məliyin yanındakı oğlan durub masanın üstünə çıxdı, masanın üstündəki boşqabları basdalayıb sındırdı və iki barmağını ağzına soxub fit çalmağa başladı.

Xidmətçi qız onların masasına yanaşdı, sınıq boşqabları yığışdırıb yenilərini qoydu və Məliyin yanında elə əyildi ki, yumru məmələri aydın göründü. Məlik başa düşdü ki, ora pul qoymalıdır, amma etmədi. Yanındakı məxluq masanın üstünə təzə qoyulmuş boşqabları götürdü, hirslə yerə çırpdı, boşqablar çilik-çilik oldu, məxluq xidmətçi qızı itələyib qovdu.

Səhnədəki adam nə isə danışırdı. Məlik nə qədər diqqət etsə də hansı dildə və nə danışdığını anlaya bilmirdi – ingilis sözləri də vardı dedikləri arasında, Azərbaycan sözləri də, amma nə Azərbaycan diliydi, nə ingilis dili. Onsuz da bu mərəkədə heç nə eşitmək mümkün deyildi. Salondakılar gah əl çalır, gah fışdırıq çalır, gah çaqqal kimi ulayır, gah da masaların üstündəki boşqabları sındırırdılar. Xidmətçi qızlar dərhal yeni boşqablar gətirirdilər, dərhal onları da sındırırdılar. Məlik fikir verdi ki, boşqabları daha çox sinli kişilər sındırır, və qızlar dərhal təzə boşqablar gətirən kimi onların büstqalterlərinə, tumanlarına pul salıb qurdlarını öldürürdülər.

Disk – jokey:

– Saylens pliz – dedi – sakit, sakit, uan sekınd – bir saniyə.

Səhnədəki pərdə işıqlandı və orada iri şəkli görünən adamı Məlik tanıdı: Cəh-cəh Can idi.

Salon dərhal sükuta qərq oldu.

Disk jokey:

– Sitimizin Don Juanı, Lovelası, Kazanovası – salondan qəh-qəhə qopdu, (alqışlar, fit, ulama) – popa ulduz (qəhqəhələr), bağışlayın, pop-ulduz (alqışlar) – Disk jokey pauza verdi, sonra daha yüksək tonla – Brik-brak şahzadəsi... – yenə pauza və ən uca tonla – CƏH... CƏH... CAAAAN!!!

Cəh-cəh Can elə bil hardansa yerin dibindən çıxdı (alqışlar, fit, ulama).

Cəh-cəh Canın əynində topuğunacan uzun, qırçınlı qadın tumanı, baftalı köynək vardı. Əlində gitara tutmuşdu. Naz-qəmzəylə o tərəfə, bu tərəfə çevrilir, işvəylə hamıya öpüşlər göndərirdi. Sonra:

– May dearz – dedi – əzizlərim, demə bu gün aborigenlərin bayramıdır... e... e... Novruz bayramı. Nourus, nyu-ryus. Lap yeni-ruslar kimi səslənir. Mən bu bayrama brik– brak yazmışam: Nyu-ryus holidey. – gitarasından bir akkord alıb əcaib bir ritmdə oxumağa başladı.

Novrus, nourus, nyü-ryus. Ryus, ryus, ryus. Rus, rus, rus. Ruz, ruz, ruz. Duz, duz, duz, Buz, buz, buz. Qafiyə – mafiya, mafiya-qafiyə. Biz, biz, biz. Qız, qız, qız. Vız, vız, vız. Cız, cız, cız. Bız, bız, bız.

Cız-bız, cız-bız

Cız-bız, cız-bız

Bütün salon bir ağızdan təkrar etməyə başladı: cız-bız, cız-bız, cız-bız...

(*Təbii ki, alqışlar, fit, ulama*)

Məliyin yanındakı məxluqun ağzı açıq qalmışdı:

– Genidi də – dedi – Gördün Novruzu necə gətirib cız-bıza çıxartdı. Dahi!

Cəh– cəh Can oxumaqda – əgər buna oxumaq demək olardısa – davam edirdi:

Caz, caz, caz,
qaz, daz, naz,
saz, baz, yaz,
vaz, taz, paz.

Məxluq siqaretindən qullab vurduqca gözləri dumanlanır, dodağının altında: – Genidi, geni – deyə mızıldanırdı.

Məlik xəbər aldı: – Nə dilində oxuyur? – deyəsən məxluqu bütün bu işlərin mütəxəssisi sayırdı.

– Necə nə? Brik-brak oxuyur da...

– Bəs o sözlər nə deməkdir?

– Hansı sözlər?

– Nə bilim daz, baz, taz, paz.

– Hamısı öz dilimizdədir də, bu sözləri bilmirsiz? Cəh-cəh Can sözləri qəfəsdən çıxarır. – Məxluq gözlənilməz qıvraq hərəkətlə yerindən sıçradı, masanın üstünə çıxdı və bərkdən: – Yaşasın sözlərin azadlığı! – deyə bağırdı – sözlərə azadlıq!

Dərhal o biri masalardan da sıçrayıb: Lonq liv fridom, sözlərə azadlıq! – deyə qışqırmağa, ulamağa başladılar.

Kimsə: – Viva seks azadlığı! – deyə qışqırdı. Cəh-cəh Can səhnədən ona öpüş göndərdi.

Yey-yerdən:Viva seks azadlığı! – deyə qışqırışdılar.

Yaşılbaş məxluq yenidən oturdu, yenə siqareti içinə sümürdü, yenidən sıçrayıb qışqırdı: – Gey, gey, oxu.

Bu həngamədə Can onu eşitdi, bəlkə əvvəlcədən belə danışmışdılar. Məxluqa tərəf çevrilib şəhadət barmağıyla hədələdi: Ay xətakar – dedi.

Yenə hər yerdən qışqırmağa başladılar. – Gey, Gey, oxu.

Cəh-cəh Can ani bir hərəkətlə əynindəki baftalı köynəyi cırıb atdı. Qurşaqdan yuxarı çılpaq bədənində qara krujevalı qadın büstqalterindən başqa heç nə yoxdu.

Cəh-cəh Can gitarasından bir akkord aldı, birdən gitaranı zərblə yerə çırpdı. Gitara parçalandı. Bu da azmış kimi gitaranın üstünə çıxdı, onu təpikləməyə, parça-parça etməyə başladı, simləri ayağına ilişdi, hiddətlə dartıb simləri qırdı. Salondakılar isterika halına gəlmişdi: Gey, Gey, – deyə bağırırdılar. Cəh-cəh parçalanmış gitarasının tikələrini bir-bir salona atmağa başladı. Aləm bir-birinə qarışdı, yer yerindən oynadı. Adamlar gitaranın tikələrini bir-birinin əlindən qapırdılar, bir-birini itələyir, yıxır, saçlarını yolurdular.

Məxluq: keçən səfər gitaradan iki parça qapa bildim, auksionda bilirsən neçəyədi Cəh-cəhin dəsmalı, corabı, gitarasının hər tikəsi?

Cəh-cəhə ayrı gitara gətirdilər və o oxumağa başladı:

Kim dedi ki keyəm mən<br>
Geyəm. Geyəm. Geyəm mən.

Salondakılar birağızdan təkrar etməyə başladılar:

Geyəm, geyəm, geyəm mən.

Beş altı dəfə təkrar olundu. Sonra Can arxasını gəh o tərəfə, gah bu tərəfə çevirə-çevirə ardını oxudu:

Həm sizinəm, həm ögey.<br>
Bəli, belədir. O key.

Salondakılar təkrar etdilər:

Həm sizinəm, həm ögey,<br>
Bəli belədir, o key.

Bu sözləri azı on dəfə təkrar etdi, sonra əl çalanlara, fit verənlərə dönə-dönə baş əydi, öpüş göndərdi, alnının tərini silib dəsmalı salona atdı, dərhal qapa-qap başladı. Axır ki, ön masada oturmuş yaşlı qadın dəsmalı ələ keçirib öpdü, bağrına basdı.

Cəh-cəh Can:

– Əzizlərim, sevgililərim, dostlarım – dedi – Sizə bir sirr açım. Bizim – dünya gözəlimiz, dahi rəqqasəmiz miss Bura mer seçilmək istəyir. (*Alqışlar, fit, ulama*) Mən də buna bir brik-brak yazmışam. (*Alqışlar*) Daha çox alqışlar istəyirəm. (*Alqışlar, fit, ulama*)

Gitarasından bir akkord aldı, oxumağa başladı.

Biz gəlmişik buraya
Səs verməyə Buraya.
O heç uçmur çarterlə
Arası yox barterlə.
Atsalar da təndirə
Razılaşmaz tenderə.
Oynayanda poker
Əlindədir coker,
Varmı burda roker,
Ya da bəlkə broker?
Biz gəlmişik buraya
Səs verməyə Buraya.

Tullandı – hə, oppa, bir yerdə.

Salondakılar oxudular:

Biz gəlmişik buraya
Səs verməyə Buraya –

Cəh-cəh davam edirdi:

Bura – mer, Bura – mer.
Buraya səs ver, səs ver.
Görmüsünüzmü triller,
Varmı burda killer?
Lazım deyildir bizə
Marazmatik plebeylər,
Xarizmatik pleyboylar
Biz gəlmişik buraya
Səs verməyə Buraya.
Buraya səs ver, səs ver.
Mer – Bura, Bura – mer.

Yer-yerdən təkrar etməyə başladılar:

Mer – Bura, Bura – mer,
Buraya səs ver, səs ver,
Biz gəlmişik buraya
Səs verməyə Buraya.

Məlik ayağa durdu. Bəsiydi, bundan artığına dözməyə taqəti qalmamışdı.

Yaşılbaş məxluq:

– Hara father, hələ Bura özü çıxacaq. Aləmdi.

Məlik masaların arasıyla çıxışa tərəf getdi. Yerlərdən ona söz atırdılar:

– Father, hara? Hələ striptiz olacaq, lap sənin malındır.

Güldülər, fit çaldılar, uladılar.

Kimsə onu dümsüklədi, kimsə itələdi: – Çəkil, səhnəyə baxaq.

Kimsə qabağını kəsdi – sərxoşdu, ya həşiş çəkmişdi:

– Hara? Olmaz.

Kimsə: – Burax getsin. Hara gedəcək, krematoriyə, vaxtdır – dedi.

Yenə gülüşlər, fışqırıq, ulaşma.

Məlik birtəhər salondan çıxdı. Şirvanşahlar sarayının... keçmiş Şirvanşahlar sarayının həyətindən keçdi. Vaxtilə bura ekskursiyalara gəldiyi əsas qapıdan çıxdı.

Buradakı meydanı tanıya bilmədi. Meydan çil-çıraq içindəydi. Böyük reklamda "Plas Piqal" yazılmışdı. Birmərtəbəli evlərin üstündə açıq-saçıq cinsəl şəkillər, fotolar vardı, reklamların hamısı bir yöndə idi:

"Kazino Las-Veqas", "Kazino Monte-Karlo", seks-şop, erotik şou, porno film... qapıları yan-yana düzülmüşdü. Məlik tələsik keçib yan küçəyə çıxdı. Bura ordan da aləm imiş. Qırmızı fənərli küçədə şəffaf şüşə vitrinlər ardında şəhvani pozalarda lüt qızlar oturmuşdu. Məlik vitrinlərin yanından ötdükcə ona baxıb göz vurur, içəri çağırırdılar. Gözünü yerdən qaldırmamağa çalışaraq addımlarını yeyinlətdi.

Qırmızı fənərlər qurtaran yerdə göy fənər asılmışdı. Qabağına sıçan-pişik padşahına oxşayan burma bığlı bir kişi çıxdi, irişə-irişə:

– Deyəsən qızlarımızı bəyənmədiniz – dedi – Könlünüz ayrı şeyə meyil edirsə göyçək oğlanlarımız da var.

Məlik onu itələyib keçdi, az qala qaça-qaça bu küçədən uzaqlaşdı. Bir neçə küçə ötdü, deyəsən azmışdı. Heç kəs də yoxdu ki, xəbər ala.

Burnuna xörək iyi dəydi. O tərəfdə restoran vardı, Məliksə gəlib restoranın arxa tərəfinə, həyətinə çıxmışdı. Gördü ki, divarın dibində

xeyli adam var. Yan-yana dayanıblar, üzləri divaradır. Əvvəl bilmədi sırayla yan-yana duran bu adamlar neyləyirlər, bu an ay buludlardan çıxanda gördü ki, əyin-başları cır-cındır olan kişilər, qadınlar restoran mətbəxinin yan-yana düzülmüş sarı zibil qutularında eşələnir, nə-isə tapıb ya tələsik ağızlarına, ya da torbalarına atırdılar.

Yalın ayaqlarına nimdaş qaloş keçirmiş, yamaq-yamaq paltosuna bürünmüş, ordu-orduna yapışmış, üzünü saqqal basmış yaşlı kişinin eynəyinin bir şüşəsi sınığ idi, sol sağanağının yerinə sap bağlamışdı, sapı qulağına keçirmişdi. O da qutularda eşələnirdi, amma elə bil bu işi çəkinərək, o birilərdən utana-utana edirdi. Məliyi görüb qutudan bir addım aralandı.

Amma zibil qutularında eşələnənlərin heç nə vecinə deyildi, heç hara baxmırdılar, hərə öz işində idi, əllərini dirsəyəcən qutuların lap dibinə salmışdılar. Məlik fikir verdi ki, hamısı bir dəriydi, bir sümük.

Məlik eynəkliyə yanaşdı:

– Mən buradan necə çıxa bilərəm?

– Hara çıxmaq istəyirsiniz ki?

Məlik çiyinlərini çəkdi, tamamilə yadlaşmış bu şəhərdə haranı tanıyırdı axı...

Onun tərəddüdünü görən eynəkli kişi bir az yaxınlaşdı.

– Bəlkə – dedi – dəniz qırağına çıxmaq istəyirsiz?

– Dəniz qırağına?

Eynəkli kişi onun lap qulağına əyildi, pıçıldadı: – O yolu bircə mən bilirəm.

– Nə yol?

– İki tin o yanda divarın bir yerində daşlar uçub, deşik açılıb, ordan dəniz qırağına keçmək olar.

– Dəniz qırağı hansı zonadadır?

– Buralı deyilsiz?

– Yox, neçə ildir burada olmamışam.

– Belə de. Hə, dəniz hansı zonadadır? Heç birində. Dənizin altını bölüblər, içini, üstünü bölüblər, kirli, mazutlu sahilləri kimə lazımdır? – eynəkli adam səlis danışırdı. Sözünə davam etdi – Xəzərin səthi qalxdı, bulvarı su basdı, bulvar yadınıza gəlir?

– Gəlir.

– Neftçilər prospekti vardı.

Məlik: – vardı – dedi.

– İndi ora qumluqdur, qumlu, mazutlu sahil. Ora çıxarda bilərəm sizi. – Eynəkli sanki nə isə deməkdən çəkinırdı. Axır qərara gəldi – Amma bir şərtlə.

– Nə şərt?

Bir az da tutulan kimi oldu, sınıq eynəyini çıxardı, sildi, utancaq bir tərzdə:

– Beş dollar... beş dollar verəcəksiz mənə... Cəmi beş dollar.

– Yaxşı. – Məlik özü də başa düşmürdü ki, niyə razılaşdı. Dəniz qırağı da, dənizin özü də onun nəyinə gərəkdi, amma hər halda, söz ağzından çıxmışdı. Bəlkə də bu ziyalı kişinin ehtiyacını duymuşdu, yardım etmək istəyirdi. Eynəkli kişinin ardınca düşüb bir neçə dar küçənin tinini buruldular. Bu İçərişəhərin keçmiş dar dalanları deyildi, kartonlardan, taxta qutulardan, paslı metal laylarından, borulardan tez-tələsik quraşdırılmış daxmalar idi. Ankaranın gecəqonduları kimi, amma onlardan yüz dəfə bərbad, miskin, kasıb. Hamısı da qaranlığa qərq olmuşdu, bir iki pəncərədən zəif şam işığı şölələnirdi. Heç yerdən bir səs-səmir, bir bişmiş qoxusu gəlmirdi.

Axır ki, sal daş sərhəd divarı çıxdı qarşılarına. Divarın bu tərəfində gözətçilər-filan da yoxdu. Eynəkli kişi o tərəf bu tərəfə döyüküb, dönə-dönə arxaya boylanıb, axır ki, divarın uçuq yerini göstərdi:

– Burdan keçə bilərik – dedi. Əvvəl kişi özü, sonra da Məlik əyilib deşikdən keçdilər, qumlu sahilə çıxdılar. Burda dənizin səsi eşidilməyə başladı. Ətrafı dəhşətli üfunət bürümüşdü. Məlik burnunu tutdu.

Eynəkli kişi: – Bəli – dedi – üfunətdir. Şəhərin bütün kanalizasiyası Xəzərə burdan axır.

Məlik burdan uzaqlaşmağa çalışdı. Ayaqları topuğacan quma batırdı.

Bura niyə gəlmişdi, buradan hara gedəcəkdi, heç nə haqqında düşünə bilmirdi...

Eynəkli kişi də onun dalınca addımlayırdı. Qum dolmuş qaloşlarını çıxartdı, çırpdı, yenə geyindi, sonra bir balaca öskürdü:

– Bağışlayın – dedi – mən sözümü yerinə yetirdim. Sizi bura keçirdim. Siz demişdiz...

Hiss olunurdu ki, pul söhbətini eləmək onunçün asan deyil.

Məlik: – Bəli, əlbəttə – dedi, cibindən çıxarıb kişiyə on dollar uzatdı.

Eynəkli kişi pula baxıb: – Yox, biz beş dollara danışmışdıq – dedi – artıq mənə lazım deyil.

Məlik: – Xırdam yoxdur – dedi – götürün. Çəkinməyin. Ziyalı adama oxşayırsınız. Nə peşə sahibisiniz... e... idiniz?

Eynəkli kişi başını aşağı saldı, lap yavaş səslə: – Bir vaxt yazıçı idim – dedi. Sonra cəld çevrilib vidalaşmadan iti addımlarla uzaqlaşdı. Yenə də qaloşlarını çıxarıb çırpdı, geyindi və əyilib divarın uçuğundan geri keçdi.

## IV

Məlik sahilboyu addımlamağa başladı, üfunətli yerdən bir az uzaqlaşmağa çalışırdı, amma hara getdiyini özü də bilmirdi.

Hər şey bitmişdi. Nə yeri-yurdu qalmışdı, nə xalqı, nə vətəni, nə ailəsi.

Keçmiş yoxdu. Darmadağın dağıdılmış, yandırılmış, tar-mar edilmişdi.

İndi – bax beləydi.

Gələcək? Gələcək də yoxdu. Hər halda onunçün. Onun, Məlik Məmmədlinin, Məlik Məhmədoğlunun heç bir gələcəyi yoxdu.

Türkiyəyə qayıtmaq? Bundan sonra, bu xatirələrlə, bu təəssüratlarla, bu gördükləri, eşitdikləriylə bundan sonra orda necə yaşaya bilərdi. Bir də ki, bundan sonra yaşamağının nə mənası vardı...

İntihar etmək? Bax burda, elə bu dənizə atılmaq?

Kanalizasiyanın bura axıdıldığı yadına düşdü. Nəcislər içində boğulmaq? Məliyin ürəyi qalxdı, ödü ağzına gəldi.

Ayaqları quma bata-bata gedirdi, büdrəyib yıxıldı, amma ayağa qalxmaq istəmədi.

Dənizə baxdı. Uzaqda məhbəsə çevrilmiş Nargin adasının silueti görünürdü.

Damarlarınımı kəssin, alnına gülləmi sıxsın? Bəlkə özünü assın. Ya zəhər tapıb içsin? Hansı ölüm daha asan, daha rahatdır? Hər halda bunu Türkiyədə etmək lazımdır ki, heç olmasa torpağa basdırsınlar. Burda ölsə meyitini krematoridə yandırıb külünü havaya sovuracaqlar. Bir yandan baxanda elə bu da ömrünün məntiqi sonu deyildimi? Külə çevrilib göyə sovrulmaq. Heç nə qalmayıb ondan, heç nə də qalmayacaq.

– Axı dedim sizə bədbinləşməyin.

Məlik diksindi, bu adamsız sahildə kim idi onunla danışan? Başını çevirdi və donub qaldı: Ərxan qumun üstündə, onun yanında oturmuşdu. Haçan gəlmişdi bura? Necə gəlmişdi ki, Məlik heç nə duymamışdı. Ürəyi şiddətlə döyünməyə başladı, bir az toxtayıb:

– Ərxan? Sən hardan gəlib çıxdın bura? – dedi.

Ərxan gülümsəyib göyü göstərdi:
– Ordan – dedi.
– Aydındır ki, uçaqla gəlmisən, bəs bura necə gəlib çıxdın?
Ərxan yenə gülümsədi və göyü göstərdi.
– Göydən?
– ...
– Yəni quş-zadsan?
Ərxan bu səfər daha da müəmmalı gülümsünərək:
– Bəlkə də – dedi.
Susdular.
Ərxan: – Sizinkilərin hamısını görə bildiz? – deyə soruşdu.
Məlik köksünü ötürdü.
– Gördüm – dedi – sonra əlavə etdi – Bilmirəm məni bura gətirtməklə yaxşılıq elədin mənə, ya pislik.
– Bunu ancaq siz özünüz təyin edə bilərsiz.
– Mən də bilmirəm. Ailə üzvlərimi ölmüş bilməyim daha yaxşıydı, ya onları BELƏ görmək.
– Ölüm hər şeyin sonudur. Yaşadıqca insanın hələ həyatın dəyişəcəyinə ümidi var. Bu bir az da insanın özündən asılıdır. Öləndən sonra ondan daha heç nə asılı olmur.
– Bir ölümə çarə yoxdur deyiblər. Amma görünür ölüm çarəsizliyin çarəsiymiş. Çıxılmazlıqdan yeganə çıxış.
Ərxan bir şey demədi.
Ola bilsin ki, Ərxan çox gizli bir təşkilatın nümayəndəsi idi, hər cür səlahiyyətləri vardı, istədiyi yerə girib-çıxa bilirdi, bura da Məliyi izləyə-izləyə gəlib çıxmışdı, amma axır ki, ondan nə istəyirdi?
– Yaxşı, axı nə bildin mən burda, bu qumlu sahildəyəm?
Ərxan:
– Yəqin özünüz də bilmədən tükümü oda tutmusuz – dedi – mən də uçub gəlmişəm. Məlik Məmməd nağılı yadınızdan çıxıb, bəlkə mən də sizin Zümrüd quşunuzam – güldü.
– Boşla sən Allah, nə nağılbazlıqdır? Həyat nağıl deyil. Çox acı şeymiş həyat.
– Təəssüf ki, elədir – dedi Ərxan – amma nağıl həyatdan daha gerçəkdir.
– Yaxşı, nağıl həyatdan gerçəkdirsə, sən də Zümrud quşusansa, çıxar məni işıqlı dünyaya. Qa deyəndə ət, qu deyəndə su verərəm.
Özü də təəccübləndi ki, bu halında hələ zarafat da edə bilir.

Ərxan:
– Yox işıqlı dünyaya yalnız öz gücümüzlə çıxa bilərik – dedi.
– Kimin gücüylə?
– Hamımızın.
– Bununçün nə etmək lazımdır?
– Əvvəla, ağ qoçu qara qoçdan seçə bilmək lazımdır. Sonra da sıçrayıb ağ qoçün belinə minəndə, elə möhkəm oturmalısan ki, səni qara qoçun belinə ata bilməsin.
– Eh, ay Ərxan, mənim də, elə sənin də nağıla inanmaq vaxtımız keçib.
Ərxan yenə cavab vermədi, xeyli susdular, sonra Ərxan:
– Bir ora baxın – dedi.
Hava işıqlanmağa başlamışdı, Məlik Ərxan göstərən səmtə baxdı.
– Nə var ki, orda?
– Görmürsüz? Diqqətlə baxın.
Məlik bir az da diqqətlə baxdı və doğrudan da nə isə gördü.
– Deyəsən itlərdir – dedi – hə, iki itdir, boğuşur.
Ərxan:
– İtlər deyil, iki qoçdur, boğuşmurlar, döyüşürlər. Ağ qoç, qara qoç.
– Qoçlar burda nə gəzir?
– Sizinçün gəliblər. Məlik Məmməd nağılını tamamlamaqçün. Axı hələ göydən üç alma düşməyib.
Məlik: – çoxdan düşüb üç alma – dedi və kədərlə əlvavə etdi: – özü də hərəsi bir zonaya.
Ərxan: – Yox, bu çürük almalardı, mən birinci gün çiçək açan, ikinci gün çiçəyini tökən, üçüncü gün bar verən almaları deyirəm. Padşahın həsrət qaldığı almaları.
– O almaları da divlər yeyərmiş – dedi Məlik – yenə Məlik Məmməd nağılı.
– Divlərə də qalib gəlmək olar. Unutmayın ki, divlərin canı bir şüşədədir.
– Bütün bu rəmzlərlə nə demək istəyirsən Ərxan, sözünü açıq de, bir şey başa düşüm.
– Məlik Məmməd ağ qoçun belinə sıçrayıb İşıqlı dünyaya çıxa bilərdi. Sizin də hələ bu şansınız var.
Elə bil bu sözlər Məliyi ovsunladı. Çətinliklə yerindən durdu, az qala yıxılacaqdı. Bir-iki addım atdı, indi qoçları doğrudan da aydın

görürdü. Ərxana tərəf çevrildi və yenə donub qaldı: Ərxan ilim-ilim itmişdi. Yerin dibinəmi batmışdı, uçub göyəmi qalxmışdı? Bəlkə doğrudan da quş imiş – Zümrüd quşu.

Məlik qumların üstüylə qoçlara tərəf addımlamağa başladı. İndi lap aydın görürdü, özü də orda tək bir qoç qalmışdı: Ağ qoç. Amma Məlik irəlilədikcə elə bil o da uzaqlaşırdı. Məlik qaçmağa başladı, ayaqlarını qumlardan güclə dartıb çıxarırdı.

Bir-iki dəfə büdrəyib yıxıldı, sonra durub yenə qaçmağa başladı. Ona elə gəlirdi ki, məsafə get-gedə azalır. Bax indicə ağ qoça çatacaq. Az qala çatacaqdı...

Az qala. Az qala...

*Avqust-sentyabr 2003*
*Zuğulba*

## MÜNDƏRİCAT

